mahiyyətinə, düşüncəsinə elə «nəqş etdi» ki, bütün varlıq onu tanıdı, tanıyır və tanıyacaq. Bu uca Allahın (c.c.) qüdrətinin sonsuzluğunu göstərir, onun «nəqş etdiyini» kimsə poza bilməz).

**Burada «əlif»in birinciliyi «Əhməd»in Peyğəmbər (s.a.s.) nurunun ilk olduğuna işarədir. Elə ki yaradılış əmri verildi, onda Peyğəmbər (s.a.s.) nuru yaradıldı.**

**Hz.Nizami Gəncəvi ustad sənətkar olaraq bu yaradılışın sistemini, ardıcıllığını «uçuş» «uçmaq» anlayışı ilə bədii bir üslubda mükəmməl ifadə edib. «Əlif havalandı, uçdu «Əhməd»in bağlı, örtülü («məhcub») qapısına qondu, «ha», «mim», «dal» kökündən «Əhməd»in (çox həmd edən) yaradıldığını müjdələdi (bir sıra quşların gözəl bir xəbərin müjdəçisi olduğu da bəllidir). Burada quşa bağlı bir imkanın («uçmaq») yada düşməsi, müjdənin bu yolla çatdırılması hz.Nizaminin bütün məsələləri dərindən bilməsinin , inanmasının və parlaq istedadının göstəricisidir. Axı, uca Allahın (c.c.) qərarları niyə, nə vaxt, nə üçün qəbul etdiyini, necə çatdırdığını kimsə bilmir. Burada «uçmaq» anlayışı din sisteminə, Allahın idarəetmə vasitə və prinsiplərinə çox uyğundur. Allahın (c.c.) bir sıra mələkləri də gözə görünmür, ancaq onlar Allahdan (c.c.) əmr alıb uçur və zəruri ünvana müjdə çatdırırlar.**

Hz.Nizami iki misrada dini və bədii informasiya yükü ağır olan gözəl bir mənzərə yaradır. Şair, alim hz.Nizami bu faydalı, bizi nurlandıran informasiyanı «Lövhə», «əlif», «Əhməd» sözləri üzərində yerləşdirir. O, varlığın yaradılış sırasında Peyğəmbərin (s.a.s.) yerini göstərir.

Hz.Nizami Gəncəvi «Əhməd»in örtülmüş qapısından da danışır. Burada şair sait səsin («əlif») imkanından yararlanır.

Bu iki yolla baş verir: birincisi, bilindiyi kimi «əlif» əlifbanın və «Əhməd» sözünün birinci hərfidir. Hz.Nizami bundan yararlanaraq «Peyğəmbər nuru»nun ilkinliyinə işarə edir. İkincisi, sait səs «əlif», samit səslərin: «ha», «mim», «dal»ın önünə artırılaraq başqa bir söz yaradır, «həmd» sözü «Əhməd» (çox həmd edən, Allahı çox öyən) sözünə çevrilir, sözün önü açılır, «örtülmüş qapı» açılır. Yəni, Allah (c.c.) gizli bir xəzinəni açmaq qərarına gəlir. Uca Allah özü bir xəzinə idi, öz varlığını bildirmək üçün varlığı yaratdığını bəyan edir. Bu açıqladığımız mənaları bildirmək üçün «əlif»in imkanları göz önündədir. Burada bir hərf «əlif» bir sözə də bərabərdir, yəni sözü təmsil edir. Sözlər səslərdən ibarətdir, səslər də hərflərlə ifadə olunur, şəkillənir. Uca Allahın ilk əmri də «Oxu»dur:

اقْرَأْ بِاسْمِ رَبِّكَ الَّذِي خَلَقَ . خَلَقَ الْإِنسَانَ مِنْ عَلَقٍ . اقْرَأْ وَرَبُّكَ الْأَكْرَمُ . الَّذِي عَلَّمَ بِالْقَلَمِ . عَلَّمَ الْإِنسَانَ مَا لَمْ يَعْلَمْ

(Ələq, 96/1-5)

«Oxu! Yaradan Rəbbinin adıyla. O, insanı ələqdən yaratdı. Oxu! Rəbbin sonsuz kərəm sahibidir. Rəbb ki, qələmlə yazmağı öyrətdi. İnsana bilmədiyini də öyrətdi…»

Biz yuxarıda hz.Məhəmmədin (s.a.s.) Peyğəmbər olaraq gələcəyinin öncədən (hz.Məhəmməd (s.a.s.) həyatda olmayanda) müjdələndiyini Allahın kitablarına əsaslanaraq açıqlamışdıq. Bu məsələyə açıqlıq gətirən və İslam tarixində yer tutan bir-iki gerçək hadisəni də dediklərimizə artıraq. Ərəb şairləri İslam öncəsi şeir yarışmaları keçirirdilər. Belə yarışmalardan birində (Ukaz yarışmasında) Kus b. Səidə ərəb şairlərinə üz tutaraq dedi: «… Allahın gelecek bir peyğamberi vardır ki, onun gelmesi pek yakındır. Gölgesi

başımızın üstüne geldi. Ne mutlu o kimseye ki, ona inanacak, o da onu doğru yola yöneltecektir».[85]

Bu önəmli çıxışı dinləyənlər arasında olan hz.Məhəmməd (s.a.s.) sonralar bu hadisəni xoş duyğularla anmış və buyurmuşdur: «Öyle inanıyorum ki, uca Allah (c.c.) Kus b. Saidi Kiyamet günü ayrı bir ümmet olarak huzura getirecektir».[86]

İndi də hz. Məhəmmədə (s.a.s.) ilk vəhyin gəldiyi anı göz önündə canlandıraq. Vəhydən öncə hz.Məhəmməd (s.a.s.) ardıcıl olaraq düşünür, tək qalır, Ramazan ayında yeyəcək, içəcək götürərək Hira mağarasına gedərdi. Uca Allah (c.c.) onu Peyğəmbərliyə hazırlayırdı. Allah elçisi buyurur: «… uyuyordum, elinde atlas bir kab içinde bir Kitap olduğu halda Cebrail bana geldi:

- Oku, dedi.

- Okuma bilmem, ne okuyayım.

O zaman Cebrail elindeki kitabla gögsüme çöktü, o kadar bunaldım ki, ölüyorum sandım. Sonra beni birakıp «Oku» dedi. Ben ona gene «Ben okuma bilmem», dedim. Sonunda o bana şunları okuttu: «Oku, yaratan Rabin adıyla. O, insanı bir muqdadan yaratmışdır. Oku, senin Rabin pek kerimdir. Bilmedigi şeyleri kalemle insana öyreten odur». Ben bunları okudum. Cebrail de beni burakıp gitti. Uyku halinden çıktığımda okuduğum ayetler sanki kalbime yazılmış gibi hatırımda kalmışdı. Hira mağarasından çıkdım, dağın ortalarına doğru geldiyimde gökden bir ses bana «Ey Muhammed, sen Allahın elçisisin, ben de Cibrilim» diyordu. Başımı kaldırıp gök yüzüne baktığımda Cebraili ayaklarını gökyüzünün ufuklarına doğru sermiş bir adam şeklinde

---

85 Prof. Dr. Sabri Hizmetli, İslam Tarihi (ilk dönəm), Ankara, 2001, s. 191.

86 Prof. Dr. Sabri Hizmetli, göstərilən qaynaq, s. 191.

gördüm. O, devamlı olaraq bana, «Ey Muhammed sen Allahın elçisisin, Ben de Cibrilim» diyordu. Artık yürüyemiyordum. İleriye doğru bir adım atsam, sağa, sola ve ya gökyüzüne baksam, hep Cebraili görüyordum, aynı sesi ve aynı sözleri işitiyordum».[87]

Göründüyü kimi, uca Allah (c.c.) ilk buyruqda insanın yaradılışını anladır, yaradılışın ardıcıllığını, gedişini və insanın mahiyyətini «oxumağı»-anlamağı əmr edir. Hz. Nizami Gəncəvi də uca Allahın (c.c.) anlatma üsulunu və üslubunu qəbul edir, ona sadiq qalır. O, nətin ilk beytində yaradılışı bədii dillə anladır. İndi hz. Nizaminin sırasına baxaq:

(Lövhədəki birinci nəqş edilmiş «əlif», «Əhməd»in məhcub qapısına qondu)

**İlk beyt, hər şeyin öncədən yazıldığını göstərən «lövhə», ilk hərf olan «əlif», ilk yaradılan - «Əhməd», hər şeyin girişi olan «qapı», ilki xəbər verən «müjdə» və bütövlükdə bu ilklik anlayışını anladan simvollar, şifrələr üzərində qurulmuşdur. Yaradılışın bu yolla anladılması, hz. Nizaminin «uçmaq, qonmaq» kimi sürət, gücü ilahidən olan, hərəkət anlayışları bildirən sözləri mətnə daxil etməsi bu yaradılış karvanını, ardıcıllığını necə gözəl anladır, tamamlayır!**

Quranda, hədislərdə olan «Əhməd» adı ayrı-ayrı nətlərdə də çox işlədilmişdir. Bir sıra nətlərdə bu ad «Əhmədi-Muxtar» «Əhmədi-Mürsəl» kimi verilmişdir. XIX yüzil şairi Müştaq Baba hz.Peyğəmbərin (s.a.s.) yer üzündə «Mustafa», göy üzündə «Əhməd» adı ilə anıldığını bildirir.[88]

---

[87] Prof, dr. Sabri Hizmetli, göstərilən qaynaq, s. 196.

[88] Emine Yeniterzi, Divan Şiirinde nat, Ankara, 1993, s. 168.

Ancaq nətlərdə «Əhməd» adının daha çox «mim» hərfi atıldıqdan sonra «Əhəd» adı ilə yaranan uyğunluğu önə çəkilir. «Ancak bu ismin natlarda en çok üzerinde durulan yönü, kelimeden «mim» harfi çıkarılınca geriye kalan «ehad» ile Cenabi-Haqqın birliyine işaret edilmesidir. Dolayısıyla, Ahmedden Ehadı bilmek esprisi ile hz.Peyğamberin ehadiyyete mazhar olması, nurunu O Cenabı-Hakdan aldığı konu edilir».[89]

**Ahmedi:**

Gitse andan nokta-i mim-i cesed,
Ne kalur fikr eylegil bakı Ehad.[90]
(Ondan «mim» hərfi getsə, «Əhəd» qaldığını görərsən)

**Bayburutlu Zehni:**

Ehaddan Ahmediyyet zahir oldı zata mazharla,
Avalım mim-i Ahmedden nümadir ya Resulallah.[91]
(«Əhəd»dən Əhmədiyyət yarandı, hər şey Əhmədin «mim»indən görünür)

**Sezayi-i Gülşeni:**

Bülbüli-baği-gülistani-Ehad,
Nami-pakine didiler Ahmed.

Buldi mimin ile vücud imkan,
Zahir oldı anınla kevnü mekan.[92]
(Pak adına «Əhəd» gülüstanın bülbülü dedilər. Sənin «mim»inlə vücud imkan tapdı, onunla yer, göy aşkar oldu)

**Şeyx Qalib:**

---

[89] Emine Yeniterzi, göstərilən qaynaq, s. 168.
[90] Emine Yeniterzi, göstərilən qaynaq, s. 168.
[91] Emine Yeniterzi, göstərilən qaynaq, s. 168.
[92] Emine Yeniterzi, göstərilən qaynaq, s. 169.

Bir dürr didi aşinayi-vahdet,
Mevci-Ehadiyyet Ahmediyyet.[93]

Nətlərdə şairlərin oxucunun diqqətini yönəltdiyi cəhətlərdən biri də «həmd» kökündən törəyən Əhməd, Məhəmməd, Mahmud, Həmid kimi adların nöqtəsiz hərflərlə yazılmasıdır. Şairlər bunu hz. Məhəmmədin (s.a.s.) nöqtə qədər olsa belə, qüsuru olmadığı kimi yozmuşlar.

Türk şairi Muhyi «Əhməd» adındakı «əlif»i hz. Nizamidən fərqlı bir yöndə şərh etmişdir. Ona görə, «əlif» «həmd bayrağı», «uca aləm», «qələm»dir:

Elif ol ismi-pakün evvelinde,
Liva-i Hamddür Ahmed elinde.
Ve ya alemde bir ali alemdür,
Yaxud tehriri-hamd ider kalemdür.
O bir nami-şerifi-Müctebadur,
Kim ana laik olan Mustafadur.
…Elif çün oldı ol namun karini,
Nola can içre iderse yirini.[94]

(«Əlif» o təmiz adının önündə Əhmədin əlində olan həmd bayrağıdır. O, aləmdə bir uca aləmdir, ya da həmd yazan qələmdir. O seçilmiş şərəfli addır. Bu ada Mustafa layiqdir. «Əlif» «həmd»in önünə artırıldı. Kaş bu ad varlığıma yerləşə)

«Əhməd» adında olan hərflərlə bağlı gözəl yorumlardan biri də böyük türk şairi Əlişir Nəvaiyə məxsudur. «Nevai, Ahmeddeki «elif», «dal» ve «mim» harflerinin hz.Ademden bir nişan olduğunu, «ha» ile de «Habib» adına işaret edildiyini belirtir».[95]

---

[93] Emine Yeniterzi, göstərilən qaynaq, s. 169.
[94] Emine Yeniterzi, göstərilən qaynaq, s. 170.
[95] Agah Sırrı Levend, Ali Şir Nevai, c. III, Hamse, Ankara, 1967, s. 24.

## İKİNCİ BEYTİN ŞƏRHİ:
## «ƏLİF» «HA»NIN HALQASINA
## BİR İQLİM BƏXŞ ETDİ

حلقه حـی را کالف اقلیم داد
طوق ز دال و کمر از مـیـم داد

***(Sonra) «əlif» «ha»nın halqasına bir iqlim bəxş etdi,***
***Və «dal» (hərfindən) boyunbağı, «mim»dən kəmər bağışladı.***[96]

Hz.Nizami bu beytdə varlığın yaradılışının sonrakı dönəmini şərh edir. Bu beytin dini qatı belə açıqlana bilər. Bilindiyi kimi, hərflər Qurani-Kərimdə simvol kimi də işlənmişdir. Quranın bir sıra surələri mənası bilinməyən hərflərlə başlayır. Məsələn: «Əlif, Lam, Mim», «Ya-sin», «Əlif, Lam, Ra», «Ta-ha».

**بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ**
الم .ذَلِكَ الْكِتَابُ لاَ رَيْبَ فِيهِ هُدًى لِّلْمُتَّقِينَ
(Bəqərə, 2/ 1-2)

«Əlif, Lam, Mim. Bu kitab şübhə olmayan kitabdır. Təqva sahiblərinə doğru yolu göstərəndir»

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ يس . وَالْقُرْآنِ الْحَكِيمِ
(Yasin, 36/1-2)

«Ya, Sin. Hikmətli Qurana and olsun…»

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ الَر كِتَابٌ أَنزَلْنَاهُ إِلَيْكَ لِتُخْرِجَ النَّاسَ مِنَ الظُّلُمَاتِ إِلَى النُّورِ بِإِذْنِ رَبِّهِمْ إِلَى صِرَاطِ الْعَزِيزِ الْحَمِيدِ . اللّهِ الَّذِي لَهُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الأَرْضِ وَوَيْلٌ لِّلْكَافِرِينَ مِنْ عَذَابٍ شَدِيدٍ
(İbrahim, 14/1-2)

«Əlif, Lam, Ra! (Ey Rəsulum! Bu Quran) elə bir Kitabdır ki, onu sənə insanları onların öz Rəbbinin izni ilə zülmətlərdən nura (küfrdən imana) yenilməz qüvvət sahibi,

[96] Nizami Gəncəvi, Sirlər xəzinəsi, s. 25.

(hər cür) tərifə (şükrə) layiq olan Allahın yoluna (İslam dininə) çıxartmaq üçün nazil etmişik. Elə bir Allaha ki, göylərdə və yerdə nə varsa, hamısı Onundur. Düçar olacaqları şiddətli əzabdan ötrü vay kafirlərin halına!»

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ طه {1} مَا أَنزَلْنَا عَلَيْكَ الْقُرْآنَ لِتَشْقَى

(Taha, 20/1-2)

«Ta, Ha. Quranı sənə bədbəxt olasan deyə endirmədik.»

Alimlər bu hərflərlə işarələnmiş mənaları fərqli yöndən izah etmişlər. Məsələn, «Ta-ha» Quranın iyirminci surəsidir. Bu surənin birinci ayəsi «Ta-ha»dır. Bununla bağlı çoxsaylı təfsirlər var. Alimlərin fikrinə görə, «Ta-ha» Əsmai-Hüsnadan (gözəl adlar) biridir. «Ta-ha» Hz. Peyğəmbərin (s.a.s.) adlarından biridir. «Ya Rəsul», «ey adam» deməkdir, «and içmək», «ey insan» anlamındadır. Təfsirlərə görə «Ta-ha» sözünün birinci hərfi hz.Peyğəmbərin «Tahir» adına, «Ha» isə «Hadi» (doğru yol göstərən) adına işarədir. «Ta-ha» - Tahir və Hadi, yəni insanları küfr və şirkdən təmizləyən, onları doğru yola yönəldən deməkdir. Başqa bir şərhə görə «Ta-ha» hər iki ayağını yerə basmaq anlamındadır. Peyğəmbər (s.a.s.) gecə namazlarında bir sıra hallarda bir ayağı, bəzən də başqa ayağı üzərində dururdu. Ona görə də ayaqları şişirdi. Uca Allah (c.c.) ona hər iki ayağını yerə basmağı əmr etdi. Başqa bir yozuma görə «Ta-Ha» kəlməsinin ilk hərfi Tubaya, ikinci hərfi də Hüdaya işarə edir. Cənnətdə olan Tuba ağacına gedib çatmaq üçün Peyğəmbərin (s.a.s.) hidayətinə ehtiyac var. Ayrı bir şərhə görə «Ta-Ha» adındakı birinci hərf əbcəd hesabına görə doqquz, «ha» isə beş rəqəminə bərabərdir. İkisinin cəmi on dörddür. Hz.Məhəmməd (s.a.s.) qüsursuz olduğundan on dörd gecəlik

aya bənzəyir. Buna görə də, Peyğəmbərin (s.a.s.) adlarından biri də «Ta-Ha»dır.[97]

Türk divan ədəbiyyatında bu şərhlərdən doğan çoxsaylı beytlər var:

**Aşıq Paşa:**

«Ta-Ha» birle ogdi anun özini,
Yani ayun bedri diyüp yüzini.[98]

(Onu «Ta-Ha» ilə öydü. Yəni üzünə bədirlənmiş ay dedi)

**Karamanlı Nizami:**

Ey mahi-çar-deh-şebe diyü hitab ider,
Hak sana anda kim didi Kuranda «Ta-Ha».[99]

(Uca Allah Quranda «Ta-ha» deməklə sənə on dörd gecəlik ay deyə müraciət etdi)

**Yəhya bəy:**

Hitabi-izzeti-«Ta-Ha» vü «Ha-Mim»,
Zihi devlet zihi tazim ü tekrim.[100]

(«Ta-Ha», «Ha-Mim» xitabının izzəti, dövlət (nemət) və təzimdir)

**Füzuliyə** görə «Ya-Sin» Peyğəmbərin (s.a.s.) sifətlərini, «Ta-Ha» isə zatını göstərir:

«Ya-Sin» sədəfi-dürri-sifətin,
«Ta-Ha» güli-bustani-zatın.[101]

**Nəbi:**

---

[97] Şərhlər üçün bax: Kurani-Hakim, c. II, s. 564; Hak Dini, c. V, s. 3318; Delaili-Hayrat şerhi, İstanbul, 1975.
[98] Emine Yeniterzi, göstərilən qaynaq, s. 199.
[99] Emine Yeniterzi, göstərilən qaynaq, s. 199.
[100] Emine Yeniterzi, göstərilən qaynaq, s. 200.
[101] Emine Yeniterzi, göstərilən qaynaq, s. 200.

İsmi-pakünde olan mani-i «Ta-Ha» eyler,
Cümle-eşyada tulu ile hübuta imdad.[102]

(Pak adında olan «Ta-Ha» mənası dünyaya gələn və yaradıcısına dönən varlığın yol göstərəni Məhəmməddir)

Muhyi isə «ha» hərfinin yazılış şəklindən yararlanaraq «əlifin» ağırlığından «ha» - nın belinin büküldüyünü göstərir:

Elif çün oldı ol namun karını,
Nola can içre iderse yirini.

Riyazat ile kaddın bükdi tenha,
Karin olunca ta ol nam ile ha.[103]

Bir sıra təfsirlərdə «Ha»nın «hakimi-mütləqin zatını bildirdiyi», «Peyğəmbərin (s.a.s.) ilahi vəhyə yükləndiyi» anlamında olduğu, «Ha»nın «Əhməd» anlamına gəldiyi də açıqlanıb.[104]

Əhmədi «İsgəndərnamə»sində «Ha»nın səkkiz rəqəminə (əbcədə görə) uyğunluğuna əsaslanaraq bunun cənnət demək olduğunu bildirir:

Çil sabah u heşt huldi-bimisal,
Cümle anunçün söze Ha-Mim Dal.[105]

(Ha, Mim, Dal bənzərsiz səkkiz cənnəti bildirir)

Hz. Nizami Gəncəvi hərfləri bir-bir endirir, onları mənalandırır, hərflərin yazılış şəklindən yararlanaraq əsas mənanı çatdırır. Nətin birinci beytində hz. Nizami uca Allahın (c.c.) yaradılış buyruğunu obrazlı bir dillə açıqlayandan sonra, ikinci beytdə yaradılışın tamamlandığını bildirir. Beytdəki «bir iqlim bəxş etdi» fikri uca Allah

---

[102] Emine Yeniterzi, göstərilən qaynaq, s. 200.
[103] Emine Yeniterzi, göstərilən qaynaq, s. 170.
[104] Emine Yeniterzi, göstərilən qaynaq, s. 179.
[105] Emine Yeniterzi, göstərilən qaynaq, s. 179.

yaradılışa məna verdi, onun yaradılışını tamamladı anlamına gəlir. Bu düşüncəmizi əsaslandırmaq üçün «mim» və «dal» hərflərinin mənalarına baxaq.

Divan ədəbiyyatında «mim» hərfi maddi Aləm, ya da masiva (Allahdan başqa olanlar) olaraq izah edilir. Bununla birlikdə «mim»in hz. Məhəmmədin (s.a.s.) son Peyğəmbər olmasına işarə etməsi fikri də var. Eyni zamanda «mim»in Peyğəmbərin (s.a.s.) qəlbindən Allah sevgisindən başqa hər şeyi çıxarmasının da əlaməti olduğu bildirilir. Bir sıra divan şairləri Peyğəmbərin (s.a.s.) mübarək ağzını «mim»ə bənzətmişdir.[106]

Divan ədəbiyyatında «mim» məkan və mövcudiyyətin, Peyğəmbərin (s.a.s.) cismani varlığının da simvoluna çevrilmişdir:

**Kamal Edib Kürkçüoğlu:**

Ahmediyyetle giren çille-i mimi-mecde,
Ehediyyetle erer izzete pinhan olarak.[107]

(«Mim» hərfinin əbcəddəki qarşılığı qırxdır. Çillə də qırx gün olur. Bu ağırlığa dözən Allahın birliyi, düşüncəsi ilə şərəflənər)

Divan ədəbiyyatında Peyğəmbərin boyu «əlif», «lam» hərflərinə, saçı «lam», «cim», «dal» hərflərinə, ağzı «mim»ə, qaşı «nun»a, «məddə», gözü «nun», «ayn», «sad» hərflərinə, barmağı «əlif»ə bənzədilmişdir. Bir çox şeirlərdə «əlif» Allaha (c.c.), «mim» Peyğəmbərə (c.c.) işarə etmişdir. Divan ədəbiyyatında «mim» daha çox hz.Məhəmmədin (s.a.s.) son elçi olduğunu bildirmişdir. Bir sıra şairlər isə «əlif»i Allahın (c.c.), «cim»i Cebrailin, «mim»i Məhəmmədin (s.a.s.), «ayn»ı hz. Əlinin (r.a.) rəmzi kimi vermişdir:

---

[106] Emine Yeniterzi, göstərilən qaynaq, s. 243.
[107] Emine Yeniterzi, göstərilən qaynaq, s. 169.

**Aşıq Deryami:**

Yaradanım «kün» emrini vermezdi,
İndinde sevgili «Mim» olmasaydı.[108]

(Allah (c.c.) yanında hz. Məhəmməd (s.a.s.) olmasa idi, «ol» əmrini verməzdi)

**Nəbi:**

Ehli-dünyadan sorarsan male düşdü gönlümüz,
İki mim bir ha ile yek dale düşdü gönlümüz.[109]

(İki «mim», bir «ha», bir «dal» hz. Məhəmmədə (s.a.s.) işarədir)

Peyğəmbərin (s.a.s.) «Əhməd» adındakı bir hikmət də belə açıqlanmışdır: «Ahmed adındakı harflerle ilgili bir inanış da Cenabi-hakkın ruhları yarattığı zaman onları Ahmeddeki harflere görə namaza çağırmasıyla ilgilidir. Buna göre namazdakı kiyam, yani ayakta durmak elif, ruku ha, secde mim, tahiyyat oturması da dala benzer»[110]

Divan ədəbiyyatında «dal» hərfindən daha çox Peyğəmbərin (s.a.s.) saçı təsvir edilərkən, bir də bu hərflərlə bağlı bir sıra mənalar izah olunarkən istifadə olunmuşdur. Şairlər saçın təsviri üçün «cim», «lam» hərflərindən də yararlanmışlar.

Bir sıra şairlər Peyğəmbərin (s.a.s.) gözünü «sad»a, ağzını «mim»ə, saçını «dal» hərfinə bənzətmiş, sonra bu hərfləri yanaşı işlədərək «Səməd» (hər varlığın arzu və ehtiyaclarına görə yönəldiyi, ulu, heç bir şeyə ehtiyac olma-

---

[108] Emine Yeniterzi, göstərilən qaynaq, s. 325.
[109] Emine Yeniterzi, göstərilən qaynaq, s. 326.
[110] Ahmed Bican, Aşıkların nurları, c. II, s. 404-405.

yan, ehtiyacsız) sözünü yaratmışlar. Bilindiyi kimi, «Səməd» adı Quranın «İxlas» surəsində də çəkilir:

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ قُلْ هُوَ اللَّهُ أَحَدٌ . اللَّهُ الصَّمَدُ . لَمْ يَلِدْ وَلَمْ يُولَدْ . وَلَمْ يَكُن لَّهُ كُفُواً أَحَدٌ .

(İxlas, 112\1-4)

«De ki, o Allah birdir, Allah səməddir. Doğmamışdır, doğulmamışdır. Heç bir şey onun şəriki deyil».

Divan şairi Rövşəni «Səməd» adı ilə Peyğəmbər (s.a.s.) arasında bu uyğunluğu yaradır:

…Sad aynun, mim ağzun, dal zülfün göreli,
Ya Nebi, gitmez dilümden bir nefes zikri- «Samed».[111]

(Ey Məhəmməd! «Sad» hərfinə bənzəyən gözünü, «mim»ə bənzəyən ağzını, «dal»a bənzəyən saçını görəndən «Səməd» zikri dilimdən düşmür. «Səməd» adı bu hərflərlə yazılır)

Belə hərflər vasitəsi ilə mənalar yaradan Karamanlı Nizami Peyğəmbərin (s.a.s.) boyunu «əlif»lə, saçını «lam»a, ağzını da «mim» hərfinə bənzətmiş, sonra bu hərfləri yanaşı qoyaraq «Əlif Lam Mim» ayəsinə işarə etmişdir:

الم . أَحَسِبَ النَّاسُ أَن يُتْرَكُوا أَن يَقُولُوا آمَنَّا وَهُمْ لَا يُفْتَنُونَ

(Ənqəbut, 29/1-2)

«Əlif Lam Mim. İnsanlar (sadəcə) «inandıq» demələriylə canlarını qurtaracaqlarını və imtahana çəkilməyəcəklərini düşünürlər?»

**Rövşəni** buna işarə edərək yazır:

…Kaddünle zülfü ağzuna eyler işareti,
Kuranda her ne yirde «elif lam i mim» ola.[112]

[111] Emine Yeniterzi, göstərilən qaynaq, s. 212.

(Quranda harada «əlif», «lam», «mim» var, orada boyuna, saçına, ağzına işarə edilir).

## HƏZRƏT NİZAMİ HƏRFLƏRLƏ YARADILIŞ KARVANINI ANLADIR

Hərfləri bir-bir «endirərək» varlığın yaradılış ardıcıllığını anladan hz. Nizami «əlif»in «ha»nın halqasına (burada hz. Nizami «ha»nın halqasını məkan, yer, yaradılanlar kimi dəyərləndirir. O, bu varlığı sonlu olduğu üçün «ha»nın halqasına yerləşdirir, bir qapalı, əvvəli və sonu olan, məkan cızır. Şair bu düşüncəni ifadə edir: yaradılan hər şey ölümə, yoxluğa məhkumdur. Sonsuz, əbədi olan ancaq uca Allahdır) bir «iqlim bəxş etdiyini» bildirir. Burada bir yandan «ha» həm başqa hərflərlə yanaşı yazılaraq, təklikdən qurtularaq yeni məna qazanır, həm Peyğəmbərin (s.a.s.) yaradılışı ilə bağlı ilahi hökmə işarə edilir («bəxş etmək»), həm də «iqlim» sözü ilə məna, keyfiyyət, şəkilləndirmək anlamlarına işarə edilir.

Hz. Nizami bu ikinci beytdə yaradılışın tamamlandığını da gözəl ifadə edib. Bu beytdə gözümüz qarşısında sanki geyinmiş, boyunbağı taxmış, kəmər bağlamış, missiyasını yerinə yetirməyə hazır bir insan canlanır. İndi bu mənanı əyaniləşdirmək üçün birinci və ikinci beyti bir yerdə oxuyaq: İlahi əmr verildi, lövhədən «əlif» havalandı, «Əhməd»in örtülü qapısına qondu, «ha»nın halqasına bir iqlim bəxş etdi, «dal» hərfindən boyunbağı, «mim»dən kəmər bağışladı.

Hz.Nizami yaradılış karvanının gedişini, düzümünü, bu mübarək karvanın yükünü, getdiyi yeri, hədəflərini (III misra hədəfləri açıqlayır) çox dəqiq düşünüb.

---

[112] Emine Yeniterzi, göstərilən qaynaq, s. 212.

Hz.Nizami ikinci beytdə «dal» və «mim» hərflərinin yazılış şəklindən yararlanaraq obrazlılıq yaratmışdır. Burada diqqəti çəkən odur ki, hz. Nizami «dal»ın boyunbağıya oxşamaq, «mim»in kəməri andırmaq imkanından istifadə etmişdir. Biz yuxarıda divan şairlərinin bu hərfləri fərqli bədii məqamlarda təqdim etdiklərini gördük.

**Ancaq hz.Nizaminin bu hərflərin «boyunbağı», «kəmər» obrazını yaratmaq imkanlarını önə çəkməsinin səbəbi mətndə anlaşılır. Beytdə boyunbağı taxmaq, kəmər bağlamaq hazırlıq mərhələsini bitirib, bütün zəruri tədbirlərini görüb yola çıxmağa hazırlaşan adamı, karvanı xatırladır. Hz. Nizami sözün, hərflərin dini, qrafik, leksik, bədii imkanlarından ustalıqla yararlanaraq həm gözəl bir tablo yaratmış, həm də bu tablonun kölgəsində dərin bir məna vermişdir. Sevən, yaradan uca Allah «həbibim» dediyi sevgili Peyğəmbərini (s.a.s.) mübarək bir səfərə hazırladı, ona ağıl, iradə, iman, Quran neməti verdi. Onu cahil toplumun içinə əliyalın buraxmadı, öncədən bütün təhlükələri gördü və «Həbibi»ni zəruri imkanlarla təmin etdi. Hz. Nizaminin təqdimatında «boyunbağı», «kəmər» hazırlığın tamamlanması kimi mənalanır, həm də sevən sevdiyinə qiymətli əşyalarını verir. Şair psixoloji planda oxucunu yola hazırlayır, diqqəti sırada olan beytə yönəldir. Görəsən, bu karvan hara gedəcək?**

Hz.Nizami sonrakı beytdə «səadət məmləkəti» və «kamal fərmanı»ndan danışır.

## ÜÇÜNCÜ BEYTİN ŞƏRHİ: «ƏLİF» SƏADƏT MƏMLƏKƏTİ VƏ KAMAL FƏRMANI ALDI

لاجرم او یافت از آن میـم ودال
دایــره دولت و خط کمال

***İstər-istəməz o («əlif») həmin «mim» və «dal»dan,***
***Səadət məmləkəti və kamal fərmanını aldı.***[113]

Buradan anlaşılan bir neçə məna var. İlk sırada onu deməliyik ki, artıq hərflər hamısı «endirilmiş», «Əhməd» sözü tam yazılmışdır. İnsanlara azadlıq yolunu göstərən, Allahın (c.c.) yerdəki təmsilçisi olan Peyğəmbərlər və hz.Məhəmməd (s.a.s.) «kamal fərmanını» alaraq bütün zəruri imkanlarla təmin edilmişdir.

Təsəvvüf düşüncəsinə görə də həqiqəti-Məhəmmədiyə elə kamil insandır. Kamil insan könlünü arındırmış, Allah (c.c.) sevgisi ilə dolmuş insandır. «Hakikati-Muhammediye zaman ve mekan sınırlarının dışında saf metafizik bir ilkedir»[114]

Kamil insanın vəzifəsi ancaq Allaha (c.c.) qulluq etməkdir. Allaha qul olmaqdan imtina insanın yaradılış fitrətinin pozulmasına, azadlığın itirilməsinə, köləliyin, bütpərəstliyin qapısının açılmasına gətirib çıxarır. Təsəvvüfü kamil insan ölçülərinə görə, insan Allah mərtəbəsinə çıxa bilməz, onun keyfiyyətlərini götürə bilməz, bütün varlıq, o sıradan həqiqəti-Məhəmmədiyə yaradılıb (Nizami «Əhməd»in yaradılışını gözəl izah edib). Yaradılmayan ancaq Allahdır (c.c.), insan ilahlaşmaq iddiasından əl çəkməlidir.

---

113 Nizami Gəncəvi, Sirlər xəzinəsi, s. 25.
114 Tasavvuf, ilmi ve akademik araşdırma dergisi, yıl 6, sayı 14, Ankara, 2005, s. 64.

«Kamal fərmanı» almış «Əhməd»in vəzifəsi «səadət məmləkəti» qurmaqdır. Burada hz. Nizami peyğəmbərlik anlayışının mənasına açıqlıq gətirir (Ona görə, Peyğəmbərin (s.a.s.) vəzifəsi «səadət məmləkəti» qurmaqdır), Peyğəmbərin (s.a.s.) işini, ilahi təyinat və vəzifəsini göstərir.

Hz.Məhəmməd (s.a.s.) kamildir, o, elçidir. Onun vəzifəsini hz. Mövlana belə açıqlayır: «Peyğəmbərlər qulları Allaha çatdırmaq üçün gəlmişlər».[115]

İnsanın təkbaşına Allahı (c.c.) tanımaq imkanı yoxdur. Peyğəmbərlərin işi Allahı (c.c.) insana tanıtmaqdır, Allaha (c.c.) iman gətirməyin zəruriliyini bildirməkdir, onun sifətlərini şərh etməkdir, ona qulluğun yollarını göstərməkdir. Peyğəmbərlər haqq aşiqləridir. Onlar ilahi təlimatla hərəkət edər, Allah üçün sevər, Allah üçün nifrət edərlər. Nizaminin ifadəsiylə Peyğəmbərin (c.c.) vəzifəsi yerdə «səadət məmləkəti» qurmaqdır. Əslində, Peyğəmbərə tabe olmağın anlamı da budur.

## KAMİL İNSANIN ÖLÇÜLƏRİ

Uca Allah Peyğəmbərləri vasitəsi ilə «səadət məmləkəti» qurmağın yolunu və bu ölkənin vətəndaşlarının əxlaqi ölçülərini necə müəyyənləşdirib? Dinə görə bunun yolu Allaha, onun kitabına, onun göndərdiyi müəllimə- Hz. Məhəmmədə (s.a.s.) tabe olmaqdır. Bu şərt daxilində «səadət məmləkəti»nin vətəndaşları bu prinsiplərin daşıyıcıları olan insanlardır: Böyük islam alimi İmam Buxari, hz. Nizaminin işarə etdiyi bu «səadət məmləkəti»nin insanlarının əxlaqi ölçülərini belə sıralayır: onlar həya sahibidirlər, dili və əli ilə başqa müsəlmanlara zərər verməzlər, onlar Allahın qadağan etdiklərindən üz döndərərlər, onlar başqalarını doyurarlar, tanıdıqlarına və tanımadıqlarına salam verərlər, özü üçün

---

[115] Tasavvuf, göstərilən qaynaq, s. 104.

arzu etdiklərini başqaları üçün də istəyərlər, nəfsinə qarşı belə olsa, insafdan ayrılmazlar, yoxsullara yardım edərlər, Hz.Məhəmmədi (s.a.s.) öz nəfsindən, atasından, övladından, dünyadakı hər şeydən çox sevərlər, sevdiklərini Allah üçün sevərlər, küfrdən imana yönəldikdən sonra geriyə dönməkdən atəşə atılmaq qədər nifrət edərlər, ənsari, mühacirləri, Peyğəmbərin əshabını çox sevərlər, Allaha heç bir şeyi şərik qoşmazlar, oğurluq, zina etməzlər, övlad öldürməkdən, uydurmadan, böhtandan qaçarlar, bir xardal dənəsi qədər olsa belə, dünyadan imanla köçərlər, onlar Allahdan başqa ilah olmadığına, Məhəmmədin (s.a.s.) onun elçisi olduğuna inanırlar, ardıcıl namaz qılarlar, zəkat verərlər, Allah yolunda cihad edərlər, həccə gedərlər, edilən yaxşılığa təşəkkür edərlər, nemətə qarşı naşükürlük etməzlər, bir kimsəni atasına, anasına, qohumuna görə ittiham etməzlər, onların idarəçiliyində olanlara öz yediklərindən yedirərlər, öz geydiklərindən geyindirərlər, gücləri çatmayan işi onlara yükləməzlər, onlara ağır işlərdə yardım edərlər, möminlə savaşmazlar, möminlə savaşmaq istəyənə mane olarlar, imana şirk bulaşdırmazlar, yalan danışmazlar, onlar vədlərinə sadiq qalarlar, əmanətə xəyanət etməzlər, müzakirə və mübahisələrdə haqdan ayrılmazlar, onlar Allah (c.c.) yolunda şəhidlik duyğusunu eşq kimi yaşayarlar, dində orta yolu tutarlar, etdikləri ibadət az olsa da, bunu ona nəsib etdiyi üçün Allaha şükr edərlər, dində asan bir yol tutarlar, islamı bütün gözəlliyi ilə yaşayarlar, ona sıx, sağlam bağlanarlar, ibadəti az da olsa, ardıcıl edərlər, müsəlmanın cənazə namazını qılarlar, dəfnində iştirak edərlər, müsəlmana söyüş söyməzlər, halal və haram sərhədinə əməl edərlər, günah şübhəsi olan şeylərdən qaçarlar, onlar mülayimdirlər, ibadətlərində niyyətləri yalnız Allah üçündür, niyyətləri təmizdir, sədəqəni yalnız Allah (c.c.) rizasını qazanmaq üçün verərlər, savabını Allahdan umarlar, onlar müsəlmanlara qarşı xeyirxahdırlar, duyğularını kirlərdən təmizləyərlər,

işləri əhlinə verərlər, gözəl abdəst alarlar, müsəlmanın qanını tökməyi, malına, namusuna toxunmağı haram sayarlar, onları qoruyarlar, öyrəndiklərini bir başqasına öyrədərlər, bunu bir təbliğ vəzifəsi kimi qiymətləndirərlər, nəsihət etdikləri insanın durumunu nəzərə alarlar, insanlara ümid verərlər, bir ümmətin parçası olduqlarını unutmazlar, onlar iradəlidirlər, bilmədikləri şey haqqında hökm verməzlər, bir şey uydurmazlar, elm öyrənərlər, uşaqlarına gözəl ad qoyarlar, dava salmazlar, Məkkədə qan tökməzlər, onun ağacına, çiçəyinə, otuna toxunmazlar, geyimdə islam ölçülərinə uyarlar, ya xeyir danışarlar, ya susarlar, qonşusu ilə mehriban olarlar, pisliyə qarşı əli, dili, qəlbi ilə dirənərlər, bir kimsəyə zülm etməzlər, günah etsələr , tövbəyə yönələrlər, yaxşılıqla bu günahı yuyarlar, daim öz üzərlərində çalışarlar, sağlamlıqlarının, vaxtlarının qədrini bilərlər, gülərüzlü, gözəlsözlü olarlar, onlar əliaçıqdırlar, xəsisliyi ziyanlı sayarlar, israfçı da deyillər, qeybətdən uzaqdırlar, sevinci və kədəri paylaşarlar, mərhəmətlidirlər, heyvanlara belə əziyyət verməzlər, insanların qüsurlarını örtərlər, əl əməyini, alın tərini halal çörək qazanmağın şərti kimi qəbul edərlər, ailə üzvlərini çox sevərlər, uşaqlara Allahın (c.c.) əmanəti kimi baxarlar, alimə hörmət edərlər, acı da olsa, doğru danışarlar.[116]

## HƏZRƏT NİZAMİNİN «İSLAM İQLİMİ» ANLAYIŞI

Hz.Nizami Gəncəvinin üçüncü beytdə göstərdiyi «səadət məmləkəti»nin qanunları, ölçüləri yuxarıda sadalananlardır. Əslində, hz. Nizaminin «səadət məmləkəti»nin qaynağı, qarşılığı Quranda olan «islam iqlimi» anlayışıdır. Biz ikinci beytin şərhində bu beytdə olan «iqlim bəxş etmə»yi, «məna vermək», bir həyatın ölçülərini müəyyən etmək kimi dəyərləndirmişdik. Hz.Nizami də bu

[116] Altınoluk dergisi, sayı, 181, Haziran, 2001, s. 3-5.

ilahi vəzifəni icra edəcək, insanları Allahın nuruna boyayacaq «Əhməd»in yaradılışının tamamlandığını poetik biçimdə təsvir etdikdən sonra onun vəzifəsini «səadət məmləkəti» qurmaq kimi açıqlayıb.

O da diqqəti çəkir ki, hz. Nizami üçüncü beytdə Peyğəmbərin (s.a.s.) seçilməsinin, vəzifə və hədəfinin ilahi qaynaqlı olduğunu bu anlayışları bütün gücü, anlamı ilə göstərən «kamal fərmanı» ifadəsini işlətmişdir. Bu ifadə ilə hz.Nizami diqqəti bir neçə məsələyə yönəldir. **«Kamal fərmanı» ifadəsinin mesajına görə Peyğəmbəri (s.a.s.) Allah (c.c.) seçir, onu Allah (c.c.) tərbiyə edir, onu Allah (c.c.) kamala çatdırır, ona ilahi vəzifəni icra etmək gücü və yetkisi verir, Peyğəmbər (s.a.s.) Allahın (c.c.) kamil insan ölçüsünə tam uyğundur və Allahın (c.c.) müəyyən etdiyi vəzifəni icra edərək «səadət məmləkəti» yaratmaq bir əmrdir, fərmandır, Peyğəmbərin (s.a.s.) bu fərmandan boyun qaçırmaq imkanı, haqqı yoxdur.** Başqa yöndən «kamal fərmanı» anlayışında Peyğəmbərə (s.a.s.), onun kamalına, əxlaqına etimad, qarantiya da var. Allah (c.c.) fərman verir ki, Peyğəmbər (s.a.s.) «səadət məmləkəti»ni qurmağa hazırdır və layiqdir. Ədalətli padşah tanıdığı, inandığı, işin əhli olan şəxsi iş başına qoyar. Sultan olan Allah (c.c.) da bu işi sevgili Peyğəmbərinə (s.a.s.) verir, ona inanır və uğur qazanacağına əmindir.

**Hz.Nizaminin sultan Allah (c.c.) ilə qul Məhəmməd (s.a.s.) münasibətini «fərman» qavramı ilə verməsi çox uğurlu bir tapıntı və seçimdir, hz.Nizaminin məsələni dəqiq, doğru öyrəndiyinin göstəricisidir. Ona görə ki, «fərman» sözü idarəçi ilə icraçı münasibətlərinə bağlı bir anlayışdır, «fərman» sözü sultanın bir şəxsə inamının, etibar etdiyinin, onu təyin etdiyi işin əhli saydığının göstəricisidir. «Fərman» sözündə məcburilik və səlahiyyət mənaları da var. Burada icraçı səlahiyyəti ölçüsündə məsuliyyət daşıyır. Deməli, uca Allah (c.c.) Peyğəmbərini (s.a.s.) seçdi, onu ehtiyaca uyğun yetişdirdi, hədəfini göstərdi («səadət məmləkəti qurmaq»), bu hədəfə gedəcək yolları göstərdi (Quran), ona inandı, ona səlahiyyət verdi**

**və bu işi onun üçün yerinə yetirilməsi zəruri olan bir vəzifəyə çevirdi.**

Bu deyilənləri Hz.Nizami «Səadət məmləkəti və kamal fərmanı adlı» misrasında məzmun və biçim dəqiqliyi ilə, hər sözün leksik, dini, poetik anlamını ölçüb biçərək gözəl ifadə edib.

Burada bir neçə məsələyə də açıqlıq gətirmək istəyirik. Yuxarıda bildirildiyi kimi, hz. Nizaminin ifadə etdiyi «səadət məmləkəti» anlayışının Qurandakı qarşılığı «Bütün olaraq islam iqliminə girin», mübarək ayəsidir. Uca Allah bu ayədə «islam iqlimi» anlayışını bir coğrafi sərhəddən daha çox mənəvi sınır kimi təqdim edir. Burada «islam iqlimi» Allahın ölçülərinə uyğun yaşamaqdır, bir düşüncə, əxlaq sistemidir. Bu islami iqlimdə yaşamağın şərti də Allahın (c.c.) buyruqlarına təslimiyyətdir. «İslami iqlim»dən və bu iqlimdə yaşamaqdan imtina isə fəlakətdir. Uca Allah (c.c.) bu iqlimi qəbul edənlərə bu dünyada və axirətdə gözəlliklər vəd edir. **Buradan ortaya çıxan bir məna da odur ki, «iqlim» orada yaşayanların bir düşüncəni, bir havanı, suyu, ortaq taleyi paylaşdıqlarını göstərir. Bu isə bir «ümmət» deməkdir.** «Ümmət» sadəcə insan yığını deyil, uluhiyyət (Allahın varlığı və birliyi), nübüvvət (Peyğəmbərlik anlayışı və Peyğəmbər), Axirət (o biri dünyanın varlığına inanmaq) kimi qırılmaz bağlarla bir-birinə bağlanan diri, imanlı, iradəli, güclü bir toplumdur. Uca Allah (c.c.) Qurani-Kərimdə bu «iqlim»in (hz. Nizaminin deyim ilə «səadət məmləkəti»nin ümmətinə duyurur:

إِنَّ هَذِهِ أُمَّتُكُمْ أُمَّةً وَاحِدَةً وَأَنَا رَبُّكُمْ فَاعْبُدُونِ . وَتَقَطَّعُوا أَمْرَهُم بَيْنَهُمْ
كُلٌّ إِلَيْنَا رَاجِعُونَ . فَمَن يَعْمَلْ مِنَ الصَّالِحَاتِ وَهُوَ مُؤْمِنٌ فَلَا كُفْرَانَ
لِسَعْيِهِ وَإِنَّا لَهُ كَاتِبُونَ . وَحَرَامٌ عَلَى قَرْيَةٍ أَهْلَكْنَاهَا أَنَّهُمْ لَا يَرْجِعُونَ

(Ənbiya, 21/92-94)

«(Ey insanlar!) Həqiqətən, bu (tövhid dini olan İslam) tək bir din olaraq sizin dininizdir. Mən də sizin Rəbbinizəm. Buna görə də, yalnız mənə ibadət edin! Amma (insanlar din barəsində) öz aralarında firqələrə bölünüb parçalandılar. Onların hamısı Bizim hüzurumuza qayıdacaqlar. Hər kim mömin ikən yaxşı işlər görsə, onun zəhməti danılmayacaqdır. Şübhəsiz, Biz onun üçün (gördüyü işləri mələklər vasitəsi ilə əməl dəftərinə) yazırıq».

## HƏZRƏT MÖVLANAYA GÖRƏ «ALLAHIN FƏRMANI» ANLAYIŞI

Hz.Nizaminin üçüncü beytdə ifadə etdiyi «fərman» anlayışının dəyişməzliyini, adi fərmanlardan fərqini hz. Mövlana belə dəyərləndirir: «Padşahların xütbələri, mesajları dəyişər, ucalıqları, adları, sonları unudulub gedər. Ancaq Peyğəmbərlərin ucalıqları əbədidir. Onların xütbələri də, insanlıq üçün gətirmiş olduqları mesajlar və ilahi qanunlar da əsla dəyişməz, bunlar sonadək insan oğluna işıqdır. Çünki, padşahların ucalığı havadandır (öz istək və çıxarları ilə bağlıdır). Peyğəmbərlərə verilən dövlət buyruğu isə ucalıq sahibinin birbaşa özündəndir. Dünyəvi paralarda padşahların adlarını nəqş edirlər. Ancaq axirət axçasında Əhmədin adı bütün Peyğəmbərlərin adıdır. Çünki, yüz gəlincə doxsan da o yüzün içindədir».[117]

Deməli, insan oğlu bu dünyada və axirətdə hz. Nizaminin dediyi «səadət məmləkəti»ndə yaşamaq istəyirsə, (hz. Nizaminin «səadət məmləkəti»nin bir şərhi də axirətdəki cənətlə-«xoşbəxtlik məmləkəti» ilə bağlıdır. Yəni, ey insanlar, siz Allahın fərmanı ilə «səadət məmləkəti» qurmaqla

[117] Tasavvuf, göstərilən qaynaq, s. 109.

vəzifələndirilmiş Peyğəmbərin (s.a.s.) dediklərinə uyğun, bu dünyada «səadət məmləkəti»ndə yaşayın, nəticədə axirətdəki «səadət məmləkəti»ndə yaşamağa da viza alın-haqq qazanın) «kamal fərmanı» almış Peyğəmbərə (s.a.s.) uymalıdır.

Burada «fərman» sözü təkcə Peyğəmbərlə (s.a.s.) bağlı deyil (biz «fərman» sözünü Peyğəmbərlə (s.a.s.) bağlı yönlərini yuxarıda açıqladıq). Hz. Nizaminin «fərman» anlayışı ilə ifadə etdiyi məna həm də eyni məsuliyyətlə insanlara da aiddir. Yəni, hz.Nizami «fərman» sözü ilə uca Allahın (c.c.) insanların Peyğəmbərə (s.a.s.) uymasını da buyurduğunu (əmr etdiyini) vurğulayıb. Allahın (c.c.) «fərmanla» təyin etdiyi Peyğəmbərə (s.a.s.) uymaq da əmrdir, bunun mükafatı isə bu dünyada və axirətdə «səadət məmləkəti»dir, «fərman»dan imtina isə bu dünyada və axirətdə «əbədi, sönməyən odda» əbədi yanmaqdır. Deməli, hz. Nizamiyə görə, xoşbəxtliyin yolu Allaha, onun sevimli, ilahi «fərman»la təyin olunmuş Peyğəmbərinə (s.a.s.) uymaqdır. Qurani-şərifin buyruğu ilə «evlərə («səadət məmləkətinə») qapılarından (Peyğəmbərə uymaq) girməkdir»:

يَسْأَلُونَكَ عَنِ الأهِلَّةِ قُلْ هِيَ مَوَاقِيتُ لِلنَّاسِ وَالْحَجِّ وَلَيْسَ الْبِرُّ بِأَنْ تَأْتُوْاْ
الْبُيُوتَ مِن ظُهُورِهَا وَلَـكِنَّ الْبِرَّ مَنِ اتَّقَى وَأْتُواْ الْبُيُوتَ مِنْ أَبْوَابِهَا
وَاتَّقُواْ اللّهَ لَعَلَّكُمْ تُفْلِحُونَ

(Bəqərə, 2/189)

«(Ey Rəsulum!) Yeni doğan aylar (hilal) barəsində səndən sual edildikdə söylə ki, bunlar insanların istifadəsi və həcc üçün vaxt ölçüləridir. Evlərinizə (cahiliyə dövründə olduğu kimi) arxa tərəfdən girməniz yaxşı iş deyildir. Yaxşı iş (pis əməllərdən) çəkinən kimsənin əməlidir. Evlərə qapılarından daxil olun və Allahdan qorxun ki, nicat tapasınız!».

İslam alimi Məhəmməd Əsəd bu ayədəki «evlərə qapısından girin» anlayışını belə şərh edir: «… gerçək ərdəmlilik imani məsələlərə «arxa qapıdan» yaxınlaşmaq, yəni yalnız çeşidli dini vəzifələrin ifası üçün qoyulmuş şəkil və vaxtlara uymaqdan ibarət deyil. Bu şəkil və vaxt sınırları, öz-özlüyündə nə qədər önəmli olsalar da, hər işə onun ruhi «giriş qapısı»ndan, yəni Allaha qarşı sorumluluq bilinci duyaraq yaxınlaşmadıqca gerçək hədəflərinə çatmış olmazlar. Bab («qapı») kəlməsi məcazi olaraq «bir şeyə təsir etməyin yolları»nı göstərdiyindən…» «bir evə (ön) qapısından girmə» məcazi klassik ərəbcədə daha çox bir problemə doğru yanaşmağı anlatmaq üçün işlədilir»[118]

## PEYĞƏMBƏRLİYƏ GEDƏN YOL

Hz.Nizaminin üçüncü beytdə işlətdiyi «kamal fərmanı» anlayışının doğru, dərindən anlaşılması üçün bu ifadənin qaynaqlarını, onun içində gizlədilmiş mənaları da şərh edək. Hz.Nizami ilk üç beytdə varlığın yaradılışının mərhələli olduğunu açıqladığı kimi, hz.Məhəmmədin (s.a.s.) də Peyğəmbərliyə hazırlanmasının ardıcıl, mərhələli bir iş olduğunu göstərmişdir. Hz. Nizami bu iki xətti bir arada birləşdirmişdir. Bir uşaq çeşidli dönəmlərdən keçərək «kamal attestatı» aldığı kimi, uca Allah (c.c.) da hz.Məhəmmədi (s.a.s.) bu ilahi Peyğəmbərlik vəzifəsinə hazırlamışdır. Ona gözəl bir nəsil vermişdir. Atası Abdullahın təmiz bir insan olduğu bəllidir. Abdullah gəncliyində bir gözəl qızın istəyini rədd edərək: «…Haram elə bir acıdır ki, ölüm acısı ondan çox daha yüngüldür. Get sən halalından ara, şərəf və iffət sahibi olanlar dinlərini qoruyarlar», demişdir.[119]

---

[118] Kuran mesajı, meal-tefsir, İstanbul, 2002, s. 54.
[119] Ali Ünal, Mekke Rasullerin yolu, Ankara, 1994, s. 104.

Məhəmməd bin Kəlbi yazır: «Onun (hz.Peyğəmbərin) beş yüz böyük anasını təsbit etdim. Heç birində …zinaya, başqa bir pisliyə rast gəlmədim».[120] Hz.Məhəmmədin (s.a.s.) atası və anası eyni nəsildəndir. O, hansı nəsildən gəldiyini bildirmək üçün «mən iki qurbanın uşağıyam» deyərək İsmayıl Peyğəmbərə və atası Abdullaha işarə etmişdir. Allahın elçisi öz soyu ilə bağlı bu hədisi də söyləmişdir: «Şübhəsiz ki, uca Allah İsmayılın övladı içindən Kinanə qəbiləsini, Kinanə içindən Qureyş qəbiləsini, Qureyş içindən Haşim oğullarını, Haşim oğulları içindən də məni süzüb çıxardı».[121]

Hz.Məhəmmədin (s.a.s.) doğumu, uşaqlığı, gəncliyi hikmətlərlə doludur. Bu illər onun Peyğəmbərliyə hazırlığının mərhələləridir. Böyük islam alimi, professor Məhəmməd Həmidullah Peyğəmbərin (s.a.s.) doğuluş anını belə anladır: «…Doğum sancıları başladığında Amine yalnızdı. Aniden bir takım uzun boylu hanımların etrafını çevirdiyini gördü. Sorması üzerine, bunlardan biri şöyle dedi: «Men Firavunun zövcesi Asiyeyem» (Nil nehrine bir sandık içinde salındıktan sonra hz.Musanın hayatını kurtaran hanım). Digeri hz.İsanın annesi Meryemdi. Ötekiler ise Cennet hurilerindendi (Yeni bir peyğamberlik, yeni bir risalet başlarken evvelce aynı vazifeyi görmüş olanların yeni seçileni istikbal etmesi, karşılaması gerekirdi. Muhakkak ki, Musa ve İsa, cocuk dünyaya getirmekte iken bir hanımın yanına varamayacaqlarından onları temsil etmek üzere Asiye ve Meryem gelmişlerdi). Nihayet, melekler Aminenin vücudunu, onu sayğısız bakışlardan mühafiza etmek üzere kanatlarıyla örtmüşler ve az sonra da cocuk dünyaya gelmişti.

[120] Ali Ünal, Mekke Rasullerin yolu, Ankara, 1994, s. 104.
[121] Ali Ünal, Mekke Rasullerin yolu, Ankara, 1994, s. 104.

Sünnetli idi ve secde vaziyetinde yerde duruyordu. İşaret parmağını Allahın birliyi inancına şehadet üzere kalkık tutuyordu. Ak bir bulut kendisini sardı ve bir müddet onu içinde gizledi. Tam bu sırada bir ses: «Onu Doğuda ve Batıda dolaştır ve okyanuslara daldır. Ta ki bütün yaratıklar, melek, hayvan, kuş, balık ve bütün diger mahlukat onun Resüllügünü tanımış, bilmiş olsun», diye nida etti. Bulut dağılıp kaybolunca cocuk yeniden gözükmüş ve bu defa diger bir bulut tarafından çevrilmişti. Tekrar hafiften bir ses şöyle dedi: «Evvelki peyğamberlerin sifatlarını ona ver:

Ademin (Halk)ını,
Şitin (Marifet)ini,
Nuhun (Şecaat)ini,
İbrahimin (Hullet)ini,
İsmayilin (Lisan)ını,
İshakın (Rıza)sını,
Salihin (Fesahat)ını,
Lutun (Hikmet)ini,
Yakubun (Beşaret)ini,
Yusufun (Cemal)ini,
Musanın (Şiddet)ini,
Eyyubun (Sabır)ını,
Yunusun (İtaat)ını,
Davudun (Ses güzelligi)ini,
Danyalın (Hubb, muhabbet)ini,
İlyasın (Vakar)ını,
Yahyanın (İsmet)ini,
İsanın (Zühd)ünü

Onu peyğamberlerin hususiyet ve sifatlarına daldır». Sonra bu bulut da dağıldı ve cocuk yeniden gözüktü. Nihayet, üç melek zuhur edip gümüş bir tekne içinde onu üç defa yıkadılar ve beyaz ipekten bir beze sardılar, ısınması için bir

müddet kanatları altında tuttular. Müteakiben onu anasına teslim edir çekildiler…» [122]

Hz.Məhəmmədlə (s.a.s.) bağlı peyğəmbərliyədək olan hadisələrdən biri də belədir: «O süd anası Həlimənin yanında olarkən Həlimənin oğlu anasının yanına gəldi, tanınmayan adamların Məhəmmədin sinəsini yardığını söylədi. Həlimə təşvişə düşdü, hz.Məhəmmədin yanına qaçdı. Hz. Məhəmməd bir qayanın üstündə oturub göyə baxırdı. Həlimənin həyəcanlı sorğusuna belə cavab verdi: «Bu yabançı kimsələr onun köksünü yardılar, qəlbini çıxardılar, qəlbinin şeytani bir hissə dedikləri hissəsini – qara bir ləkəni buradan ayırdılar. Qəlbini yuyaraq köksünə yerləşdirdilər və uçub getdilər».[123]

Hz.Məhəmməd (s.a.s.) peyğəmbərliyədək olan dönəmdə təmiz bir həyat yaşadı,hamının etibarını qazandı. Mələklər ona «əl-əmin», «Məhəmməd-ül-Əmin» deyirdilər.[124]

Biz belə misalların sayını artıra bilərik. **Əslində, hz.Məhəmmədin (s.a.s.) peyğəmbərliyədək olan hər günü, işi, qazancı, ailəsi hikmətlə doludur. Günlər və hadisələr onun müqəddəs bir işə hazırlığının pillələridir.**

Hz.Nizami bu məsələləri dərindən bilirdi, bu duyğularla yaşayırdı. Ona görə də onun bu bilgisi və inancı misrada «kamal fərmanı» kimi kodlaşdı. Bu ifadə Peyğəmbərlə (s.a.s.) bağlı zəngin qaynaqlardan və ona sevgidən süzülərək gəldi, Nizaminin düşüncəsinə yerləşdi, yığcam, dəqiq biçimdə misraya töküldü.

---

[122] Prof. Dr. Muhammed Hamidullah, Rasulullah Muhammed, İstanbul, 1992, s. 23.
[123] Prof. Dr. Muhammed Hamidullah, Rasulullah Muhammed, İstanbul, 1992, s. 23.
[124] İslam tarihi, göstərilən qaynaq, s. 179.

## DÖRDÜNCÜ BEYTİN ŞƏRHİ:
## O, SARAY BEHİŞTİNDƏ YETİŞMİŞ TƏR-TƏZƏ TURUNC İDİ

Hz.Nizami nətin dördüncü beytində hz.Məhəmmədi (s.a.s.) və onun peyğəmbərlik missiyasını gözəl bənzətmələrlə təqdim edir:

بود درین گنبد فیروزه خشت
تازه ترنجی ز سرای بهشت

*«Bu firuzə rəngli kərpicdən (tikilmiş) günbəzin altında o,*
*Saray behişitində yetişmiş təp-təzə turunc idi»*[125]

Bu beytdə hz.Nizami ideyanı anlatmaq üçün bir-birindən gözəl bədii təsvir və ifadə vasitələrindən istifadə etmişdir. Bu beyt də məzmunca öncəki beytə bağlıdır və onunla birgə anlaşılır.

Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) «səadət məmləkəti» qurmaq üçün «kamal fərmanı» aldıqdan sonrakı yerini, dəyərini anladır. Bizcə, bu beytdə hz. Nizami Peyğəmbərin dəyərini önə çəkir. Düşüncəmizi əsaslandırmağa çalışaq.

## ALLAH SEVGİSİNİN RƏNGİ

Hz.Nizami öncə uca Allahdan (c.c.) səlahiyyət, hakimiyyət almış Peyğəmbərin (s.a.s.) məkanını göstərir, onun üçün ayrıca bir yer seçir. Bu yer firuzə rəngli kərpicdən tikilmiş günbəzin altıdır. **Hz.Nizami fərmanla təyin olunmuş Peyğəmbərin (s.a.s.) məkanının rəngini firuzəyi olaraq seçir. Yaşıla, maviyə çalan bu boya islamın rəngidir. Yenini, cavanlığı, təzəliyi andırır, göz oxşayır, insan ruhuna rahatlıq verir.**

---

[125] Nizami Gəncəvi, Sirlər xəzinəsi, s. 25.

Qaynaqlardan hz.Məhəmmədin (s.a.s.) də yaşıl və ağ rəngi sevdiyi bəllidir. Burada adı çəkilən rəngi bir düşüncənin simvolu kimi də dəyərləndirə bilərik. Uca Allah Quranda belə buyurur:

صِبْغَةَ اللّهِ وَمَنْ أَحْسَنُ مِنَ اللّهِ صِبْغَةً وَنَحْنُ لَهُ عَابِدونَ

(Bəqərə, 2/138)

«(De ki, həyatımız) Allahın rəngi (ilə rənglənir)! Kim (həyatda) Allahdan daha gözəl rəng verə bilər, əgər gerçəkdən Ona qulluq etsək».

Alimlərin şərhinə görə, bu ayədəki rəng anlayışı insan fitrətini, bu fitrətin dinə uyğunluğunu, insan ruhunun gözəl şeylərə rəğbətini nəzərdə tutur.

Hz.Nizami də Peyğəmbərin (s.a.s.) məkanını öz rəngi ilə, öz fitrəti, düşüncəsi ilə təqdim edir. Burada ilahi bir düzüm var. Allahın (c.c.) son və yeni fərmanı, fərmanla təyin olunmuş Peyğəmbərin (s.a.s.) yeni məkanı, yeni düşüncə sistemi. Başqa yöndən bu firuzəyi rəng maviliyi, səmanın rəngini, sonsuzluğu, genişliyi təmsil edir. Burada da Peyğəmbərin (s.a.s.) hakimiyyətinin ilahi qaynağına, hamıya aid olmasına, genişliyinə və əbədiliyinə işarə var. Burada ilkliklə yaşıllıq arasında bir bağlılıq da tapa bilərik.

## DİVAN ƏDƏBİYYATINDA MƏKAN ANLAYIŞI

Başqa bir məsələ məkan anlayışının divan ədəbiyyatındakı yeri ilə bağlıdır. Divan ədəbiyyatında sevgilinin yeri, evi, qapısı toxunulmazdır. «Natlarda Hz.Peyğamberin Medinedeki ravzası için de aynı telakkiler mevcuttur. Güneş her sabah yüzünü o dergaha sürdüyü için böylesine parlaktır. Ya da Cezminin «afitab» redifli natında olduğu gibi güneş ateta o muhterem haremi süpürmekle görevli bir köledir; o ravzanın feyzli nurundan istifade eden

güneş oranın toprağını anbere çevirir; her gün Cebrail (a.s.) gibi o mübarek ravzaya yüz sürer; kubbesi gök yüzü, kandili yıldızlar olan ravzaya güneş bir mihrab olur. Və ya Fehimi-Kadimin «ruz ve şeb» rədifli natında güneş ve ay, meleklerin o mukaddes ravzada dolaştırdığı iki buhurdandır. Füzuli eşsiz «Su kasidesi»nde suyun hz.Peyğambere olan aşkıyla durmadan hep o mukaddes ravzaya aktığını dile getirir. Azeri yolunun torpağı «maye-i ikbal» olan yüce peyğamberin hareminin de «maksadi-aksa» olduğunu belirtir. Fevri, Ravzai-Mutahharadakı «kubbeyi-hadra»nın gökyüzü köşkünün tavanına degdigini söyleyerek o mubarek türbenin yüceliyini ifade etmeye çalışır»[126]

Divan ədəbiyyatında sevgilinin yeri cənnətdir:

**Muhibbi:**

Merve hakkı say ile ger Kabe kuyunı tavaf
Eylesem can ile dil andan olurdu, pür-safa. [127]

(Kəbəni haqqı ilə tavaf etsəm, canım və qəlbim pak olardı)

**Ayni:**

Süre-i Kevserle taltif eyledi Mövla seni
Oldu kuyun cennetül-Meva Habibi-Kibriya.[128]

(Allah səni «Kövsər» surəsi ilə təltif elədi. Sənin məkanın cənnət oldu)

Hz. Peyğəmbərin (s.a.s.) rövzəsinin torpağı şəfadır.

**Rizayi:**

Çare bu derde bendegi-i kuyıdur heman,
Kuyi-Habib hasılı darüş-sifa imiş.[129]

---

[126] Emine Yeniterzi, göstərilən qaynaq, s. 281.
[127] Emine Yeniterzi, göstərilən qaynaq, s. 281.
[128] Emine Yeniterzi, göstərilən qaynaq, s. 281.

(Bu qulun dərdinin şəfası Allahın dostunun məkanıdır)

Təbii ki, hz.Nizami bu beytdə rövzəni deyil, Əhmədin yaradılışını, onun bu yaradılışdan sonrakı məkanını təsvir edir. Hz. Nizami bu yaradılış mərhələsi (ilk) ilə rəng arasında uyum yaradır. Bunun üçün firuzəyi rəngi seçir. Bu beytdə firuzəyi rəng çoxmənalıdır. Məsələn, hz.Məhəmməd (s.a.s.) barış, sülh peyğəmbəridir. Hz. Nizami firuzəyi rənglə bu mesajı simvollaşdırır. Nizamiyə görə Peyğəmbər (s.a.s.) Allahın (c.c.) salamını, ədalətini, barış içində yaşamaq buyruğunu insanlara çatdırır:

هُوَ اللَّهُ الَّذِي لَا إِلَهَ إِلَّا هُوَ الْمَلِكُ الْقُدُّوسُ السَّلَامُ الْمُؤْمِنُ الْمُهَيْمِنُ الْعَزِيزُ الْجَبَّارُ الْمُتَكَبِّرُ سُبْحَانَ اللَّهِ عَمَّا يُشْرِكُونَ

(Həşr, 59/23)

«O, özündən başqa ilah olmayan Allahdır. Hökmdardır, müqəddəsdir, Salamdır, əminlik verəndir, gözləyib qoruyandır, daima qalıb, istədiyini etdirən və böyüklükdə tayı-bərabəri olmayandır. Allah onların ortaq qoşduqları şeylərdən münəzzəhdir».

## RƏNGLƏRİN AHƏNGİ

**Firuzəyi rəng məscidin rəngidir. Məscid islamın toxunulmaz yerlərindən biridir, ibadətin, elmin, birliyin, Allahı tanımanın, hakimiyyətin məkanıdır. Məscid istiqamətdir:**

قَدْ نَرَى تَقَلُّبَ وَجْهِكَ فِي السَّمَاء فَلَنُوَلِّيَنَّكَ قِبْلَةً تَرْضَاهَا فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ وَحَيْثُ مَا كُنتُمْ فَوَلُّواْ وُجُوِهَكُمْ شَطْرَهُ وَإِنَّ الَّذِينَ أُوْتُواْ الْكِتَابَ لَيَعْلَمُونَ أَنَّهُ الْحَقُّ مِن رَّبِّهِمْ وَمَا اللّهُ بِغَافِلٍ عَمَّا يَعْمَلُونَ

(Bəqərə, 21/144)

---

[129] Emine Yeniterzi, göstərilən qaynaq, s. 282.

«Sənin üzünü dəfələrlə göy üzünə çevirib durduğunu, əlbəttə, görürük. İndi səni xoşnud olcağın bir qibləyə döndərəcəyik. Üzünü Məscidi-Həram tərəfə (Kəbəyə) çevir. Ey müsəlmanlar, harada olsanız siz də üzlərinizi onun tərəfinə çevirin. Özlərinə kitab verilənlər bunun Rəbblərindən gələn bir haqq olduğunu çox yaxşı bilirlər. Allah onların etdiklərindən qafil deyildir».

Hz.Nizami də «kamal fərmanı» almış Peyğəmbəri (s.a.s.) «firuzə rəngli kərpicdən tikilmiş günbəzin altında» təsvir edir. Hz. Nizaminin hz.Məhəmməd (s.a.s.) üçün «tikdiyi» məkan incə naxışlarla bəzədilib. Burada hər bir cizgi mənalandırılıb, ideyanın açılmasına yönəldilib. Hz. Nizami, əslində, sonsuz bir məkan təqdim edib. Bu firuzəyi səma altında əbədi olan Allahın (c.c.) ideyalarını, buyruqlarını insanlara çatdıran bir elçi əyləşib.

Hz.Nizami günbəzin «firuzə rəngli kərpicdən» tikildiyini deyir. Kərpic sözündə də ilahi nizamin işarəsi var. Kərpic, hörgü və düzümlə tikilmiş günbəz. Kərpic gözəlliyi, istini, nizamı, uzunömürlüyü təmsil edir. Kərpic eyni zamanda təbiiliyin və təvazökarlığın simvoludur. İslam da insanlar üçün qoruyucu bir məkandır. Bu qoruyucu məkan olmasa insanın fitrəti pozular. Deməli, hz.Məhəmməd (s.a.s.) bizə Allahın əmri ilə bir «ev» tikir. Hz.Məhəmməd (s.a.s.) mübarək hədislərinin birində Qurandan bir şey əzbər bilməyənin qəlbini  xaraba evə bənzədir.

İbni Abbas (r.a.) rəvayət edir. «Rəsulullah belə buyurdu: «Qəlbində Qurandan bir miqdar olmayan kimsə uçmuş ev kimidir»[130]

Təbii ki, xaraba ev ilan-çayanla dolu, kimsəsiz, qoruma imkanı olmayan bir evdir.

---

[130] Riyazüs Salihin, İstanbul, 2004, c. V, s. 109.

Hz.Məhəmməd (s.a.s.) insanlara bir ev, bir qoruma sistemi «tikir». Hz. Nizami də bu Allah mesajını bədii bir biçimdə insanlara çatdırır. Hz.Nizaminin misrasında «günbəz» cizgisi də diqqət çəkicidir. «Firuzəyi rəngli günbəz» günəş şüaları altında çox gözəl görünür. Günbəz ucalığın, ən əsası isə Allaha doğru istiqamətin simvoludur.

Hz.Nizami beytin ikinci misrasında hz.Məhəmmədi (s.a.s.) saray behişitində yetişmiş tər-təzə turunca bənzədir. Bu misrada da bir neçə maraqlı məsələ var. Biz bu misranın daşıdığı dini, bədii yükün hansı bilgilər üzərində durduğuna diqqət yetirək. Burada olan önəmli məsələlərdən biri Peyğəmbərin (s.a.s.) meyvəyə bənzədilməsidir.

İslama bağlı olan təsəvvüfdə dünya bir bağdır, insan ağacdır, başqa canlılar bu ağacın yarpaqları, Peyğəmbərlər bu ağacın meyvələri, hz.Məhəmməd (s.a.s.) də o meyvənin özəyidir, içindəki toxumdur. Bu toxumu əksən, yenə ağac olar, meyvə verər, yenə toxuma çevrilər. «Hz.Peyğamber – meyve-çekirdek münasibəti de Onun ilk ve son peyğamber, Evvel ve Ahır oluşuna dayanır».[131]

**Niyazi Misri:**

Cihan bağında insan bir şecerdür qayrılar yaprak,
Nebiler meyvedür sen zübdesisin, ya Resulallah.[132]
(Dünya bağında insan bir ağacdır, başqaları yarpaq.
Nəbilər meyvədir, Sən özək, toxum)

**Nevi:**

Nola hoş-bu olursa ger ezhar,
Meyvedür çün muradi-ahir-kar.
Nola ger evvel olsa bergi-şeçer,

[131] Emine Yeniterzi, göstərilən qaynaq, s. 318.
[132] Emine Yeniterzi, göstərilən qaynaq, s. 318.

Nakis olurmu hiç kemali-semer.
Çün derext oldı meyveden zahir,
Meyve hem evvel oldı, hem ahır.[133]

(Zahiri xoş ətirli olsa da, əsas meyvədir. Ağacın yarpağı əsas olsa, faydası olmaz.

Çünki ağac meyvədən yarandı. Meyvə həm əvvəldir, həm də son)

Bu misralarda hz.Məhəmmədin əvvəl-axır, ilk-son olduğu meyvə obrazı ilə anladılıb. Hz.Nizami də sonrakı beytdə daha açıq bir biçimdə hz. Məhəmmədin (s.a.s.) ilk-son olması məsələsinə açıqlıq gətirib. Əslində, hz. Nizaminin bütün beytləri bir-biri ilə sıx bağlıdır, bir-birinin yardımı ilə anlaşılır. Nətin dördüncü və beşinci beytləri də bütöv quruluşla bağlıdır və bir-birini tamamlayır. Dördüncü beyt beşinci beytin anlaşılmasına yol açır.

Bu beytlərdə ifadə olunmuş ideyanın doğru anlaşılması üçün hz.Məhəmmədin (s.a.s.) «ilk-son» olması düşüncəsinə açıqlıq gətirək.

## İBN ƏRƏBİYƏ GÖRƏ «İLK-SON» ANLAYIŞI

Böyük islam alimi İbn Ərəbiyə görə insani-kamil təkdir və o da bütün zamanlarda, dövrlərdə hz.Peyğəmbərdir (s.a.s.). Buna görə, hz.Peyğəmbər (s.a.s.) «varlığın səbəbi» olduğu kimi, eyni zamanda onun bəqa səbəbidir. İbn Ərəbiyə görə, Tanrının bilinmə arzusu ancaq hz.Məhəmmədin (s.a.s.) vasitəsiylə gerçəkləşir, bütün bilgilər ancaq Peyğəmbərin (s.a.s.) nurundan alınır. Deməli, hz.Peyğəmbərin (s.a.s.) həqiqəti bütün peyğəmbərlərin bilgilərini aldıqları nurdur. Peyğəmbərin (s.a.s.) vəkil və naibləri də vardır. Bunların önündə peyğəmbərlər gəlir.

---

[133] Emine Yeniterzi, göstərilən qaynaq, s. 318.

Ona görə də hər Peyğəmbərin gətirdiyi vəhy hz.Məhəmmədin (s.a.s.) gətirdiyi ilahi bilginin bir qismidir. İbn Ərəbiyə görə, hz.Peyğəmbər (s.a.s.) ontolojik olaraq ilk Peyğəmbər, tarixi baxımdan isə son Peyğəmbərdir.

İbn Ərəbi ilk və son anlayışlarını (ilk və son varlığın kəsişən iki ucunu təmsil edir. İlk hər zaman təsir edir. İbn Ərəbi ilklərə «ata» adını verib) belə şərh edir ki, hz.Peyğəmbərin (s.a.s.) vəhyi bütün Peyğəmbərlərin gətirdiklərinə təsir edib. Hz.Peyğəmbər (s.a.s.) son Peyğəmbər olaraq da bütün vəhyləri tamamlayıb. İbn Ərəbi dairəvi bir varlıqdan danışır. Ona görə, başlanğıclar sonda yerləşmişdir. Ona görə, hər Peyğəmbərin vəhyi tam deyil, onlar parça-parça bilgilər gətirmişlər. İbn Ərəbiyə görə, hz.Məhəmməd (s.a.s.) isə «cəvaimül kəlim»dir, Ona Quran verilmişdir. O, Peyğəmbərlərə ayrı-ayrılıqda verilən həqiqətlərin hamısını birləşdirir, bir araya toplayır. Nəticə olaraq, İbn Ərəbiyə görə, hz.Məhəmməd (s.a.s.) ontoloji olaraq ilk varlıq, aləmin əsli, bütün Peyğəmbərlərin bilgilərini ondan aldıqları nurdur. O, son Peyğəmbərdir, bütün Peyğəmbərlərin dəvətlərini birləşdirir.[134]

## PEYĞƏMBƏRİN «ƏVVƏL» ADI

Bununla birgə gözəl adlardan olan «Əvvəl» hz. Peyğəmbərin (s.a.s.) yaradılışda, Peyğəmbərlikdə və həşrdə ilk olduğunu da göstərir. Burada onu da xatırladaq ki, hz.Nizami nətin ilk üç beytində bir yandan Əhmədin yaradılışını təsvir edir, başqa yöndən isə onun ilk olduğunu açıqlayır. Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) nuru, onun «Əvvəl» adı üzərində ayrıca durur.

[134] Tasavvuf, göstərilən qaynaq, s. 360.

Hədislərdən də anlaşıldığı kimi (biz bu məsələni sıradakı beytin şərhində açıqlayacağıq) qiyamətdə ilk öncə hz.Peyğəmbər (s.a.s.) dirildilib məhşərə çəkiləcək. «Əvvəl» adının sahibi olan hz.Məhəmməd (s.a.s.) risaləti, Peyğəmbərliyi tamamladığı üçün Axırdır.

Nətlərdə hz.Peyğəmbərin (s.a.s.) ilk və son olmasına ayrıca yer verilmiş, onun üstünlükləri sadalanmışdır. Nətlərdə hz.Məhəmmədin «İlk» («Əvvəl») adı anılarkən uca Allahın (c.c.) ilk öncə hz.Məhəmmədin (s.a.s.) nurunu yaratdığı, sonra başqa varlıqları xəlq etdiyi önə çəkilir.

## PEYĞƏMBƏRİN «SON» ADI

Başqa yöndən hz.Məhəmmədin «Son» («Axır») adı Qurandan qaynaqlanır.

مَّا كَانَ مُحَمَّدٌ أَبَا أَحَدٍ مِّن رِّجَالِكُمْ وَلَكِن رَّسُولَ اللَّهِ وَخَاتَمَ النَّبِيِّينَ وَكَانَ اللَّهُ بِكُلِّ شَيْءٍ عَلِيماً

(Əhzab, 33/40)

«Məhəmməd adamlarınızdan hər hansı birinin atası deyil, ancaq Allahın rəsulu və Peyğəmbərlərin də sonuncusudur. Allah hər şeyi haqqı ilə biləndir».

Nətlərdə hz.Peyğəmbərin «Son» («Axır») adı onun üstünlüyü kimi dəyərləndirilir. Ağacda ən dadlı, faydalı nəticənin meyvə-Son olduğu bildirilir:

**Haləti:**

Bergi-sebz evvel itmeyince zuhur,
Şahi-gül gülşene idermi mürur.
Alemi mahdur iden ruşen,
Ne kadar sonra gelse encümden.
Yirine cümle gelmeden erkan,
Şahlar çıkmaz itmege divan.
Gerçi evvel bulur şükufe vucud,

Bagi-alemde meyvedür maksud.[135]

(Yaşıl yarpaq görünməyincə gülün şahı gülşənə gəlməz.Son gəlsə də, Aləmi ay işıqlandırır. Bütün adamlar yığışmasa, şahlar divana çıxmaz.Gül əvvəl olsa da, bağda məqsəd meyvədir)

**Fevri:**

Enbiyanun nəticesi sensin,
Sonradan geldügüne oldur hal.[136]

(Sonradan gəldiyinin mənası odur ki, peyğəmbərlərin nəticəsi sənsən)

**Riyazi:**

Ey Hatmi-Rusül alemde gelsen nola ahir,
Adet budur ahirde gelür bezme ekabir.[137]

(Ey peyğəmbərlərin sonuncusu, sən aləmə sonuncu gəldin. Böyüyün məclisə sonda gəlməsi adətdir)

Hz.Nizami də nətin dördüncü beytində hz.Məhəmmədin (s.a.s.) ilk-son olduğunu ifadə etmək üçün «meyvə»dən («turunc») istifadə etmişdir. Meyvə həm sondur, nəticədir, həm də meyvənin içində toxum var, o, ilkdir. Biz yuxarıda göstərdik ki, hz.Nizaminin meyvələrdən turuncu seçməsinin də səbəbləri var. Bunu sonrakı beyt də göstərir.

**Ancaq bu beytdə hz. Nizami turuncun rəngi ilə «firuzə rəngli kərpicdən tikilmiş günbəz» arasında bir rəng uyumu da yaratmışdır. Hz.Peyğəmbər (s.a.s.) bir meyvədir, sondur. O, gəlişi ilə varlığa, insanlığa ölçü, düzən (nizam) gətirmişdir. Beytdəki rəng seçimi, rəng uyumu (firuzəyi, narıncı) və bu uyğunluqdan doğan ahəng,**

[135] Emine Yeniterzi, göstərilən qaynaq, s. 167.
[136] Emine Yeniterzi, göstərilən qaynaq, s. 167.
[137] Emine Yeniterzi, göstərilən qaynaq, s. 168.

**nizam, rənglərin yaratdığı rahatlıq, kərpiclərin düzümündəki nizamla Peyğəmbərin (s.a.s.) gətirdiyi ilahi ahəng arasındakı bağlılıq göz önündədir. Günbəzin təmsil etdiyi simvolika ilə (Allaha yönəlmə və ibadət), məscidin elm mərkəzi olaraq toplumda nizam, ölçü yaratmaq missiyası arasında da qırılmaz bir bağlılıq var.**

## HƏZRƏT MƏHƏMMƏD (s.a.s) CƏNNƏT MEYVƏSİDİR

Hz.Nizami Peyğəmbəri (s.a.s.) «saray behiştində yetişmiş təp-təzə turunca» bənzədir. Burada saray anlayışı bir yandan hakimiyyət, güc, özəl himayə anlamlarını ağıla gətirir, başqa yöndən də Peyğəmbərin (s.a.s.) uca Allahın (c.c.) nəzarətində yetişdiyini göstərir. **Hz.Nizami hz.Peyğəmbəri (s.a.s.) faydasına, önəminə görə cənnət meyvəsi ilə tutuşdurur. Hz.Nizami Peyğəmbəri-meyvəni (turuncu) Allahın insanlığa bəxş etdiyi əvəzedilməz nemət kimi mənalandırır. Buradan o mənanı da çıxarmaq olar ki, hz. Nizamiyə görə, hz.Məhəmməd (s.a.s.) insanlara cənnəti qazandıracaq bir meyvədir, nemətdir. Bu meyvədən dadan – onun elm və əxlaqına yiyələnən Allahın (c.c.) rizasını qazanmış sayılır. Burada sarayın özəl himayəni təmsil etdiyini də dedik. Gerçəkdən də Peyğəmbər (s.a.s.) uca Allahın tərbiyəsində, onun bağbanlığında yetişmiş dadlı, çox faydalı, çox şəfalı bir turuncdur, ətirli bir çiçəkdir. Bu mətn (beyt) içində turunc həm də işıqdır, nuru (turuncun rəngi) andırır.**

Biz cənnət meyvələri və Peyğəmbərin (s.a.s.) Allahın (c.c.) himayəsi ilə yetişdiyini göstərən ayə və hədisləri də araşdırmamıza artırmaq istəyirik:

وَبَشِّرِ الَّذِين آمَنُواْ وَعَمِلُواْ الصَّالِحَاتِ أَنَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي مِن تَحْتِهَا
الأَنْهَارُ كُلَّمَا رُزِقُواْ مِنْهَا مِن ثَمَرَةٍ رِّزْقاً قَالُواْ هَـذَا الَّذِي رُزِقْنَا مِن قَبْلُ
وَأُتُواْ بِهِ مُتَشَابِهاً وَلَهُمْ فِيهَا أَزْوَاجٌ مُّطَهَّرَةٌ وَهُمْ فِيهَا خَالِدُونَ .

(Bəqərə, 2/25)

«(Ey Peyğəmbər!) İman gətirən və yaxşı işlər görən kimsələrə müjdə ver: onlar üçün (ağacları) altından çaylar axan cənnətlər (bağlar) var. (O cənnətlərin) meyvələrindən bir ruzi yedikləri zaman: «Bu bizim əvvəlcə (dünya evində) yediyimiz ruzidir»,-deyəcəklər. Əslində, isə bu (ruzi meyvələr) onlara (dünyadakılara zahirən) bənzər olaraq verilmişdir. Onlardan ötrü orada (hər cəhətdən) pak (olan) zövcələr də var. Onlar (möminlər) orada əbədi qalacaqlar».

قُلْ أَؤُنَبِّئُكُم بِخَيْرٍ مِّن ذَلِكُمْ لِلَّذِينَ اتَّقَوْا عِندَ رَبِّهِمْ جَنَّاتٌ تَجْرِي مِن تَحْتِهَا الأَنْهَارُ خَالِدِينَ فِيهَا وَأَزْوَاجٌ مُّطَهَّرَةٌ وَرِضْوَانٌ مِّنَ اللّهِ وَاللّهُ بَصِيرٌ بِالْعِبَادِ . الَّذِينَ يَقُولُونَ رَبَّنَا إِنَّنَا آمَنَّا فَاغْفِرْ لَنَا ذُنُوبَنَا وَقِنَا عَذَابَ النَّارِ . الصَّابِرِينَ وَالصَّادِقِينَ وَالْقَانِتِينَ وَالْمُنفِقِينَ وَالْمُسْتَغْفِرِينَ بِالأَسْحَارِ

(Ali-İmran, 3/15-17)

«(Ey Rəsulum!) Söylə: «Sizə bunlardan (dünya zinətlərindən) daha yaxşısını xəbər verimmi? Allahdan qorxub pis əməldən çəkinənlər üçün Rəbbi yanında (ağacları) altından çaylar axan cənnətlər (bağlar) vardır ki, orada əbədi qalacaqlar. Onlardan ötrü orada (hər cür eyibdən) pak olan zövcələr və (ən böyük nemət olan) Allah rizası (razılığı, hüsn-rəğbəti) var. Allah, həqiqətən, bəndələrini görəndir! O bəndələr ki: «Ey Rəbbimiz, biz, həqiqətən, (Sənə) iman gətirmişik, günahlarımızı bağışlayıb bizi cəhənnəm əzabından qoru!»,-deyirlər. Onlar (müsibətlərə) səbir edən, (sözlərində və işlərində) doğru olan, (Allaha) itaət edən, mallarından fəqirlərə verən və sübh vaxtı (Allahdan) bağışlanmaq diləyənlərdir (sübh namazına qalxanlardır)».

## CƏNNƏT AĞACI

Hədislərdə cənnət ağacı ilə bağlı deyilənlərdən misallar:

Enes (r.a) rəvayət edir: Hz.Peyğəmbər (s.a.s.) belə buyurdu: «Şübhəsiz cənnətdə bir ağac vardır ki, miniyi olan bir kimsə yüz il kölgəsi altında yüyürər, amma sonuna çata bilməz».[138]

Hz.Nizami «saray behiştində yetişmiş tər-təzə turunc»un bağbanının-uca Allahın özəl tərbiyəsinə də işarə edir. Quranda bu özəl himayənin, gözəl tərbiyənin açıq qaynaqları var. Uca Allah sevimli Peyğəmbərini (s.a.s.) yetişdirmə yolunu belə açıqlayır:

أَلَمْ نَشْرَحْ لَكَ صَدْرَكَ. وَوَضَعْنَا عَنكَ وِزْرَكَ .الَّذِي أَنقَضَ ظَهْرَكَ . وَرَفَعْنَا لَكَ ذِكْرَكَ

(İnşirah, 94/1-4)

«Biz sənin köksünü açıb genişlətmədikmi? Belini bükən yükünü səndən alıb atmadıqmı? Sənin şanını və ününü ucaltmadıqmı?».

لَقَدْ جَاءكُمْ رَسُولٌ مِّنْ أَنفُسِكُمْ عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُم بِالْمُؤْمِنِينَ رَؤُوفٌ رَّحِيمٌ

(Tövbə, 9/128)

«And olsun sizə özünüzdən elə bir Peyğəmbər gəlmişdir ki, sizin sıxıntıya düşməyiniz ona çox ağır gəlir. O, sizə çox düşkün, möminlərə qarşı çox şəfqətlidir, mərhəmətlidir».

وَمَا أَرْسَلْنَاكَ إِلَّا رَحْمَةً لِّلْعَالَمِينَ

(Ənbiya, 21/107)

«Rəsulum! Biz səni ancaq aləmlərə rəhmət olaraq göndərdik».

---

[138] Sahihi – Buxari, Muhtasari Tecridi – Sarih, Konya, 2004, s. 392.

إِنِّي لَكُمْ رَسُولٌ أَمِينٌ

(Şuəra, 26/125)

«Bilin ki, mən sizə göndərilmiş güclü (əmin) bir elçiyəm».

Ya da baxın, Allah onu necə idarə edir, yönləndirir:

يَا أَيُّهَا الْمُدَّثِّرُ . قُمْ فَأَنذِرْ . وَرَبَّكَ فَكَبِّرْ . وَثِيَابَكَ فَطَهِّرْ . وَالرُّجْزَ فَاهْجُرْ . وَلَا تَمْنُن تَسْتَكْثِرُ . وَلِرَبِّكَ فَاصْبِرْ

(Müddəsir, 74\1-7)

«Ey bürünüb sarınan Rəsulum! Qalx və insanları uyar. Sadəcə Rəbbini böyük tanı. Paltarını təmiz saxla. Pis şeyləri tərk et. Etdiyin yaxşılığı çox görərək başa qaxma. Rəbbinin rizasını əldə etmək üçün səbr et».

Uca Allah Peyğəmbərə (s.a.s.) davranış ölçüləri verir:

وَقُل لِّعِبَادِي يَقُولُواْ الَّتِي هِيَ أَحْسَنُ إِنَّ الشَّيْطَانَ يَنزَغُ بَيْنَهُمْ إِنَّ الشَّيْطَانَ كَانَ لِلإِنْسَانِ عَدُوّاً مُّبِيناً

(İsra, 17/53)

«Qullarıma söylə: Sözün ən gözəlini söyləsinlər, sonra şeytan aralarını pozar. Çünki, şeytan insanın açıq düşmənidir».

يَا أَيُّهَا النَّبِيُّ قُل لِّأَزْوَاجِكَ وَبَنَاتِكَ وَنِسَاء الْمُؤْمِنِينَ يُدْنِينَ عَلَيْهِنَّ مِن جَلَابِيبِهِنَّ ذَلِكَ أَدْنَى أَن يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ وَكَانَ اللَّهُ غَفُوراً رَّحِيماً

(Əhzab, 33/59)

«Ey Peyğəmbər! Xanımlarına, qızlarına və möminlərin qadınlarına, bir ehtiyac üçün çölə çıxdıqları zaman örtülərini üstlərinə atmalarını söylə. Onların tanınması və incidilməməsi üçün ən uyğun olan budur. Allah bağışlayandır, əsirgəyəndir».

Allahın (c.c.) Peyğəmbərə (s.a.s.) verdiyi başqa bir təlimatı oxuyaq:

وَقُل لِّلْمُؤْمِنَاتِ يَغْضُضْنَ مِنْ أَبْصَارِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا مَا ظَهَرَ مِنْهَا وَلْيَضْرِبْنَ بِخُمُرِهِنَّ عَلَى جُيُوبِهِنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا لِبُعُولَتِهِنَّ أَوْ آبَائِهِنَّ أَوْ آبَاء بُعُولَتِهِنَّ أَوْ أَبْنَائِهِنَّ أَوْ أَبْنَاء بُعُولَتِهِنَّ أَوْ إِخْوَانِهِنَّ أَوْ بَنِي إِخْوَانِهِنَّ أَوْ بَنِي أَخَوَاتِهِنَّ أَوْ نِسَائِهِنَّ أَوْ مَا مَلَكَتْ أَيْمَانُهُنَّ أَوِ التَّابِعِينَ غَيْرِ أُوْلِي الْإِرْبَةِ مِنَ الرِّجَالِ أَوِ الطِّفْلِ الَّذِينَ لَمْ يَظْهَرُوا عَلَى عَوْرَاتِ النِّسَاء وَلَا يَضْرِبْنَ بِأَرْجُلِهِنَّ لِيُعْلَمَ مَا يُخْفِينَ مِن زِينَتِهِنَّ وَتُوبُوا إِلَى اللَّهِ جَمِيعاً أَيُّهَا الْمُؤْمِنُونَ لَعَلَّكُمْ تُفْلِحُونَ

(Nur, 24/31)

«Mömin qadınlara da söylə. Gözlərini harama baxmaqdan qorusunlar. Namus və iffətlərini uca tutsunlar. Görünən qismləri müstəsna olmaq üzərə zinətlərini göstərməsinlər. Baş örtülərini yaxalarının üzərinə qədər örtsünlər. Ərləri, ataları, ərlərinin ataları, öz oğulları, ərlərinin oğulları, qardaşları, qardaşlarının oğulları, bacılarının oğulları, öz qadınları, əllərinin altında olanlar (kölələri), kişilərdən ailənin qadınına şəhvət duymayan xidmətçi və başqa tabe kimsələr, ya da hələ qadınların gizli qadınlıq xüsusiyyətlərinin fərqində olmayan uşaqlardan başqasına zinətlərini göstərməsinlər. Gizlədikləri zinətləri bilinsin deyə ayaqlarını yerə vurmasınlar. Diqqətləri üzərinə çəkəcək tərzdə yeriməsinlər. Ey möminlər! Hamınız birdən Allaha tövbə edin ki, qurtulasınız».

Hz.Nizaminin ifadə etdiyi «saray behiştində yetişmiş tər-təzə turunc»a qüdrət sahibi Allah (c.c.) üstünlüklər, ayrıca dad vermişdi. Bu özəl xüsusiyyətlər də bağbanın lütfü idi, yetişdirmə gücünün sonsuzluğundan irəli gəlirdi. Şəmail kitabları yazır ki, Peyğəmbərin (s.a.s.) üzü çox gözəl və işıqlı idi, bədən üzvləri arasında bir uyum var idi, bədəni mütənasib, alnı, köksü, iki çiyninin arası, ovucları geniş idi. Ortaboylu, iri sümüklü, güclü idi. Peyğəmbərin dərisi çox yumşaq idi, qaşları hilal, üzü uzun, kiprikləri uzun, gözləri

qara və iri, qaşlarının arası açıq idi. İki qaşının arasında bir damar var idi, o, əsəbiləşəndə bu damar görünürdü, çöhrəsi buğda rəngli idi, dişləri inci kimi ağ, parlaq idi, saçları nə qıvrım idi, nə də düz, bədəni çox təmiz idi. O, sünnətli və göbəyi kəsik olaraq doğulmuşdu. Yeriyəndə bir ahəng içində addımlayar, az danışar, hər sözü öyüd, hikmət olardı. Güləndə qəhqəhə etməzdi, gözəl nitqi var idi, heç kimin sözünü kəsməzdi.[139]

İslam alimi Kəttani yazır: «Bu özəlliklər ancaq bir Peyğəmbərin ola bilər və bunlar yanında dəlil olaraq da başqa bir şeyə ehtiyac yoxdur. Vücud özəlliklərinin mötədil olması əxlaqın gözəlliyinə dəlalət edir. Bu aydınladan nurdan və yanında batil olmayan haqdan gələn bir yaradılışdır».[140]

Hz.Nizaminin işarə etdiyi «Allahın behişt sarayında yetişən turunc» mənəvi və fiziki yönüylə bir bütöv idi. Görün, şairlər bu tamlığı, gözəlliyi necə dəyərləndirib:

**Yunis Əmrə:**

«Gül Məhəmməd təridir»

**Osman Şəms:**

Vücudun bir kitabi-asimani, ya Resulallah,
Ki tenzil etti Mevla arza Ani, ya Resulallah.[141]

(Sənin vücudun Allahın yerə endirdiyi bir asiman (səma) kitabıdır. Hz.Nizami də onun səmadan – saray behiştindən gəldiyini yazır)

**Müəllim Naci:**

Hüsni-Kurani görür insan olur hayran sana,
Desti-kudretle yazılmış hilyedir Kuran sana.[142]

(Quranın gözəlliyini görüb insan sənə heyran olur. Quran sənin üçün qüdrət əli ilə yazılmış hilyədir)

---

[139] Ali Akyüz, Yaşayan Kuran hazreti Peyğamber, İstanbul, 2003, s. 116.
[140] Ali Akyüz, Yaşayan Kuran hazreti Reyğamber, İstanbul, 2003, s. 117.
[141] Ali Akyüz, Yaşayan Kuran hazreti Peyğamber, İstanbul, 2003, s. 5.
[142] Ali Akyüz, Yaşayan Kuran hazreti Peyğamber, İstanbul, 2003, s. 6.

## BEŞİNCİ BEYTİN ŞƏRHİ: O, ƏVVƏL MEYVƏ VERİR, SONRA İSƏ BAHARI GƏTİRİR

Hz.Nizami hz.Peyğəmbəri (s.a.s.) «turunc»a bənzətməsinin gerçək səbəbini beşinci beytdə açıqlayır.

رسم ترنجست که د ر روزگار
پیش دهد میوه پس آرد بهار

***Turuncun rəsmi (adəti) zəmanədən belədir:***
***O, əvvəl meyvə verir, sonra isə bahari gətirir.***[143]

Biz yuxarıda verilən misallarda hz.Nizaminin düşüncəsinin Quranda, hədislərdə olan mənalarla sıx bağlı olduğunu görürük. Hz.Nizaminin beytlərindəki məna Qurandan, hədislərdən süzülüb gəlir, şairin düşüncəsində bişir, yeni bir ifadə biçimi qazanır. Hz.Nizaminin üslub özəlliklərindən biri də budur ki, onun beytləri bir-birinə sıx bağlıdır, bir-birini izah edir, bu vahid, düşünülmüş sistemdə artıq beyt, söz, bənzətmə yoxdur. Hz. Nizamidə beytlər bir-birini şərh edir, bu beytdə qoyulan məsələnin cavabı başqa bir beytdədir.

Hz.Nizami «Əhmədin» varlığının yaradılışını addım-addım şərh edir. Onun üslubunda hər beyt bir pillədir. O, bu beytdə də bədii biçimdə gözəl bir məna vermişdir. Biz, hz.Nizaminin bu əsərinin Quranın, Peyğəmbərliyin, hz. Məhəmmədin (s.a.s.) şərhi olduğuna inanırıq. Bu beytin də Quran qatı, hədis qatı, bədii qatı var.

Bu beytdə hz.Nizami başlıca ideyanı turunc meyvəsinin üzərində qurub. O, hz. Peyğəmbərin (s.a.s.) ilk-son

---

[143] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 25.

Peyğəmbər olduğunu bildirmək üçün turuncun özəlliyindən yararlanıb. Turunc meyvəsi baharın əvvəlində yetişir, sonra isə baharda yenidən çiçəkləyir.

Biz yuxarıda Peyğəmbərlərin həyat ağacının meyvəsi, özü olduğunu göstərmişdik. Yəni hər şey meyvəyə bağlıdır, o olmasa, yaradılışın, ağacın davamı yoxdur. Meyvə öz içindəki toxumu yetişdirir, sonra bu toxum özünü torpağa fəda edir (torpağa qarışır), bu fədakarlıqdan yeni ağac bitir, bu ağac çiçək açır, meyvə verir və varlıq beləcə davam edir. Deməli, varlığın davamı meyvəyə bağlıdır. Hz.Nizami bir yandan hz.Məhəmmədi (s.a.s.) önəminə, faydasına görə meyvəyə bənzədir. İkinci yöndən isə elə meyvə seçir ki, bu meyvə hz.Məhəmmədin (s.a.s.) ilk-son Peyğəmbər olduğu düşüncəsini ifadə etmək imkanında olsun. Öncə meyvə vermək-uca Allahın (c.c.) öncə Peyğəmbər nurunu yaratması, varlığın əsasına bu nuru qoyması, sonra bu turunc adlı meyvənin çiçək açması, baharın gəlişini xəbər verməsi – hz. Məhəmmədin (s.a.s) son Peyğəmbər olması. Adi ağaclar öncə çiçək açır, sonra meyvə verir. Ancaq turuncda bu ardıcıllıq pozulur. Bu, Allahın bir lütfüdür. Allahın (c.c.) qüdrətinin sonsuzluğuna işarədir.

## TURUNC HƏM DƏ FƏDAKARLIQ SİMVOLUDUR

**Burada daha iki önəmli məsələ də var. Turunc elə bir ağacdır ki, o başqa fəsildə deyil, qışın qurtarması, yazın başlanması ərəfəsində meyvə verir. Bu dönəmi biz, «fədakarlıq mərhələsi» adlandırırıq. Meyvənin yetişməsi üçün uyğun olmayan bir şəraitdə, zamanda baharın – gözəlliyin gəlişini bildirmək sevdasına özünü qorxmadan fəda etmək.** Bu, hz.Məhəmmədin (s.a.s.) həyatının canı, özəyi

deyilmi? O, insanlığı xilas etmək adına hər şeyini fəda etmədimi? O, bütün çətinliklərə (bu dönəmin soyuğuna, şaxtasına, məhv olmaq təhlükəsinə) qalib gəlmədimi? Burada turuncun, meyvənin,həyatın (ağacın) mənası olmaqla birgə fədakarlıq, gözəllik adına özünü qurban etmək özəlliyi, eləcə də iradəni təmsil etməsi də göz önündədir. Turuncun hz.Nizamiyə verdiyi imkanlardan biri də onun qışla - baharın arasında yer tutmasıdır. Burada turuncun yetişmə vaxtı Allah (c.c.) buyruğudur, onun seçim imkanı yoxdur. Burada qış cəhaləti, qaranlığı, bahar elmi, nuru təmsil edir. Uca Allahın (c.c.) ilk olaraq Peyğəmbərin (s.a.s.) nurunu yaratmaqda məqsədi də insanlığı cəhalətdən qurtarmaq, Allahı insanlara tanıtmaqdır. Bu, bütün Peyğəmbərlərin vəzifəsidir. Peyğəmbərlər hər zaman, bütün şərtlərdə nurun, elmin təmsilçiləridir:

وَلَوْلاَ فَضْلُ اللّهِ عَلَيْكَ وَرَحْمَتُهُ لَهَمَّت طَّآئِفَةٌ مُّنْهُمْ أَن يُضِلُّوكَ وَمَا يُضِلُّونَ إِلاُّ أَنفُسَهُمْ وَمَا يَضُرُّونَكَ مِن شَيْءٍ وَأَنزَلَ اللّهُ عَلَيْكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَعَلَّمَكَ مَا لَمْ تَكُنْ تَعْلَمُ وَكَانَ فَضْلُ اللّهِ عَلَيْكَ عَظِيماً

(Nisa, 4/113)

«(Ey Məhəmməd!) … Allah sənə Kitabı və hikməti endirmiş, bilmədiyin şeyləri də öyrətmişdir. Allahın sənin üzərindəki fəzl və inayəti çox böyükdür».

Turunc baharın gəlişini soraq verir. Bahar da işıqdır, gözəldir, sevgidir, sevincdir. Deməli, hz.Məhəmməd (s.a.s.) və bütün Peyğəmbərlər insanlığa Allahın (c.c.) nurunu daşıyan fədakar, cəsur, iman, iradə, ağıl sahibi insanlardır.

Hz.Nizami beytdə əvvəl, sonra, meyvə, bahar sözlərindən də yerində istifadə etmişdir. Turunc meyvə olmaq özəlliyi ilə başqa meyvələrə bənzəyir. Ancaq mahiyyətinə görə başqalarından seçilir. Hz.Məhəmməd (s.a.s.) də adi insandır, yeyir, içir, evlənir, sevinir, kədərlənir,

ancaq mənada hamıdan seçilir. Burada başqa bir islam böyüyü hz.Mövlana yada düşür. Gəlin, onu dinləyək: «İnsanı insan edən özdür (mənadır), adam şəkillə insan olsa idi, Əhmədlə Əbu Cəhl bir olardı. Peyğəmbər görünüşdə «sizin cinsinizdənəm», deyir, ancaq könül baxımından «ona vəhy edilir» sözüylə görüş sahibidir o»[144]

Turunc hz.Nizaminin yorumunda hz.Məhəmmədin (s.a.s.) başqalarından fərqini necə aydın göstərir! Turunca verilən bu özəllik Allahdan (c.c.) olduğu kimi, hz.Məhəmmədə (s.a.s.) verilənlər də yaradan Allahın (c.c.) buyruğu ilə oldu. **İndi gəlin, hz.Nizaminin sözlə çəkdiyi tablonun görünüşünə və mənasına yuxarıda verilən anlamlarla baxaq: gözəl rəngli, firuzəyi kərpicdən hörülmüş günbəzin altında yerləşmiş, saray behiştində yetişmiş, dadlı, uca Allahdan (c.c.) səadət məmləkəti qurmaq buyruğu ilə kamal fərmanı almış, ilk-son olan, cəhalətin (qışın) düşməni, yazın (işığın) müjdəçisi, cəsur, fədakar, iradəli, sədaqətli, sarsılmaz iman sahibi turunc – hz.Məhəmməd (s.a.s). Hz.Nizami ideyanı bədii boyalarla elə çəkmiş, mənaları elə əyaniləşdirmişdir ki, bütün anlam gözlə görünən, anlaşılan olmuşdur. Hz. Nizami naxışları son dərəcə dəqiq seçmişdir, burada içlə dış birləşmiş, hər naxış, hər ilmə məna ilə yüklənmişdir. Burada divan ədəbiyyatının «qissədən hissə» prinsipini (şairlər bir ideyanı bir hekayə biçimində verərək mənanın anlaşılmasını asanlaşdırırlar) «obrazdan anlama», «obrazdan (simvoldan) görmə» yolu (metodu) əvəz edir.**

Hz.Mövlana da hz. Peyğəmbərin (s.a.s.) mənaca başqalarından seçildiyini dəniz, meyvə, meyvə toxumu, su qaynağı kimi görünən anlayışlarla izah etmişdir. «Görünüşdə

[144]Tasavvuf, göstərilən qaynaq, s. 105.

meyvə ağacdan doğsa da, gerçəkdə ağac meyvədən doğmuşdur. Mustafa da bunun üçün: «Adəm də, başqa Peyğəmbərlər də mənim ardımdadır, mənim sancağımın altındadır», dedi. O hünərlər sahibi: «Bunun üçün biz sonra gələnlərik, ancaq önə keçənlərik», buyurmuşdur. Demişdir ki, görünüşdə Adəm oğluyam, ancaq anlam baxımından Adəmin atasının da atasıyam mən. Mələklərin səcdələri mənə idi. Adəm yeddinci qat göyə mənim ardımdan ayaq basdı. Elə isə məna baxımından atam məndən doğulmuşdur, elə isə məna baxımından ağac da meyvədən doğulmuşdur».[145]

Biz yuxarıda xatırlatdıq, əsaslandırdıq ki, hz. Nizami şərh etdiyimiz ilk beş beytdə iki başlıca ideyanı bədii biçimdə təqdim edib. Bunlardan biri varlığın addım-addım yaradılışı, ikincisi də hz.Məhəmmədin (s.a.s.) ilk-son olmasıdır. Birinci beytdə bu ideyalar islam düşüncəsində son dərəcə güclü, dərin məna ilə yüklənmiş «lövhə», «əlif», «Əhməd» anlayışları ilə, ikinci beytdə «əlif»in hərfləri düzərək onları mənalandırması ilə, üçüncü beytdə «səadət məmləkəti», «kamal fərmanı» anlayışları ilə, dördüncü beytdə firuzə rəngli kərpicdən tikilmiş günbəzin altında taxt qurmuş, saray behiştində yetişmiş, meyvə-turunc anlayışları ilə, beşinci beytdə isə «meyvə», «bahar» qavramları ilə vermişdir. Burada hz.Nizaminin ideyanı ifadə gücü, fikri təqdim imkanları göz önündədir. Hz.Nizami anlayışları, fərqli qavramları bir ideya ətrafında elə mənalandırmış, onları bir-birinə elə hörmüşdür ki, ilk-son ideyası tam görünən bir gözəl mənzərəyə çevrilmişdir.

Düşüncəmizi bir az da açıqlayaq. Məsələn, ilk baxışda «lövhə», «əlif» qavramları ilə «turunc», «meyvə», «bahar» anlayışları arasında bir bağlılıq yoxdur. Ancaq hz.Nizami bu

---

[145] Tasavvuf, göstərilən qaynaq, s. 106.

qavramları hər birinin məna imkanlarından yararlanaraq bir sapa düzmüşdür. Ya da bir başqa misala baxaq. Hz.Nizami «meyvə-turunc» anlayışının bütün imkanlarından yararlanmışdır. Belə ki, meyvə hz.Məhəmmədin (s.a.s.) varlığın mənası olduğunu anladır. Meyvə ağacın ən önəmli, dəyərli bərəkəti olduğundan Peyğəmbərin (s.a.s.) ən bərəkətli varlıq olduğunu göstərir, turuncun rəngi Peyğəmbərin (s.a.s.) nurunu xatırladır, turuncun yetişmə zamanı və öncə meyvə verib sonra çiçək açma özəlliyi hz.Məhəmmədin (s.a.s.) ilk-son olma ideyasını gözəl ifadə edir. Bundan başqa meyvə son dərəcə təmiz, çıxarı olmayan bir nemətdir. Təsadüfi deyildir ki, uca Allah cənnət nemətləri sırasında hər zaman meyvənin olduğunu müjdələyir:

لَهُمْ فِيهَا فَاكِهَةٌ وَلَهُم مَّا يَدَّعُونَ

(Yasin, 36/57)

«Orada onlar üçün meyvələr vardır. Onlar üçün istədikləri hər şey vardır».

إِنَّ الْمُتَّقِينَ فِي مَقَامٍ أَمِينٍ . فِي جَنَّاتٍ وَعُيُونٍ .يَلْبَسُونَ مِن سُندُسٍ وَإِسْتَبْرَقٍ مُّتَقَابِلِينَ . كَذَلِكَ وَزَوَّجْنَاهُم بِحُورٍ عِينٍ . يَدْعُونَ فِيهَا بِكُلِّ فَاكِهَةٍ آمِنِينَ

(Duhan, 44/51-52-55)

«Allahdan çəkinənlər əmin bir yerdə, bağçalarda və bulaq başındadırlar… Orada hər qorxudan əmin olaraq hər çeşid meyvədən istərlər».

**Hz.Nizami də hz.Məhəmmədi (s.a.s.) saray behiştində yetişmiş meyvəyə bənzədərək onun təmiz, bərəkətli olduğunu önə çəkmişdir. Bundan başqa meyvə bərəkətin, nemətin davamı üçün toxumları içində, ən dərin qatında, bətnində gizləyir, onları qoruyur. Hz.Məhəmməd (s.a.s.) də**

**bir qoruyucudur. O, insanlığı şərdən, pisliklərdən qoruyur. Meyvəyə verilmiş əmanət toxumdur. Hz. Məhəmmədə (s.a.s.) verilmiş əmanət Allahın buyruqlarıdır.**

Hz.Nizami Peyğəmbəri bir sonsuz səma altında təsvir edir. Bu firuzəyi rəngli səma altında hz.Məhəmmədin (s.a.s.) dəyəri açıqlanır. Bu sonsuz səma Allahın (c.c.) ona olan sevgisinin, onun Allaha olan yaxınlığının simvolu kimi dəyərləndirilir.

Beşinci beytdə turuncun hz. Nizamiyə verdiyi imkanlardan biri də hz.Məhəmmədin ilk-son Peyğəmbər olması düşüncəsini biçimləndirməsidir.

## HƏZRƏT MÖVLANAYA GÖRƏ MƏHƏMMƏDİN (s.a.s) NURU

Hz.Mövlana, hz.Məhəmmədin (s.a.s.) ilk-son olmasını təsəvvüfün ən önəmli dəyərlərindən biri olan «Məhəmmədin nuru», «Məhəmmədin həqiqəti» anlayışları içində şərh etmişdir. «And olsun o Tanrıya ki, aşağılıq torpaqdan ulular ulusu bir birinci yaratmışdır. Torpaqdan yaradılanları arıtdı da, göydəkilərdən irəli keçirdi, üstün etdi onları. Atəşdən aldı, ap-arı bir nur halına qoydu. Ondan sonra da o işıqla bütün işıqları parlatdı. Parıl- parıl parlayan o işıq canlara vurdu da, Adəm o işıqla bilgi sahibi oldu. Adəmdən bitip Şitin büründüyü işığı… Adəm onu Şitdə gördü də, yerinə xəlifə təyin etdi. Nuh o işıqdan işıqlandı da, can dənizinin havasında incilər yağdırdı. İbrahimin canı, o işıqda işıqlandı da, heç çəkinmədən atəş dilimlərinə daldı. İsmayıl o işığın irmağına düşdü də, su verilmiş xəncərə boynunu, başını uzatdı. Davudun canı onun istisi ilə qızışdı, dəmir əlində yumşaldı. Suleyman onun vüsal südünü əmdi, dəvələr buyruğuna girdilər, qul-kölə kəsildilər. Yaqub onun qəzasına

baş qoydu da, oğlunun qoxusu ilə gözü aydın oldu. Ay üzlü Yusuf o günəşi gördü, ona görə də röya yorumunda o qədər oyanıq oldu. Sopa Musanın əlindən su içdi, Fironun səltənətini bir loxma etdi, uddu. Məryəm oğlu İsa o işığın nərdivanını tapdı, tez göyün dördüncü qat ucalığına çıxdı. Məhəmməd o mülkü, o neməti tapdı da bir anda ay dəyirmisini ikiyə böldü»[146]

Hz.Nizami də bu görüşün içərisindədir. O, beşinci beytdə «turunc» meyvəsinin özəlliyi ilə ifadə etdiyi ilk-son ideyasını altıncı beytdə də açıq bir biçimdə, hədisə dayanaraq şərh edir.

[146]Tasavvuf, göstərilən qaynaq, s. 106.

## ALTINCI BEYTİN ŞƏRHİ: PEYĞƏMBƏRLİYƏ SON QOYULMASI ONA HƏVALƏ OLUNDU

كنت نبياً چو علم پيش برد
ختم نبوت به محمد سپرد

***«Mən Peyğəmbər idim…» bayrağını bütün (Peyğəmbərlərdən) qabaq qaldırmışdı.***

***Və Peyğəmbərliyə son qoyulması Məhəmmədə həvalə olundu»***[147]

## BEYTİN DİNİ QAYNAĞI

Hz.Nizaminin bu beytdə ifadə etdiyi fikrin dini qaynağına baxaq. Hz.Məhəmmədin (s.a.s.) ilk Peyğəmbər olması ilə bağlı üç hədisi var. Doğrudur, Təbarani, Tırmizi, İbn Teymiyə, Əs-Suyuti, Əs-Saqani kimi alimlər bu hədislərin zəif olduğunu bildirmişlər.[148] Ancaq bu hədislər, onlarda ifadə olunan fikirlər dillərdə əzbər olmuş, hz.Nizami, hz.Mövlana, yüzlərlə islam böyüyü bu hədislərin doğruluğuna inanmış, bu ideyanın üzərində qurulmuş şeirlər yazmışlar.

İndi hz.Nizaminin beytinin işarə etdiyi hədislərin mətninə baxaq:

«Allahın ilk yaratdığı mənim nurumdur».

Bu hədis «Allahın ilk yaratdığı mənim ruhumdur», «Allahın ilk yaratdığı ağıldır», «Allahın ilk yaratdığı Qələmdir» şəklində də rəvayət olunur.[149]

İkinci hədis: «Adəm su ilə palçıq arasında ikən mən peyğəmbər idim».[150]

---

[147] Nizami Gəncəvi, Sirlər xəzinəsi, s. 25.
[148] El-Elbani, Silsiletül-Ehadis, c. I, s. 203; Mevlana Şibli, Asri-Saadet, c. III, s. 166.
[149] Emine Yeniterzi, göstərilən qaynaq, s. 148.

Üçüncü hədis : «Sən olmasan, sən olmasan, fələkləri yaratmazdım»[151].

Hz.Nizaminin üz tutduğu «Mən Peyğəmbər idim…» hədisi ilə bağlı başqa rəvayətlər də var. Məsələn, İmam Əbdür Rəzzaqın rəvayətinə görə, Cabir bin Abdullah əl-Ənsari buyurmuşdur: «Ya Resulallah! Anam, babam sana feda olsun. Allah Teala hezretlerinin cümle eşyadan evvel halk ettigi ne nesnedir?, dedim.

Buyurdu: «Ya Cabir! Tahkikan Allah tebareke ve teala hazretleri cemi eşyadan evvel Senin peyğamberinin nurunu kendi nurundan yaratdı. Dahi şöyle eyledi ki, o nur Allah Tealanın kudretiyle diledigi yerlerde devr edib gezerdi. O zaman ne levh, ne gök, ne yer, ne güneş, ne ay, ne cin, ne de ins vardı. Hasili mahlukattan bir nesne yaratılmamışdı»[152].

Hz.Ömərdən belə bir rəvayət var: «Resulullah (s.a.s.) buyurdu:

- Adem (s.a.s.) hatayı işleyip günahgar olduğu zamanda: Ya Rabb! Muhammed (s.a.s.) hakkı için beni mağfiret eyle, dedi.

Uca Allah:

- Ya Adem, sen Muhammedi nice bildin ki, Ben onu henuz halk etmedim!, – deye buyurdu.

Adem (s.a.s.):

- Oradan bildim ki, Sen beni kudret elinle halk edip bana ruh nefh ettiyin zamanda başımı kaldırıp arş üzerinde: la ilahe illallah Muhammeden rasulullah yazılmış gördüm. Bildim ki, Sen ismi-şerifini ancak Sana cemi halkın en sevgilisi olan bir kimsenin ismine muzaf eylersin, dedi.

---

150 Emine Yeniterzi, göstərilən qaynaq, s. 152.
151 Emine Yeniterzi, göstərilən qaynaq, s. 155.
152 Altınoluk dergisi, sayı 134, Haziran, 2001, s. 26.

Uca Allah:

- Ya Adem! Doğru söyledin. O, bana halkın en sevgilisidir. Madem ki, onun hürmetine benden mağfiret istedin, muhakkak Ben seni afv eyledim. Eger Muhammed (s.a.s) olmasaydı, seni halk etmezdim» - buyurdu.[153]

## DİVAN ŞEİRİNƏ GÖRƏ İLK YARADILAN NUR

Ərzurumlu Darirə görə, ilk yaradılan ruh hz. Peyğəmbərin (s.a.s.) ruhu, ilk nur onun nuru, ilk ağıl onun ağlıdır və bütün əşyadan öncə Qələm yaradılmışdır.[154]

Divan şeirində isə uca Allahın (c.c.) ilk yaratdığı cövhərin hz.Məhəmmədin (s.a.s.) nuru olduğu bildirilir. Sonra bu nura «əqli-mücərrəd», «əqli-küll», «cövhəri-əvvəl», «lövhi-mahfuz», «ruhi-izafi» kimi adlar verilmişdir. «Allahın nuri-Muhammediden sırası ile meleklerin, peyğamberlerin, velilerin, ariflerin, abidlerin, müminlerin, kafirlerin, cinlerin, şeytanların, hayvanların, bitkilerin ve tabiatların ruhlarını yaratdığı, aradan iki bin sene geçtikten sonra da cisimler alemi olarak yine aynı cevherden arşı-azam, kürsi, cennet, cehennem, yedi kat gökler ve anasiri –erbaanın yaratıldığı telakkısı yer alır»[155]

**Nəbi:**

«Evvelü ma halakallah» ki senün nurundur,
Seni idrak edecek kimdür eya Nuri-Cevad.[156]

(İlk yaradılan nur sənin nurundur. Ey əbədi nur, səni dərk edəcək bir kimsə varmı?)

**Şeyx Qalib:**

Çün «Evvelü ma halak» dur ol Nur,

---

[153] Altınoluk dergisi, göstərilən qaynaq, s. 26.
[154] Emine Yeniterzi, göstərilən qaynaq, s. 149.
[155] Ali Nihad Tarlan, Şeyhi Divanını tedkik, s. 224.
[156] Emine Yeniterzi, göstərilən qaynaq, s. 142

Sani-i Huda disem de mazur.[157]

(İlk yaradılan nur onun nuru olduğundan Ona ikinci Allah desəm, üzürlüyəm)

İkinci hədislə bağlı divan ədəbiyyatından nümunələr:

**Şəmsi:**

Dedin «küntü nebiyyen», hem de «beynel-mai vet-tin» sen,

Nübüvvette sana hastır asalet ya Resulallah»[158]

(Dedin ki, «mən peyğəmbər idim», həm də Adəm su ilə palçıq olduğu vaxt. Peyğəmbərlik sənə layiqdir)

**Xüdayi:**

Nebi idün dahi Adem dururken ma utin içre,

İmami-enbiya olsan, revadur ya Resullah.[159]

(Adəm palçıq içində olarkən Sən peyğəmbər idin. Peyğəmbərlərin başçısı olsan, haqdır)

**Əhməd Rəmzi Ağürək:**

Adem ki henuz tin idi umman arasında,

İsmin okudu Sure-i Rahman arasında.[160]

(Adəm ummanda palçıq olanda adını Rəhman surəsində oxudu)

**Füzuli:**

Ey vücudun əsəri-xilqəti-əşya səbəbi,

Nəbi ol vaxt ki, bilfel gərəkməzdi nəbi.[161]

---

[157] Emine Yeniterzi, göstərilən qaynaq, s. 149.
[158] Emine Yeniterzi, göstərilən qaynaq, s. 158.
[159] Emine Yeniterzi, göstərilən qaynaq, s. 153.
[160] Emine Yeniterzi, göstərilən qaynaq, s. 153.
[161] Emine Yeniterzi, göstərilən qaynaq, s. 153.

(Ey varlığı hər şeyin yaradılmasının səbəbi olan, peyğəmbər, sən o vaxt peyğəmbər idin ki, peyğəmbərə ehtiyac yox idi)

Üçüncü hədisin divan şeirindəki izləri:

**Niyazi Misri:**

Gelmeseydün aleme sen halk olınmazdı cihan,
Dostlıquna yaradıldı, ey Nebiyy-i Muhterem.[162]

(Sən aləmə gəlməsə idin, dünya yaradılmazdı. Bu varlıq sənin dostluğun xatirinə yaradıldı)

**Şeyxi:**

Bu arş u ferş ü ins ü cinn ü eflak,
Buyurur hak kı olmaz idi «Levlak»[163]

(Bu yer, göy, fələklər, insanlar, cinlər sən olmasaydın, yaradılmazdı)

**Şemsi:**

Senin nurundan aldı varlığın encüm, kamer, eflak,
Onunçün şanına «Levlak» denildi, ey kerem kanı.[164]

(Fələklər, ay, bütün varlıq nurunu səndən aldı, ona görə də sənin şanına «sən olmasaydın…» deyildi).

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) ANLAYIŞININ TƏFSİRİ

Ali Nihad Tarlan «Məhəmməd nuru»ndan danışarkən önəmli bir məsələyə toxunur: «Kainatın yaratılışındakı qayeyi hz.Peyğamberin (s.a.s.) yalnızca maddi varlığında aramak hatadır. Asıl önemli unsur Onunun maddi varlığının altında

[162] Emine Yeniterzi, göstərilən qaynaq, s. 156.
[163] Emine Yeniterzi, göstərilən qaynaq, s. 156.
[164] Emine Yeniterzi, göstərilən qaynaq, s. 156.

gizlenen manayi-Muhammedidir ki, bu da yaradılış kanunu demekdir. Zira hiç bir şey belli bir kanuna tabe olmadan vücuda gelmez. Zatı ve manası böylesine yüce olan peyğamberin maddi varlığı da Kurani-Kerimle vasıflandırılmışdır. Çünki Kurani-Kerim kelimeler halinde madde alemine indirilirken hz.Peyğamberden (s.a.s.) sudur etmişdir. Bu cihetle hz. Peyğamber (s.a.s.) adeta Kuranın zarfı; Kurani-Kerimde ele alınan yaratılış nizamı, yani manayi-Muhammedi de Onun madde alemindeki görünüşüdür»[165]

Uca Allahın (c.c.) kainatı hz.Məhəmmədin (s.a.s.) varlığı səbəbi ilə yaratdığı düşüncəsini hz.Mövlana daha da irəli aparır. Hz.Mövlanaya görə, hz.Məhəmməd (s.a.s.) : «Yaxşı işlərdə imam olan, kərəmlərə, kəramətlərə düzən verəndir»[166]. «Ona bənzər nə gəlmişdir, nə də gələcək»[167]. «O olmasaydı, göy üzü olmazdı, dönməzdi, nurlanmazdı, mələklər yurd olmazdı. O olmasaydı, dənizlər olmaz, dənizlərdəki heybət yaranmaz, balıqlar və padişahlara layiq incilər meydana gəlməzdi. Yenə o olmasaydı, yer üzü olmaz, yer üzünün içində dəfinələr, dışında yasəmənlər yaradılmazdı»[168].

Mövlanaya görə, hz.Məhəmməd (s.a.s.) «Təzə bəxt dostumuz, ona can vermək işimiz-gücümüz, kervanbaşımız da dünyanın öyündüyü Mustafa bizim»[169], «O, eşq mədəni»[170], «O, kərəm dənizi»[171], «O, aləmin də, adəmin də ən son başı, ən böyüyü, ən yaxşısı, insanlarla cinlərin

---

[165] Ali Nihad Tarlan, Natlar arasında, 1964, s. IV, s. 44.
[166] Tasavvuf, göstərilən qaynaq, s. 68.
[167] Tasavvuf, göstərilən qaynaq, s. 69.
[168] Tasavvuf, göstərilən qaynaq, s. 69.
[169] Tasavvuf, göstərilən qaynaq, s. 69.
[170] Tasavvuf, göstərilən qaynaq, s. 69.
[171] Tasavvuf, göstərilən qaynaq, s. 69.

peyğəmbəri, iki aləmin günəşi, aləmin rəhməti, Adəm oğullarının öyüncü»[172].

## HƏZRƏT NİZAMİNİN «BAYRAQ QALDIRMAQ» ANLAYIŞINA VERDİYİ MƏNA

Hz.Nizaminin altıncı beytinin birinci misrasında yer tutan «Mən peyğəmbər idim…» anlayışının dini qaynağının hz.Məhəmmədin hədisləri olduğu aydındır. Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) ilk olduğu düşüncəsini daha da gücləndirmək üçün «… bayrağını bütün (peyğəmbərlərdən) qabaq qaldırmışdı» fikrini də birinci misraya artırır. **Burada «bayraq qaldırmaq» anlayışı bir neçə yöndən şərh oluna bilər. «Bayraq qaldırmaq» öndə olmaq, ilk olmaq, liderlik, başçılıq, güclü olmaq, bir ideyanın əsasını qoymaq, doğru bir ideya adına savaşmaq, fərqlənmək, qalib gəlmək, yol göstərmək mənalarını ehtiva edir.** Bu mənaların hamısını «bayraq qaldırmaq» qəlibinə yerləşdirən hz.Nizami islam Peyğəmbərinin həyatının, ilahi missiyasının məzmun və hədəfini dəqiq göstərmişdir. Gerçəkdən də hz.Məhəmməd (s.a.s.) ilahi qaynaqlı, əbədi dalğalanacaq, insanları azadlığı çağıracaq, onlara doğru yol göstərəcək, heç vaxt enməyəcək bir qurtuluş bayrağının yenilməz daşıyıcısıdır.

**Bu da diqqəti çəkir ki, hz.Məhəmməd (s.a.s.) öz xəbərdaredici missiyasını bayraq obrazı ilə bildirmişdir.** İnsanları cəhalətdən, köləlikdən qurtarıb ancaq uca Allaha ibadətə çağıran, onları xilas uğrunda varlığını fəda edən hz.Məhəmməd (s.a.s.), Əbu Musa əl Əşaridən rəvayət edilən bir hədisində belə buyurur: «Mənim və Allahın məni özüylə göndərdiyi islamın durumu bir topluluğa gəlib belə deyən bir insanın halı kimidir: «Ey millətim! Mən (üzərinizə gəlməkdə olan) bir düşmən ordusunu gözlərimlə gördüm. Mən çılpaq

[172] Tasavvuf, göstərilən qaynaq, s. 69.

bir xəbərdarediciyəm. Başınızın çarəsinə baxın!» Millətindən bir qrup onun bu sözlərinə inanıb, onu dinləyib adətləri üzərə axşamdan yola çıxıb oradan ayrıldılar və yaxalarını qurtardılar. Ancaq onlardan bir qrup da o kişini yalançı sayıb, yerlərində qaldılar. Ordu onlara basqın etdi, hamısını həlak edib, köklərini də kəsdi. Mənə itaət edən və gətirdiyimə uyanlarla, mənə üsyan edib, haqq olaraq gətirdiyimi yalan sayanların durumu bundan ibarətdir»[173].

**Bu hədisdə hz.Məhəmməd (s.a.s.) öz qurtuluş missiyasını önə çəkir və bunu ifadə etmək üçün «çılpaq bir uyarıcı (xəbərdaredici)» deyimindən yararlanır.** Bilindiyi kimi, ərəblər arasında belə bir qayda geniş yayılmışdı. Onlar içərilərindən ən inandıqları adamı gözətçi olaraq kəndin kənarına göndərirdilər. Onun vəzifəsi adamları düşmənin hücumundan xəbərdar etmək idi. O, bu vəzifəni yerinə yetirmək üçün düşmən gələndə paltarını soyunub bir ağacın başına keçirər və bayraq kimi dalğalandırardı.

**Hz.Məhəmməd (s.a.s.) də özünü bu bayraq dalğalandırana bənzədir, insanları qurtuluşa çağırır.** Elə Qurani-Kərimdə də xəbərdar etmək uca Allah (c.c.) tərəfindən Peyğəmbərin (s.a.s.) vəzifələrindən biri kimi müəyyənləşdirilmişdir:

قُل لاَّ أَمْلِكُ لِنَفْسِي نَفْعاً وَلاَ ضَرّاً إِلاَّ مَا شَاء اللّهُ وَلَوْ كُنتُ أَعْلَمُ الْغَيْبَ لاَسْتَكْثَرْتُ مِنَ الْخَيْرِ وَمَا مَسَّنِيَ السُّوءُ إِنْ أَنَاْ إِلاَّ نَذِيرٌ وَبَشِيرٌ لِّقَوْمٍ يُؤْمِنُونَ

(Əraf, 7/188)

«Ey Məhəmməd! De ki, özümə Allahın dilədiyindən başqa nə bir fayda, nə də bir zərər vermək əlimdə deyil. Əgər qeybi bilsəydim, əlbəttə, daha çox xeyir əldə etmək istərdim və mənə bir pislik toxunmazdı. Ancaq mən inanan

---

[173] Riyazüs Salihin, göstərilən qaynaq, c. I, s. 35.

kimsələr üçün bir uyarıcı (xəbərdaredici) və bir müjdə-çiyəm».

**Qurana görə, insanları uyarmaq, «xəbərdarlıq bayrağı qaldırmaq» hz.Məhəmmədin vəzifəsidir.** O, bu vəzifəni yerinə yetirməyə borcludur. Hz.Nizaminin də dediyi «Mən peyğəmbər idim…», «bayrağı bütün peyğəmbərlərdən qabaq qaldırmaq» anlayışları Peyğəmbərin (s.a.s.) vəzifəsinə, məsuliyyətinə işarə edir. Bu həm də Allahın (c.c.) varlığını, birliyini bildirmək şərəfi və məsuliyyətidir:

يَا أَيُّهَا الْمُدَّثِّرُ  قُمْ فَأَنذِرْ

(Müddəsir, 74/1-2)

«Ey bürünüb sarınan! Qalx, insanları uyar».

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ وَاللّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ إِنَّ اللّهَ لاَ يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ

(Maidə, 5/67)

«Ey Rəsul! Rəbbindən sənə endiriləni təbliğ et. Əgər bunu etməsən, onun elçiliyini yerinə yetirməmiş olarsan. Allah səni insanlardan qoruyacaqdır. Doğrusu, Allah kafirlər topluluğuna rəhbərlik etməz».

فَذَكِّرْ إِن نَّفَعَتِ الذِّكْرَى

(Əla, 87/9)

«Əgər öyüd fayda verirsə, öyüd ver».

وَذَكِّرْ فَإِنَّ الذِّكْرَى تَنفَعُ الْمُؤْمِنِينَ

(Zariyat, 51/55)

«Sən yenə də öyüd ver. Çünki öyüd möminlərə fayda verir».

كَذَلِكَ أَرْسَلْنَاكَ فِي أُمَّةٍ قَدْ خَلَتْ مِن قَبْلِهَا أُمَمٌ لِّتَتْلُوَ عَلَيْهِمُ الَّذِيَ أَوْحَيْنَا إِلَيْكَ وَهُمْ يَكْفُرُونَ بِالرَّحْمَنِ قُلْ هُوَ رَبِّي لا إِلَـهَ إِلاَّ هُوَ عَلَيْهِ تَوَكَّلْتُ وَإِلَيْهِ مَتَابِ

(Rəd, 13/30)

«(Ey Rəsulum! Səndən əvvəl peyğəmbərlər gön dərdiyimiz kimi) səni də özündən əvvəl çoxlu ümmətlər gəlib-getmiş bir ümmətə Peyğəmbər göndərdik ki, onlar Rəhmanı (Allahı) inkar etdikləri halda, sənə vəhy etdiyimizi (Quranı) onlara oxuyasan. De: «O (Rəhman) mənim Rəbbimdir. Ondan başqa heç bir Tanrı yoxdur. Mən ancaq Ona təvəkkül etdim. Axır dönüşüm (ya da tövbəm) də yalnız Onadır!».

**«Bayraq qaldırmaq» bir də hakimiyyət deməkdir.** Gerçəkdən, hz.Məhəmməd (s.a.s.) Allahın (c.c.) izni ilə peyğəmbərlik bayrağı qaldırdı, uca Allah (c.c.) ona bir əbədi hakimiyyət verdi. Burada «bayraq qaldırmaq» peyğəmbərlik anlayışının mənasına da işıq tutur. Bilindiyi kimi, peyğəmbərlik inanc sistemi, qurumları olan bir quruluşdur. Bizcə, hz.Nizaminin «bayraq qaldırmaq» qavramı yuxarıda deyilən bütün mənaları ehtiva edir.

**Bayraq anlayışı nətlərdə hz.Peyğəmbərin (s.a.s.) məhşərdəki şəfaətinin, ümmətinin qurtuluşunun da simvoludur.** Dini inanışa görə, hz.Məhəmməd (s.a.s.) axirətdə ümmətinə şəfaət üçün icazə alacaq. Onun ümməti Livai-Həmd adı verilən bayrağının altına toplanacaq. İnanışa görə, bu bayrağın uzunluğu min illik, eni də beş yüz illik yol qədərdir. Bu bayrağın üzərinə: «Bismillahir-Rəhmanir-Rəhim, Əlhəmdü Lillahi Rəbil Aləmin və La ilahə illallah Məhəmmədən Rəsulullah» yazılmışdır. Nətlərdə bu bayraq «Livai-inayət», «Livai-məhəbbət», «rəhmət aləmi» kimi də adlandırılmışdır. Bu da hz.Məhəmmədin (s.a.s.) qiyamətdə ümmətinin lideri olacağının göstəricisidir. Bu bayraq insanları qiyamətin atəşindən qoruyacaqdır. İnanan insanlar onları qiyamətdə bu

bayrağın altına toplayacaq əməl sahibi olmağa çalışırlar. Divan şairi **Yəhya bəy** bu mənaları belə ifadə edib:

Livaül-hamdidür şemi-hidayet,
Olupdur bayrağı nuri-şafaat.[174]

(O, qurtuluş bayrağıdır, onun bayrağı şəfaət nurudur)

Hz.Nizami altıncı beytdə birinci misrada «bayraq qaldırmaq» - ilk olmaq, ikinci misrada «Peyğəmbərliyə son qoymaq» - son olmaq bir arada işlətmişdir. Bu yolla da o, birinci beytdən başlayaraq ayrı-ayrı yollarla, dini-bədii anlayış və obrazlarla açıqladığı hz.Məhəmmədin (s.a.s.) ilk-son olması düşüncəsini daha da gücləndirmişdir.

Bilindiyi kimi, hz.Məhəmmədin (s.a.s.) son peyğəmbər olması Qurani-Kərimdə təsbit olunmuşdur:

مَّا كَانَ مُحَمَّدٌ أَبَا أَحَدٍ مِّن رِّجَالِكُمْ وَلَكِن رَّسُولَ اللَّهِ وَخَاتَمَ النَّبِيِّينَ وَكَانَ اللَّهُ بِكُلِّ شَيْءٍ عَلِيماً

(Əhzab, 33/40)

«(Və bilin ki, ey möminlər) Məhəmməd sizin adamlarınızdan heç birinin atası deyildir, ancaq o, Allahın elçisi və bütün Peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi haqqı ilə biləndir».

Hz.Məhəmməd (s.a.s.) hədislərində də sonuncu peyğəmbər olduğunu açıqlamışdır. Cübeyr b. Mutim (r.a) rəvayət edir: «Rəsulullah(s.a.s.): «Mənim beş adım vardır: mən Məhəmmədəm, Əhmədəm mən, Allahın mənimlə küfrü sildiyi Mahiyəm (silən) və yenə mən insanların izim boyu toplandığı Haşirəm (Toplayan), mən Aqibəm (sonuncu)» buyurdu.[175]

[174] Emine Yeniterzi, göstərilən qaynaq, s. 307.
[175] Müttefekun aleyh hadisler (metinsiz), Konya, 2004, s. 484.

Əbu Hüreyrədən (r.a.) rəvayət edilən bir hədisdə deyilir: «Rəsulullah (s.a.s.): Mənim misalımla başqa Peyğəmbərlərin misalı köşədə bir kərpiclik yerdən başqa ən gözəl və ən yaxşı bir ev tikən kimsəyə bənzər. İnsanlar içini dolaşmağa başlayıb bu kimsəyə heyrət edərək: «Bura bu kərpicin qoyulması gərək deyilmi?», - deyərlər. Mən o kərpicəm, mən Peyğəmbərlərin sonuncusuyam»,- buyurdu»[176].

Hz.Məhəmmədin (s.a.s.) sonuncu peyğəmbər olması ilə bağlı ayələri təfsir edən alimlər «O, sizlərdən kimsənin atası deyildir…» mesajını o, bəlli bir insanın, bir qrupun atası deyil, bütün toplumun atasıdır, yəni o, bütün insanlığa göndərilmişdir kimi yozmuşlar. Təfsirçilərə görə, möhür bir sənədin sonunu göstərdiyi kimi, o da Peyğəmbərlərin sonuncusudur. «Xatəm» termini yuxarıdakı anlamla birgə bir şeyin «sonu», «sonucu» anlamındakı «xitam» qavramı ilə də bir mənanı daşıyır. Buradan da o anlaşılır ki, Quran bütün ilahi vəhylərin sonu və canıdır.[177]

Təbiidir ki, uca Allah ilk-son olmaq şərəfini hz. Məhəmmədə (s.a.s.) verməklə onu özünə ən yaxın qul saydığını göstərmişdir. Hz.Nizami də ilk-son olmaq şərəf və məsuliyyətini Allahın (c.c.) hz.Məhəmmədə (s.a.s.) sevgisi kimi dəyərləndirib. O, beytdə ilk-son anlayışlarını bir araya gətirərək bunu hz.Məhəmmədin (s.a.s.) başqalarından üstünlüyü və önəmli fərqi kimi təqdim etmişdir.

Hz.Məhəmmədlə (s.a.s.) peyğəmbərlik sona çatır, ancaq Musa Carullah Bikiyevin dediyi kimi «ümmətin risaləti» dönəmi başlayır. İslamı öyrənmək, yaymaq, dünyanı islamla aydınlatmaq hz.Məhəmmədin (s.a.s.) ümmətinin vəzifəsidir.

---

[176] Müttefekun aleyh hadisler (metinsiz), Konya, 2004, s. 475.

[177] Muhammed Esed, Kuran mesajı (meal-təfsir), İstanbul, 2002, s. 860.

## YEDDİNCİ BEYTİN ŞƏRHİ: AY ÜZÜNÜN ZƏBƏRCƏD DAŞLI QAŞINDA ONUN ADI HƏKK OLUNUB

Hz.Nizami nətin yeddinci beytindən başlayaraq birinci beytdən şərh etdiyi hz.Məhəmmədin ilk-son olması düşüncəsini yeni bir mərhələyə keçirir. Hz.Nizami artıq Peyğəmbərin (s.a.s.) başqa özəlliklərini təqdim edir:

مه که نگیـن دان زبرجد شد ست
خاتم او مُهـر محمد شدست

***Ay üzünün zəbərcəd daşlı qaşında,***
***Məhəmmədin möhürü həkk olunmuşdur.***[178]

Öncə onu deyək ki, hz.Nizami bu və sonrakı beytdə başlıca ideya olaraq hz.Məhəmmədin (s.a.s.) ilahi qaynaqlı hakimiyyətinin gücünü, ölçülərini sözün bədii imkanları ilə verib. O, bu ideyanı vermək üçün bir sıra anlayışlardan, bu anlayışların dini, ədəbi-bədii imkanlarından yararlanıb. Beytdə ideyanın verilməsində «Ay», «zəbərcəd daşı», «Məhəmmədin möhürü» kimi anlayışlar önəmli yer tutur.

## AY PLANETİNİN İSLAM DİNİNDƏ YERİ

Bilindiyi kimi Ayın islam dinində önəmli yeri var:

وَالشَّمْسُ تَجْرِي لِمُسْتَقَرٍّ لَّهَا ذَٰلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِ . وَالْقَمَرَ قَدَّرْنَاهُ مَنَازِلَ حَتَّى عَادَ كَالْعُرْجُونِ الْقَدِيمِ .لَا الشَّمْسُ يَنبَغِي لَهَا أَن تُدْرِكَ الْقَمَرَ وَلَا اللَّيْلُ سَابِقُ النَّهَارِ وَكُلٌّ فِي فَلَكٍ يَسْبَحُونَ

(Yasin, 36/38-39-40)

«Və Günəşdə də onlar üçün bir işarə vardır. O, özünə aid bir yörüngədə (çevrədə) axıb gedər. Bu qüdrət sahibi və hər şeyi bilən Allahın iradəsinin bir sonucudur. Və Ayda da bir işarə vardır. Biz onu quru və əyri bir xurma budağını

---

[178] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 25.

andıracaq hala gələnəcən çeşidli mənzillərdən keçirdik. Nə Günəş Aya çata bilər, nə də gecə gündüzü yox edə bilər. Çünki, hamısı səmada (yasalarımız çərçivəsində) hərəkət edərlər».

كَلَّا وَالْقَمَرِ . وَاللَّيْلِ إِذْ أَدْبَرَ . وَالصُّبْحِ إِذَا أَسْفَرَ . إِنَّهَا لَإِحْدَى الْكُبَرِ
نَذِيراً لِّلْبَشَرِ . لِمَن شَاء مِنكُمْ أَن يَتَقَدَّمَ أَوْ يَتَأَخَّرَ .

(Müddəsir, 74/32-37)

«Xeyr, inkara əsla yer yoxdur. Aya, keçib getməkdə olan gecəyə, açılan sabaha and içirəm ki, insan üçün, içinizdən önə keçmək, yaxud geri qalmaq istəyən kimsə üçün cəhənnəm bir uyarıcı olaraq sözsüz ki, böyük bəlalardan biridir».

## AY PLANETİNİN HƏDİSLƏRDƏ YERİ

Hz.Məhəmmədin (s.a.s.) hədislərində də Ayın parlaqlılığından istifadə yolu ilə ayrı-ayrı düşüncələr ifadə olunmuşdur. Əbu Hureyrə (r.a.) söyləyir: «Rəsulullah (s.a.s.): «Cənnətə girəcək olan topluluğun ilk bölüyünün şəkilləri mahtablı gecədəki Ay kimi olacaqdır. Onlar cənnətdə tüpürməzlər, bəlğəm çıxarmazlar, sümkürməzlər, böyük, kiçik abdəst pozmazlar. Onların cənnətdə istifadə etdikləri əşyaları qızıldandır. …Cənnətdəkilərin aralarında anlaşılmazlıq və düşmənçilik olmaz. Qəlbləri tək bir qəlb olaraq sabah-axşam Allahı təsbih edər».[179]

Yenə Əbu Hureyrə söyləyir: «Rəsulullah (s.a.s.) buyurdu: «Cənnətə girən topluluğun ilk bölüyü mahtablı bir gecədəki Ay şəklindədir. Onlardan sonrakılar da parlaqlıqda qüvvətlə parlayan bir ulduz kimi olacaqdır»[180].

Səhl b. Sad (r.a.) söyləyir: «Hz.Peyğəmbər (s.a.s.) buyurdu: «Ümmətimdən yeddi min, ya da yeddi yüz min kişi

---

179 Muttefekun aleyh hadisler (mətnsiz), Konya, 2004, s. 391.
180 Muttefekun aleyh hadisler (mətnsiz), Konya, 2004, s. 392.

mütləq cənnətə girəcək. Onların öndəkiləri sondakılar girən kimi girməyəcək. Üzləri məhtablı bir gecədəki Ay şəklində olacaqdır».[181]

## DİVAN ƏDƏBİYYATINDA AY

Divan ədəbiyyatında da sevgilinin üzü aya bənzədilmişdir. Nətlərdə hz.Peyğəmbər (s.a.s.) yer üzünün ən gözəl insanı kimi təsvir edilmişdir. Şəmail kitablarında da hz.Məhəmmədin üzünün çox işıqlı olduğu yazılır.[182]

Divan ədəbiyyatında cəhalətin düşməni olan hz. Məhəmməd işığın, nurun simvolu kimi verilmişdir: «Bu sebeble natlarda yüzü güneş, ay, mum, nur ve Kurani-Kerimdeki güneşe kasem edilen ayetlere benzetilir ve melih, münir, pak ve şerif gibi sıfatlarla ele alınır. Bu arada Onun yalnızca «melihül-vech», yani yüzü güzel olan degil, aynı zamanda ahlaken de «kalbi safa» üzre olan en temiz ve en yüce insan olduğu, bu yüzden de seçkinliyini bildiren Murtaza, Mücteba, Mustafa isimleriyle anıldığı belirtilir».[183]

Divan ədəbiyyatında hz.Məhəmmədin (s.a.s.) nurlu üzü günəş, ay, şamla müqayisə edilmişdir. Biz bu bənzətmələrə hz.Məhəmmədin (s.a.s.) gözəlliyi ilə bağlı məsələlərdən yazarkən toxunacağıq.

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ AY

Yuxarıda da göstərdiyimiz kimi, hz.Nizami yeddinci beytdə Aydan başqa bir biçimdə yararlanmışdır. O, peyğəmbərlik verilmiş hz.Məhəmmədin (s.a.s.) mövqeyini, yerini, hökmünü anlatmaq üçün Aya müraciət edir. Burada hz. Nizami nə üçün Ay planetini seçmişdir? Bu sualın

---

[181] Muttefekun aleyh hadisler (mətnsiz), Konya, 2004, s. 392.
[182] Peyğamberlerimizin Şemaili, ahlak ve adabı (prof. Dr. Hüseyn Algül), İstanbul, 2002.
[183] Emine Yeniterzi, göstərilən qaynaq, s. 227.

cavabını dəqiqləşdirmək üçün Ay planeti ilə bağlı bir neçə məsələyə də toxunaq.

İslam dininə görə, hz.Məhəmməd (s.a.s.) yaradılmışların ən kamilidir. O, yer üzünə insanları cəhalətdən qurtarıb azadlığa çıxarmaq məqsədi ilə göndərilmişdir. **Ay da bir neçə qata, dərəcəyə bölünmüş səmadan dünya (yer) səmasına aiddir. Ay aləmin mərkəzinə nisbətlə doqquz fələyin birincisidir. Ay hərəkətində çox sürətlidir, o, öz fələyində tək başına hakimdir. Alimlər ona kiçik aydınlıq adı vermişlər. Bu keyfiyyətlər hz.Məhəmmədin (s.a.s.) möhürünün Ayda həkk olunmasını şərtləndirir, onu mümkün edir.**

Ayın başqa özəlliklərinə baxaq. **Ayın rəngi, əslində, qaraya çalan laciverddir. O nə göy rənglidir, nə də qara. Ay parlaq bir yuvarlaq top şəklindədir. O, başqasından aldığını əks etdirə bilir. Ay işığını ancaq Günəşdən alır.**

**Ayın bu özəllikləri hz.Nizami üçün ikinci fürsətdir. Hz Məhəmməd (s.a.s.) də işığını ancaq uca Allahdan alır.**

Hz.Nizami yeddinci beytdə deyir ki, ay üzünün zəbərcəd daşlı qaşında Məhəmmədin (s.a.s.) möhürü həkk olunmuşdur. **Zəbərcəd daşının rəngi də sarıya çalan yaşıldır. Deməli, Ay top-üzük şəklindədir, rəngi laciverddir, onun sarıya çalan yaşıl qaşı var, (Nizaminin bənzətməsində) və bu qaşda hz.Məhəmmədin (s.a.s.) möhürü var.**

Bir az da geniş düşünək. Varlıq, yer kürəsi, yer səması top şəklindədir. Bu yer səmasına daxil olan yumru Ayın-üzüyün ən qiymətli hissəsi qaşıdır. Varlığın ən dəyərlisi də hz. Məhəmməddir (s.a.s.) . Yuxarıda da gördüyümüz kimi, hz.Nizami başlıca ideyanı vermək üçün beytin quruluşunda cisimlərdən, rənglərdən gözəl istifadə etmişdir. Bir beytdə böyük bir məkan cızılmış (Ay və onun qaşı), gözəl rənglər

seçilmiş (laciverd, yaşıl, sarı) və bu fonda hz. Məhəmmədin (s.a.s.) hökmünün genişliyi verilmişdir.

Ayın təbiəti soyuq və rütubətlidir. Ay bazar ertəsi günü və cümə gecəsi yer üzünə hakim olur. Ay günəşdən gələn şüaları yerə əks etdirir. Ay dəniz üfüqündə doğulduqda dəniz qabarması baş verir. Biz, Ay üzündə Yer kürəsini müşahidə edə bilərik. İnsanların Ayın hərəkəti ilə təqvim yaratdığı da bilinən bir gerçəklikdir. Yer kürəsinə ən yaxın olan, insan həyatı ilə sıx bağlı Ayın imkanlarını bədii bir dillə təqdim edən hz.Nizami (O, Ayı gözəl qaşı olan üzüyə bənzədib) Peyğəmbər (s.a.s.) sevgisinin tablosunu çəkmişdir.

## MÖCÜZƏ ANLAYIŞI

Hz.Nizaminin Ay və hz.Məhəmməd (s.a.s.) münasibətlərinin şərhində istifadə etdiyi başqa bir məqam da Peyğəmbərin (s.a.s.) bir möcüzəsi ilə bağlıdır. Bilindiyi kimi, uca Allah seçdiyi Peyğəmbərləri möcüzələrlə dəstəkləmişdir. Möcüzə göstərmək də uca Allahın yardımı ilə Peyğəmbərlərə məxsusdur. Möcüzə «aciz edən bir şey» anlamındadır. Termin olaraq isə «sadece peyğamber olduğunu söyleyen kimsenin hiç bir bilimsel yönteme baş vurmadan göstere bildiyi tabiat kanunlarını aşan olay» dır.[184]

Alimlər peyğəmbərlərin möcüzələrini üç yerə ayırmışlar: hissi, xəbəri, bilgi möcüzələri.

Hissi möcüzələr insanların duyğularına üz tutur. Uca Allahın (c.c.) yardımı ilə bu möcüzələr təbiət qanunlarını dəyişdirir. Məsələn, Qurani-Kərimdə hz.Salehin (s.a.s.) dəvə möcüzəsini göstərdiyi bildirilir:

وَيَا قَوْمِ هَـذِهِ نَاقَةُ اللّهِ لَكُمْ آيَةً فَذَرُوهَا تَأْكُلْ فِي أَرْضِ اللّهِ وَلاَ تَمَسُّوهَا بِسُوءٍ فَيَأْخُذَكُمْ عَذَابٌ قَرِيبٌ

(Hud, 11/64-67)

---

[184] Prof. Dr. Bekir Topaloğlu, Prof. Dr. Y. Şevki Yavuz, Doc. Dr İlyas Çelebi, İslamda İnanc Esasları, İstanbul, 2002, s. 172.

«Ey qövmüm! – deyə davam etdi. Bu Allaha aid olan dişi dəvə sizin üçün bir işarə olacaqdır. Onun üçün onu buraxın, Allahın sahəsində (yerində) otlasın, ona bir pislik etməyin. Yoxsa gözləmədiyiniz bir əzaba düçar olarsınız».

مَا أَنتَ إِلَّا بَشَرٌ مِّثْلُنَا فَأْتِ بِآيَةٍ إِن كُنتَ مِنَ الصَّادِقِينَ . قَالَ هَذِهِ نَاقَةٌ لَّهَا شِرْبٌ وَلَكُمْ شِرْبُ يَوْمٍ مَّعْلُومٍ . وَلَا تَمَسُّوهَا بِسُوءٍ فَيَأْخُذَكُمْ عَذَابُ يَوْمٍ عَظِيمٍ . فَعَقَرُوهَا فَأَصْبَحُوا نَادِمِينَ . فَأَخَذَهُمُ الْعَذَابُ إِنَّ فِي ذَلِكَ لَآيَةً وَمَا كَانَ أَكْثَرُهُم مُّؤْمِنِينَ

(Əş-Şüara, 26/154-158)

«Sən bizim kimi bir bəşərdən başqa nəsən? Əgər doğru söyləyənlərdən isən, bir ayə (möcüzə) göstər, dedilər. Saleh dedi ki: «Bax, bu dişi dəvə. Su içmə haqqı (bir gün) onundur, bəlli bir günün içmə haqqı da sizin. Əsla ona bir pislik etməyin, sizi böyük bir günün əzabı yaxalayar. Ancaq o dəvəni kəsdilər, ancaq peşman oldular. Onları əzab yaxaladı. Şübhəsiz, bunda mütləq bir ibrət vardır. Beləliklə, çoxu mömin olmadı».

Qüdrət sahibi Allahın əmri ilə hz.Musanın əsası ilana, əjdahaya çevrilir:

قَالَ أَوَلَوْ جِئْتُكَ بِشَيْءٍ مُّبِينٍ . قَالَ فَأْتِ بِهِ إِن كُنتَ مِنَ الصَّادِقِينَ. فَأَلْقَى عَصَاهُ فَإِذَا هِيَ ثُعْبَانٌ مُّبِينٌ . وَنَزَعَ يَدَهُ فَإِذَا هِيَ بَيْضَاء لِلنَّاظِرِينَ . قَالَ لِلْمَلَإِ حَوْلَهُ إِنَّ هَذَا لَسَاحِرٌ عَلِيمٌ

(Əş-Şüara, 26/30-34)

«İndi onu (əsanı) yerə at, ey Musa!», dedi. Bir də nə gördü! O, sürətlə gedən bir ilana çevrilmişdi! «Onu tut», dedi, qorxma! Biz onu öncəki halına döndərəcəyik. İndi də əlini qoynuna sox. Hər hansı bir uğursuzluğun deyil, (Bizim rəhmətimizin) başqa bir işarəsi olaraq ağappaq (işıldayaraq) çıxacaqdır. Bu yolla sənə böyük möcüzələrimizdən bir qismini göstərmiş olaq».

Hz.İsa (s.a.s.) beşikdə olarkən danışmış, ona kitab və Peyğəmbərlik verildiyini söyləmişdir:

وَيُكَلِّمُ النَّاسَ فِي الْمَهْدِ وَكَهْلاً وَمِنَ الصَّالِحِينَ

(Ali İmran, 3/46)

«O (həm) beşikdə ikən, (həm də) yaşa dolduqdan sonra insanlara danışacaq və salehlərdən olacaq».

Uca Allah (c.c.) Nuh (s.a.s.) qövmünü tufan, hz.Salehin (s.a.s.) qövmü Səmudu, hz.Hudun (s.a.s.) qövmü Adı, hz. Suaybın (s.a.s.) qövmü Medyen xalqını qorxunc gurultu möcüzəsi, hz.Lutun (s.a.s.) qövmünü zəlzələ, daş yağışı möcüzəsi, Firon ordusunu dəniz yarılması ilə həlak etmişdir.[185]

Qurani-Kərimdə hz.Məhəmmədin (s.a.s.) möcüzələrinə az yer verilmişdir. Alimlər bunu başlıca olaraq iki səbəblə bağlayırlar. İnsanın təkamülü və Quranın hər yönü ilə yetkinliyi.[186]

Xəbər yönlü möcüzələr Peyğəmbərlərin ilahi vəhylə verdikləri bilgilərdir. Bilgi möcüzələri isə Peyğəmbərlərin insan və toplumla bağlı verdiyi doğru informasiyalardır. Onlar insanı, toplumu yönəldəcək ilahi ölçülər gətirmişlər. Məsələn, yaxşılığı əmr et, ədalətli ol, hamının hüququna hörmət et, doğru danış, insanlara gözəl söz söylə, əmanəti qoru, elm öyrən, zalımlara qarşı savaş, yetimlərə, yoxsullara yardım et, bağışla, ata-ana haqqını qoru və b. Bu ölçülər olmasa, insan və cəmiyyət çökər, insanın və toplumun fitrəti, yaradılış qayəsi pozular. Uca Allah Loğman surəsində insanlara ilahi ölçüləri belə açıqlayır:

---

185 Əraf, 7/64, 73, 78, 84, 91.

186 İslamda inanc əsasları, göstərilən qaynaq, s. 175.

وَلَقَدْ آتَيْنَا لُقْمَانَ الْحِكْمَةَ أَنِ اشْكُرْ لِلَّهِ وَمَن يَشْكُرْ فَإِنَّمَا يَشْكُرُ لِنَفْسِهِ
وَمَن كَفَرَ فَإِنَّ اللَّهَ غَنِيٌّ حَمِيدٌ . وَإِذْ قَالَ لُقْمَانُ لِابْنِهِ وَهُوَ يَعِظُهُ يَا بُنَيَّ لَا
تُشْرِكْ بِاللَّهِ إِنَّ الشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ

(Loğman, 31/12-13)

«Biz Loğmana bu hikməti bağışladıq. Allaha şükr et, çünki ona şükr edən öz yaxşılığı üçün şükr etmiş olur. Nankorluq etməyə üstünlük verən isə (bilsin ki,) Allah əsla heç bir şeyə möhtac deyildir və hər zaman öygüyə layiqdir. Loğman oğluna öyüd verərkən belə danışdı: «Ey mənim sevimli oğlum! Allahdan başqasına ilahi sifətlər yaraşdırma! Bil ki, belə (düzməcə) ortaqlıq qoşmalar gerçəkdən böyük bir zülmdür».

**Peyğəmbərlərin möcüzələri ilə bağlı məsələlərə bir neçə yöndən baxmaq olar. Hər şeydən öncə uca Allahın (c.c.) peyğəmbərlərini möcüzələrlə dəstəklədiyi bəllidir. Toplumda elə insanlar var ki, onları yalnız möcüzə yolu ilə inandırmaq olar. Yəni möcüzənin obyekti inanmayanlardır. Ağıllı insanların Allahın varlığına inanmaq üçün başqa bir dəlilə ehtiyacı yoxdur. Başqa yöndən möcüzə bir tərbiyə metodudur.**

Hz.Məhəmmədin (s.a.s.) ən böyük möcüzəsi Qurandır. Bu ilahı kitabı qadir Allah ərəbcə endirmişdir. Onun məqsədi insanlara Allahı tanıtmaq, onları cəhalətdən qurtarmaq, onları doğru yola yönəltmək, könüllərə şəfa verməkdir. Quran ilahi qorunma altındadır. O, necə nazil olmuşdursa, bu gün də elədir. Quran bir Allah kəlamıdır, o, kitabların sonuncusudur, ona bənzər bir kitab yazmaq mümkün deyil. O, halal ilə haramın sərhədini müəyyən edir, o, insanları tərbiyə etmək, onlara bu dünya və axirət xoşbəxtliyini qazandırmaq məqsədi daşıyır.

Hz.Nizaminin nətin yeddinci beytində işarə etdiyi Ay öz oxu ətrafında, Günəşin və Yerin ətrafında dövr edir. Ay göy cisimlərindən Yerə ən yaxınıdır. Bu beytin qurulmasında, onun dini, bədii informasiya yükünün müəyyənləşməsində iştirak edən Ay bir də ona görə diqqəti çəkir ki, hz.Məhəmmədin (s.a.s.) bu göy cismi ilə bağlı möcüzəsi var:

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ اقْتَرَبَتِ السَّاعَةُ وَانشَقَّ الْقَمَرُ

(Qəmər, 54/51)

«Son saat yaxınlaşacaq və ay yarılacaq».

Bir sıra təfsirçilər bu ayənin hz.Məhəmmədin (s.a.s.) Ay bölməsi möcüzəsinə işarə etdiyini bildirsə də, bu yorumla razılaşmayanlar da var.[187]

Məkkəlilər hz.Məhəmməddən (s.a.s.) möcüzə istəmiş və Peyğəmbərin barmağının işarəsi ilə Ay ikiyə bölünmüşdür. Bu qureyşli müşriklərə göstərilən ən son möcüzədir. Bu olay divan ədəbiyyatında, nətlərdə ən çox işlənən mövzulardan biridir. Biz yeri gəldikcə buna da toxunacağıq.

## PEYĞƏMBƏRİN MÖHÜRÜ

Hz.Nizaminin yeddinci beytinin ideyasının təqdimatında iştirak edən anlayışlardan biri də «Peyğəmbərin möhürü» qavramıdır. İslam tarixində «Peyğəmbərin möhürü» iki anlamda işlədilir. Peyğəmbər (s.a.s.) doğulanda kürəyində, iki çiyni arasında bir iri xal-möhür var idi. Hz.Məhəmməd (s.a.s.) özü bunu «peyğəmbərlik möhürü» kimi dəyərləndirib. Alimlərin yazdığına görə, hz.Peyğəmbər (s.a.s.) vəfat edəndən sonra bu möhür silinmişdir.[188]

---

[187] Muhammed Esed, Kuran mesajı, göstərilən qaynaq, s. 1087.
[188] Huseyn Algül, Alemlere Rahmet hz. Muhammed, Ankara, 1994, s. 281.

İkincisi isə bilindiyi kimi hz.Məhəmməd (s.a.s.) gümüş üzük taxmışdır. O, üzərində «Məhəmməd Rəsulullah» yazılmış bu üzükdən möhür kimi istifadə etmişdir. Bu möhür-üzük hz.Osman dönəmində Eris adında bir quyuya düşdü və tapılmadı.[189]

**Hər iki halda möhür hakimiyyət, səlahiyyət anlayışını ifadə edir. Hz.Nizami də hz.Məhəmmədin (s.a.s.) yerdə və yer səmasında hakimiyyətinin olduğunu ifadə etmək üçün Ay, möhür, mavi rəng kimi anlayışlardan yararlanmışdır. Öncəki beytlərdən də göründüyü kimi, hz.Məhəmmədi təqdim edən hz.Nizami onu geniş, sonsuz məkan içində təsvir edir. Ay-yer səması, mavi rəng sonsuzluğun boyası, möhür-Allahın verdiyi səlahiyyət. Bu ilahi məkanda biz hz.Məhəmmədin (s.a.s.) uca Allahın (c.c.) seçdiyi elçi olduğunu, onun səlahiyyət ölçülərini aydın görə bilərik.**

[189] Prof. Celal Yeniçeri, Peyğamber, devlet başkanı, aile reisi hz. Muhammed ve yaşadığı hayat, İstanbul, 2000, s. 321.

## SƏKKİZİNCİ BEYTİN ŞƏRHİ: HƏR İKİ DÜNYANIN HALQASI ONUN İTAƏTİNDƏDİR

Hz.Nizami səkkizinci beytdə də hz.Məhəmmədin (s.a.s.) hökmünü şərh edir.

گوش جهان حلقه کش میم اوست
خود دو جهان حلقه تسلیم اوست

***Cahanın qulağı onun «mim»inin halqasını daşıyandır,***
***Hər iki cahanın (dünyanın) halqası onun itaətindədir.***[190]

Bu beytin də ideyası, məzmunu, söz və ifadələrinin dini, tarixi, bədii gücü Qurandan, hədislərdən, klassik ənənədən süzülüb gəlir. Hz.Nizami üslubuna, inancına uyğun olaraq öncə Allahın elçisinin dini, bədii məkanını, zamanını müəyyənləşdirir. Bu məkan, bu dünya və axirətdir. İlahi ölçülü bir məkan. Hz.Nizami beytdə bu iki dünya arasında dəqiq tarazlıq yaratmışdır.

Allahın (c.c.) elçisi də bir duanı tez-tez oxuyardı: «Allahım, mənim bu dünyamı da gözəl yarat, o dünyamı da. Məni cəhənnəm atəşindən qoru».

## UCA ALLAHIN HƏZRƏT MƏHƏMMƏDƏ (s.a.s.) VERDİYİ NEMƏTLƏR

**Hz.Məhəmməd (s.a.s.) hər şeydən öncə bir tarazlıq Peyğəmbəridir. O, bu dünyaya axirətin tarlası kimi baxıb, bu dünyanı bir sınaq, bir imtahan, bir şans kimi dəyərləndirib.** Hz.Nizami də, hz.Məhəmmədin (s.a.s.) hakimiyyəti, üstünlüyü ideyasını iki dünyanın tarazlığında

[190] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 25.

verib. Hz.Nizami uca Allahın (c.c.) hz.Peyğəmbərə verdiyi nemətlər işığında onun üstünlüyünü açıqlayıb. **Hz.Məhəmmədin (s.a.s.) aldığı nemətlərdən biri də hakimiyyətdir.** O, Allaha qul oldu, hakim oldu.

Uca Allah (c.c.) Qurani-Kərimdə sevimli Peyğəmbərinə nemət verdiyini və axirətdə də verəcəyini sıx-sıx xatırladır:

مَا وَدَّعَكَ رَبُّكَ وَمَا قَلَى . وَلَلْآخِرَةُ خَيْرٌ لَّكَ مِنَ الْأُولَى . وَلَسَوْفَ يُعْطِيكَ رَبُّكَ فَتَرْضَى

(Duha, 93/3-5)

«Rəbbin səni nə unutdu, nə də sənə acığı tutdu. O biri dünya sənin üçün (həyatının) bu ilk bölümündən mütləq daha yaxşı olacaq! Və zaman gəldiyində (Rəbbin sənə qəlbindən keçəni) bağışlayacaq və səni razı edəcək».

إِنَّا أَعْطَيْنَاكَ الْكَوْثَرَ فَصَلِّ لِرَبِّكَ وَانْحَرْ

(Kövsər, 108/1-2)

«Bax, biz sənə bol nemət verdik. O halda yalnız Rəbbinə ibadət et və (yalnız onun adına) qurban kəs».

**Təfsirçilər bu ayələrdəki nemət anlayışını vəhy, elm, hikmət, yaxşılıq, həm bu dünyada, həm də o biri dünyada şərəfli olmaq kimi yozmuşlar. Allahı (c.c.) ona hər şeydən bol-bol ehsan etmişdir.**[191]

**Uca Allah (c.c.) bu dünyada hz.Məhəmmədi (s.a.s.) insanların ən şərəflisi etmişdir. Allahın (c.c.) lütfü ilə o sonuncu Peyğəmbər olmuş, bütün insanlara, cinlərə Peyğəmbər olaraq göndərmiş, ona kitabların anası olan Qurani-Kərim verilmiş, o, üstün əxlaqı, elmi ilə başqalarından seçilmişdir. Uca Allah (c.c.),**

---

[191] Muhammed Esed, Kuran mesajı, göstərilən qaynaq, s. 1314.

**hz.Məhəmmədə (s.a.s.) verdiyi nemət, səlahiyyət və imkanları belə sadalayır:**

كَمَا أَرْسَلْنَا فِيكُمْ رَسُولاً مِّنكُمْ يَتْلُو عَلَيْكُمْ آيَاتِنَا وَيُزَكِّيكُمْ وَيُعَلِّمُكُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَيُعَلِّمُكُم مَّا لَمْ تَكُونُواْ تَعْلَمُونَ

(Bəqərə, 2/151)

«Öz içinizdən sizə ayələrimizi oxuyan, sizi pisliklərdən arındıran, sizə kitabı və hikməti təlim edib, bilmədiklərinizi öyrədən bir Rəsul göndərdik»

وَكُـلاًّ نَّقُصُّ عَلَيْكَ مِنْ أَنبَاءِ الرُّسُلِ مَا نُثَبِّتُ بِهِ فُؤَادَكَ وَجَاءكَ فِي هَـذِهِ الْحَقُّ وَمَوْعِظَةٌ وَذِكْرَى لِلْمُؤْمِنِينَ

(Hud, 11/120)

«Peyğəmbərlərin xəbərlərindən sənin qəlbini doyuracaq və təskin edəcəyimiz hər xəbəri sənə anladırıq. Bunda sənə gerçəyin bilgisi, möminlərə də bir öyüd və bir uyarı gəlmişdir».

قُلْ آمِنُواْ بِهِ أَوْ لاَ تُؤْمِنُواْ إِنَّ الَّذِينَ أُوتُواْ الْعِلْمَ مِن قَبْلِهِ إِذَا يُتْلَى عَلَيْهِمْ يَخِرُّونَ لِلأَذْقَانِ سُجَّداً

(İsra, 17/1107)

«De ki, siz ona istər inanın, istər inanmayın. Bu bir gerçək ki, bundan öncə özlərinə elm verilən kimsələrə Quran oxunanda dərhal üzü üstə səcdəyə qapanırlar».

وَلَقَدْ آتَيْنَا دَاوُودَ وَسُلَيْمَانَ عِلْماً وَقَالَا الْحَمْدُ لِلَّهِ الَّذِي فَضَّلَنَا عَلَى كَثِيرٍ مِّنْ عِبَادِهِ الْمُؤْمِنِينَ

(Nəml, 27/15)

«And olsun ki, biz Davuda və Süleymana elm verdik. Onlar: «Bizi mömin qullarının bir çoxundan üstün edən Allaha həmd olsun», dedilər».

وَيَرَى الَّذِينَ أُوتُوا الْعِلْمَ الَّذِي أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ هُوَ الْحَقَّ وَيَهْدِي إِلَى صِرَاطِ الْعَزِيزِ الْحَمِيدِ

(Səbə, 37/6)

«Özlərinə bilgi verilənlər Rəbbindən sənə endirilən Quranın gerçək olduğunu bilir, onun mütləq qalib və öygüyə layiq olan Allahın yoluna yönəltdiyini görürlər».

وَلَن تَرْضَى عَنكَ الْيَهُودُ وَلاَ النَّصَارَى حَتَّى تَتَّبِعَ مِلَّتَهُمْ قُلْ إِنَّ هُدَى اللّهِ هُوَ الْهُدَى وَلَئِنِ اتَّبَعْتَ أَهْوَاءهُم بَعْدَ الَّذِي جَاءكَ مِنَ الْعِلْمِ مَا لَكَ مِنَ اللّهِ مِن وَلِيٍّ وَلاَ نَصِيرٍ

(Bəqərə, 2/120)

«Dinlərinə uymadıqca yəhudilər də, xristianlar da əsla səndən razı olmayacaqlar. De ki, doğru yol ancaq Allahın yoludur. Sənə gələn elmdən sonra onların arzularına uysan, and olsun ki, Allahdan sənə nə bir dost, nə də bir yardımçı vardır».

وَكَذَلِكَ أَنزَلْنَاهُ حُكْماً عَرَبِيّاً وَلَئِنِ اتَّبَعْتَ أَهْوَاءهُم بَعْدَ مَا جَاءكَ مِنَ الْعِلْمِ مَا لَكَ مِنَ اللّهِ مِن وَلِيٍّ وَلاَ وَاقٍ

(Rəd, 13/37)

«Və beləcə biz onu ərəbcə hikmətli bir söz olaraq endirdik. Sənə gələn elmdən sonra onların arzularına uysan, o zaman Allah tərəfindən sənin nə bir dostun, nə də qoruyucun vardır».

**Uca Allah bir yandan cəhalətlə savaşa göndərdiyi hz.Məhəmmədə (s.a.s.) nemət-elm verir, başqa yöndən də bu elm əsasında hazırlanmış iman, əxlaq, əməl ölçülərini təqdim edir:**

قُلْ تَعَالَوْاْ أَتْلُ مَا حَرَّمَ رَبُّكُمْ عَلَيْكُمْ أَلاَّ تُشْرِكُواْ بِهِ شَيْئاً وَبِالْوَالِدَيْنِ إِحْسَاناً وَلاَ تَقْتُلُواْ أَوْلاَدَكُم مِّنْ إمْلاَقٍ نَّحْنُ نَرْزُقُكُمْ وَإِيَّاهُمْ وَلاَ تَقْرَبُواْ الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ وَلاَ تَقْتُلُواْ النَّفْسَ الَّتِي حَرَّمَ اللّهُ إِلاَّ بِالْحَقِّ ذَلِكُمْ وَصَّاكُمْ بِهِ لَعَلَّكُمْ تَعْقِلُونَ

(Ənam, 6/151)

«De ki, gəlin, Rəbbinizin sizə nələri haram qıldığını oxuyum. Ona heç bir şeyi ortaq qoşmayın, ata-anaya yaxşılıq edin. Yoxsulluq qorxusu ilə uşaqlarınızı öldürməyin. Pisliklərin açığına da, gizlisinə də yaxınlaşmayın. Allahın yasaqladığı cana haqsız yerə qıymayın! Bunlar, Allahın sizə əmr etdikləridir. Umulur ki, düşünüb anlarsınız. Yetkinlik yaşına çatanadək yetimin malına, ən yaxşı niyyətlə yaxınlaşın. Ölçü və tərəzini ədalətlə çəkin. Biz hər kəsə ancaq gücünün yetdiyi qədərini yükləyirik. Söz söylədiyiniz zaman yaxınlarınız belə olsa, ədalətli olun. Allaha verdiyiniz sözün üstündə durun. Allah sizə yaxşı düşünəsiniz deyə bunları əmr etdi. Sözsüz, bu, mənim dosdoğru yolumdur. Buna uyun. Başqa yollara baş vurmayın. O yollar sizi Allahın yolundan ayırar. Çəkinməyiniz üçün Allah sizə bunları əmr etdi».

Hz.Nizaminin «iki cahanın hakimi» olaraq dəyərləndirdiyi hz.Məhəmmədə (s.a.s.) verilmiş elmin toplumdakı sosial, əxlaqi, iqtisadi, psixoloji düzəni qorumaq üçün müəyyən etdiyi başqa ölçülərə baxaq. Bu sistem, ölçü olmasa, insanın, toplumun nə bu dünyada, nə də axirətdə xoşbəxtliyi var:

وَقَضَى رَبُّكَ أَلاَّ تَعْبُدُواْ إِلاَّ إِيَّاهُ وَبِالْوَالِدَيْنِ إِحْسَاناً إِمَّا يَبْلُغَنَّ عِندَكَ الْكِبَرَ أَحَدُهُمَا أَوْ كِلاَهُمَا فَلاَ تَقُل لَّهُمَا أُفٍّ وَلاَ تَنْهَرْهُمَا وَقُل لَّهُمَا قَوْلاً كَرِيماً . وَاخْفِضْ لَهُمَا جَنَاحَ الذُّلِّ مِنَ الرَّحْمَةِ وَقُل رَّبِّ ارْحَمْهُمَا كَمَا رَبَّيَانِي

صَغِيراً . رَّبُّكُمْ أَعْلَمُ بِمَا فِي نُفُوسِكُمْ إِن تَكُونُواْ صَالِحِينَ فَإِنَّهُ كَانَ
لِلأَوَّابِينَ غَفُوراً  وَآتِ ذَا الْقُرْبَى حَقَّهُ وَالْمِسْكِينَ وَابْنَ السَّبِيلِ وَلاَ تُبَذِّرْ
تَبْذِيراً . إِنَّ الْمُبَذِّرِينَ كَانُواْ إِخْوَانَ الشَّيَاطِينِ وَكَانَ الشَّيْطَانُ لِرَبِّهِ كَفُوراً
. وَإِمَّا تُعْرِضَنَّ عَنْهُمُ ابْتِغَاء رَحْمَةٍ مِّن رَّبِّكَ تَرْجُوهَا فَقُل لَّهُمْ قَوْلاً
مَّيْسُوراً . وَلاَ تَجْعَلْ يَدَكَ مَغْلُولَةً إِلَى عُنُقِكَ وَلاَ تَبْسُطْهَا كُلَّ الْبَسْطِ فَتَقْعُدَ
مَلُوماً مَّحْسُوراً .إِنَّ رَبَّكَ يَبْسُطُ الرِّزْقَ لِمَن يَشَاءُ وَيَقْدِرُ إِنَّهُ كَانَ بِعِبَادِهِ
خَبِيراً بَصِيراً . وَلاَ تَقْتُلُواْ أَوْلادَكُمْ خَشْيَةَ إِمْلاقٍ نَّحْنُ نَرْزُقُهُمْ وَإِيَّاكُم إنَّ
قَتْلَهُمْ كَانَ خِطْءاً كَبِيراً . وَلاَ تَقْرَبُواْ الزِّنَى إِنَّهُ كَانَ فَاحِشَةً وَسَاء سَبِيلاً .
وَلاَ تَقْتُلُواْ النَّفْسَ الَّتِي حَرَّمَ اللّهُ إِلاَّ بِالحَقِّ وَمَن قُتِلَ مَظْلُوماً فَقَدْ جَعَلْنَا
لِوَلِيِّهِ سُلْطَاناً فَلاَ يُسْرِف فِّي الْقَتْلِ إِنَّهُ كَانَ مَنْصُوراً . وَلاَ تَقْرَبُواْ مَالَ
الْيَتِيمِ إِلاَّ بِالَّتِي هِيَ أَحْسَنُ حَتَّى يَبْلُغَ أَشُدَّهُ وَأَوْفُواْ بِالْعَهْدِ إِنَّ الْعَهْدَ كَانَ
مَسْؤُولاً . وَأَوْفُوا الْكَيْلَ إِذا كِلْتُمْ وَزِنُواْ بِالقِسْطَاسِ الْمُسْتَقِيمِ ذَلِكَ خَيْرٌ
وَأَحْسَنُ تَأْوِيلاً . وَلاَ تَقْفُ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ إِنَّ السَّمْعَ وَالْبَصَرَ وَالْفُؤَادَ
كُلُّ أُولـئِكَ كَانَ عَنْهُ مَسْؤُولاً. وَلاَ تَمْشِ فِي الأَرْضِ مَرَحاً إِنَّكَ لَن تَخْرِقَ
الأَرْضَ وَلَن تَبْلُغَ الْجِبَالَ طُولاً . كُلُّ ذَلِكَ كَانَ سَيِّئُهُ عِنْدَ رَبِّكَ مَكْرُوهاً .
ذَلِكَ مِمَّا أَوْحَى إِلَيْكَ رَبُّكَ مِنَ الْحِكْمَةِ وَلاَ تَجْعَلْ مَعَ اللّهِ إِلَهاً آخَرَ فَتُلْقَى
فِي جَهَنَّمَ مَلُوماً مَّدْحُوراً

(İsra, 17/23-39)

«Rəbbin sadəcə ona qulluq etmənizi, ana-atanıza da yaxşı davranmanızı qəti bir şəkildə əmr etdi. Onlardan biri, ya da hər ikisi sənin yanında yaşlanarsa, onlara «of» belə demə. Onları incitmə. İkisinə də gözəl söz söylə. Onlara mərhəmət edərək  üzərlərinə qanad aç (gər) və «Rəbbim! Kiçikliyimdə onlar məni necə yetişdirmişlərsə, indi sən də onlara eləcə rəhm et», deyərək dua et. Əgər Allahdan umduğun bir rəhmət üçün onların üzünə baxa bilmirsənsə, heç olmasa onlara könül açan bir söz söylə. Rəbbiniz sizin qəlblərinizdəkini çox yaxşı bilir. Əgər siz yaxşı olsanız, bunu

bilin ki, Allah pisliklərdən üz çevirərək tövbəyə yönələnləri son dərəcə bağışlayıcıdır. Bir də qohuma, yoxsula, yolçuya haqqını ver. Gərəksiz yerə də saçıb sovurma. Belə ki israf edənlər şeytanların dostlarıdır. Şeytan isə Rəbbinə qarşı çox nankordur. Xəsis olma! İsrafçı da olma! Sonra qınanar, itirdiklərinin həsrətini çəkərsən. Rəbbin ruzini dilədiyinə bol verir, dilədiyinə az. O, qullarından xəbərdardır, onları çox yaxşı görür. Dolanışıq qorxusu ilə uşaqlarınızın canına qıymayın. Biz onların da, sizin də ruzinizi veririk. Onları öldürmək gerçəkdən böyük bir günahdır. Zinaya yaxınlaşmayın. O, bir həyasızlıqdır və çox pis bir yoldur. Haqlı bir səbəb olmadıqca Allahın möhtərəm etdiyi cana qıymayın. Bir kimsə zülmlə öldürülərsə, onun vəlisinə haqqını alması üçün yetki verdik. Ancaq bu vəli də qisasda irəli getməsin. Verilən bu yetki ilə o, alacağını almışdır. Yetimin malına, yetkinlik yaşına çatanadək ancaq ən gözəl bir niyyətlə yaxınlaşın. Verdiyiniz sözü də yerinə yetirin. Çünki verilən söz məsuliyyət yaradır. Ölçdüyünüz zaman tam doğru ölçün və doğru tərəzi ilə çəkin. Bu, həm daha yaxşıdır, həm də nəticəsi baxımından daha gözəldir. Haqqında bilgin olmayan şeyin ardına düşmə. Çünki qulaq, göz və könül – bunların hamısı ondan sorumludur. Yer üzündə özündən razı olaraq dolaşma. Sən qürurla nə yeri yara bilər, nə də dağlarla ululuq yarışına girə bilərsən. Bütün bu sayılanların pis olanları Rəbbinin yanında sevimsizdir. Bəli, bunlar Rəbbinin sənə verdiyi hikmətlərdir. Allahdan başqa ilah axtarma. Sonra qınanmış və Allahın rəhmətindən uzaqlaşdırılmış olaraq cəhənnəmə atılarsan».

**Bu mübarək ayələrdən açıqca görünür ki, «iki cahanın ixtiyarı əlində olan» hz.Məhəmmədə (s.a.s.) öncə bu şərəfi qazandıracaq elm neməti verilmişdir. Allahın**

**elçisi olmaqla şərəfləndirilmiş hz.Məhəmməd (s.a.s.) bu ada layiq olan bütünün nemətlərlə təmin edilmiş, üstün elmi, üstün əxlaqı ilə yaradılmışların başçısı olmuşdur.**

Hz.Nizami bu beytin ikinci misrasında hz.Məhəmmədin (s.a.s.) axirətin də ən şərəflisi olduğunu bildirir. Nizamiyə görə, axirətin «halqası onun itaətindədir».

## «KÖVSƏR» NEMƏTİ

Bu misranın dini əsaslarına baxaq. Uca dinimizdə hz.Məhəmmədə (s.a.s.) axirətdə veriləcək nemətlərin açıq işarələri var. Uca Allah (c.c.) Qurani-Kərimdə belə buyurur:

إِنَّا أَعْطَيْنَاكَ الْكَوْثَرَ . فَصَلِّ لِرَبِّكَ وَانْحَرْ. إِنَّ شَانِئَكَ هُوَ الْأَبْتَرُ

(Kövsər, 108/1-3)

«(Ey Məhəmməd!) Sənə Kövsəri verdik. Rəbbin üçün namaz qıl və qurban kəs. Gerçək olan budur ki, əsl soyu kəsik olan sənə kin bəsləyən kimsədir».

Təfsir kitablarında «Kövsər»in nə olması ilə bağlı çeşidli düşüncələr irəli sürülmüşdür. «Kövsərin» elm, şəfaət haqqı, böyük bir çay olması ilə bağlı fikirlər var.

Uqbə ibn Amrdan (r.a.) rəvayət edilən bir hədisdə deyilir: «Rəsulullah (s.a.s.) aradan səkkiz il keçdikdən sonra bir gün Uhud şəhidlərini  ziyarətə getdi. Yaşayanlara və ölənlərə vida edən kimi onlara dua etdi. Sonra minbərə çıxdı və bunları söylədi: «Mən axirətə sizdən öncə gedəcəyəm və sizin üçün hazırlıq görəcəyəm. Sizin Allah yolundakı xidmətlərinizə şahidlik edəcəyəm. Görüş yerimiz Kövsər hovuzunun yanıdır. Mən bu bulunduğum yerdən Kövsər hovuzunu görməkdəyəm. Mən sizin Allaha şərik

qoşmanızdan qorxmuram. Ancaq dünya hərisliyi ilə bir-birinizlə didişib çəkişmənizdən qorxuram».[192]

Başqa bir hədisdə Rəsuli-Əkrəm belə buyurur: «İçinizdə Kövsər hovuzuna ilk çatan mən olacağam və sizin Allah yolundakı xidmətlərinizə şahidlik edəcəyəm. Vallah, bu anda hovuzum gözümün önündədir. Yer üzü xəzinələrinin açarları (və ya yer üzünün açarları) mənə verildi…»[193]

Başqa bir hədis. Əbu Yəhya Üseyd ibni Xudayardan (r.a) rəvayət edildiyinə görə mədinəli bir adam: «Ey Allahın Rəsulu, filankəs kimi məni də vali təyin etməzsinizmi?, – dedi. Peyğəmbər (s.a.s.) : «Siz, məndən sonra adamları haqsız yerə qorumaq olayları görəcəksiniz. Hovuz başında mənə qovuşuncaya qədər səbr edin!»[194]

Hz.Məhəmmədə verilmiş Kövsər neməti ilə bağlı başqa bir hədis. Əbu Hureyrədən (r.a.) rəvayət edildiyinə görə, Rəsullah (s.a.s.) qəbirstanlığa gəldi və : «Salam sizə ey möminlər diyarı! İnşallah biz də sizə qovuşacağıq. Qardaşlarımı görmək çox istərdim», - dedi. Əshabi-kiram:

- Biz sənin qardaşların deyilikmi, ey Rəsulullah?, - dedilər.

Rəsuli-Əkrəm:

- Sizlər mənim əshabımsınız, qardaşlarımız hələ gəlməmiş olanlardır.

- Ümmətindən hələ gəlməmiş olanları necə tanıyacaqsan, ey Allahın Rəsulu?

- Nə danışırsınız? Bir adamın alnı ağ, ayaqları səkilli bir atı olsa, əsmər və qara yallı at sürüsü içində öz atını tanımazmı?

---

[192] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 549.
[193] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 550.
[194] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 275.

- Bəli, tanıyar, ey Allahın Rəsulu.

- Məhz onlar da abdəstdən dolayı üzləri nurlu, əl və ayaqları parlaq olaraq gələcəklər. Mən hovuzun (Kövsərin) başına onlardan öncə varacağam».[195]

Təfsirlərə görə Kövsər xeyiri çox olmaq anlamına da gəlir. Bu nəhəng çay hz.Məhəmmədə (s.a.s.) məxsus olan hovuza tökülür. Hz.Məhəmmədin (s.a.s.) ümməti qiyamət günü bu hovuzun başına yığışacaq. Hovuzun ətrafında ortası boş incilərdən düzəldilmiş qübbələr olacaq, oraya sayı ulduzlar qədər olan bardaqlar düzüləcək. Suyunun rəngi süddən ağ, qoxusu müşkdən daha xoş, dadı baldan şirindir. Bir başından o biri başına ancaq bir ayda gediləbiləcək qədər də uzundur.[196]

Yuxarıdakı hədislərdə olan «yer üzünün xəzinələrinin açarları (yer üzünün açarları) mənə verildi» müjdəsi də hz.Məhəmməd (s.a.s.) ümmətinin İslamın nurunu bütün yer üzünə yayacağı kimi yozulmuşdur.

## ŞƏFAƏT NEMƏTİ

**Hz.Nizaminin misrasında işarə edilən, hz. Məhəmmədə (s.a.s.) verilmiş bir nemət də onun axirətdəki şəfaət haqqıdır.** Şəfaət haqqı uca Allahın (c.c.) sevimli Peyğəmbərinə verdiyi ən önəmli nemətlər sırasındadır.

Uca Allah (c.c.) hz.Məhəmmədə (s.a.s.) hakimiyyət verir, bu hakimiyyətdən irəli gələn səlahiyyətlərin (yetkilərin) sınırını bəlli edir. Bizcə, şəfaət haqqı hz. Məhəmmədin (s.a.s.) insanlar üzərindəki nüfuzunu artıran, ona və onun gətirdiklərinə inamı gücləndirən, dünya və axirət inancını bir arada qavramağa yol açan çox önəmli bir yetkidir. Şəfaət

195 Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 170-171.
196 Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 551.

haqqı uca Allahın (c.c.) «əfv edən», «Qafur», «Qaffar» adlarının doğurduğu bir anlayışdır. Şəfaət haqqı uca Allahın (c.c.) hz.Məhəmməd (s.a.s.) üçün bəlli etdiyi təbliğ yolunun (metodunun) (müjdələmək) bir parçasıdır.

Qurani-Kərimdə «şəfaət haqqı» anlayışına bir sıra ayələrdə toxunulmuşdur. (3/255; 4/85; 10/3; 19/15; 2/109; 21/28; 34/23; 40/18; 43/86; 82/19). Bu ayələrdən ikisinə baxaq:

وَلَا تَنفَعُ الشَّفَاعَةُ عِندَهُ إِلَّا لِمَنْ أَذِنَ لَهُ حَتَّى إِذَا فُزِّعَ عَن قُلُوبِهِمْ قَالُوا مَاذَا قَالَ رَبُّكُمْ قَالُوا الْحَقَّ وَهُوَ الْعَلِيُّ الْكَبِيرُ

(Səbə, 34/23)

«Onun hüzurunda izn verdiyi kimsələr istisna olmaqla heç kəsin şəfaəti fayda verməz. Nəhayət, ürəklərindən o qorxu çıxınca onlar: «Rəbbiniz nə buyurdu?»,-deyə soruşar, o biriləri də: «Haqqı! O ucadır, böyükdür!»,-deyə cavab verərlər».

وَأَنذِرْهُمْ يَوْمَ الْآزِفَةِ إِذِ الْقُلُوبُ لَدَى الْحَنَاجِرِ كَاظِمِينَ مَا لِلظَّالِمِينَ مِنْ حَمِيمٍ وَلَا شَفِيعٍ يُطَاعُ

(Mömin, 40/18)

«Ey Məhəmməd! Onları yaxınlaşmaqda olan o qiyamət günü ilə uyar. O gün, ürəklər boğazlara qədər gəlib dayanar, çıxmaması üçün udqunub durarlar. O gün zalımlər üçün nə bir dost, nə də sözü dinlənən bir şəfaətçi vardır».

Başqa ayələrə baxanda da uca Allahın (c.c.) «şəfaət haqqı» nemətini son dərəcə ağır halları ifadə edən anlayışlarla («qiyamət günü», «ürəyin boğaza gəldiyi gün», «kimsənin kimsəyə yardım edə bilməyəcəyi bir gün», «Allahdan üz döndərənlər») bir arada təqdim etdiyini görürük. Bu iki bir-birinə zidd anlayışları bir arada verən uca Allah (c.c.) məsələnin mahiyyətinin anlaşılmasına, «şəfaət haqqı»nın önəminə diqqəti çəkir, hz.Məhəmmədə (s.a.s.)

iman etməyin, onun ətəyindən bərk-bərk yapışmağın önəmini vurğulayır. Uca Allah (c.c.) bu yolla, bu yetki ilə həm hz. Məhəmmədi (s.a.s.) dəstəkləyir, həm də bizi Allahın (c.c.), Peyğəmbərin (s.a.s.) yoluna yönəldir.

Hz.Nizaminin bu iki misrada insanlara çatdırmaq istədiyi məna sadəcə hz.Məhəmmədə (s.a.s.) öygü deyil. O, Quranda, hədislərdə açıqlanmış, hz.Məhəmmədə (s.a.s.) verilmiş nemətləri şeirin dili ilə («cahanın qulağı onun, «mim»inin halqasını daşıyır, hər iki cahanın halqası onun ixtiyarındadır») ifadə edərək insanları ilahi qaynaqlı, Peyğəmbərə verilmiş nemətlərin işığında, onun müjdəsində Allaha (c.c.), Peyğəmbərə (s.a.s.) iman etməyə yönəldir.

**Hz.Nizaminin təqdimatında hz.Məhəmməd (s.a.s.) çox güclü, yenilməz lider, mərhəmət edəcək başçı kimi görünür, o, bu beytdə sığınılacaq, pənah aparılacaq ünvandır. Kövsəri olan, şəfaət haqqı verilmiş Peyğəmbərə (s.a.s.) kim inanmaz ki?**

Burada hz.Nizami ikinci misrada axirətdən danışır. Bu onunla bağlıdır ki, insanın Kövsərə, Şəfaət haqqına inanması üçün öncə Axirətin varlığına inanması şərtdir. Axirətə inandırmağın yollarından biri də onun nemətlərini sadalamaqdır, insanları bu nemətlərlə müjdələməkdir. Burada biz, hz.Nizaminin ideya seçmək, onu təqdim etmək bacarığını, təbliğ metodunu dərindən bildiyini görürük.

Uca Allah (c.c.), hz.Məhəmmədə (s.a.s.) üz tutaraq Qurani-Kərimdə belə buyurur:

وَمِنَ اللَّيْلِ فَتَهَجَّدْ بِهِ نَافِلَةً لَّكَ عَسَى أَن يَبْعَثَكَ رَبُّكَ مَقَاماً مَّحْمُوداً

(İsra, 17/79)

«(Ey Rəsulum!) Gecənin bir vaxtı durub ancaq sənə xas olan əlavə (təhəccüd) namazı qıl ki, Rəbbin səni bəyənilib təriflənən bir məqama (axirətdəki ən böyük şəfaət məqamına) göndərsin!».

اللّهُ لاَ إِلَـهَ إِلاَّ هُوَ الْحَيُّ الْقَيُّومُ لاَ تَأْخُذُهُ سِنَةٌ وَلاَ نَوْمٌ لَّهُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الأَرْضِ مَن ذَا الَّذِي يَشْفَعُ عِنْدَهُ إِلاَّ بِإِذْنِهِ يَعْلَمُ مَا بَيْنَ أَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ وَلاَ يُحِيطُونَ بِشَيْءٍ مِّنْ عِلْمِهِ إِلاَّ بِمَا شَاء وَسِعَ كُرْسِيُّهُ السَّمَاوَاتِ وَالأَرْضَ وَلاَ يَؤُودُهُ حِفْظُهُمَا وَهُوَ الْعَلِيُّ الْعَظِيمُ

(Bəqərə, 2/255)

«Allahdan başqa heç bir Tanrı yoxdur. Əbədi, əzəli varlıq Odur. O, nə mürgü, nə də yuxu bilər. Göylərdə və yerdə nə varsa Onundur. Allahın izni olmadan Onun yanında kim şəfaət edə bilər? O, bütün yaranmışların keçmişini və gələcəyini bilir. Onlar Allahın elmindən Onun Özünün istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun kürsüsü göyləri və yeri əhatə etmişdir. Bunları mühafizə etmək heç də çətin deyildir. Ən uca, ən böyük varlıq da Odur!».

إِنَّ رَبَّكُمُ اللّهُ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالأَرْضَ فِي سِتَّةِ أَيَّامٍ ثُمَّ اسْتَوَى عَلَى الْعَرْشِ يُدَبِّرُ الأَمْرَ مَا مِن شَفِيعٍ إِلاَّ مِن بَعْدِ إِذْنِهِ ذَلِكُمُ اللّهُ رَبُّكُمْ فَاعْبُدُوهُ أَفَلاَ تَذَكَّرُونَ

(Yunus, 10/3)

«Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra ərşi yaradıb hökmü altına alan, hər şeyi yoluna qoyan Allahdır. Onun izni olmadan heç bir şəfaət edən ola bilməz. Bu, Rəbbiniz olan Allahdır. Ona ibadət edin. Məgər öyüd-nəsihət qəbul etməyəcəksiniz?».

لَا يَمْلِكُونَ الشَّفَاعَةَ إِلَّا مَنِ اتَّخَذَ عِندَ الرَّحْمَنِ عَهْداً

(Məryəm, 19/87)

«Rəhmanın yanında söz və izn alandan başqa heç birinin şəfaətə gücü yetməyəcək».

يَوْمَئِذٍ لَّا تَنفَعُ الشَّفَاعَةُ إِلَّا مَنْ أَذِنَ لَهُ الرَّحْمَنُ وَرَضِيَ لَهُ قَوْلاً

(Taha, 20/109)

«O gün Rəhmanın izin verdiyi və sözündən xoşlandığından başqasının şəfaəti fayda verməz».

İslam dininə görə, başqa peyğəmbərlərə, mələklərə, alimlərə, şəhidlərə, saleh möminlərə, uşaqlara və Allahın (c.c.) cənnət əhlindən uyğun gördüyü bir sıra kimsələrə də şəfaət haqqı verilmişdir. Ancaq ən böyük şəfaətçi hz.Məhəmmədir (s.a.s.). Onun məqamı «məqami-Mahmud»dur. «O zaman Rəsulullah əlində livaül-həmd (həmd sancağı) olaraq aralarında hz.Adəm (s.a.s.) də olmaq üzərə bütün Peyğəmbərlər bu bayrağın altında toplanacaqdır»[197]

İndi gəlin, «şəfaət haqqı»nı hz.Məhəmmədin (s.a.s.) necə anlatdığına baxaq. Əbu Hureyrədən (r.a.) söylənilən hədisdə deyilir: «Bir yemək dəvətində Rəsulullah (s.a.s.) ilə bərabər idik. Ona ətin qol tərəfi verildi. Rəsuli-Əkrəm ətin qol tərəfini sevərdi. Ondan bir loxma qopardıqdan sonra belə buyurdu: «Qiyamət günündə insanların əfəndisi mənəm. Bu da nədən, bilirsinizmi? Uca Allah gəlmiş, gələcək bütün insanları düz bir yerə toplayacaq. Ora insanlara baxan kimsənin hamısını görə biləcəyi, onları çağıranın hamısının səsini duya biləcəyi bir yerdir. Günəş onlara yaxınlaşacaq, insanlar sıxıntıdan və kədərdən artıq dayana bilməyəcək hala gələndə bir-birinə – içində olduğunuz sıxıntını, başınıza gələn halı görmürsünüzmü? Halınızı Rəbbinizə ərz edəcək, sizə şəfaət edəcək birini tapmağı düşünmürsünüzmü? Bir sıra adamlar başqalarına deyəcək:

- Atanız Adəmin yanına gedin.

Onlar Adəmin yanına gedəcəklər, ona deyəcəklər:

- Ey Adəm! Sən insanların atasısan. Səni Allah qüdrət əli ilə yaratdı. Sənə öz ruhundan üflədi. Mələklər sənə səcdə

[197] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 567.

etmələrini əmr etdi, onlar da səcdə etdilər. Səni cənnətə yerləşdirdi. Rəbbinin yanına get, bizim üçün şəfaət dilə. Halımızı, başımıza gələn dərdi görmürsənmi?

Adəm:

- Bu gün Rəbbim çox qəzəblidir. Nə daha öncə belə qəzəbləndi, nə də bundan sonra belə qəzəblənər. Rəbbim o ağaca yaxınlaşmağı yasaqladı, ancaq mən Onu dinləmədim. Mənim nəfsim şəfaət edilməyə möhtacdır, mənim nəfsim, mənim nəfsim! Siz başqasının yanına gedin. Nuhun yanına gedin. Onlar da Nuhun yanına gedərlər.

- Ey Nuh! Sən yer üzü xalqına göndərilən rəsulların ilkisən. Allah Təala sənə «çox şükr edən qul» demişdi. Halımızı görmürsənmi? Başımıza gələnləri görmürsənmi? Rəbbinin hüzurunda bizə şəfaət etməyəcəksənmi?

Nuh:

- Bu gün Rəbbim bənzəri görülməyəcək şəkildə qəzəblidir. Nə daha öncə belə qəzəbləndi, nə də bundan sonra belə qəzəblənəcək. Mənim bir duam var idi, onu da qövmümün əleyhinə istifadə etdim. Mənim nəfsim şəfaət edilməyə möhtacdır. Mənim nəfsim! Mənim nəfsim! Siz başqasının yanına gedin. İbrahimin yanına gedin.

Onlar İbrahimin yanına gəldilər:

- Sən Allahın Peyğəmbərisən. Yer üzü xalqı içində Allahın dostu sənsən. Rəbbinin hüzurunda bizə şəfaət et. Halımızı görmürsənmi?

İbrahim:

- Bu gün Rəbbim bənzəri görülməyəcək şəkildə qəzəblidir. Nə daha öncə belə qəzəbləndi, nə də bundan sonra belə qəzəblənər. Mən vaxtı ilə üç yalan söyləmişəm. Mənim nəfsim şəfaət edilməyə möhtacdır. Mənim nəfsim, mənim nəfsim! Siz başqasının yanına gedin. Musanın yanına gedin.

Onlar da Musanın yanına gəldilər:

- Ey Musa! Sən Allahın elçisisən. Allah sənə Peyğəmbərlik vermək, səninlə danışmaq surətiylə səni başqa insanlardan üstün etmişdir. Rəbbinin hüzuruna get, bizə şəfaət et. Halımızı görmürsənmi?

Musa:

- Bu gün Rəbbim bənzəri görülməyəcək şəkildə qəzəblidir. Nə daha öncə belə qəzəbləndi, nə də bundan sonra belə qəzəblənəcək. Mən öldürülməsinə dair əmr almadığım bir adamı öldürdüm. Mənim nəfsim şəfaət edilməyə möhtacdır. Mənim nəfsim, mənim nəfsim! Siz başqasının yanına gedin. İsanın yanına gedin.

Onlar İsanın yanına getdilər:

- Ey İsa! Sən Allahın Rəsulusan. Onun Məryəmə göndərdiyi kəlməsi, Onun yaratdığı bir ruhsan. Sən hələ beşikdə ikən insanlarla danışdın. Rəbbinin hüzurunda bizə şəfaət et! Pərişan halımızı görmürsənmi?

İsa:

- Bu gün Rəbbim bənzəri görülməyəcək şəkildə qəzəblidir. Nə daha öncə belə qəzəbləndi, nə də bundan sonra belə qəzəblənəcək. (İsa bir günahdan danışmayacaq) Mənim nəfsim şəfaət edilməyə möhtacdır. Mənim nəfsim, mənim nəfsim! Siz başqasının yanına gedin. Siz Məhəmmədin yanına gedin.

Onlar da Rəsuli-Əkrəmin yanına gələcəklər:

- Ey Məhəmməd! Sən Allahın rəsulu və son Peyğəmbərsən. Uca Allah sənin gəlmiş, keçmiş bütün günahlarını bağışlamışdır. Rəbbinin hüzurunda bizə şəfaət et! Pərişan halımızı görmürsənmi? Məndə yüyürüb Ərşin altına gedəcəyəm. Rəbbimə səcdəyə qapanacağam. Sonra uca Allah daha öncə kimsəyə öyrətmədiyi ən gözəl həmdi mənə ilham edəcək. Sonra mənə xitabla:

- Ey Məhəmməd! Səcdədən başını qaldır! İstə! İstədiyin sənə veriləcək. Şəfaət et, şəfaətin qəbul ediləcək!

Mən də başımı səcdədən qaldıracağam və:

- Ey Rəbb! Ümmətimi mənə bağışla! Ey Rəbb! Ümmətimi qurtar! Ey Rəbb! Ümmətimi bağışla!, – deyə yalvaracağam.

O zaman mənə:

- Ey Məhəmməd! Ümmətindən hesaba çəkilməyəcək olanları cənnət qapılarının ən sağındakı «Babül eymə»dən içəri al! Onlar başqaları ilə birgə cənnətin başqa qapılarından da girəcəklər.

Sonra Rəsuli-Əkrəm sözünə belə davam etdi: «Canımı qüdrətiylə yaradan Allaha and içirəm ki, cənnət qapılarının iki qanadı arasındakı məsafə Məkkə ilə (Bəhreyndəki) Həcər və ya Məkkə ilə (Suriyadakı) Busra arasındakı məsafə qədər genişdir».[198]

Başqa bir hədis oxuyaq. Abdullah İbnil-Asın (r.a) rəvayət etdiyinə görə, Peyğəmbər (s.a.s.) uca Allahın İbrahim (aleyhissəlam) haqqında olan: «Rəbbim, bütlər insanlardan bir çoxunun sapmasına səbəb oldular. İndi kim mənə uyarsa, o məndəndir», ayəsini:

رَبِّ إِنَّهُنَّ أَضْلَلْنَ كَثِيراً مِّنَ النَّاسِ فَمَن تَبِعَنِي فَإِنَّهُ مِنِّي وَمَنْ عَصَانِي فَإِنَّكَ غَفُورٌ رَّحِيمٌ

(İbrahim, 14/36)

və İsa (aleyhissəlamın): «Əgər özlərinə əzab edərsən, şübhəsiz onlar sənin qullarındır. Əgər onları bağışlarsan şübhəsiz, sən izzət və hikmət sahibisən» ayəsini:

إِن تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَ وَإِن تَغْفِرْ لَهُمْ فَإِنَّكَ أَنتَ الْعَزِيزُ الْحَكِيمُ

(Maidə, 5/118)

---

198 Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 563-565.

oxudu, əllərini qaldırdı və :

«Allahım, ümmətimi qoru, ümmətimə acı!», - deyə dua etdi və ağladı. Uca Allah:

- Ey Cəbrail! Rəbbin hər şeyi daha yaxşı bilir, get Məhəmməddən nə üçün ağladığını soruş.

Cəbrail gəldi. Rəsulallah (s.a.s.) da ümməti üçün duyduğu əndişədən dolayı ağladığını söylədi. Onsuz da Allah hər şeyi yaxşı bilәndir. (Cəbrailin dönüb xəbər verməsi üzərə) uca Allah: «Ey Cəbrail! Məhəmmədin yanına get və ona bu sözümü çatdır», deyə buyurdu:

«Ümmətinin məsələsində səni razı edəcəyik və səni əsla üzməyəcəyik».[199]

Hz.Peyğəmbərin (s.a.s.) hədislərində onun cənnət paltarından və cənnətdəki köşkündən də danışılır. Bu yöndə olan hədislər onun axirətdəki üstün mövqeyini göstərir. Hz.Məhəmməd (s.a.s.) bir hədisində «Cənnət paltarlarından bir paltar geyər, sonra ərşin sağ tərəfində ayaqda duraram. O anda bu məqamda Allahın yaratdıqlarından məndən başqa heç kimsə yoxdur», buyurur.[200]

Başqa bir hədisində isə yerinin «Adn cənnətində ağ buluda bənzəyən bir köşk» olduğunu açıqlayır.[201]

Hz.Məhəmməd (s.a.s.) bir başqa hədisində isə axirətdə də ümmətinə başçı olacağını buyurur: «Uca Allah bir ümmətə rəhmətlə yanaşmaq istəyirsə, o ümmətin Peyğəmbərini onlardan öncə öldürər. Onu özləri üçün axirətdə öncül və yol göstərən edər. Uca Allah bir ümməti də həlak etmək istəyincə daha Peyğəmbərləri sağ ikən o millətə əzab edər, onun gözü önündə onları məhv edər. Peyğəmbəri

[199] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 105.
[200] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 581.
[201] Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 510.

yalanlayıb, əmrinə qarşı gəlmələri üzündən onları həlak etməklə peyğəmbəri də məmnun edər».[202]

Hz. Məhəmmədin (s.a.s.) axirətdəki vəzifələrindən biri də şahid olmaqdır:

فَكَيْفَ إِذَا جِئْنَا مِن كُلِّ أمَّةٍ بِشَهِيدٍ وَجِئْنَا بِكَ عَلَى هَـؤُلاء شَهِيداً

(Nisa, 4/41)

«Hər ümmətdən bir şahid gətirdiyimiz və səni də (ey Məhəmməd!) bütün bunlara şahid göstərdiyimiz zaman o kafirlərin halları necə olacaqdır».

Bu Quran ayəsindən anlaşılan ilahi xəbərlər onu göstərir ki, hz.Məhəmməd (s.a.s.) ümmətinə bu dünyada çox şəfqətli, mərhəmətli, axirətdə də şəfaət istəyəndir. Hz.Məhəmmədin (s.a.s.) qiyamət günü həm öz ümmətinə, həm də başqa ümmətlərin Peyğəmbərlərinə şahidlik edəcəyi ilahi qaynaqlı bir gerçəklikdir.

Hz.Məhəmməd (s.a.s.) bir mübarək hədisində: «Hər Peyğəmbərin özünə xas və qəbul ediləcək olan bir duası var. Onunla Allaha dua etmişdir. Ancaq mən duamı axirətdə ümmətimə şəfaət üçün saxlayıram», buyurur.[203] Aləmlərə rəhmət olaraq göndərilən hz.Məhəmmədin (s.a.s.) bu hədisində də bu dünya ilə axirət arasında bir tarazlığın olduğu, onun hər zaman, ən çətin anlarda ümmətinin yanında olacağı görünür.

Hz.Məhəmmədin (s.a.s.) bu dünyadakı vəzifələri, öncüllüyü, rəhməti, mərhəməti və şəfqəti, axirətdəki kövsəri, şəfaət haqqı, şahidliyi, cənnətdəki yeri nətlərə mövzu olmuşdur:

**Cəfər Çələbi:**

Ey ser-firaz-i halk etek senün el benüm,

---

[202] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 135.
[203] Emine Yeniterzi, göstərilən qaynaq, s. 303.

Şol gün ki, ola bir ayak üstünde bin ayak.[204]

(Ey xalqın başçısı (hz.Məhəmməd), bir ayaq üstündə min ayaq olan gün (qiyamət günü) əl mənim, ətək sənin)

**Nəcati:**

Şefaatün demidür geldi, ya Resulullah,
İnayet eyle ki, gelmez inayetüne zeval.[205]

(Ey Rəsulullah, şəfaət anı gəldi. Bizə şəfaət istə, sənin şəfaətinə zaval yoxdur)

**Füzuli:**

Darüş-şəfai-həşrdə bimarı-məsiyyət,
Şəhdi-şəfaətündən umar şərbəti-şifa.[206]

(Həşrdə, şəfa yerində xəstə şəfa şərbətindən şəfaət şirinliyi umar)

İndi hz.Nizaminin birinci nətinin səkkizinci beytində olan sözlərin, bütövlükdə beytin informasiya qaynaqlarını üzə çıxardıqdan, əldə etdikdən sonra onu bir də oxuyaq: «Cahanın qulağı onun «mim»inin halqasını daşıyandır, Hər iki cahanın (dünyanın) halqası onun itaətindədir».

## HƏZRƏT NİZAMİNİN BEYTƏ YÜKLƏDİYİ MƏNALAR

**Hz.Nizaminin beytinin birinci xəbəri hz. Məhəmmədin (s.a.s.) ilahi qaynaqlı, bu dünyada başlayan və axirətdə də davam edəcək hakimiyyətinin olması ilə bağlıdır.** Hz.Məhəmməd (s.a.s.) həm ümmətin – Allahdan başqa Allah yoxdur, hz.Məhəmməd onun qulu və elçisidir düşüncəsini daşıyanların başçısıdır, həm də dövlət başçısıdır. Onun hakimiyyəti bütün insanlara aiddir, onun rəhmətindən, bərəkətindən, şəfaətindən bütün insanlara bol-bol pay düşür. Hz.Nizami bu mənanı «cahan» (dünya) sözü ilə ifadə edib.

---

[204] Emine Yeniterzi, göstərilən qaynaq, s. 304.
[205] Emine Yeniterzi, göstərilən qaynaq, s. 304.
[206] Emine Yeniterzi, göstərilən qaynaq, s. 304.

O, bölgə, qəbilə, bir millət başçısı deyil. Hz.Nizaminin təqdimatında o, cahan lideridir.

Hz.Nizami həm də onun hakimiyyətinin təkcə insanlara bağlı olduğunu düşünmür. **Şair «O aləmlərə göndərildi» ilahi mesajından çıxış edərək hz.Məhəmmədi (s.a.s.) bütün yaradılmışların başçısı sayır, onun hakimiyyətinin sınırlarını belə bəyan edir: Onun hakimiyyəti bütün yaradılmışlar üzərində olan mübarək islam peyğəmbərinin rəhməti də, salamı da, bərəkəti də, şəfaəti də sonsuzdur, hamıya və hər şeyə aiddir.** Hz.Məhəmmədin (s.a.s.) insan, gül, çiçək, heyvan, hava, su sevgisi də sadəcə bir insan sevgisi deyil, ilahi qaynaqlı bəşəri hakimiyyətlə vəzifələndirilmiş, yaradılan hər şeyə görə sorumlu olan Peyğəmbər sevgisidir.

Hz.Məhəmməd (s.a.s.) yaradılan hər şeyin fitrəti üzrə, təyinatına uyğun fəaliyyət göstərməsini təmin etmək üçün seçilmiş və göndərilmişdir. O, uca Allahdan (c.c.) varlıqdakı tarazlığı qorumaq vəzifəsi almışdır. Bu ilahi düzümü qorumağın yolu yaradılan hər şeyin haqqını özünə verməklə ola bilər, onu öyrənməklə, onlarla bağlı Allahın (c.c.) elmini oxumaqla olar. Bunu da ancaq Allahı tanıyan insan edə bilər.

Hz.Nizami bu beytdə də üslubuna uyğun olaraq hz. Məhəmmədlə (s.a.s.) bağlı danışanda, onu təqdim edəndə ideyanı və Peyğəmbəri sonsuz bir məkan içində təqdim edir. **Yuxarıdakı beytlərdə «firuzə rəngli kərpicdən tikilmiş günbəzin (səmanın) altında, saray behiştində yetişmiş» olan Hz.Məhəmmədin (s.a.s.) bu beytdəki yeri bu dünya və axirətdir.** Onun hakimiyyətinin məkanı (bu dünya və axirət) və zamanı sonsuzdur. Məkan və zaman sonsuzluğu onun uca Allah yanındakı yerini, insanlıq üçün dəyərini göstərir.

Burada şeirdə ideyanın ölçü vahidi olan beytlə bağlı da bir neçə söz demək istəyirik. «Beyt» ərəbcə «ev» deməkdir. Bir gözəl ev tikmək üçün hər şeyin düşünülməsi, planlı, sistemli olması şərt olduğu kimi, «beyt» də eləcə düşünülməlidir. Hz.Nizami hər evi (beyti), bu beytin hər bir kərpicini (sözünü), onun ölçüsünü, yerini, rəngini bir-bir seçmişdir. Hz.Nizaminin hər bir evi (beyti), bu evlərdən ibarət sarayı hz.Məhəmmədin (s.a.s.) adına layiqdir.

**Hz.Nizaminin bu beytinin bizə verdiyi ikinci önəmli xəbər, ölçü odur ki, Allahın rizasını qazanmaq istəyirsinizsə, Peyğəmbərin (s.a.s.) gətirdiklərinə uymalısınız.** Bu dünyada və axirətdə xoşbəxt yaşamağın tək yolu budur. Hz.Məhəmməd (s.a.s.) rəhmət, şəfqət, mərhəmət, şəfaət sahibidir.

Hz.Nizami bu beytdə də öncəki beytlərdə olduğu kimi özünü insanları hz.Məhəmmədə (s.a.s.) inandırmaq missiyasının daşıyıcısı kimi hiss edir, o, bu düşüncənin, bu hədəfin şairidir. Hz.Nizami insanları uca Allaha (c.c.), hz.Məhəmmədə (s.a.s.) inandırmaq üçün də Peyğəmbəri onlara tanıtmaq yolunu seçir. Bəyan edir ki, hz.Məhəmməd (s.a.s.) iki dünyanın sultanıdır. Ona itaətin nəticəsi bu dünyada gözəl əxlaq, azadlıq, axirətdə də cənnətdir. Hz.Nizami bir yandan hz.Məhəmmədi (s.a.s.) insanlara tanıdır, başqa yöndən isə müjdə verir. Tanıtmaq və müjdə vermək isə inandırmağın iki ən etibarlı yoludur.

**Hz.Nizaminin bu beytdə bizə verdiyi üçüncü önəmli xəbər odur ki, axirəti anlamadan bu dünyanı doğru yaşamaq mümkün deyil.** Bizə bu dünyanı və axirəti anladan mübarək insan da hz.Məhəmməddir (s.a.s.) . Uca Allah insanı sadəcə yemək, içmək, yatmaq üçün yaratmadı. Ona böyük hədəflər göstərdi, ölümlə hər şeyin bitmədiyini anlatdı, onun bədənini və ruhunu böyük işlər görmək üçün zəruri

imkanlarla təmin etdi, Quran, Peyğəmbər göndərdi. Hz.Nizaminin bu beytinə yerləşmiş «sirlər»dən biri də budur ki, bizə hər iki dünyada fitrət üzrə yaşamaq səadəti verəcək imkan Qurana və Allahın elçisinə (c.c.) imandır.

## BEYTİN BƏDİİ BİÇİMİ

Hz.Nizami beytin poetik biçimini də gözəl seçmişdir. Beyt bütövlükdə bir tarazlıq üzərində qurulmuşdur. Şair dünyanı bir qula, köləyə bənzədir, bu kölənin qulağında onun qul olduğunu göstərən bir halqa var. Bu halqa Məhəmmədin (Əhməd) adındakı «mim» hərfinin halqasına oxşayır. Sonra hz.Nizami axirəti də bir köləyə bənzədir. Onun da halqası hz.Məhəmmədin (s.a.s.) itaətindədir. Sultan (hz.Məhəmməd), qul (bu dünya və axirət) arasında olan münasibət hz.Məhəmmədin (s.a.s.) hakimiyyətinin tamlığını vermək üçün dəqiq seçilib. Qulağında halqa olan qul öz ağasına tabedir. İki dünya da hz.Məhmmədin (s.a.s.) itaətindədir. Halqadan imtina mümkün olmadığı kimi hz. Məhəmmədin (s.a.s.) hakimiyyətindən imtina da mümkün deyil, bunun sonu fəlakətdir. Hər iki cahanı qazanmağın yolu da hz.Məhəmmədə (s.a.s.) itaətdir. İtaət də sevginin göstəricisidir. Uca Allaha (c.c.), hz.Məhəmmədə (s.a.s.) qul olmağın tək qurtuluş yolu olduğunu, baxın Quran necə buyurur:

قُلْ إِن كُنتُمْ تُحِبُّونَ اللّهَ فَاتَّبِعُونِي يُحْبِبْكُمُ اللّهُ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَاللّهُ غَفُورٌ رَّحِيمٌ

(Ali-İmran, 3/31)

«Əgər Allahı sevirsinizsə, mənə uyun ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah çox bağışlayan və sonsuz mərhəmət sahibidir».

Hz.Mövlana Allaha, hz.Məhəmmədə (s.a.s.) itaətin zəruriliyini hər şeyin önünə qoyur: «Canım tənimdə olduqca Quranın köləsiyəm. Mən Allahın seçkin Peyğəmbəri Məhəmmədin yolunun torpağıyam. Hər kim bundan başqa məndən bir söz danışarsa, ona çox üzülür və o sözdən də çox üzüntü duyaram».[207] «Mustafanın hüzurunda ağlı qurban et. «Allahım yetər mənə», de, «Allahım yetər!»[208]

**Yunis Əmrə** də «Allaha, Peyğəmbərə itaət et, qurtul» ölçüsünü belə təqdim edir:

Hakkı nerden bulasın Hakka kul olmayınca,
Erenler eşiyinde yaslanıp yatmayınca?

Bir bağ ki viran ola, içi dikenle dola,
Ayıtlamaq neylesin od ile yanmayınca.

İssızlıkta, yabanda odmu bulunur onda,
Kavı, taşı, çakmağı bir yerde olmayınca?

İssızlıkta kalma sen, odunu söndürme sen,
Odu nerden bulasın ocağa varmayınca?

O hakiykat güneşi doğar burcundan,
Şule vermez Yunusa hiçaplar gitmeyince.[209]

***

…Gel bırak beni yanayım, baştan başa usanayım,
Ol sevdigin Muhammede olayım çırak Çalabım.

… Kullar Senin, sen kulların, günahları yok bunların,
Uçmağına sal bunları, binsinler burak Çalabım.

Ne ilmim var, ne taatım, ne gücüm var, ne kuvvetim,

---

[207] Tasavvuf, göstərilən qaynaq, s. 68.
[208] Tasavvuf, göstərilən qaynaq, s. 109.
[209] Yunus Emre (hazırlayan, Abdülbakı Gölpınarlı), İstanbul, 1995, s. 117.

Meger Senin inayetin kıla yüzüm ak Çalabım.

Gel bağışla sen Yunusu bu günahlı kullar ile,
Eger bağışlamaz isen key katı firak Çalabım.[210]

Burada bir məsələyə də toxunaq. Hz.Nizami başqa beytlərdə olduğu kimi bu beytdə də ideyanı əyaniləşdirmək yolunu tutmuşdur. Beytdə ideyanın təqdimi mücərrəd obrazlarla, bədii təsvir-ifadə vasitələri ilə deyil, canlı, yadda qalan detallarla, naxışlarla verilmişdir. Bunun da iki səbəbi var. Birincisi, hz.Nizami ideyanı asan başa salmaq, insanları ona inandırmaq istəyir**.**

**Buna görə də, hər bir beytin ideyasına uyğun bədii biçim, obraz seçir. Məsələn, bu beytdə başlıca ideya hz. Məhəmmədin (s.a.s.) hakimiyyətidir. Bu ideyanı vermək üçün hz.Nizami sultan obrazı yaradır.** Sultan hakimiyyət düşüncəsini yaradan ən önəmli obrazlardan biridir. Sonra şair misrada ikiqat köləlik anlayışı yaradır. Bu dünya onun– Sultanın (hz.Məhəmmədin) köləsidir, Axirət onun köləsidir. Hz.Nizami Peyğəmbərin (s.a.s.) tam hakimiyyətini, onun itaətindən imtinanın mümkünsüzlüyünü göstərmək üçün bu kölənin (bu dünya və axirət) qulağında halqa təsvir edir və bu halqa Məhəmmədin (s.a.s.), Əhmədin «mim»inin halqasıdır. Bu kölənin (bu dünya və axirətin) Sultan (hz. Məhəmməd) yanında olmasa belə, qulağındakı halqası onun hz.Məhəmmədə (s.a.s.) məxsusluğunu təsdiq edir. Buradan çıxan bir məna da odur ki, bu dünya hz.Məhəmməddən (s.a.s.) öncə və sonra onun itaətindədir. Uca Allah Məhəmmədin (s.a.s.) eşqinə bu dünyanı yaratdı, bu dünyanın nizamı hz. Məhəmmədin (s.a.s.) gətirdiyi ilahi qanunlar üzərində qurulub.

---

[210] Yunus Emre (hazırlayan, Abdülbakı Gölpınarlı), İstanbul, 1995, s. 117.

Beyt, hz.Nizaminin başlanğıcdan verdiyi ilk-son Peyğəmbər ideya və inancını vurğulayaraq öncəki «ev»lərin – beytlərin sırasına qoşulur, onlara bağlanaraq məzmun və biçim tamlığı yaradır.

Hz.Nizaminin naxışlarındakı – obrazlılığındakı canlılığın bir önəmi də şairin təbliğ metodu ilə bağlıdır. İdeyanı təbliğ etmək, insanları ona inandırmaq üçün o, təkrar olunmalı, onun haqqında düşünülməlidir. Düşünmək üçün isə obrazlar gərəkdir. Bir şeyi göz önündə canlandıraraq onunla bağlı düşünmək daha asandır, o obraz yadda qalaraq, əyaniləşərək bizi bu obrazın ifadə etdiyi mənaya, ideyaya yönəldir.

**İndi hz.Nizaminin beytini «səhnələşdirək» : Bir sultan əyləşib, qulağında onun halqası olan kölələr hərəkətdədir. Hər kəs bu kölələri görür və onun sahibinin zəngin, hökm sahibi olduğunu düşünür. Kölə sultanın hakimiyyətinin dəlilinə çevrilir. İnsanlar güclü, yenilməz olan varlığa inanır.**

Hz. Nizami beytin birinci misrasında bu təsviri yaradır və bu inandırıcı təsvirin işığında ideyanı verir. İkinci misra belədir: «Hər iki cahanın (dünyanın) halqası onun itaətindədir».

Əslində, bu, Quranın təbliğ metodudur. Bir ayəyə baxaq:

أَوَلَمْ يَرَوْا إِلَى الطَّيْرِ فَوْقَهُمْ صَافَّاتٍ وَيَقْبِضْنَ مَا يُمْسِكُهُنَّ إِلَّا الرَّحْمَنُ
إِنَّهُ بِكُلِّ شَيْءٍ بَصِيرٌ

(Mülk, 67/19)

«Üstlərində qanad açıb süzərək uçan quşlara baxmırlarmı? Onları havada saxlayan ancaq Rəhmandır. Şübhəsiz ki, o, hər şeyi görür».

Bu ayədə uca Allah yaradanın qüdrətini anlatmaq üçün gözlənilmədən insanların baxışını havada uçan quşa yönəldir. Quşun uçmasını, özünün isə uça bilmək bacarığının

olmamasını düşünən insan quşa bu imkanı verənin Allah olduğunu anlayır. Ya da uca Allah insanları axirətə inandırmaq üçün cənnəti və cəhənnəmi aydın detallarla verir, insanı bu obrazlarla düşünməyə yönəldir. Düşünmə təkrarla dərinləşir və inandırıcılıq imkanı artır. Təbii ki, mücərrəd bir şeyi düşünmək, ona inanmaq çox çətindir. Bir-iki ayəyə baxaq:

وَبَشِّرِ الَّذِين آمَنُواْ وَعَمِلُواْ الصَّالِحَاتِ أَنَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي مِن تَحْتِهَا الأَنْهَارُ كُلَّمَا رُزِقُواْ مِنْهَا مِن ثَمَرَةٍ رِّزْقاً قَالُواْ هَـذَا الَّذِي رُزِقْنَا مِن قَبْلُ وَأُتُواْ بِهِ مُتَشَابِهاً وَلَهُمْ فِيهَا أَزْوَاجٌ مُّطَهَّرَةٌ وَهُمْ فِيهَا خَالِدُونَ

(Bəqərə, 2/25)

«İman edib saleh əməl işləyənləri isə müjdələ. Onlar üçün altından çaylar axan cənnətlər var. Onlara hər hansı bir meyvə veriləndə onlar hər dəfə «bu bizim öncədən yediyimiz (ruzi olaraq aldığımız) şeydir», deyərlər. O ruzi bir-birinin bənzəri olaraq onlara verilir. Orada özləri üçün çox təmiz zövcələr də var. Həm də onlar orada əbədi qalacaqlar».

وَإِن كُنتُمْ فِي رَيْبٍ مِّمَّا نَزَّلْنَا عَلَى عَبْدِنَا فَأْتُواْ بِسُورَةٍ مِّن مِّثْلِهِ وَادْعُواْ شُهَدَاءكُم مِّن دُونِ اللّهِ إِنْ كُنْتُمْ صَادِقِينَ {23} فَإِن لَّمْ تَفْعَلُواْ وَلَن تَفْعَلُواْ فَاتَّقُواْ النَّارَ الَّتِي وَقُودُهَا النَّاسُ وَالْحِجَارَةُ أُعِدَّتْ لِلْكَافِرِينَ

(Bəqərə, 2/23-24)

«Əgər qulumuza parça-parça endirdiyim Qurandan şübhədə isəniz, onun kimi bir surə gətirin və Allahdan başqa güvəndiklərinizin hamısını çağırın. Əgər doğrusunuzsa, bunu edin. Yox! Edə bilməzsiniz. Heç bir zaman edə bilməyəcəksiniz. O halda yanacağı insanlarla daşlar olan o atəşdən çəkinin. O atəş kafirlər üçün hazırlandı».

Bu ayələrdən birincisində uca Allah cənnəti təsvir edir. O təqdimatında «axar su», «meyvə», «zövcə» obrazından yararlanır. Su bir gözəllik, təmizlik, həyat qaynağı, meyvə bir dad, zövcə də insan oğlunun ehtiyacı olan başqa bir nemət. Biz cənnəti bir su kimi, bir meyvə kimi, bir zövcə kimi düşünürük, duyuruq, arzulayırıq və inanırıq.

İkinci ayədə isə cəhənnəm bir «atəş», «yanan insan», «yanan daş» obrazları ilə təqdim olunur. Bu dəhşətli atəş cəhənnəmin gerçək obrazını yaradır. Biz cəhənnəmi bu «atəş», «yanan insan», «yanan daş» obrazları ilə düşünür, onun varlığına inanır, ondan qorxur və ora düşməmək üçün çalışırıq.

Biz, hz.Nizaminin təqdimatında bu kölənin sahibini – dünyanın və axirətin qulağında halqası olan sultanı – hz.Məhəmmədi (s.a.s.) tanıyırıq, onun əzəmətini görürük və ona inanırıq.

## DOQQUZUNCU BEYTİN ŞƏRHİ: O, SAHƏÖLÇƏNDİR

Nətin doqquzuncu beytinin şərhinə başlayaq:

خواجه مساح ومسيحش غلام

آنت بشير اينت مبشر به نام

***O (Məhəmməd), sahəölçən xacə, Məsih isə onun nökəridir.***

***O, (Allahdan) müjdə (xeyir xəbər) gətirən, bunun isə yalnız adı muştuluqçudur.***[211]

Bu beytdə hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) başqa Peyğəmbərlərdən üstünlüyü ideyasını bədii bir biçimdə vermişdir. **Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) başqa peyğəmbərlərdən üstünlüyünü vermək üçün uyğun yol – metod seçmişdir. Bu tutuşdurma – müqayisə yoludur.** Öncəki beytlərdə daha çox bənzətmə yolu seçən hz.Nizami bu beytin ideyasını tutuşdurma – müqayisə yolu ilə verərək şərh etmişdir. Çünki, üstünlüyü sübut etməyin yolu tutuşdurmaqdır. Gəlin, beytin simmetriyasına, tərəzinin gözündə olan nəsnələrə baxaq:

Məhəmməd --------- Məsih
Sahəölçən xacə --------- Nökər
Allahdan müjdə gətirən --------- Muştuluqçu

## HƏZRƏT NİZAMİ HƏZRƏT MƏHƏMMƏDLƏ (s.a.s.) MÜQAYİSƏ OBYEKTİ OLARAQ NİYƏ HƏZRƏT İSANI (s.a.s.) SEÇİB?

Biz, bu anlayışlara yerləşmiş mənaları bir-bir açıqlayaq. Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) başqa Peyğəmbərlərdən üstünlüyünü vermək üçün nəyə görə məhz hz.İsanı (s.a.s.) seçmişdir? İkinci bir məsələ də odur ki, hz.Nizami,

[211] Nizami Gəncəvi, göstərilən qaynaq, s. 25.

hz.Məhəmmədin (s.a.s.) üstünlüyünü vermək üçün insanlıq tarixində, İslam tarixində, uca Allahın (c.c.) insanlarla bağlı qəbul etdiyi qərarlar, buyruqlar sırasında çox önəmli yer tutan Meracda verilən müjdəni- buyruğu (ilahi əmri) əsas götürmüşdür. Hz.İsanın (s.a.s.) və Meracın anlaşılması beytin sirrinin açarıdır.

Uca Allah (c.c.) insanlara peyğəmbərlər göndərərək , onları zülmdən qurtarmaq, onları doğru yola yönəltmək istədi:

رُّسُلاً مُّبَشِّرِينَ وَمُنذِرِينَ لِئَلاَّ يَكُونَ لِلنَّاسِ عَلَى اللّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ وَكَانَ اللّهُ عَزِيزاً حَكِيماً

(Nisa, 4/165)

«Biz müjdələyici və qorxuducu olaraq Peyğəmbərlər göndərdik ki, insanların Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanələri olmasın! Allah izzət və hikmət sahibidir» .

Peyğəmbərlər ilahi ölçülər gətirərək insanları Allahı (c.c.) tanımağa yönəltdilər:

مَّنِ اهْتَدَى فَإِنَّمَا يَهْتَدي لِنَفْسِهِ وَمَن ضَلَّ فَإِنَّمَا يَضِلُّ عَلَيْهَا وَلاَ تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَى وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّى نَبْعَثَ رَسُولاً

(İsra, 17/15)

«Doğru yol tutan yalnız özünə xeyir, haqq yoldan azan da ancaq özünə zərər edər. Heç bir günahkar başqasının günahını daşımaz. Biz peyğəmbər göndərməmiş əzab vermərik!».

وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ أُمَّةٍ رَّسُولاً أَنِ اعْبُدُواْ اللّهَ وَاجْتَنِبُواْ الطَّاغُوتَ فَمِنْهُم مَّنْ هَدَى اللّهُ وَمِنْهُم مَّنْ حَقَّتْ عَلَيْهِ الضَّلالَةُ فَسِيرُواْ فِي الأَرْضِ فَانظُرُواْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ

(Nəhl, 16/36)

«Biz hər ümmətə: «Allaha ibadət edin, Tağutdan çəkinin!,-deyə peyğəmbər göndərmişdik. Onların bir qismini

doğru yola yönəltmiş, bir qismi isə haqq yoldan azmalı olmuşdur. Yer üzündə dolaşıb görün ki, (peyğəmbərləri) yalançı hesab edənlərin axırı necə oldu!».

Əslində, peyğəmbərlərə vəhy edilənlər arasında da bir fərq yoxdur. Uca Allah (c.c.) göndərdiyi peyğəmbərlərin gətirdiklərində hədəf birliyinin olduğunu bəyan etmişdir:

شَرَعَ لَكُم مِّنَ الدِّينِ مَا وَصَّى بِهِ نُوحاً وَالَّذِي أَوْحَيْنَا إِلَيْكَ وَمَا وَصَّيْنَا بِهِ إِبْرَاهِيمَ وَمُوسَى وَعِيسَى أَنْ أَقِيمُوا الدِّينَ وَلَا تَتَفَرَّقُوا فِيهِ كَبُرَ عَلَى الْمُشْرِكِينَ مَا تَدْعُوهُمْ إِلَيْهِ اللَّهُ يَجْتَبِي إِلَيْهِ مَن يَشَاءُ وَيَهْدِي إِلَيْهِ مَن يُنِيبُ . وَمَا تَفَرَّقُوا إِلَّا مِن بَعْدِ مَا جَاءهُمُ الْعِلْمُ بَغْياً بَيْنَهُمْ وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِن رَّبِّكَ إِلَى أَجَلٍ مُّسَمًّى لَّقُضِيَ بَيْنَهُمْ وَإِنَّ الَّذِينَ أُورِثُوا الْكِتَابَ مِن بَعْدِهِمْ لَفِي شَكٍّ مِّنْهُ مُرِيبٍ . فَلِذَلِكَ فَادْعُ وَاسْتَقِمْ كَمَا أُمِرْتَ وَلَا تَتَّبِعْ أَهْوَاءهُمْ وَقُلْ آمَنتُ بِمَا أَنزَلَ اللَّهُ مِن كِتَابٍ وَأُمِرْتُ لِأَعْدِلَ بَيْنَكُمُ اللَّهُ رَبُّنَا وَرَبُّكُمْ لَنَا أَعْمَالُنَا وَلَكُمْ أَعْمَالُكُمْ لَا حُجَّةَ بَيْنَنَا وَبَيْنَكُمُ اللَّهُ يَجْمَعُ بَيْنَنَا وَإِلَيْهِ الْمَصِيرُ

(Sura, 42/13-15)

«Dini doğru tutun və onda ayrılığa düşməyin deyə din olaraq Nuha tövsiyə etdiyini, sənə vəhy etdiyimizi, İbrahimə, Musaya və İsaya tövsiyə etdiyimizi sizin üçün hüqüq düzəni etdi. Ancaq onları çağırdığın bu düzən Allaha ortaq qoşanlara ağır gəldi. Allah dilədiyini özünə seçər, ona yönələni də doğru yola yönəldər. Onlara elm gəldikdən sonra sadəcə aralarındakı paxıllıq üzündən ayrılığa düşdülər. Əgər bəlli bir vaxtadək Rəbbindən bir (ertələmə) sözü keçmiş olmasa idi, aralarında həmən hökm verilirdi. Onlardan sonra Kitaba varis olanlar (yəhudilər, xristianlar) da onda (Quran) bir şübhə və tərəddüd içindədirlər. Ona görə də, sən (tövhidə) dəvət et və əmr oldunduğun kimi dosdoğru ol. Onların pis arzularına uyma və de ki, mən Allahın kitabdan endirdiyinə inandım və aranızda

ədaləti gerçəkləşdirməklə əmr olundum. Allah bizim də Rəbbimiz, sizin də Rəbbinizdir. Bizim etdiklərimiz bizə, sizin etdikləriniz də sizədir. Bizimlə sizin aranızda mübahisəni zəruri edən bir durum yoxdur. Allah hamınızı bir araya toplayar, dönüş onadır».

Bu ayədə uca Allahın (c.c.) peyğəmbərlər göndərməklə hədəfinin nə olduğu, onların bir-birini tamamladığı açıqca görünür. Onlar Allahın (c.c.) varlığı və birliyini təbliğ etmək, yaradanı insanlara tanıtmaq, ədaləti bərpa etmək üçün göndərildi. Uca Allah (c.c.) bir çox ayədə peyğəmbərləri bir arada təqdim edir, onların adlarını sıralayır. Burada da başlıca hədəflərdən biri Peyğəmbərlərin gətirdikləri ilahi xəbərlərin aralarında bir fərq olmadığını göstərməkdir. Bir neçə ayəyə baxaq:

وَمَا أَرْسَلْنَا مِن قَبْلِكَ مِن رَّسُولٍ إِلَّا نُوحِي إِلَيْهِ أَنَّهُ لَا إِلَهَ إِلَّا أَنَا فَاعْبُدُونِ

(Ənbiya, 21/25)

«Səndən öncə heç bir Peyğəmbər göndərmədik ki, ona : məndən başqa Tanrı yoxdur, mənə qulluq edin!, - deyə vəhy etmiş olmayaq».

وَإِذْ يَرْفَعُ إِبْرَاهِيمُ الْقَوَاعِدَ مِنَ الْبَيْتِ وَإِسْمَاعِيلُ رَبَّنَا تَقَبَّلْ مِنَّا إِنَّكَ أَنتَ السَّمِيعُ الْعَلِيمُ . رَبَّنَا وَاجْعَلْنَا مُسْلِمَيْنِ لَكَ وَمِن ذُرِّيَّتِنَا أُمَّةً مُّسْلِمَةً لَّكَ وَأَرِنَا مَنَاسِكَنَا وَتُبْ عَلَيْنَا إِنَّكَ أَنتَ التَّوَّابُ الرَّحِيمُ . رَبَّنَا وَابْعَثْ فِيهِمْ رَسُولاً مِّنْهُمْ يَتْلُو عَلَيْهِمْ آيَاتِكَ وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَيُزَكِّيهِمْ إِنَّكَ أَنتَ العَزِيزُ الحَكِيمُ. وَمَن يَرْغَبُ عَن مِّلَّةِ إِبْرَاهِيمَ إِلاَّ مَن سَفِهَ نَفْسَهُ وَلَقَدِ اصْطَفَيْنَاهُ فِي الدُّنْيَا وَإِنَّهُ فِي الآخِرَةِ لَمِنَ الصَّالِحِينَ . إِذْ قَالَ لَهُ رَبُّهُ أَسْلِمْ قَالَ أَسْلَمْتُ لِرَبِّ الْعَالَمِينَ . وَوَصَّى بِهَا إِبْرَاهِيمُ بَنِيهِ وَيَعْقُوبُ يَا بَنِيَّ إِنَّ اللّهَ اصْطَفَى لَكُمُ الدِّينَ فَلاَ تَمُوتُنَّ إَلاَّ وَأَنتُم مُّسْلِمُونَ . أَمْ كُنتُمْ شُهَدَاء إِذْ حَضَرَ يَعْقُوبَ الْمَوْتُ إِذْ قَالَ لِبَنِيهِ مَا تَعْبُدُونَ مِن بَعْدِي قَالُواْ

نَعْبُدُ إِلَـهَكَ وَإِلَـهَ آبَائِكَ إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ وَإِسْحَاقَ إِلَـهاً وَاحِداً وَنَحْنُ لَهُ مُسْلِمُونَ

(Bəqərə, 2/127-133)

«Bir zamanlar İbrahim İsmayıl ilə bərabər Evin (Kəbənin) təməllərini yüksəldir, ey Rəbbimiz, bizdən qəbul et, şübhəsiz, Sən eşidənsən, bilənsən. Ey Rəbbimiz! Bizi sənə təslim olanlardan et, nəslimizdən də sənə təslim olan bir ümmət çıxart, bizə ibadət yerlərimizi göstər, tövbəmizi qəbul et. Axı, Sən tövbələri qəbul edən, çox mərhəmətli olan ancaq sənsən. Ey Rəbbimiz! Onlara öz içlərindən Sənin ayələrini onlara oxuyacaq, onlara kitab və hikməti öyrədəcək, onları təmizləyəcək bir elçi göndər, hər zaman üstün gələn, hər şeyi yerli yerində edən sənsən. Ancaq nəfsinə zülm edən kimsə İbrahim dinindən üz çevirir. Həmd olsun ki, biz onu dünyada elçi seçdik, axirətdə də o yaxşılardandır. Rəbbi ona «islam ol» dediyi zaman aləmlərin Rəbbinə təslim oldum demişdi. İbrahim də bunu öz oğullarına vəsiyyət etdi. Yaqub da «Oğullarım! Sizin üçün o dini (islamı) seçdi. O halda sadəcə müsəlmanlar olaraq ölün», - dedi. Yoxsa siz Yaquba ölüm gəldiyi zaman orada idinizmi? O zaman Yaqub oğullarına : «Məndən sonra kimə qulluq edəcəksiniz?, demişdi. «Sənin Allahın və ataların İbrahim, İsmayıl və İshaqın  Allahı olan tək Allaha qulluq edəcəyik. Biz Ona təslim olanlarıq» - dedilər».

مَا كَانَ إِبْرَاهِيمُ يَهُودِيّاً وَلاَ نَصْرَانِيّاً وَلَكِن كَانَ حَنِيفاً مُّسْلِماً وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ . إِنَّ أَوْلَى النَّاسِ بِإِبْرَاهِيمَ لَلَّذِينَ اتَّبَعُوهُ وَهَـذَا النَّبِيُّ وَالَّذِينَ آمَنُواْ وَاللّهُ وَلِيُّ الْمُؤْمِنِينَ

(Ali-İmran, 3/67-68)

«İbrahim nə yəhudi, nə də xristian idi. Ancaq o Allahı bir tanıyan dostdoğru bir müsəlman idi, müşriklərdən də deyildi. İnsanların İbrahimə ən yaxın olanı ona uyanlar, bu Peyğəmbər (Məhəmməd) və ona iman edənlərdir. Allah möminlərin dostudur».

قُلْ آمَنَّا بِاللّهِ وَمَا أُنزِلَ عَلَيْنَا وَمَا أُنزِلَ عَلَى إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ وَإِسْحَاقَ وَيَعْقُوبَ وَالأَسْبَاطِ وَمَا أُوتِيَ مُوسَى وَعِيسَى وَالنَّبِيُّونَ مِن رَّبِّهِمْ لاَ نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِّنْهُمْ وَنَحْنُ لَهُ مُسْلِمُونَ

(Ali-İmran, 3/84)

«De ki, biz Allaha, bizə endirilənə, İbrahim, İsmayıl, İshaq, Yaqub və Yaqub oğullarına endirilənlərə, Musa, İsa və başqa peyğəmbərlərə Rəbbləri tərəfindən verilənlərə iman etdik. Onları bir-birindən ayıra bilmərik. Biz sadəcə müsəlmanlarıq».

Qüdrət sahibi Allah (c.c.) peyğəmbərləri bir-birindən ayırmağı küfr sayır:

إِنَّ الَّذِينَ يَكْفُرُونَ بِاللّهِ وَرُسُلِهِ وَيُرِيدُونَ أَن يُفَرِّقُواْ بَيْنَ اللّهِ وَرُسُلِهِ وَيقُولُونَ نُؤْمِنُ بِبَعْضٍ وَنَكْفُرُ بِبَعْضٍ وَيُرِيدُونَ أَن يَتَّخِذُواْ بَيْنَ ذَلِكَ سَبِيلاً . أُوْلَـئِكَ هُمُ الْكَافِرُونَ حَقّاً وَأَعْتَدْنَا لِلْكَافِرِينَ عَذَاباً مُّهِيناً

(Nisa, 4/150-151)

«Allahı və Peyğəmbərlərini inkar edənlər və (inanmaqla bağlı) Allah ilə Peyğəmbərlərini bir-birindən ayırıb: «Bir qisminə inanırıq, ancaq bir qisminə inanmırıq», deyənlər və bunlar (iman ilə küfr) arasında bir yol tutmaq istəyənlər yoxmu, gerçəkdən kafirlər onlardır. Biz kafirlərə alçaldıcı bir əzab hazırlamışıq».

Yaradan Allah (c.c.) peyğəmbərləri bir-birindən ayırmayanları isə müjdələyir:

وَالَّذِينَ آمَنُواْ بِاللّهِ وَرُسُلِهِ وَلَمْ يُفَرِّقُواْ بَيْنَ أَحَدٍ مِّنْهُمْ أُوْلَـئِكَ سَوْفَ يُؤْتِيهِمْ أُجُورَهُمْ وَكَانَ اللّهُ غَفُوراً رَّحِيماً

(Nisa, 4/152)

«Allaha və Peyğəmbərlərinə iman edən və onlardan heç birini başqalarından ayırmayanlara (gəlincə) isə Allah onlara mükafatlarını yaxında verəcəkdir. Allah çox bağışlayıcı və mərhəmətlidir».

Hz. Nizami doqquzuncu beytdə hz. Məhəmmədin (s.a.s.) başqa peyğəmbərlərdən üstünlüyünü müqayisə yolu ilə bədii bir biçimdə verib. Burada başlıca hədəf hz. Məhəmmədin (s.a.s.) sonuncu olduğunu, Allahın (c.c.) insanlara olan «nemətini tamamladığını» bildirərək qulları hz. Məhəmmədə (s.a.s.) inanmağa yönəltmək və bununla da insanların bu dünyada və axirətdə xoşbəxtliyinə çalışmaqdır. Hz.Nizami hz.Məhəmmədlə (s.a.s.) müqayisə tərəfi olaraq hz.İsanı (s.a.s.) seçib. Bunun da səbəbi var.

**Uca Allah (c.c.) peyğəmbərləri bir-birindən ayırmamağı buyurur.** Yuxarıda verdiyimiz ayələr bunun açıq göstəriciləridir. Bunun anlamı odur ki, peyğəmbərləri Allah (c.c.) seçir, peyğəmbərlər Allahın (c.c.) varlığının dəlilləri sırasında yer tuturlar, onların hədəfi Allahı (c.c.) insanlara tanıtmaqdır və peyğəmbərləri inkar Allahı inkar deməkdir. Bununla birgə uca Allah (c.c.) peyğəmbərlərin dərəcələrinə görə bir-birindən seçildiyini də bəyan edir:

تِلْكَ الرُّسُلُ فَضَّلْنَا بَعْضَهُمْ عَلَى بَعْضٍ مِّنْهُم مَّن كَلَّمَ اللّهُ وَرَفَعَ بَعْضَهُمْ دَرَجَاتٍ وَآتَيْنَا عِيسَى ابْنَ مَرْيَمَ الْبَيِّنَاتِ وَأَيَّدْنَاهُ بِرُوحِ الْقُدُسِ وَلَوْ شَاء اللّهُ مَا اقْتَتَلَ الَّذِينَ مِن بَعْدِهِم مِّن بَعْدِ مَا جَاءتْهُمُ الْبَيِّنَاتُ وَلَـكِنِ اخْتَلَفُواْ فَمِنْهُم مَّنْ آمَنَ وَمِنْهُم مَّن كَفَرَ وَلَوْ شَاء اللّهُ مَا اقْتَتَلُواْ وَلَـكِنَّ اللّهَ يَفْعَلُ مَا يُرِيدُ

(Bəqərə, 2/253)

«O Peyğəmbərlər ki, biz onlardan bir qismini başqalarından üstün etdik. Allahın özləri ilə danışdığı onlardır. Bir sıra Peyğəmbərlərin dərəcələrini yüksəltdik. Məryəm oğlu İsaya açıq möcüzələr verdik, onu Ruhul-Qüds ilə təyid etdik. Allah diləsə idi, o Peyğəmbərlərdən sonra gələn millətlər, özlərinə açıq bəlgələr gəldikdən sonra bir-biriylə savaşmazlardı. Ancaq onlar ixtilafa yönəldi. Onlardan bir qismi iman etdi, bir qismi də inkar etdi. Allah diləsə idi, əlbəttə, onlar savaşmazlardı. Ancaq Allah murad etdiyini həyata keçirər».

İndi İsa (s.a.s.) peyğəmbərin yerini göstərmədən öncə Qurani-Kərim işığında Peyğəmbərlərə verilən özəllikləri, onları bir-birindən seçən cizgiləri təqdim edək. Şanı uca olan Qurana görə, uca Allah (c.c.) mələklərə ilk peyğəmbər Adəmə (c.c.) səcdə etməyi əmr edib:

وَإِذْ قُلْنَا لِلْمَلاَئِكَةِ اسْجُدُواْ لآدَمَ فَسَجَدُواْ إِلاَّ إِبْلِيسَ أَبَى وَاسْتَكْبَرَ وَكَانَ مِنَ الْكَافِرِينَ

(Bəqərə, 2/34)

«O zaman mələklərə: «Adəmə səcdə edin», dedik. Dərhal səcdə etdilər. Ancaq iblis etmədi, təkəbbürünə yedirdə bilmədi. Onsuz da o kafirlərdən idi».

Qurani-Kərim hz.Nuh (s.a.s.) peyğəmbərin Adəmdən (s.a.s.) sonra insanlığın ikinci atası olduğunu buyurur:

ذُرِّيَّةَ مَنْ حَمَلْنَا مَعَ نُوحٍ إِنَّهُ كَانَ عَبْداً شَكُوراً

(İsra, 17/3)

«Ey Nuhla bərabər gəmiyə yüklədiyimiz kimsələrin soyundan olanlar! Doğrusu, o, çox şükr edən bir qul idi».

وَقَوْمَ نُوحٍ لَّمَّا كَذَّبُوا الرُّسُلَ أَغْرَقْنَاهُمْ وَجَعَلْنَاهُمْ لِلنَّاسِ آيَةً وَأَعْتَدْنَا لِلظَّالِمِينَ عَذَاباً أَلِيماً

(Furkan, 25/37)

«Nuh qövmünü də Peyğəmbərləri yalançı saydıqları vaxt suda boğub, özünü insanlara bir ibrət qıldıq. Zalımlara üzücü bir əzab hazırladıq».

Uca Allahın (c.c.), hz.İbrahimə (s.a.s.) verdiyi özəlliyin biri budur ki, o, atəşə atılsa da, yanmadı:

قَالُوا حَرِّقُوهُ وَانصُرُوا آلِهَتَكُمْ إِن كُنتُمْ فَاعِلِينَ . قُلْنَا يَا نَارُ كُونِي بَرْداً وَسَلَاماً عَلَى إِبْرَاهِيمَ

(Ənbiya, 21/68-69)

«Onlar: «Bir şey edəcəksinizsə, bunu yandırın da tanrılarınıza yardım edin», dedilər. Biz: «Ey atəş, İbrahimə qarşı sərin və səlamət ol», dedik».

Uca Quran, hz.Musanın (s.a.s.) Allahla (c.c.) danışmaq şərəfinə yüksəldiyini buyurur:

وَرُسُلاً قَدْ قَصَصْنَاهُمْ عَلَيْكَ مِن قَبْلُ وَرُسُلاً لَّمْ نَقْصُصْهُمْ عَلَيْكَ وَكَلَّمَ اللّهُ مُوسَى تَكْلِيماً

(Nisa, 4/164)

«Daha öncə sənə anlatdığımız peyğəmbərlərə, anlatmadığımız başqa peyğəmbərlərə də vəhy etdik. Və uca Allah Musa ilə danışdı».

وَلَمَّا جَاء مُوسَى لِمِيقَاتِنَا وَكَلَّمَه رَبُّهُ قَالَ رَبِّ أَرِنِي أَنظُرْ إِلَيْكَ قَالَ لَن تَرَانِي وَلَـكِنِ انظُرْ إِلَى الْجَبَلِ فَإِنِ اسْتَقَرَّ مَكَانَهُ فَسَوْفَ تَرَانِي فَلَمَّا تَجَلَّى رَبُّهُ لِلْجَبَلِ جَعَلَهُ دَكّاً وَخَرَّ موسَى صَعِقاً فَلَمَّا أَفَاقَ قَالَ سُبْحَانَكَ تُبْتُ إِلَيْكَ وَأَنَاْ أَوَّلُ الْمُؤْمِنِينَ . قَالَ يَا مُوسَى إِنِّي اصْطَفَيْتُكَ عَلَى النَّاسِ بِرِسَالاَتِي وَبِكَلاَمِي فَخُذْ مَا آتَيْتُكَ وَكُن مِّنَ الشَّاكِرِينَ

(Əraf, 7/143-144)

«Musa təyin etdiyimiz vaxt mükafatımıza gəldiyi zaman Rəbbi kəlamı ilə ona lütf etdi: «Ey Rəbbim, göstər mənə özünü sənə baxım»,- dedi. Rəbbi ona buyurdu ki, məni qətiyyən görə bilməzsən, ancaq dağa bax. Əgər o yerində dura bilərsə, sonra sən də məni görəcəksən. Rəbbi dağa təcəlli edəndə onu yerlə bir etdi. Musa özündən getdi. Ayılıb özünə gələndə: «Sübhansan sən, tövbə etdim, sənə döndüm və mən iman edənlərin ilkiyəm», - dedi. Allah buyurdu ki, ey Musa, göndərdiklərimlə və səninlə danışmağımla səni o insanlardan üstün etdim. İndi bu sənə verdiyimi al və şükrünü bilənlərdən ol».

Hz.Süleymana (s.a.s.) da bir sıra heyvanların dilini anlamaq möcüzəsi verilmişdir, insanlar, quşlar, cinlər, vəhşi heyvanlar, küləklər onun əmrində olmuşdur:

وَلَقَدْ آتَيْنَا دَاوُودَ وَسُلَيْمَانَ عِلْماً وَقَالَا الْحَمْدُ لِلَّهِ الَّذِي فَضَّلَنَا عَلَى كَثِيرٍ مِّنْ عِبَادِهِ الْمُؤْمِنِينَ . وَوَرِثَ سُلَيْمَانُ دَاوُودَ وَقَالَ يَا أَيُّهَا النَّاسُ عُلِّمْنَا مَنطِقَ الطَّيْرِ وَأُوتِينَا مِن كُلِّ شَيْءٍ إِنَّ هَذَا لَهُوَ الْفَضْلُ الْمُبِينُ . وَحُشِرَ لِسُلَيْمَانَ جُنُودُهُ مِنَ الْجِنِّ وَالْإِنسِ وَالطَّيْرِ فَهُمْ يُوزَعُونَ

(Nəml, 27/15-17)

«Şanıma and olsun ki, biz Davuda və Süleymana bir elm verdik. Onlar: «Bizi mömin qullarının bir çoxundan üstün edən Allaha həmd olsun», - dedilər. Süleyman Davuda varis olub dedi ki, ey insanlar, bizə quş dili öyrədildi və bizə hər şeydən verildi. Doğrusu, bu bir lütfdür. Cinlərdən, insanlardan və quşlardan qurulmuş ordular Süleymanın xidmətində toplandı. Hamısı bir arada düzənli olaraq idarə olunurdular».

Burada bir məsələyə də toxunaq ki, peyğəmbərlər şərəf baxımından bir-birindən ayrılmır, onların dərəcələri Allah

(s.a.s.) yanındadır. İslam peyğəmbəri də bu məsələ ilə bağlı ümmətini xəbərdar etmişdir:

«Peyğəmbərlər arasında bir üstünlük axtarmayın».

«Allahın peyğəmbərləri haqqında üstünlüklər çıxartmayın».

«Məni Yunis b. Məttadan üstün tutmayın».[212]

Dediyimiz kimi, hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) dərəcəsini göstərmək üçün müqayisə obyekti olaraq hz.İsanı (s.a.s.) seçmişdir. Bunun başlıca səbəbi odur ki, hz.İsanın (s.a.s.) yeri və dərəcəsi başqalarından fərqlidir. İndi bu fikrin təsdiqi üçün Quran və hədislərin işığında hz.İsanın (s.a.s.) dindəki yerinə baxaq.

Qurani-Kərim hz.İsaya (s.a.s.) ayrıca yer vermişdir. Quran, hz.İsanın (s.a.s.) anası hz.Məryəmi namuslu, pak bir qadın olaraq təqdim edir. Quranda hz.İsanın (s.a.s.) dünyaya gəlişi, doğumdan öncəki hadisələr bir möcüzə, bir qeyri-adi hadisə kimi verilir:

إِنَّ اللّهَ اصْطَفَى آدَمَ وَنُوحاً وَآلَ إِبْرَاهِيمَ وَآلَ عِمْرَانَ عَلَى الْعَالَمِينَ .
ذُرِّيَّةً بَعْضُهَا مِن بَعْضٍ وَاللّهُ سَمِيعٌ عَلِيمٌ . إِذْ قَالَتِ امْرَأَةُ عِمْرَانَ رَبِّ
إِنِّي نَذَرْتُ لَكَ مَا فِي بَطْنِي مُحَرَّراً فَتَقَبَّلْ مِنِّي إِنَّكَ أَنتَ السَّمِيعُ الْعَلِيمُ .
فَلَمَّا وَضَعَتْهَا قَالَتْ رَبِّ إِنِّي وَضَعْتُهَا أُنثَى وَاللّهُ أَعْلَمُ بِمَا وَضَعَتْ
وَلَيْسَ الذَّكَرُ كَالأُنثَى وَإِنِّي سَمَّيْتُهَا مَرْيَمَ وِإِنِّي أُعِيذُهَا بِكَ وَذُرِّيَّتَهَا مِنَ
الشَّيْطَانِ الرَّجِيمِ. فَتَقَبَّلَهَا رَبُّهَا بِقَبُولٍ حَسَنٍ وَأَنبَتَهَا نَبَاتاً حَسَناً وَكَفَّلَهَا
زَكَرِيَّا كُلَّمَا دَخَلَ عَلَيْهَا زَكَرِيَّا الْمِحْرَابَ وَجَدَ عِندَهَا رِزْقاً قَالَ يَا مَرْيَمُ
أَنَّى لَكِ هَـذَا قَالَتْ هُوَ مِنْ عِندِ اللّهِ إنَّ اللّهَ يَرْزُقُ مَن يَشَاءُ بِغَيْرِ حِسَابٍ

(Ali-İmran, 3/33-37)

[212] Müslim, Fədail, 159-163, 166.

«Allah bir-birindən törəmə bir nəsil olaraq Adəmi, Nuhu, İbrahim ailəsi ilə İmran ailəsini seçib aləmlərə üstün etdi. Allah eşidən və biləndir. İmranın qarısı belə demişdi: «Rəbbim! Qarnımdakını azad bir qul olaraq yalnız sənə niyyət edirəm. Onu məndən qəbul et. Şübhəsiz, sən eşidən və bilənsən. Onu doğanda Allah onun nə doğduğunu bildiyi halda: «Rəbbim mən onu qız doğdum, oğlan qız kimi deyildir. Ona Məryəm adını verdim. Qovulmuş şeytana qarşı onu və soyunu tapşırıram», - dedi. Rəbbi Məryəmi gözəl qəbul etdi, onu gözəl bir bitki kimi yetişdirdi. Zəkəriyyəyə ona baxmağı tapşırdı. Zəkəriyyə onun yanına – məbədə hər dəfə girəndə orada bir yeyəcək tapır və: «Ey Məryəm! Bu sənə haradan gəlir?» - deyə soruşanda Məryəm: «Bu Allah tərəfindəndir. Allah istədiyinə saysız ruzi verir».

Qurani-Kərim daha sonra Zəkəriyyə Peyğəmbərlə bağlı olanları anladır.[213]

Quran hz.İsanın (s.a.s.) anası olan Məryəmi belə təqdim edir:

وَإِذْ قَالَتِ الْمَلاَئِكَةُ يَا مَرْيَمُ إِنَّ اللّهَ اصْطَفَاكِ وَطَهَّرَكِ وَاصْطَفَاكِ عَلَى نِسَاء الْعَالَمِينَ . يَا مَرْيَمُ اقْنُتِي لِرَبِّكِ وَاسْجُدِي وَارْكَعِي مَعَ الرَّاكِعِينَ

(Ali-İmran, 3/42-43)

«Ey Məryəm! Allah səni seçdi. Səni tərtəmiz yaratdı və səni bütün dünya qadınlarından üstün etdi. Ey Məryəm! Rəbbinə ibadət et, səcdəyə qapan, onun hüzurunda əyilənlərlə bərabər sən də əyil».

Hz.Məhəmməd (s.a.s.) də bir hədisində buyurur: «Dünya qadınlarının ən yaxşısı İmran qızı Məryəm ilə Huveylid qızı Xədicədir».[214]

---

213 Ali-İmran, 3/38-39
214 Müslim, Fədail, 69.

Daha sonra Quran, hz.Məryəmin hz.İsaya (s.a.s.) hamilə qalmasını anladır:

إِذْ قَالَتِ الْمَلآئِكَةُ يَا مَرْيَمُ إِنَّ اللّهَ يُبَشِّرُكِ بِكَلِمَةٍ مِّنْهُ اسْمُهُ الْمَسِيحُ عِيسَى ابْنُ مَرْيَمَ وَجِيهاً فِي الدُّنْيَا وَالآخِرَةِ وَمِنَ الْمُقَرَّبِينَ. وَيُكَلِّمُ النَّاسَ فِي الْمَهْدِ وَكَهْلاً وَمِنَ الصَّالِحِينَ . قَالَتْ رَبِّ أَنَّى يَكُونُ لِي وَلَدٌ وَلَمْ يَمْسَسْنِي بَشَرٌ قَالَ كَذَلِكِ اللّهُ يَخْلُقُ مَا يَشَاءُ إِذَا قَضَى أَمْراً فَإِنَّمَا يَقُولُ لَهُ كُن فَيَكُونُ

(Ali-İmran, 3/45-47)

«Mələklər demişdi: «Ey Məryəm! Allah səni özündən bir kəlmə ilə müjdələyir. Adı Məryəm oğlu Məsihdir. Dünyada da, axirətdə də şərəfli və Allaha yaxın olanlardandır. Beşikdə və yetişkənlik çağında insanlarla danışacaq, yaxşılardan olacaq». Məryəm dedi: «Rəbbim! Mənə bir insan əli toxunmayıb. Mənim necə uşağım ola bilər?». Allah istədiyin edər, bir işə hökm etdisə, «ol» deyər və o olur».

Quran, hz.İsanın (s.a.s.) uca Allahın (c.c.) «ol» əmrindən yarandığını buyurur:

وَاذْكُرْ فِي الْكِتَابِ مَرْيَمَ إِذِ انتَبَذَتْ مِنْ أَهْلِهَا مَكَاناً شَرْقِيّاً . فَاتَّخَذَتْ مِن دُونِهِمْ حِجَاباً فَأَرْسَلْنَا إِلَيْهَا رُوحَنَا فَتَمَثَّلَ لَهَا بَشَراً سَوِيّاً . قَالَتْ إِنِّي أَعُوذُ بِالرَّحْمَن مِنكَ إِن كُنتَ تَقِيّاً . قَالَ إِنَّمَا أَنَا رَسُولُ رَبِّكِ لِأَهَبَ لَكِ غُلَاماً زَكِيّاً . قَالَتْ أَنَّى يَكُونُ لِي غُلَامٌ وَلَمْ يَمْسَسْنِي بَشَرٌ وَلَمْ أَكُ بَغِيّاً . قَالَ كَذَلِكِ قَالَ رَبُّكِ هُوَ عَلَيَّ هَيِّنٌ وَلِنَجْعَلَهُ آيَةً لِلنَّاسِ وَرَحْمَةً مِّنَّا وَكَانَ أَمْراً مَّقْضِيّاً

(Məryəm, 19/16-21)

«Biz ona ruhumuzu göndərdik. Ona tam, doğru bir insan şəklində göründü. Məryəm, «səndən çox mərhəmətli Allaha sığınıram», - dedi. «Əgər Allahdan çəkinən bir kimsə

isən, mənə toxunma». Ruh, «mən yalnız sənə tərtəmiz bir oğlan uşağı bağışlamaq üçün Rəbbinin bir elçisiyəm», - dedi. Məryəm, «mənə bir insan əli dəymədiyi, namussuz da olmadığım halda mənim necə uşağım ola bilər»,- dedi. Mələk: «elədir, ancaq Rəbbin buyurdu ki, bunu etmək ona asandır. Çünki biz, onu insanlara bir dəlil və bizdən insanlara bir rəhmət edəcəyik», - dedi. Bu, hökm və qərara bağlanmış bir iş idi».

Quran başqa ayələrdə də hz.Məryəmin namuslu bir qadın olduğunu buyurur:

وَالَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهَا مِن رُّوحِنَا وَجَعَلْنَاهَا وَابْنَهَا آيَةً لِّلْعَالَمِينَ

(Ənbiya, 21/91)

«Namusunu qorumuş olanı (Məryəmi) an. Biz ona ruhumuzdan üflədik. Onu və oğlunu cümlə Aləm üçün bir ibrət etdik».

وَمَرْيَمَ ابْنَتَ عِمْرَانَ الَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهِ مِن رُّوحِنَا
وَصَدَّقَتْ بِكَلِمَاتِ رَبِّهَا وَكُتُبِهِ وَكَانَتْ مِنَ الْقَانِتِينَ

(Təhrim, 66/12)

«Namusunu qorumuş olan İmran qızı Məryəmi də Allah örnək göstərdi. Biz Ona ruhumuzdan üflədik və Rəbbinin sözlərini və kitablarını təsdiq etdi. O, könüldən itaət edənlərdən idi».

Qurani-Kərim hz.Məryəmin duyğu və düşüncələrini bir-bir anladır, Allah (c.c.) heç zaman onu tək buraxmır, ona yol göstərir, çirkin niyyətli insanlara verəcəyi cavabı ona öyrədir.

Quran hz.İsanın (s.a.s.) doğumunu belə təsvir edir:

قَالَ إِنِّي عَبْدُ اللَّهِ آتَانِيَ الْكِتَابَ وَجَعَلَنِي نَبِيّاً. وَجَعَلَنِي مُبَارَكاً أَيْنَ مَا كُنتُ وَأَوْصَانِي بِالصَّلَاةِ وَالزَّكَاةِ مَا دُمْتُ حَيّاً. وَبَرّاً بِوَالِدَتِي وَلَمْ يَجْعَلْنِي جَبَّاراً شَقِيّاً . وَالسَّلَامُ عَلَيَّ يَوْمَ وُلِدتُّ وَيَوْمَ أَمُوتُ وَيَوْمَ أُبْعَثُ حَيّاً

(Məryəm, 19/30-33)

«Onu qucağına alaraq qövmünə gətirdi. «Ey Məryəm! Sən pis bir iş etmisən! Ey Harunun bacısı! Sənin atan pis bir adam deyildi, anan da namussuz olmayıb», - dedilər. Bunun üzərinə ona (İsaya) işarə etdi. Dedilər ki, biz beşikdəki bəbəklə necə danışaq? İsa dedi: «Mən gerçəkdən Allahın quluyam. O, mənə kitab verdi, məni Peyğəmbər etdi. Məni harada olsam, mübarək etdi və mənə həyatda olduğum müddətcə namazı, zəkatı əmr etdi… Doğduğum gün də, diri olaraq qaldırılacağım gün də salam mənədir».

Bu ayələrdən aydın görünür ki, hz.İsa (s.a.s.) başqa peyğəmbərlərdən seçilir. Quran ona ayrıca yer verir, onun anasının təmiz, seçilmiş, üstün bir qadın olduğunu buyurur. Hz.Məryəmin hamiləliyi bir möcüzədir, bu bənzəri olmayan bir hadisədir. Hz.İsa (s.a.s.) atasız doğulmuşdur. Hz.İsa (s.a.s.) beşikdə olarkən danışmışdır. Hz.İsaya (s.a.s.) İncil nazil olmuş, o, korların gözlərini açmış, dəliləri, hər cür xəstələri sağaltmışdır:

وَرَسُولاً إِلَى بَنِي إِسْرَائِيلَ أَنِّي قَدْ جِئْتُكُم بِآيَةٍ مِّن رَّبِّكُمْ أَنِّي أَخْلُقُ لَكُم مِّنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ فَأَنفُخُ فِيهِ فَيَكُونُ طَيْراً بِإِذْنِ اللّهِ وَأُبْرِئُ الأكْمَهَ والأَبْرَصَ وَأُحْيِـي الْمَوْتَى بِإِذْنِ اللّهِ وَأُنَبِّئُكُم بِمَا تَأْكُلُونَ وَمَا تَدَّخِرُونَ فِي بُيُوتِكُمْ إِنَّ فِي ذَلِكَ لآيَةً لَّكُمْ إِن كُنتُم مُّؤْمِنِينَ

(Ali-İmran, 3/49)

«Onu İsrail oğullarına bir rəsul olaraq göndərəcək o, onlara belə deyəcək: «Mən sizə Rəbbimizdən bir ayə ilə (möcüzə ilə) gəldim. Sizə palçıqdan quş biçimli bir varlıq düzəldib, ona üfürərəm. Allahın izni ilə dərhal bir quş olar. Yenə Allahın izni ilə koru və alaca xəstəliyinə tutulanları

sağaldar, ölüləri dirildərəm. Evlərinizdə yediyiniz və saxladığınız şeyləri sizə xəbər verərəm. Əgər iman edəcəksinizsə, bunda sizə bir dəlil var».

إِذْ قَالَ اللّهُ يَا عِيسى ابْنَ مَرْيَمَ اذْكُرْ نِعْمَتِي عَلَيْكَ وَعَلَى وَالِدَتِكَ إِذْ أَيَّدتُّكَ بِرُوحِ الْقُدُسِ تُكَلِّمُ النَّاسَ فِي الْمَهْدِ وَكَهْلاً وَإِذْ عَلَّمْتُكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَالتَّوْرَاةَ وَالإِنجِيلَ وَإِذْ تَخْلُقُ مِنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ بِإِذْنِي فَتَنفُخُ فِيهَا فَتَكُونُ طَيْراً بِإِذْنِي وَتُبْرِئُ الأَكْمَهَ وَالأَبْرَصَ بِإِذْنِي وَإِذْ تُخْرِجُ الْمَوتَى بِإِذْنِي وَإِذْ كَفَفْتُ بَنِي إِسْرَائِيلَ عَنكَ إِذْ جِئْتَهُمْ بِالْبَيِّنَاتِ فَقَالَ الَّذِينَ كَفَرُواْ مِنْهُمْ إِنْ هَـذَا إِلاَّ سِحْرٌ مُّبِينٌ

(Maidə, 5/110)

«Allah belə buyuracaq: «Ey Məryəm oğlu İsa, sənə və anana olan nemətimi düşün. Səni Ruhul-Qüds (Cəbrail) ilə dəstəkləmişdim. Beşikdə olarkən və yetkinlik vaxtı insanlarla danışırdın. Sənə yazını, hikməti, Tövratı və İncili öyrətmişdim. Mənim icazəmlə palçıqdan quş kimi bir şey düzəltmiş, içinə üfürmüşdün. O da icazəmlə quş olmuşdu. Anadan doğma kor olanı və alaca xəstəliyinə tutulmuş kimsələri icazəmlə sağaldırdın. Ölüləri icazəmlə dirildirdin. İsrail oğullarına açıq möcüzələrlə gəldiyin və onlardan inkar edənlərin «bu ancaq bir sehrdir»,- dedikləri vaxt səni onlardan qurtarmışdım».

İslam qaynaqları hz.İsanın (s.a.s.) möcüzələrinə yer vermiş, onun ilahi imkanlarını şərh etmişlər. Bir sıra qaynaqlarda hz.İsanın (s.a.s.) xəstələri sağaltmaq üçün oxuduğu duanın mətni də verilmişdir. Hz.İsa (s.a.s.) xəstələri sağaldarkən bu duanı oxuyardı:

«Ey Allahım! Səmada ilah Sənsən! Yerdə ilah Sənsən! İkisində də Səndən başqa ilah yoxdur! Göylərdə Cəbbar olan Sənsən! Yerdə Cəbbar olan Sənsən! İkisində də Səndən

başqa Cəbbar yoxdur! Göylərdə hökmdar olan Sənsən! Yerdə hökmdar olan Sənsən! İkisində də Səndən başqa hökmdar yoxdur! Göylərdə hökm Sənindir! Yerdə hökm Sənindir! İkisində də Sənin hökmündən başqa hökm yoxdur! Sənin yer üzündəki qüdrətin səmadakı qüdrətin kimidir! Sənin yer üzündəki səltənətin göy üzündəki səltənətin kimidir! Mən Sənin şərəfli adlarınla Səndən dilək istəyirəm! Heç şübhə yox ki, Sən hər şeyə qadirsən! Sənin hər şeyə gücün yetər!»[215]

Hz.Nizaminin beytində hz.İsa (s.a.s.) «Məsih» kimi təqdim edilmişdir. Hz.İsaya «Məsih» deyilməsinin bir neçə yozumu var. Ona ayağının altı düz olduğuna, çox gəzdiyinə, əli ilə sürtərək (toxunaraq) xəstələri sağaltdığına, özünün məsh edildiyinə, kirlərdən təmizləndiyinə, anasından yağ sürtülmüş olaraq doğulduğuna görə belə deyildiyi bildirilir.

«Məsih» İbranicədir (Mişiha). Peyğəmbər Samuel Allahın əmriylə kral etdiyi Saulun başına yağ töküb məsh etmişdir. Bundan sonra İsrail oğulları kral seçdiklərinin başına yağ sürtməyi ənənəyə çevirmişlər. Onlar «Məsih» sözünü «bədəninə yağ sürtülmüş adam» mənasında işlətmişlər. Yəhudilər hz.İsanı kiçiltmək məqsədi ilə ona kinayə ilə «Məsih» demişlər. İsrail oğullarında krallar məsh edildiyi kimi, sonralar peyğəmbərlər də məsh edilmişdir. Tanrı ilə bağlılığı olan hər kəsə «məsih» deyilirdi. Yəhudilərə görə, «Məsih» sözü onlara müjdəsi verilmiş bir qurtarıcıya işarədir. Səmavi dinlərdə «Məsih» sözündən qiyamətdən öncə pozulmuş düzəni qaydaya salacaq, haqq və ədaləti yenidən bərpa edəcək şəxs başa düşülür. Yəhudiləri qurtaracaq olan bu şəxs Davudun soyundandır. Xristiyanlara görə, hz.İsa Məsih olaraq ikinci dəfə gələcək və Allahın hakimiyyətini yenidən quracaq. İslam tarixində isə hz.İsanın

[215] Asim Köksal, Peyğamberler tarihi, c. II, s. 316

qiyamətdən öncə enərək Dəccalı öldürəcəyi, İslamı yer üzündə hakim edəcəyi bildirilir.

Qurani-Kərimdə «məsih» sözü seçilmiş, süzülmüş, təmiz insan anlamında işlədilmişdir.

Burayadək dediklərimizdən anlaşılan odur ki, bütün peyğəmbərlərin hədəfi birdir, onlar özlərindən sonra gələn peyğəmbərləri təsdiq, Allahın (c.c.) varlığını, birliyini, Allaha (c.c.) təslimiyyəti təbliğ etmişlər. Peyğəmbərin biri o birisi üçün bir mərhələdir, bir addımdır.

Hz.Nizami beytdə peyğəmbərlərin bir-birinə bağlılığını, birinin o birinə yol açdığı düşüncəsini «nökər» sözü ilə ifadə etmişdir. Bu sözün farsca mətnində qarşılığı «qulamdır». **Hz.Nizaminin, hz.İsa (s.a.s.) ilə bağlı işlətdiyi «nökər» sözünü biz neçə mənada anlamalıyıq. Birincisi, hz.Nizami bu sözlə hz.Məhəmmədin (s.a.s.) və hz.İsanın (s.a.s.) Allah (c.c.) qatında dərəcəsinə işarə etmişdir. İkincisi, beytdə «nökər» («qulam») sözü hz.Məhəmmədin gəlişinə yol açan, onun gəlişini müjdələyən, onun gəlişi üçün zəruri olan işləri görən insan anlamındadır.**

Hz.Məhəmmədin (s.a.s.) hədislərində də Peyğəmbərlərin bir-birinə bağlılığı, onlar arasında ayrı-seçkilik salmağın doğru olmadığı bildirilir. Hədislərdə hz.İsaya (s.a.s.) da ayrıca yer verilir: «Kim Allahdan başqa ilah yoxdur, yalnız Allah vardır, şəriki yoxdur, Məhəmməd Allahın qulu və rəsuludur. İsa da Allahın qulu və elçisi, Məryəmə verdiyi kəliməsi, Allah tərəfindən (həyat verilən) bir ruhdur. Cənnət haqqdır, gerçəkdir, cəhənnəm də haqqdır, gercəkdir», - deyə şəhadət edərsə, Allah o kimsəni əməli nə olursa, olsun cənnətə qoyar».[216]

[216] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 76.

Hz.Məhəmmədin (s.a.s.) başqa bir hədisində isə hz. İsanın (s.a.s.) yerə enəcəyi belə anladılır: «Dövlət başçınız (imamınız) özünüzdən olduğu halda İsa ibn Məryəm göydən yanınıza endiyi zaman halınız necə olar».[217]

Sevimli hz.Məhəmməd (s.a.s.) hər zaman peyğəmbərləri böyük ehtiramla yad etmiş, onları bir-birindən ayırmamışdır. Hz.Məhəmməd (s.a.s.) Quranda olduğu kimi hz.İsaya (s.a.s.), onun din tarixində tutduğu yerə, Allahın (s.a.s.) ona lütf etdiyi nemətlərə görə özəl bir yer ayırmış, onun adını öz adı ilə yanaşı çəkmişdir: «Mən Məryəm oğlu İsaya dünya və axirətdə insanların ən yaxınıyam (ən layiqiyəm). Peyğəmbərlər anaları ayrı, ata bir qardaş kimidirlər, dinləri birdir».[218]

## NƏTLƏRDƏ HƏZRƏT İSA (s.a.s.)

Hz.İsanın (s.a.s.) insanlara həyat vermək möcüzəsi, onun nəfəsi, göyə yüksəlməsi, Əhmədin gəlişini müjdələməsi kimi hadisələr nətlərdə də yer tutub. Nətlərdə daha çox iki Peyğəmbər müqayisə edilmiş, Allah qatında hz.Məhəmmədin (s.a.s.) daha üstün olduğu bildirilmişdir. Bir sıra şairlər hz.İsaya (s.a.s.) ölüləri diriltmək möcüzəsinin verilməsini onun Əhmədin gəlişini müjdələdiyi üçün verildiyini bildirmişlər. Şairlər «dem kelimesinin soluk, nefes manalarını göz önünde bulundurarak, hz.Peyğamberden dem vurduğu için nefesi möcüzeler göstermiş ve ya «İsmi-Azam» duasının okuyana böyük güc verdiyi kibi, Yüce Peyğamberin İsmi - Azam olan adını öyrenmesiyle nefesi hayat bağışlayıcı olmuştur… İsanın (a.s.) göge yükselmesi de hz. Peyğamberin feyzine bağlanmış, yer yüzüne onun geleceyini

[217] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 456.
[218] Salihi Buhari, Muhtasarı Tecridi-Sarih, Konya, 205, s. 419.

bildiren hz.İsa aynı müjdeyi meleklere vermek için gökyüzüne çıkmışdır».

Nətlərdə Hz.İsanın (s.a.s.) göyə yüksəlməsinin səbəbinin hz.Məhəmməd (s.a.s.) olduğu, hz.İsanın (s.a.s.), hz.Məhəmməd (s.a.s.) ümməti olması üçün göylərə çıxması, hz.Məhəmmədin (s.a.s.) meraca yüksəlməsi, hz.İsanın isə göyün dördüncü qatında yer tutması bədii bir üslubla təsvir edilir.

**Məhəmməd Füzuliyə** görə, hz.İsa (s.a.s.) merac məqsədi ilə göylərə yüksəldi, amma hədəfinə çatmadı:

Əzmi-çərx etdi Məsiha ki, bula meracın,
Yetmədi mənzili-məqsuda təriqi-tələbi.[219]

(Məsih göylərə çıxdı ki, meracın əldə etsin, ancaq məqsədinə çatmadı)

Hz.Nizami beytin birinci misrasında hz.Məhəmmədi (s.a.s.) «sahəölçən xacə» adlandırır, hz.İsanı (s.a.s.) isə «nökər». Biz, hz.İsanın (s.a.s.) dindəki yerini Quran, hədis işığında şərh etdik. Hz.Nizaminin onu niyə «nökər» adlandırdığının izahını verdik. Ancaq misranın tam anlaşılması üçün hz.Məhəmməd (s.a.s.) ilə bağlı deyilmiş «sahəölçən xacə» anlayışını da şərh edək.

Lüğətlərdə «xacə» ağıllı, ən mötəbər insan, müdrik, elmli, varlı, torpaq sahibi, tacir kimi izah edilmişdir. Hz. Məhəmməd (s.a.s.) də insanlığın tək başçısı olduğu üçün o, Xaceyi-Aləm, Xaceyi-Kainat, Xaceyi-Kövneyn kimi adlandırılmışdır. Yəni o, bu dünyanın və axirətin imamıdır. «Xacə» sözünün müəllim mənası da var. Hz.Məhəmməd (s.a.s.) də insanlığın müəllimidir. O, bir öyrədicidir, Allahın (c.c.) seçdiyi ustaddır. Şairlər, hz.Məhəmmədi (s.a.s.) «Xaceyi-dana» (bilik ustadı), «Xaceyi-İrfan» (irfan ustadı),

[219] Emine Yeniterzi, göstərilən qaynaq, s. 338.

«Xaceyi-Vədi-Haqq» (Haqqın vədinin ifadəçisi olan ustad) kimi adlandırmışlar:

**Şeyxi:**

Ey Hace kime yalvarayım ben geday çün,
Sen şahdan şefaat umar hace vü geda.[220]

(Ey xacə, mən kimə yalvarım, xacələr və qullar sən şahdan şəfaət umur)

Hz.Nizaminin beytində işlənmiş olan «sahəölçən» ifadəsi də yerində seçilmişdir. Şair bu deyimlə iki mənanı ifadə edir. Birincisi, o, hz.Məhəmmədlə (s.a.s.) bağlı Merac möcüzəsinə işarə edir, ikincisi isə diqqəti hz.Məhəmmədin (s.a.s.) uca Allahın izni ilə qət etdiyi məsafənin böyüklüyünə yönəldir.

Hz.İsa (s.a.s.) bir qövmə, hz.Məhəmməd (s.a.s.) isə bütün insanlığa göndərilmişdir. Biz, burada «sahəölçən» ifadəsinin Meracla bağlı yönünə açıqlıq gətirmək istəyirik.

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ HƏZRƏT MƏHƏMMƏD (s.a.s.) NİYƏ «SAHƏÖLÇƏNDİR» ?

Misranın müqayisə obyektinin bir tərəfində hz. İsadır (s.a.s.). Biz onunla bağlı məsələlərə toxunduq. Hz. Nizaminin, hz.Məhəmmədlə (s.a.s.) müqayisə üçün niyə məhz hz.İsanı (s.a.s.) seçdiyi bəlli oldu. Müqayisə tərəzisinin birinci gözündə də Hz.Məhəmməddir (s.a.s.). Biz onunla bağlı misrada verilmiş «sahəölçən» ifadəsi işığında bir sıra məsələlərə açıqlıq gətirəcəyik.

Hz.Məhəmmədin «sahəölçən» olmasına ən böyük dəlil Qurani-Kərimdədir:

سُبْحَانَ الَّذِي أَسْرَى بِعَبْدِهِ لَيْلاً مِّنَ الْمَسْجِدِ الْحَرَامِ إِلَى الْمَسْجِدِ الأَقْصَى الَّذِي بَارَكْنَا حَوْلَهُ لِنُرِيَهُ مِنْ آيَاتِنَا إِنَّهُ هُوَ السَّمِيعُ البَصِيرُ

[220] Emine Yeniterzi, göstərilən qaynaq, s. 178.

(İsra, 17/1)

«Qulu Məhəmmədi bir gecə Məscidi-Həramdan özünə bəzi ayələrimizi göstərmək üçün ətrafını mübarək etdiyimiz Məscidi-Əqsaya götürən Allah hər cür nöqsan sifətlərdən münəzzəhdir. Şübhəsiz ki, hər şeyi eşidən, hər şeyi görən Odur».

Bu ayənin olduğu surənin adı «İsra»dır. «İsra» gecə yolçuluğu deməkdir. Bu ayədə işlənmiş «bəzi ayələrimiz» qavramının «ilahi mesaj», «işarə», «əlamət», «simvol» mənaları daşıdığını, ayədə «Məscidi-Həram» («Toxunulmaz ibadət evi»), «Məscidi-Əqsa» («Uzaq, ən uzaq ibadət evi») kimi müqəddəs məkanların adının bir arada çəkilməsi sirlərlə dolu bir gecə yolçuluğunun anlamını, bu səfərdə veriləcək müjdənin önəmini ortaya qoyur. Məhəmməd Əsədə görə: «Bu iki ünlü kutsal mabedin («Məscidi-Həram», «Məscidi Əqsa») yana-yana zikr edilmesi, Kuranın «yeni» bir din getirmediyini, fakat önceki peyğamberler tarafından da tebliğ edilen tek ve aynı mesajın bir devamından ve nihai inkişafından ibaret olduğunu işaret amacına matufdur».[221]

Biz, hz. Nizaminin «sahəölçən» anlayışının hədislərdəki qaynaqlarına baxaq. İbn Məsudun (r.a.) rəvayətinə görə, Rəsulullah belə buyurdu: «İsra gecəsində İbrahim aleyhissəlamla qarşılaşdım. Mənə bunu söylədi: Ey Məhəmməd! Ümmətinə məndən salam söylə və onlara cənnətin torpağının çox gözəl, suyunun dadlı, ərazisinin son dərəcə geniş və dümdüz, ağaclarının da sübhanallahi vəl-həmdü lillahi vəla ilahə illallahu vallahü əkbərdən ibarət olduğunu xəbər ver».[222]

Başqa bir hədis: «Əbu Hüreyrədən (r.a.) rəvayət edildiyinə görə, Rəsuli-Əkrəmə - sallallahu aleyhi və səlləm-

---

[221] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 560.

[222] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 275.

İsra gecəsində birində şərab, o birində süd olan iki bardaq gətirildi. Bardaqlara baxdıqdan sonra süd bardağını aldı. Bunun üzərinə Cəbrail: «Səni insanın yaradılış qayəsinə uyğun olana yönləndirən Allaha həmd olsun,əgər içki dolu bardağı alsaydın, ümmətin sapıqlığa düşərdi».[223]

Hz.Məhəmmədin (s.a.s.) «gecə yolçuluğu» (İsra) Meracla başa çatır. Bu yolçuluqda o, peyğəmbərlərə namaz qıldırır, göyün qatlarına yüksəldikcə peyğəmbərləri görür. «Adəm, İsa, Yahya, Harun, Musa ve digerleri (aleyhimus-selam), nihayet, yeddinci gök katında İbrahim (a.s.), başqa peyğamberlerin onu «kardeş» hitabıyla tebrik etmelerine mukabil hz.İbrahim ona «oğul» diye hitap ederek sahip olduğu bu şeref dolayısıyle tebrik edip kutladı. Bütün bu semavatta ona, anlatılması ve taksifi mümkün olmayan fevkaladelikler gösterildi»[224]

Biz yuxarıda Hz.Nizaminin, hz.Məhəmmədə (s.a.s.) müqayisə obyekti olaraq nə üçün hz.İsanın (s.a.s) seçdiyinin səbəblərini açıqladıq. Bu səbəblər sırasında hz.İsanın (s.a.s.) möcüzələrinə də toxunduq. İndi də müqayisə olunan məsələləri, obyektləri daha yaxşı anlamaq üçün hz.Məhəmmədin (s.a.s.) möcüzələrinə də toxunaq.

Hz.Məhəmmədin (s.a.s.) möcüzələri onun doğumu ilə başlayır. O, doğulanda qeyri-adi hadisələr baş verir. Bu mübarək doğum gecəsi Tovhid inancına zidd olan şeylər dağılır, İranda Kisranın sarayı, kilsələr, bütlər uçur, Savə gölü quruyur, Zərdüştlərin atəşi sönür, Kəbə hz. Peyğəmbərin evini tavaf edir.

Sözsüz ki, peyğəmbərə verilmiş ən böyük möcüzə Qurandır. Bu daimi möcüzələr sırasına daxildir. Hədəfi

---

[223] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 191.
[224] Məhəmməd Həmidullah, göstərilən qaynaq, s. 94.

küfrün, cəhalətin kökünü kəsmək, Allahın birliyi düşüncəsini qəlblərə yerləşdirməkdir. «Hər peyğəmbərin ümməti tərəfindən tanınan bir möcüzəsi vardır. Mənim möcüzəm mənə vəhy olunan Qurandır. Bu üzdən ümmətim başqa peyğəmbərlərin ümmətindən çox olacaqdır».[225]

Hz.Peyğəmbərin (s.a.s.) ən önəmli möcüzələrindən biri də Meracdır. (Biz bu məsələyə hz.Nizaminin Meracnamələrini şərh edərkən toxunacağıq).

Hz.Məhəmmədin (s.a.s.) möcüzələri sırasında ayın ikiyə bölünməsi möcüzəsi də ayrıca yer tutur. «Saat (qiyamət) yaxınlaşdı və ay yarıldı. Hələ bir ayə (möcüzə) görsələr, üz çevirib: «Bu davam edən bir sehrdir»,- deyərlər».[226] Quranda da təsbit olunmuş bu möcüzə məkkəlilərin hz.Peyğəmbərdən bir möcüzə istəmələri səbəbi ilə baş vermişdi. Peyğəmbərin barmağının işarəsi ilə Ay ikiyə parçalanmışdı. Bu, hz.Məhəmmədin (s.a.s.) peyğəmbərliyini təsdiq edən, ona inanmayanları doğru yola yönəldən bir möcüzədir.

Bundan başqa bir ovuc torpaqla bir ordunun məğlub edilməsi, Peyğəmbərin barmaqlarından suların axması, ovcundakı daşların onu təsbih etməsi, cənnətdən gələn üzümün onu təsbih etməsi, kötükdən ağlama səsinin duyulması, qapı və divarın hz.Peyğəmbərin (s.a.s.) duasına amin deməsi, ağacların yüyürməsi və salam verməsi, əkdiyi ağacın tez meyvə verməsi, hörümçək torunun onu gizlətməsi, dəvənin danışması, ceyranın dilə gəlməsi, kərtənkələnin danışması, peyğəmbərin bərəkəti ilə yeməyin artması, quzu ətinin zəhərləndiyini xəbər verməsi, korun gözünün açılması, ölünü diriltməsi, qeybdən xəbər verməsi, yuxuda könlünün ayıq

---

[225] Asri-Saadet, c. III, s. 241, Sahihi-Buxari, c. XI, s. 226.
[226] Qəmər, 54/1-2.

qalması, önünü və arxasını eyni anda görməsi, buludun peyğəmbəri kölgələməsi, peyğəmbərin kölgəsinin olmaması da onun möcüzələri sırasında yer tutur.

Bu möcüzələrlə bağlı hədislərə baxaq. Əbu Zərdən (r.a.) rəvayət edildiyinə görə, Rəsulullah (s.a.s.) belə buyurdu: «Şübhəsiz, mən sizin görmədiklərinizi görür və bilirəm. Göy üzü qıcırdayıb inlədi və qıcırdayıb inləməkdə də haqlı idi. Göy üzündə alnını Allaha səcdə üçün qoymuş bir mələyin olmadığı dörd barmaqlıq belə boş yer yoxdur. Allaha and içirəm ki, əgər mənim bildiklərimi sizlər bilmiş olsaydınız, az gülər, çox ağlardınız. Yataqlarda qadınlardan zövq almazdınız. Yüksək səslə Allaha yalvararaq yollara və küçələrə çıxardınız».[227]

Əbu Zərdən (r.a.) rəvayət edildiyinə görə, hz. Məhəmməd (s.a.s.) belə buyurdu: «Siz Misiri fəth edəcəksiniz. Oranın xalqı ilə yaxşı davranmağınızı tövsiyə edirəm. Vəsiyyətimə əməl edin. Belə ki onlara bir əhd, aman vəzifəmiz, bir də qohumluq bağımız vardır».[228]

Əbu Hüreyrə (r.a.) bir qab südün hz. Peyğəmbərin (s.a.s.) əlində çox insanı doyurduğunu belə anladır:

«… Hz. Peyğəmbər:

- Əbu Hüreyrə!,- deyə səsləndi.

Mən:

- Buyurun, ey Rəsulullah!,- dedim.

- Südü onlara ver!

Mən də süd qabını aldım, hər kəsə verməyə başladım. Verdiyim şəxs doyuncaya qədər içir, sonra qabı geri verir, mən bir başqasına verirdim, o da doyuncaya qədər içir, sonra geri verirdi. Ən sonda qabı Nəbiyə (s.a.s.) verdim. Orada

[227] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 60.
[228] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 455.

olan adamların hamısı süddən doymuşdu. Rəsulullah qabı alıb əlində tutudu və mənə baxıb gülümsədi. Sonra:

- Əbu Hüreyrə!, - dedi.

- Buyurun, ey Rəsulullah!, - dedim.

- Bir mən qaldım, bir də sən, buyurdu.

- Doğru söylədiniz, ey Rəsulullah!

- Otur, iç.

Mən də oturdum və içdim. Və sonra yenə:

- Otur, iç, buyurdu.

Yenə oturdum və içdim. Rəsuli-Əkrəm durmadan:

- İç, iç, buyururdu.

Sonra mən:

- Xeyr. Səni haqqı Peyğəmbər olaraq göndərən Allaha and içirəm ki, artıq içəcək yer qalmadı.

- Mənə ver, buyurdu.

Qabı Rəsuli-Əkrəmə verdim. Uca Allaha həmd etdi, bəsmələ çəkdi və qalan südü özü içdi».[229]

Hz. Enesdən (r.a.) rəvayət edildiyinə görə, «Bir gün peyğəmbər (s.a.s.) bir qab su istədi. İçində bir az su olan, ancaq dərin olmayan bir qab gətirdilər. Rəsuli-Əkrəm əlini suya saldı. Rəsuli-Əkrəmin barmaqlarının arasından qaynayan suya baxmağa başladım. O sudan yetmiş, səksən adam abdəst aldı».[230]

Hz. Məhəmmədin (s.a.s.) gələcəkdən xəbər verməsi ilə bağlı bir hədis də belədir. Abdullah ibni Amrdan (r.a.) rəvayət edildiyinə görə, Rəsuli-Əkrəm belə buyurdu:

«Məndən öncəki bütün Peyğəmbərlərin vəzifəsi ümmətlərini doğru saydıqları şeyə dəvət etmək, pis hesab etdikləri şeylərdən də çəkindirmək idi. Sizin içində

---

[229] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 269.
[230] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 270.

yaşadığınız ümmətin dincliyi öncə gələnlər zamanında olacaqdır. Daha sonrakıların başına çeşidli bəlalar və bilmədiyiniz pisliklər gələcəkdir. Elə fitnələr çıxacaq ki, bu fitnələrin bir qismi başqasından daha yüngül olacaqdır. Yenə elə fitnə və qarışıqlıq olacaq ki, bunu görən mömin:

«Bu məni məhv edəcək», deyəcək. Sonra ortalıq sakitləşəcək. Arxasından elə müdhiş bir fitnə çıxacaq ki, mömin: «Artıq bundan qurtuluş yoxdur», - deyəcək».[231]

«Sahəölçən» olan hz. Peyğəmbərin (s.a.s.) «gecə yolçuluğu», başqa möcüzələri divan ədəbiyyatında geniş şərh edilmişdir. Bir sıra nümunələrə baxaq:

**Şeyxi:**

Felek farkında hükmi tacı-serdür,
Ki bir barmağı işi «şakkal-kamer»dür.[232]

(Onun hökmü fələklər yanında da baş tacıdır, bir barmaq işarəsi ilə ay parçalandı)

**Əhmədi:**

Anı çün kim getürdi Hak vücuda,
Seraser bütler indiler süçuda.[233]
(Onu Haqq yaratdığından bütün bütlər ona səcdə etdilər)

**Füzuli:**

Möcizi bir bəhri-bipayan imiş aləmdə kim,
Yetmiş andan min-min atəşxaneyi-küffara su.[234]

(Möcüzəsi elə bir sonsuz dərya imiş ki, ondan min-min susuza su çatmışdır)

---

[231] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 55.
[232] Emine Yeniterzi, göstərilən qaynaq, s. 286.
[233] Emine Yeniterzi, göstərilən qaynaq, s. 286.
[234] Emine Yeniterzi, göstərilən qaynaq, s. 287.

**Füzuli:**

Ey olub merac bürhani-ulüvvi-şan sana,
Yerə enmiş göydən istiqlal üçün Furkan sana.[235]

(Ey meracı şanına dəlil olan peyğəmbər, Quran istiqlal üçün sənə göydən enmişdir)

**Karamanlı Nizami:**

Geh bir avuç su ile sipahını kandırur,
Geh bir avuç toz ile ider düşmenin heva.[236]

(Gah bir ovuc su ilə qoşununun susuzluğunu söndürər, gah da bir ovuc toz ilə düşmənini məğlub edər)

**Şeyxi:**

Çün oldı zahirivü batını nur,
Acebmi cismi olsa sayeden dur.[237]

(Zahiri və batini nur olduğundan cisminin kölgəsi
yox idi)

Biz bu misalların sayını artıra da bilərik. Ancaq bu misallar da hz. Məhəmmədin (s.a.s.) möcüzələrini anlatmaq, onun üstünlüklərini təsvir etmək, onun mübarək şəxsiyyətinin divan ədəbiyyatındakı yerini görmək baxımından yetərlidir.

Hz.Nizaminin birinci misrasının güşüncə qaynaqlarını öyrəndikdən sonra bu misranı bir də oxuyaq:

***O (Məhəmməd), sahəölçən xacə, Məsih isə onun nökəridir.***

Verdiyimiz bilgilərə görə, «sahəölçən» hz.Məhəmməd (s.a.s.) aşağıdakı dəyərinə görə belə adlandırılır. Hər şeydən öncə hz.Məhəmmədin (s.a.s.) mesajı bütün insanlığadır. Hz.

---

235 Emine Yeniterzi, göstərilən qaynaq, s. 289.
236 Emine Yeniterzi, göstərilən qaynaq, s. 293.
237 Emine Yeniterzi, göstərilən qaynaq, s. 301.

İsanın (s.a.s.) mesajı isə bəlli bir toplumadır. Hz Məhəmmədin (s.a.s) mesajının dəyəri, ölçüsü daha böyükdür, o daha çox adamı əhatə edir.

Hz. Məhəmməd (s.a.s.) Merac gecəsi daha böyük məsafə qət etdi, Allahın (c.c.) hüzuruna getdi, ondan mübarək müjdələr aldı. Hz.İsa (s.a.s.) da göyə çəkildi. Ancaq o, göyün dördüncü qatında yer tutdu. Göründüyü kimi, hz.Məhəmmədin (s.a.s.) ölçdüyü sahə daha böyükdür.

Hz.Məhəmməd (s.a.s.) ilk və son Peyğəmbərdir. Hz.İsa (s.a.v) isə beş böyük peyğəmbərdən biridir.

Hz.Məhəmməd (s.a.s.) bir elçi və qul olaraq qaldı, bütləşdirilmədi, hz.İsaya (s.a.s.) isə «Allahın oğlu» deyilərək bütləşdirildi.

Hz.Məhəmmədin (s.a.v) həyatının bütün səhifələri bəllidir, onun ömür yolunda gizli heç bir şey yoxdur. Hz.İsanın (s.a.s.) həyatı isə gizlinlərlə doludur.

Hz.Məhəmmədin axirətdə şəfaət haqqı var. O, «şəfiül-müznibin»dir, «livai-həmd» bayrağı onun əlindədir, o, «məqami-Mahmud»a sahibdir.

O, «Hər peyğəmbərin özünə xas və qəbul olunacaq bir duası vardır. Onunla Allaha dua etmişdir. Ancaq mən duamı axirətdə ümmətimə şəfaət üçün saxlamışam», buyurmuşdur. Bu, hz. Məhəmmədin (s.a.s.) ümməti üçün fədakarlıq bəlgələrindən biridir. Başqa heç bir Peyğəmbərin axirətdə şəfaət yetkisi yoxdur.

Axirətdə bütün peyğəmbərlər «nəfsim» deyəcəyi halda, hz. Məhəmməd (s.a.s.) «ümmətim» deyə səslənəcək.

Axirətdə uca Allah (c.c.): «Ey Məhəmməd, başını qaldır, istə. Dilədiyin veriləcəkdir, şəfaət eylə, şəfaətin qəbul ediləcək», deyə buyuracaq. Bu da rəhmət Peyğəmbərinin cavabı: «Ey Rəbb ümməti, Ey Rəbb ümməti».

Hz.Məhəmməd (s.a.s.) insanlığa uca Allahın (c.c.) son sözünü çatdırmış, İslamın gəlişi ilə də başqa dinlərin hökmü qaldırılmışdır. O, Allahın (c.c.) dostudur. Füzulinin dili ilə desək, bütün insanlıq və bütün peyğəmbərlər onun şəfaətinə möhtacdır. O, «əbədi dinin sahibi, əbədiyyət mülkünün minbərində xütbəsi oxunan bir sultandır. Elə bir sultan ki, məhşərdə qurulacaq ilahi məhkəmədə tək sözü keçən, yalnızca Onun hökmü yerinə yetirilən, sözü Allah yanında məqbul olan bir şahlar şahıdır».[238]

Görün, **Şeyx Qalib** necə gözəl demişdir:

Hütben oxunur minberi-iklim-i bekada,
Hükmün tutulur mahkeme-i ruz-i cəzada [239]

(Bəqa mülkünün minbərində xütbən oxunur, cəza gününün məhkəməsində hökmün qəbul olunur)

Hz.Nizami, hz.İsanı (s.a.s.) ən böyük peyğəmbərlərdən biri olduğu üçün, onda hz.Məhəmmədin (s.a.s.) «sahə ölçmək» keyfiyyətinə uyğun olan dəyərlərin varlığına görə (hz. İsanın (s.a.s.) göyə çəkilməsi) müqayisə obyekti olaraq seçmişdir. Şair meracla, göyə çəkilmə arasında uyğunluq və fərq görmüş, bu iki elçini, bu iki önəmli hadisə işığında dəyərləndirmiş, onların Allah (c.c.) yanındakı yerini işarə etmişdir. Hz.Nizamiyə görə, uca Allahın (c.c.) bu iki elçiyə verdiyi ən böyük nemətlərdən biri onları yanına çağırmasıdır. Hz.Məhəmmədin (s.a.v) meracı onun dəyərinə, ona bu yüksəlişdə verilən müjdənin önəminə işarədir. Uca Allah, hz.Məhəmmədi (s.a.s.) yanına çağırır və insanlıq üçün ən önəmli qərarlarını ona açıqlayır. Uca Allah (c.c.) vəzifəsini başa vurmuş hz.İsanı (s.a.s.) isə göylərə çəkir.

---

[238] Emine Yeniterzi, göstərilən qaynaq, s. 306.
[239] Emine Yeniterzi, göstərilən qaynaq, s. 306.

Biz, hz.Nizaminin, hz.İsaya (s.a.v) «nökər» (qulam) deməsini də doğru anlamalıyıq. Yuxarıdakı Quran ayələrindən və hədislərdən aydın görünür ki, peyğəmbərlər eyni ilahi missiyanı yerinə yetirirlər, biz onların hamısının peyğəmbər olduğuna iman edirik. Sadəcə olaraq, uca Allahın (c.c.) yanında onların dərəcəsi fərqlidir. Ancaq bu fərqlilik də bərabərliyi aradan qaldırmır. Yəni biz insan olaraq Allah (c.c.) qarşısında bərabərik, Allah (c.c.) qarşısında vəzifələrimiz eynidir, onun buyruqlarını yerinə yetirməliyik. Allahdan (c.c.) insana baxanda hamı eynidir. Ancaq insandan Allaha (c.c.) baxanda fərqliliklər ortaya çıxır. Hər kəs iradəsinə uyğun Allaha (c.c.) yönəlir, təslimiyyəti ölçüsündə dərəcəsi yüksəlir.

Hz.Nizami «sahəölçən» anlayışının qarşılığı olaraq «nökər» sözünü seçib. Burada hz.Nizami «sahəölçən» anlayışı ilə hz.Məhəmmədin (s.a.v) gördüyü işi ortaya qoyub, «nökər» sözü ilə də hz.İsanın (s.a.s.).

## HƏZRƏT MƏHƏMMƏD (s.a.s.) ƏBƏDİ SƏFƏRDƏDİR

**Əslində, hz.Məhəmməd (s.a.s.) ömrü boyu sahə ölçüb. Öncə süd anasının yanına gedib (Məkkədən Taifə) yol ölçüb, sonra quzu otarıb yol ölçüb, sonra tacir olub yol ölçüb («xacə» sözünün bir anlamı da «varlı tacir» deməkdir), sonra Hiraya gedib, yol ölçüb, sonra İslamı Məkkədə qapı-qapı, insan-insan gəzib anladaraq, insanları bir-bir inandıraraq yol ölçüb, əshabələrini qorumaq üçün Məkkədən kənara göndərərək yol ölçüb, Məkkədən Mədinəyə mühacirət edərək yol ölçüb, dövlət başçılarına məktub yazaraq yol ölçüb, ona inananların sayını artıraraq say ölçüb, dövlət quraraq yol ölçüb,**

**nəfsindən arınaraq yol ölçüb, Məkkəni fəth edərək yol ölçüb, Meraca yüksələrək yol ölçüb, bu dünyadan axirətə köçərək yol ölçüb.**

**Onun gətirdiyi din ölkələr, qitələr fəth edərək yol ölçüb və ölçməkdə davam edir, o yayılır, coğrafiyaları, könülləri fəth edir. Deməli, hz.Məhəmməd (s.a.s.) bu dünyada olmayanda da yol, sahə ölçür. Onun dini məkan və zaman tanımır, o, bütün insanlar və bütün zamanlar üçündür.**

**Hz.Nizami ona «sahəölçən xacə» deyir. Yəni ağıllı, elmli, ölçüb-biçməyi bacaran insan. Onun ölçüləri (gətirdiyi ilahi mesajlar) doğru olduğuna görə bu qədər böyük sahələri ölçə bilir. «Sahəölçən» qavramında ədalət anlayışı da var, doğru, ağıllı ölçən insan ədalətli insan deməkdir. O, sahəni, insanları doğru tanıdığına, doğru ölçdüyünə görə, zaman dəyişsə də, bu ölçülər dəyişmədi.**

Peyğəmbərlər bir ilahi hədəfin ayrı-ayrı mərhələləridir, onlar bir-birini tamamlayır, biri estafeti o birinə verir. Hz.İsa (s.a.s.) da bu ilahi yolun ən önəmli addımlarından biridir. Hz.Məhəmməd (s.a.s.) isə bu elçilər silsiləsinin sonuncusudur, öncəkilərin gördüyü işləri tamamlayandır. «Nökər» bu anlamda son Peyğəmbərədək görülməsi zəruri olan işləri görən deməkdir.

Hz.Nizami bu misrada «sahəölçən» anlayışını, «nökər» (qulam) sözünü bir qavrama-terminə çevirib. Hz. Məhəmmədin (s.a.s.), hz. İsanın (s.a.s.) ömür yolunu, missiyasını bu qavramlara yerləşdirib. Bu qavramlar da hz.Nizaminin elm, iman xəzinəsinin «sirrlərindən» biridir. Bu «sahə ölçmək» missiyası sonsuzadək davam edəcək bir ilahi vəzifədir.

Hz.Məhəmməd (s.a.s.) mübarək hədislərinin birində axirətdə ümmətinin çoxluğu ilə öyünür, sahəsinin böyüklüyü,

qəlbini iman nuru ilə aydınlatdığı insanların sayı ilə qürur duyur, «sahə ölçmək» missiyasını şərəflə yerinə yetirdiyini düşünür.

Abdullah ibni Abbasdan (r.a.) rəvayət edildiyinə görə, Rəsulullah belə buyurdu: «(Keçmiş) ümmətlər mənə göstərildi. Peyğəmbər gördüm, yanında üç-beş adamlıq kiçik bir qrup vardı. Peyğəmbər gördüm, yanında bir-iki adam durmuşdu. Peyğəmbər gördüm yanında bir kimsə yox idi. Bu arada önümə böyük bir topluluq çıxdı. Öz ümmətim hesab etdim. Mənə «bunlar Musanın ümmətidir, sən üfüqə bax!», - dedilər. Baxdım, çox böyük bir qaraltı. «Məhz bunlar sənin ümmətindir. İçlərindən hesabsız-əzabsız cənnətə girəcək yetmiş min adam vardır», - dedilər».[240]

«Allahı ən yaxşı tanıyan», «Ondan ən çox qorxan», «Hər zaman asanlaşdıran», «gerçəkci», «bütün insanlığa göndərilmiş», «rəhmət peyğəmbəri» olan hz. Məhəmməd (s.a.s.) bir mübarək hədisində də peyğəmbərlər silsiləsindəki yerini, uca Allahın ona verdiyi ilahi vəzifəni gözəl bir bənzətmə ilə – sarayda yerinə qoyulması zəriri olan kərpiclə anladıb.

Bu beytin birinci misrasının şərhini böyük islam alimi Zöhrinin bizim üzərimizə düşən vəzifəni dərindən anladan bir sözü ilə bitirək. «Peyğəmbərlik Allah vergisidir. Rəsula təbliğ, bizə də təslimiyyət düşməkdədir».[241]

Hz.Nizami beytin ikinci misrasını da müqayisə üzərində quraraq Allahı (c.c.), onun peyğəmbərlərini anladır. O, birinci misrada «sahəölçən» anlayışı ilə «nökər» (qulam) sözü arasındakı oxşarlıq və fərqə diqqəti yönəldirsə, ikinci misrada «bəşir» və «mübəşşir» qavramları arasında müqayisə imkanı yaradır. Bu misra belədir: «O, (Allahdan) müjdə

---

[240] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 337-338.
[241] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 32.

(xeyir xəbər) gətirən, bunun isə yalnız adı muştuluqçudur». Bu misranın farscasını daha dəqiq ifadə etsək, misra belə alınır: «O, (Məhəmməd) bəşir, İsa isə mübəşşirdir».

Bu misranı şərh etmək üçün «bəşir» və «mübəşşir» anlayışlarına yerləşdirilmiş mənanın qaynaqlarını, dəyərini izah edək. Burada bir məsələni də nəzərə almalıyıq ki, «müjdə» anlayışı bir ümumi mənada, bir də beytin birinci misrasında işarə edilmiş «Merac müjdəsi» işığında dəyərləndirilməlidir.

Qurani-Kərimdə uca Allah (c.c.) hz.Məhəmmədə (s.a.s.) buyurur ki, sən Allahı tanıyanları, sənə itaət edənləri Allahın (c.c.) rəhməti ilə müjdələ. «Bəşir» də müjdə verən anlamındadır. Allahın (c.c.) rəhmətini qazanmaq qurtuluş demək olduğundan bu çox böyük, önəmli bir xəbərdir – müjdədir və uca Allah (c.c.) bu «xilas xəbərini» çatdırmağı hz. Məhəmmədə həvalə edir:

إِنَّا أَرْسَلْنَاكَ بِالْحَقِّ بَشِيراً وَنَذِيراً وَلاَ تُسْأَلُ عَنْ أَصْحَابِ الْجَحِيمِ

(Bəqərə, 2/119)

«Şübhə yox ki, biz səni haqq (Quran) ilə rəhmətimizin müjdəçisi və əzabımızın xəbərçisi olaraq göndərdik. Sən o cəhənnəmliklərdən də məsul deyilsən».

إِنَّا أَرْسَلْنَاكَ بِالْحَقِّ بَشِيراً وَنَذِيراً وَإِن مِّنْ أُمَّةٍ إِلَّا خلَا فِيهَا نَذِيرٌ

(Fatir, 35-24)

«Şübhəsiz ki, biz səni haqq ilə bir müjdəçi, həm də bir uyarıcı olaraq göndərdik. Heç bir ümmət yoxdur ki, içlərində bir uyarıcı (xəbərdaredici) olmamış olsun».

يَا أَيُّهَا النَّبِيُّ إِنَّا أَرْسَلْنَاكَ شَاهِداً وَمُبَشِّراً وَنَذِيراً

(Əhzab,33/45)

«Ey Peyğəmbər! Biz səni həm bir şahid, həm bir müjdəçi, həm də bir uyarıcı olaraq göndərdik».

Bu ayələrdə «müjdə» ilə «qorxutmaq» (xəbərdarlıq etmək) anlayışları, «bəşir» ilə «nəzir» adları bir arada çəkilmişdir. Ən yaxşı xəbərlə, ən pis xəbərin kölgəsində imanla küfr, cənnətlə cəhənnəm anladılmışdır. Bu zidd anlayışların yanaşı işlənməsi müqayisə imkanı yaratmış, müqayisə anlamağa yol açmış, bu metodla da uca Allah (c.c.) insanları dəhşətli sonluqdan çəkindirməyə çalışmışdır. Bu ayələrdə «bəşir» (müjdə verən), «nəzir» (xəbərdarlıq edən) olmaq bir ilahi vəzifədir, buyruqdur. Hz. Məhəmmədin bu buyruqları mütləq yerinə yetirməlidir.

Uca Allah (c.c.) Qurani-Kərimdə böyük, gözəl işləri də müjdələmək feli ilə buyurmuşdur. Bu yöndə olan ayələrə baxaq:

وَالَّذِينَ اجْتَنَبُوا الطَّاغُوتَ أَن يَعْبُدُوهَا وَأَنَابُوا إِلَى اللَّهِ لَهُمُ الْبُشْرَى فَبَشِّرْ عِبَادِ .الَّذِينَ يَسْتَمِعُونَ الْقَوْلَ فَيَتَّبِعُونَ أَحْسَنَهُ أُوْلَئِكَ الَّذِينَ هَدَاهُمُ اللَّهُ وَأُوْلَئِكَ هُمْ أُوْلُوا الْأَلْبَابِ

(Zumər,39/17-18)

«Tağuta ibadət etməkdən çəkinib tövbə edərək Allaha tərəf qayıdanları müjdə gözləyir. (Ey Peyğəmbər!) Bəndələrimə müjdə ver! O kəslərə ki, sözü dinləyib, onun ən gözəlinə uyarlar. Onlar Allah doğru yola yönəltdiyi kimsələrdir. Ağıl sahibləri də elə onlardır».

Bu ayədən anlaşılan odur ki, doğru sözü dinləmək, ona uymaq böyük nemətdir. Ayədə «müjdə» sözü nemətin dəyərini göstərir. «Nə ilə müjdələ»nin cavabı olmasa da, «müjdə» sözü bu cavabın nə olacağını dəqiq açıqlayır:

يُبَشِّرُهُمْ رَبُّهُم بِرَحْمَةٍ مِّنْهُ وَرِضْوَانٍ وَجَنَّاتٍ لَّهُمْ فِيهَا نَعِيمٌ مُّقِيمٌ

(Tövbə, 9/21)

«Rəbbləri onları rəhmət, sonsuz xoşnudluq, içində onlar üçün tükənməz nemətlər olan cənnətlərlə müjdələr».

اَمْرَأَتُهُ قَآئِمَةٌ فَضَحِكَتْ فَبَشَّرْنَاهَا بِإِسْحَاقَ وَمِن وَرَاء إِسْحَاقَ يَعْقُوبَ
(Hud,11/71)

«İbrahimin qarısı da ayaqda duraraq dinləyirdi, bu sözləri duyanda güldü. Ona da İshaqı, İshaqın ardından da Yaqubu müjdələdik».

فَنَادَتْهُ الْمَلآئِكَةُ وَهُوَ قَائِمٌ يُصَلِّي فِي الْمِحْرَابِ أَنَّ اللّهَ يُبَشِّرُكَ بِيَحْيَى
مُصَدِّقاً بِكَلِمَةٍ مِّنَ اللّهِ وَسَيِّداً وَحَصُوراً وَنَبِيّاً مِّنَ الصَّالِحِينَ
(Ali-İmran, 3/39)

«Zəkəriyə məbəddə duraraq namaz qılarkən mələklər ona «Allah səni Yəhya ilə müjdələyir», deyə səsləndilər».

إِذْ قَالَتِ الْمَلآئِكَةُ يَا مَرْيَمُ إِنَّ اللّهَ يُبَشِّرُكِ بِكَلِمَةٍ مِّنْهُ اسْمُهُ الْمَسِيحُ
عِيسَى ابْنُ مَرْيَمَ وَجِيهاً فِي الدُّنْيَا وَالآخِرَةِ وَمِنَ الْمُقَرَّبِينَ
(Ali-İmran, 3/45)

«Mələklər demişdilər ki, ey Məryəm, Allah sənə özündən bir kəlməni müjdələyir. Adı Məsihdir (Məryəm oğlu İsa)».

Bu ayələrə diqqətlə baxsaq, görərik ki, birinci ayədə doğru sözü «dinləmək, uymaq» neməti, ikinci ayədə «cənnət» kimi əvəzsiz bir nemət, üçüncü ayədə «İshaq, Yaqub» kimi nemət, dördüncü ayədə «Yəhya» neməti, beşinci ayədə «Məsih» (İsa) kimi nemət «müjdə» anlayışı ilə ifadə edilmişdir. Bundan başqa uca Allah (c.c.) «müjdələmək» və «xəbərdar etmək», «sevindirmək», «qorxutmaq» kimi anlayışları bir arada işlətməklə onları yanaşı qoymaqla insanları tərbiyə, inandırma metodunu açıqlayır, onları ümüd və qorxu arasında saxlayır. Müjdə ümüd yaradır, xəbərdarlıq isə qorxu.

Təbii ki, müjdə gözəl olduğu kimi onu çatdıran da (peyğəmbər) seviləndir. **Allahın (c.c.) təliminə görə O, hər zaman peyğəmbərləri dəstəkləyir. İlahi vəzifəni yerinə yetirmək üçün onlara imkanlar yaradır, onlara uyğun imkanlar verir. Müjdə vermək imkanı hz.Məhəmmədi (s.a.s.) böyüdür, onun inandırmaq gücünü artırır. Eyni zamanda «qorxutmaq»da böyük imkandır. Bir şəxs Sultanın adından kimisə qorxutsa, o şəxs ondan çəkinəcək. Hz.Nizami də beytin ikinci misrasında «müjdə»ni Peyğəmbərə verilmiş ilahi yetki kimi dəyərləndirib. Bununla bağlı bir qədər sonra.**

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ TƏBLİĞDƏ MÜJDƏ VERMƏK METODU

Hz.Məhəmməd (s.a.s.) də təlim metodu olaraq müjdələmək – asanlaşdırmaq prinsipini seçmişdir. Biz hədislərdə bunu açıqca görürük. Əbu İbrahim, ya da Əbu Məhəmməd, ya da Əbu Muaviyə Abdullah ibni Əbu Evfa (r.a.) belə dedi: «Rəsulullah (s.a.s.) Xədicəni (r.a.) cənnətdə, içində heç bir gurultunun duyulmayıb, heç bir yorğunluğun hiss edilməyəcəyi, incidən düzəldilmiş bir köşklə müjdələdi».[242]

Əbu Hureyrə (r.a.) belə deyir: «Rəsulullahın (s.a.s) ətrafında Əbu Bəkir və Ömərin (r.a.) də olduğu bir qrup insanla otururduq. Bir ara Rəsulullah (s.a.s.) aramızdan qalxıb getdi. Uzun bir vaxt geri dönmədi. Başına pis bir iş gəlməsindən qorxduq, təlaşla yerimizdən qalxdıq. Bu narahatçılığı ilk duyan mən idim. Rəsullahı axtararaq ənsardan Nəccar oğullarına aid bir bağçaya gəldim. Giriş qapısını axtararaq bağçanın ətrafını dolandım, ancaq bir qapı tapa bilmədim. Bağçanın kənarındakı bir quyudan içəriyə su

[242] Riyazüs-Salihin, c. IV, s. 151.

verən kiçik bir arx gördüm və oradan büzülərək Rəsulullahın (s.a.s) yanına getdim.

- Əbu Hureyrə, sənsənmi?

- Bəli, ey Rəsulullah!

- Nə xəbər?

- Aramızda oturarkən qalxıb getdin. Geri dönmədiyini görüncə sənə bir pislik edilməsindən qorxub təlaşlandıq. İlk narahatçılıq duyan da mən oldum. Qalxıb bu bağçaya gəldim, tülkü kimi iki büklüm içəri girdim. Başqaları da arxadan gəlir, dedim.

Rəsulullah:

- Əbu Hureyrə!, - deyə səsləndi. Sonra ayaqqabılarını çıxarıb verdi və bunları söylədi:

- Bu ayaqqabılarımı alıb geri dön. Bu divarın arxasında, könüldən inanaraq «La ilahə illallah» deyən kimi görsən, onu cənnətlə müjdələ!»[243]

Enes (r.a.) belə rəvayət edir: «Peyğəmbər (s.a.s.) belə buyurdu: «Asanlaşdırın, çətinləşdirməyin. Müjdələyin, nifrət etdirməyin (ürkütməyin)».[244]

Hz.Məhəmmədin (s.a.s.) Quran qaynaqlı bu iki yetkisi (müjdələmək, qorxutmaq), «Bəşir» və «Mübəşşir» adı divan şeirində də bir arada anılmışdır.

**Şeyxoğlu Mustafa:**

Beşir-i rahmeti – Rahman Muhammed,
Neziri – hiddet-i niran Muhammed.[245]

(Rəhmanın rəhmətinin müjdəçisi Məhəmməd, Allahın hiddətinin xəbərdar-edicisi Məhəmməd)

**Qivami:**

Cümle alem milkine Şahid, Mübeşşir, hem Nezir,

---

[243] Riyazüs-Salihin, c. III, s. 160.
[244] Riyazüs-Salihin, c. III, s. 578.
[245] Emine Yeniterzi, göstərilən qaynaq, s. 173.

Eyledi hak çün kim «erselnak» ey fahr-i Cihan.[246]
(Bütün aləmlərə şahid, müjdəçi, xəbərdaredici oldu)

**Əhmədi:**
Geh didi ana şefi ü geh Nezir,
Geh Şahid, geh Sirac ü geh Beşir.[247]
(Ona gah şəfi, gah xəbərdaredici, gah şahid, gah nur, gah da müjdəçi dedi)

Hz.Nizami, hz.Məhəmmədlə (s.a.s.) hz. İsanı (s.a.s.) müqayisə edərkən bir-birinə çox yaxın, bir-birinin yerində işlənən «Bəşir», «Mübəşşir» adlarından yararlanmışdır. Şair bu beytdə müjdə anlayışını Merac gecəsində hz. Məhəmmədə (s.a.s.) verilən ilahi xəbərlərlə açıqlamışdır.

Meracda verilən müjdə islam tarixində önəmli yer tutduğundan şair bu nöqtədən çıxış edərək hz.Məhəmmədin (s.a.s.) üstünlüyünü şərh etmişdir. Əslində, bütün Peyğəmbərlərin həyatında Merac müjdəsi var. Ancaq hz.Nizamiyə görə, hz.Məhəmmədin (s.a.s.) müjdəsi daha böyükdür. Bu gecə hz.Məhəmmədə (s.a.s.) on iki buyruq verilmişdir:

- Allahdan başqasına qulluq etməyin.
- Ana-ata ilə yaxşı davranın.
- Yetimə, yoxsula, yolda qalana haqqını verin.
- Xəsis və israfçı olmayın.
- Övladınızı yoxsulluq qorxusu ilə öldürməyin.
- Fahişəlik və zinaya yaxınlaşmayın.
- Cana qıymayın.

---

[246] Emine Yeniterzi, göstərilən qaynaq, s. 173.
[247] Emine Yeniterzi, göstərilən qaynaq, s. 189.

- Yetimin malına doğru olmayan bir niyyətlə toxunmayın.

- Əhdinizi yerinə yetirin.

- Ölçü və tərəzidə doğruluğa diqqət edin.

- Haqqında bilgi sahibi olmadığınız şeyin ardınca düşməyin.

- Yer üzündə qurur və təkəbbürlə yeriməyin. Özünüzdən razı olmayın.

Biz bu müjdələri təhlil etsək, görərik ki, onların içində tövhid inancını təsbit edən, toplumda sosial, iqtisadi ədaləti qoruyan fərdin, toplumun qorunmasına yönəlmiş, əxlaqi ölçüləri bəlli edən prinsiplər var. Bu ölçülər Quranın təməlləridir. Bu ölçülərsiz fərdin, toplumun Allahın (c.c.) razılığını qazanması mümkün deyil.

Bundan başqa, hz.Məhəmmədə (s.a.s.) Merac gecəsi daha üç müjdə verilmişdir. Bunlardan birincisi odur ki, hz. Məhəmmədin (s.a.s.) ümmətindən Allaha (c.c.) ortaq qoşmayanlara, günahlarını ödədikdən sonra tez-gec cənnətə girəcəyi vəd olundu. İkincisi, Merac gecəsi gündəlik beş vaxt namaz əmr olundu. Üçüncüsü, Bəqərə surəsinin son iki ayəsi nazil oldu. Bu müjdə ayələri də iman əsaslarını əhatə edən ayələrlə bir surədə, bir aradadır:

آمَنَ الرَّسُولُ بِمَا أنزِلَ إِلَيْهِ مِن رَّبِّهِ وَالْمُؤْمِنُونَ كُلٌّ آمَنَ بِاللّهِ
وَمَلآئِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِ لاَ نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِّن رُّسُلِهِ وَقَالُواْ سَمِعْنَا
وَأَطَعْنَا غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ الْمَصِيرُ .لاَ يُكَلِّفُ اللّهُ نَفْساً إِلاَّ وُسْعَهَا لَهَا
مَا كَسَبَتْ وَعَلَيْهَا مَا اكْتَسَبَتْ رَبَّنَا لاَ تُؤَاخِذْنَا إِن نَّسِينَا أَوْ أَخْطَأْنَا رَبَّنَا
وَلاَ تَحْمِلْ عَلَيْنَا إِصْراً كَمَا حَمَلْتَهُ عَلَى الَّذِينَ مِن قَبْلِنَا رَبَّنَا وَلاَ تُحَمِّلْنَا
مَا لاَ طَاقَةَ لَنَا بِهِ وَاعْفُ عَنَّا وَاغْفِرْ لَنَا وَارْحَمْنَا أَنتَ مَوْلاَنَا فَانصُرْنَا
عَلَى الْقَوْمِ الْكَافِرِينَ

(Bəqərə, 2/285-286)

«Peyğəmbər Rəbbindən nə endirildisə, ona iman gətirdi, möminlər də. Hər biri «Allaha, mələklərinə,

kitablarına, peyğəmbərlərinə, peyğəmbərlərdən heç birinin arasında fərq qoymarıq deyə iman gətirdilər və belə dedilər: duyduq və itaət etdik. Ey Rəbbimiz, bağışlamanı istəyirik, dönüş ancaq sənədir. Allah heç kimsəyə gücü çatmayan bir yük yükləməz. Hər kəsin qazandığı lehinə, yükləndiyi əleyhinədir. Ey Rəbbimiz, əgər unutduq və qəsdən olmayaraq etdiksə, bizi hesaba çəkmə! Ey Rəbbimiz, bizə, bizdən öncəkilərə yüklədiyin kimi ağır yük yükləmə. Ey Rəbbimiz, bizə gücümüzün yetməyəcəyi yükü də yükləmə və bizim günahlarımızı bağışla, bizə rəhm et! Sənsən bizim Mövlamız, bizə kafir qövmlərə qarşı mübarizədə yardım et!»

Bu son iki ayədə də uca Allah (c.c.) peyğəmbərlərə fərq qoymadan inanmağı əmr edir. Bu buyruq müjdə olaraq Merac gecəsi hz.Məhəmmədə (s.a.s.) verilir. Hz.Nizami də beytdə hz.Məhəmmədlə (s.a.s.) hz.İsanı (s.a.s.) bu müjdələr işığında dəyərləndirir. Buradakı fərq bu iki Peyğəmbərin yükləndiyi missiyanı anlatmaq üçündür.

Hz.Nizami nətinin birinci beytində «Əhməd» adı ilə, ikinci, üçüncü beytdə «səadət məmləkəti», «kamal fərmanı» anlayışları ilə, dördüncü beytdə «turunc» meyvəsi, beşinci beytdə «mən peyğəmbər idim» hədisi ilə, yeddinci beytdə «Məhəmmədin möhürü» qavramı ilə, səkkizinci beytdə «iki cahanın sultanı» dəyərləndirməsi ilə, doqquzuncu beytdə isə «sahəölçən xacə», «müjdə» deyimləri ilə kodlaşdırdığı mənanı, ideyanı, sirri onuncu beytdə «ümmi» sözü ilə örtüb.

## ONUNCU BEYTİN ŞƏRHİ: O, ÖZ «ƏLİF»İ İLƏ ADƏMDƏN, «MİM»İ İLƏ İSƏ MƏSİHDƏN ÖN OLUB

امی گویا به زبان فصیح
از الف آدم و میم مسیح

***O (Məhəmməd), öz fəsahətli diliylə ümmi olub,***
***Ancaq öz «əlif»i ilə Adəmdən, «mim»i ilə isə Məsihdən ön olub.***[248]

Bu beytdə hz.Nizami, hz.Məhəmmədlə (s.a.s.) müqayisə tərəfi olaraq hz.Adəmi (s.a.s.) və hz.İsanı (s.a.s.) seçib. Beytdəki müqayisə hz.Məhəmmədin (s.a.s.) ümmi olması üzərində qurulub. Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) ümmiliyini tamam başqa yöndən dəyərləndirib. O, ümmilik anlayışını «savadsızlıq», «bir şey bilməmək», «oxuma, yazması olmayan» qəlibindən çıxarıb. «Ümmi olmağı» ilahi elmə sahib olmaq kimi qiymətləndirib. Biz bu məsələni bir-bir izah edəcəyik.

## PEYĞƏMBƏRİN ÜMMİLİYİ

Öncə onu deyək ki, Qurani-Kərim hz.Məhəmmədin (s.a.s.) ümmiliyini açıqca ifadə edib:

الَّذِينَ يَتَّبِعُونَ الرَّسُولَ النَّبِيَّ الأُمِّيَّ الَّذِي يَجِدُونَهُ مَكْتُوباً عِندَهُمْ فِي التَّوْرَاةِ وَالإِنْجِيلِ يَأْمُرُهُم بِالْمَعْرُوفِ وَيَنْهَاهُمْ عَنِ الْمُنكَرِ وَيُحِلُّ لَهُمُ الطَّيِّبَاتِ وَيُحَرِّمُ عَلَيْهِمُ الْخَبَآئِثَ وَيَضَعُ عَنْهُمْ إِصْرَهُمْ وَالأَغْلاَلَ الَّتِي كَانَتْ عَلَيْهِمْ فَالَّذِينَ آمَنُواْ بِهِ وَعَزَّرُوهُ وَنَصَرُوهُ وَاتَّبَعُواْ النُّورَ الَّذِيَ أُنزِلَ مَعَهُ أُوْلَـئِكَ هُمُ الْمُفْلِحُونَ قُلْ يَا أَيُّهَا النَّاسُ إِنِّي رَسُولُ اللّهِ إِلَيْكُمْ جَمِيعاً الَّذِي لَهُ مُلْكُ السَّمَاوَاتِ وَالأَرْضِ لا إِلَـهَ إِلاَّ هُوَ يُحْيِـي وَيُمِيتُ

---

[248] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 25.

فَآمِنُواْ بِاللّهِ وَرَسُولِهِ النَّبِيِّ الأُمِّيِّ الَّذِي يُؤْمِنُ بِاللّهِ وَكَلِمَاتِهِ وَاتَّبِعُوهُ لَعَلَّكُمْ تَهْتَدُونَ
(Əraf, 7/157-158)

«Onlar ki yanlarındakı Tövrat və İncildə yazılı, inanacaqları Rəsula, oxuyub yazmaq bilməyən ümmi peyğəmbərə uyarlar. O, onlara yaxşılığı əmr edər, pislikdən uzaqlaşdırar, təmiz, xoş şeyləri onlar üçün halal, pis şeyləri haram edər, çiyinlərindən ağır yüklərini, üzərilərindəki bağları, zəncirləri endirib atar. Bu peyğəmbərə inanan, hörmət edən, yardım edən, onunla göndərilən nura uyanlar yoxmu? Məhz onlar səadətə, qurtuluşa çatanlardır. De ki: Ey insanlar, doğrusu mən göylərin və yerlərin hökmranı, ondan başqa Tanrı olmayan, dirildən, öldürən Allahın hamınız üçün göndərdiyi Peyğəmbəriyəm. Onun üçün gəlin Allaha və peyğəmbərinə iman edin. Allaha və Allahın bütün kəlamlarına inanan, o oxuyub yazması olmayan peyğəmbərə də! Uyun ona ki, hidayətə yönələsiniz».

هُوَ الَّذِي بَعَثَ فِي الْأُمِّيِّينَ رَسُولاً مِّنْهُمْ يَتْلُو عَلَيْهِمْ آيَاتِهِ وَيُزَكِّيهِمْ وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَإِن كَانُوا مِن قَبْلُ لَفِي ضَلَالٍ مُّبِينٍ
(Cümə, 62/2)

«Odur ki, ümmilərə içlərindən bir peyğəmbər göndərdi. O, onlara Allahın ayələrini oxuyur və onları təmizə çıxarıb parladır, onlara kitab və hikmət öyrədir. Halbuki, bundan öncə onlar açıq bir sapıqlıq içində idilər».

## «ÜMMİ» SÖZÜNÜN MƏNASI

İndi bu ayələrdə olan «ümmi» sözünün qaynaqlardakı təfsirlərinə baxaq. Təfsir alimi Raziyə görə, «ümmi» qavramı

«daha öncə özlərinə aid vəhy edilmiş kitabları olmayan bir toplumu, ya da millәti göstərir».[249]

«Cümə» surəsində peyğəmbərə «ümmi» deyilməsi də bu təfsir işığında onun «kitabla ilgisiz» olduğu anlamına gəlir.[250]

«Ümmi» sözünün kökü və anlamı ilə bağlı üç fərqli görüş var. «Ümmi», «Ümmülkura (Məkkə) adına görə, hz. Məhəmmədin (s.a.s.) məkkəli olduğu anlamındadır, «ümmi», «ümmət», «millət» sözünə uyğun olaraq «Ərəb millətindən» (çoxu oxumaq, yazmaq bilməyən bir topluma mənsub) olan deməkdir, «ümmi» sözü «ümm» (ana) sözünə uyğun olaraq «anasından doğulduğu kimi» (oxumaq-yazmaq bilməyən) mənasındadır.[251]

«Son görüş daha çok benimsenmişdir. Zira, İslam öncesi Arap toplumunda erkekler arasında, az da olsa, okur-yazarlar bulunmasına karşılık, kadınlardan hemen- hemen hiç kimse okuma-yazma bilmezdi. Bundan dolayı ümmi kelimesi genellikle hz.Peyğamberin en azından başlangıçta okuma-yazma bilmediyini, dolayısıyla tebliğ ettigi din ile ilgili bütün bilgilerini yalnızca Allahtan almış olduğu gerçeyini ifade eder».[252]

Hz. Məhəmmədin (s.a.s.) peyğəmbərliyinin (nübüvvət) dəlillərindən biri də onun ümmi olmasıdır. O, ümmi bir peyğəmbərdir, ancaq insanı düşündürən bütün məsələlərlə bağlı doğru bilgilər verir, heç vaxt köhnəlməyəcək ölçülər müəyyən edir. Quran bu ümmi Peyğəmbərin verdiyi bilgilərin doğruluğunu dönə-dönə təsdiq edir:

---

[249] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 1147.
[250] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 1147.
[251] Kuran yolu (türkçe meal ve tefsir), Ankara, 2004, s. II, s. 471.
[252] Kuran yolu (türkçe meal ve tefsir), Ankara, 2004, s. II, s. 471.

إِنَّ الَّذِينَ كَفَرُوا بِالذِّكْرِ لَمَّا جَاءهُمْ وَإِنَّهُ لَكِتَابٌ عَزِيزٌ. لَا يَأْتِيهِ الْبَاطِلُ مِن بَيْنِ يَدَيْهِ وَلَا مِنْ خَلْفِهِ تَنزِيلٌ مِّنْ حَكِيمٍ حَمِيدٍ

(Fussilət, 41/41-42)

«Onlar, o Quran onlara gəldiyi vaxt ona göz yumaraq inkar edənlərdir. Halbuki, o, bənzəri olmayan (və olmayacıq) əziz bir kitabdır. Ona nə önündən, nə ardından batil yaxınlaşmaz. Bütün kainatın öydüyü, həmd və hikmət sahibi olan Allah tərəfindən endirilmişdir».

قُل لَّئِنِ اجْتَمَعَتِ الإِنسُ وَالْجِنُّ عَلَى أَن يَأْتُواْ بِمِثْلِ هَـذَا الْقُرْآنِ لاَ يَأْتُونَ بِمِثْلِهِ وَلَوْ كَانَ بَعْضُهُمْ لِبَعْضٍ ظَهِيراً . وَلَقَدْ صَرَّفْنَا لِلنَّاسِ فِي هَـذَا الْقُرْآنِ مِن كُلِّ مَثَلٍ فَأَبَى أَكْثَرُ النَّاسِ إِلاَّ كُفُوراً

(İsra, 17/88-89)

«De ki: «And içərəm, əgər insanlar və cinlər bu Quranın bənzərini gətirmək üçün toplansalar, bir-birilərinə yardım da etsələr, yenə onun bənzərini gətirə bilməzlər. Cəlalım haqqı üçün Biz bu Quranda dillərə dastan olacaq hər mənadan çeşid-çeşid ifadələr işlətdik. Yenə insanların çoxu gavurluqda israr etdilər».

Qurani-Kərimi bir vəhy olaraq alan, xalqın içində inanılan, etibar edilən, doğruçu, sədaqətli bir insan olaraq tanınan hz.Məhəmməd (s.a.s.) ümmidir, ümmiliyi Qurani-Kərimin ilahi bir kitab olduğunu inkar edənlərə qarşı bir sipərdir, hz.Məhəmmədi (s.a.s.) yalançılıqda ittiham edənlərə qarşı alınmaz bir səngərdir.

Əslində, Quranın ilahi bir kitab olmadığını, onun hz.Məhəmməd (s.a.s.) tərəfindən yazıldığını iddia edənlərin (belə iddialar indi də var) məqsədi Allahın varlığını inkar etməkdir. Ancaq oxumaq, yazmaq bilməyən bir insanın kainatın, insanlığın məsələləri ilə bağlı doğru bilgilər verməsi

inkarçıların əsassız, məqsədli iddialarını çürüdür. İnkarçılara qarşı ümmilik bir cavab, Quranın bənzərsiz üslubu başqa bir cavabdır. Bu anlamda ümmilik Allahın (c.c.) varlığı və birliyi inancını sarsıtmaq, şirkə, bütpərəstliyə, bu yolla da istismar və köləliyə qapı açmaq istəyənlərin, çürük dəlillərinin yolunu kəsir, onların təməlsiz düşüncələrini, Allaha, Qurana, hz. Məhəmmədə (s.a.s.), insanlığa qarşı yönəlmiş təcavüzlərini zərərsizləşdirir. Elə buna görə də ümmilik hz.Məhəmmədin (s.a.s.) peyğəmbərliyinin (nübüvvətinin) dəlillərindən biridir. Ümmilik ehtiyac olan bir qoruyucu vasitədir.

Baxın, uca Quran inkarçıları ümmilik anlayışı işığında necə susdurur:

وَكَذَلِكَ أَنزَلْنَا إِلَيْكَ الْكِتَابَ فَالَّذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ يُؤْمِنُونَ بِهِ وَمِنْ هَؤُلَاء مَن يُؤْمِنُ بِهِ وَمَا يَجْحَدُ بِآيَاتِنَا إِلَّا الْكَافِرُونَ . وَمَا كُنتَ تَتْلُو مِن قَبْلِهِ مِن كِتَابٍ وَلَا تَخُطُّهُ بِيَمِينِكَ إِذاً لَّارْتَابَ الْمُبْطِلُونَ . بَلْ هُوَ آيَاتٌ بَيِّنَاتٌ فِي صُدُورِ الَّذِينَ أُوتُوا الْعِلْمَ وَمَا يَجْحَدُ بِآيَاتِنَا إِلَّا الظَّالِمُونَ

(Ənkəbut, 29/47-49)

«Ey peyğəmbər, sənə məhz belə kitab endirdik. Onun üçün özlərinə kitab verdiklərimiz ona iman edirlər. Bunlardan (məkkəlilərdən) da ona iman edənlər vardır. Bizim ayələrimizi ancaq kafirlər inkar edər. Sən bundan əvvəl kitab oxuyan deyildin, hələ də yazı yazmazsan. Elə olsa idi, batilə uyanlar şübhələnə bilərdi. Ancaq o (Quran) özlərinə elm verilmiş kimsələrin sinələrində parıldayan parlaq ayələrdir. Bizim ayələrimizi ancaq zalimlər inkar edər».

Qurani-Kərim onun ilahi kitab olmadığını irəli sürənlərə qarşı təklif edir:

وَإِن كُنتُمْ فِي رَيْبٍ مِّمَّا نَزَّلْنَا عَلَى عَبْدِنَا فَأْتُواْ بِسُورَةٍ مِّن مِّثْلِهِ وَادْعُواْ شُهَدَاءكُم مِّن دُونِ اللّهِ إِنْ كُنْتُمْ صَادِقِينَ

(Bəqərə, 2/23)

«Əgər qulumuza parça-parça endirdiyim Qurandan şübhədə isəniz, onun əvəzində bir surə gətirin və Allahdan başqa inandıqlarınızın hamısını çağırın, əgər doğrusunuzsa, bunu edin».

فَإِن لَّمْ تَفْعَلُواْ وَلَن تَفْعَلُواْ فَاتَّقُواْ النَّارَ الَّتِي وَقُودُهَا النَّاسُ وَالْحِجَارَةُ أُعِدَّتْ لِلْكَافِرِينَ

(Bəqərə, 2/24)

«Yox, edə bilməzsiniz. Heç bir zaman edə bilməyəcəksiniz. O halda yanacağı insanlarla daşlar olan o atəşdən çəkinin. O atəş kafirlər üçün hazırlandı».

أَمْ يَقُولُونَ افْتَرَاهُ قُلْ فَأْتُواْ بِعَشْرِ سُوَرٍ مِّثْلِهِ مُفْتَرَيَاتٍ وَادْعُواْ مَنِ اسْتَطَعْتُم مِّن دُونِ اللّهِ إِن كُنتُمْ صَادِقِينَ . فَإِن لَّمْ يَسْتَجِيبُواْ لَكُمْ فَاعْلَمُواْ أَنَّمَا أُنزِلِ بِعِلْمِ اللّهِ وَأَن لاَّ إِلَـهَ إِلاَّ هُوَ فَهَلْ أَنتُم مُّسْلِمُونَ

(Hud, 11/13-14)

«Yoxsa, «onu özü uydurdumu?», - deyirlər. De ki: «Siz də onun kimi uydurma on surə gətirin. Allahdan başqa gücünüzün yetdiyini də çağırın. Əgər doğru söyləyirsinizsə, bunu edərsiniz. Bunun üzərinə əgər sizə cavab verə bilmədilərsə, artıq bilin ki, o ancaq Allahın elmiylə endirilmişdir. Ondan başqa ilah yoxdur. Artıq müsəlman olursunuz, elə deyilmi?».

Uca Allahın (c.c.) başqa bir cavabı:

وَمَا كَانَ هَـذَا الْقُرْآنُ أَن يُفْتَرَى مِن دُونِ اللّهِ وَلَـكِن تَصْدِيقَ الَّذِي بَيْنَ يَدَيْهِ وَتَفْصِيلَ الْكِتَابِ لاَ رَيْبَ فِيهِ مِن رَّبِّ الْعَالَمِينَ .أَمْ يَقُولُونَ افْتَرَاهُ قُلْ فَأْتُواْ بِسُورَةٍ مِّثْلِهِ وَادْعُواْ مَنِ اسْتَطَعْتُم مِّن دُونِ اللّهِ إِن كُنتُمْ صَادِقِينَ بَلْ كَذَّبُواْ بِمَا لَمْ يُحِيطُواْ بِعِلْمِهِ وَلَمَّا يَأْتِهِمْ تَأْوِيلُهُ كَذَلِكَ كَذَّبَ الَّذِينَ مِن قَبْلِهِمْ فَانظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الظَّالِمِينَ

(Yunus, 10/37-39)

«Bu Quran Allahdandır. Başqası tərəfindən uydurulmuş deyildir. Ancaq özündən öncəkini doğrulayan və o Kitabı açıqlayıcı olaraq aləmlərin Rəbbi tərəfindən gəlmişdir. Bundan şübhə yoxdur. Yoxsa, «onu uydurdu!», - deyirlər? De ki: «Elə isə onun kimi bir surə gətirin və iddianızda səmimi isəniz, Allahdan başqa çağıra biləcəyinizi də çağırın. Onlar elmini əhatə edə bilmədikləri və hələ təfsiri də onlara bildirilməmiş olan şeyi yalan saydılar. Onlardan öncəkilər də beləcə yalan saymışdılar. Zalımların sonunun necə olduğuna bir bax».

Quranın ayələri nazil olmağa başlayanda hz. Məhəmmədə (s.a.s.) qarşı çoxsaylı iddialar irəli sürüldü. İnkarçılar Quranın «xəyal məhsulu», «əsilsiz bir şey», «saxta», «uydurma», «başqalarının yardımı ilə yazılmış» olduğunu iddia etdilər. Uca Allah (c.c.) Qurani-Kərimdə bu əsassız iddiaları bir-bir sadalayıb, onlara zəruri cavablar verib:

وَقَالَ الَّذِينَ كَفَرُوا إِنْ هَذَا إِلَّا إِفْكٌ افْتَرَاهُ وَأَعَانَهُ عَلَيْهِ قَوْمٌ آخَرُونَ فَقَدْ جَاؤُوا ظُلْماً وَزُوراً وَقَالُوا أَسَاطِيرُ الْأَوَّلِينَ اكْتَتَبَهَا فَهِيَ تُمْلَى عَلَيْهِ بُكْرَةً وَأَصِيلاً . قُلْ أَنزَلَهُ الَّذِي يَعْلَمُ السِّرَّ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ إِنَّهُ كَانَ غَفُوراً رَّحِيماً . وَقَالُوا مَالِ هَذَا الرَّسُولِ يَأْكُلُ الطَّعَامَ وَيَمْشِي فِي الْأَسْوَاقِ لَوْلَا أُنزِلَ إِلَيْهِ مَلَكٌ فَيَكُونَ مَعَهُ نَذِيراً

(Furkan, 25/4-7)

«Üstəlik haqqı inkara şərtlənmiş olanlar, «Bu (Quran) doğrunu gizləyib yalanı və saxtanı ortaya çıxaran başqa bir toplumun yardımı ilə onun özündən uydurduğu yalandan başqa bir şey deyildir», - deyib dururlar. Ayrıca «onun sabah axşam özünə oxunsunlar deyə yazdırdığı əskilərin məsəlləri, əfsanələridir bu!», - deyirlər. De ki: «Göylərin və yerin bütün sirlərini bilən (Allah) endirdi onu! Doğrusu, o, çox acıyıb rəhm edən, gerçək bağışlayıcıdır. Ancaq onlar yenə də belə deyirlər: Bu necə Peyğəmbərdir ki, (başqa insanlar kimi)

yeyir, içir, çarşı-bazar dolaşır? Onun yerinə bir uyarıcı olaraq bir mələk göndərilsəydi! Ya da ona (Allahdan) bir xəzinə verilsəydi, ya (zəhmətsiz) yeyib içdiyi (tilsimli) bir bağçası olsaydı!». Bu zalimlər (bir-birilərinə): «Əgər (Məhəmmədə) uyacaq olsaydınız, sehirlənmiş bir adamdan başqasına (uymuş olmazdınız) deyirlər».

Bu Quran ayələrindən iki şey aydın görünür. Uca Allah bir yöndən hz.Məhəmmədin (s.a.s.) ümmi olduğunu buyurur, nədən ümmi bir insanı seçdiyini açıqlayır, başqa yöndən isə hz.Məhəmmədin (s.a.s.) Allahın verdiyi nemətləri başqalarına öyrətmək vəzifəsi olduğunu bildirir. **Ümmi olmaqla öyrətmək anlayışları ilk baxışda bir-birinə uymasa da, əslində, bu anlayışlar bir-birini tamamlayır. Yəni hz. Məhəmmədin (s.a.s.) bizim kimi oxuma-yazma yolu ilə elm öyrənməyə ehtiyacı yoxdur, onun müəllimi uca Allahdır (c.c.). Uca Allahın (c.c.) hz. Məhəmmədə (s.a.s.) verdiyi nemət - elm qüsursuzdur, bu elm həyatın, insanlığın suallarına, problemlərinə ən doğru cavabı verir.**

## VƏHYİN MƏNASI

Hz.Məhəmmədin (s.a.s.) aldığı elm vəhy yolu ilə enir. Ona görə də, biz burada qısa da olsa, vəhyin anlamına toxunmaq istəyirik.

«Vəhy» lüğətdəki mənası ilə «gizli danışmaq», «fısıldamaq», «səslənmək», «danışmaq», «məktub yazmaq» anlamlarına gəlir. Vəhy bir qavram (termin) olaraq isə «Allah Təalanın çeşitli konulara ilişkin bilgileri söz ve ya mana

şeklinde doğrudan doğruya, ya da melek vasitesi ile peyğamberlere gizlice bildirmesidir».[253]

Vəhy bir elmdir, haldır, yaşayışdır. Onun necəliyini ancaq Peyğəmbər bilir. Vəhy Allahla (c.c.) Peyğəmbər arasında bir sirdir. Vəhy zamanı Peyğəmbərdə fizioloji və psixoloji dəyişikliklər ortaya çıxır. O, soyuq havada belə tərləyir, dəvənin üstündə olarkən vəhy gəlirsə, dəvə çökür, onun yanında olanlar arı vızıltısına bənzər səslər eşidir. Vəhy nübüvvətin əsasını təşkil edir. Kəlam kitablarında vəhyin növləri belə göstərilir:

1. Doğru yuxular. Vəhyin ən əski şəkli olan yuxular (peyğəmbərin gördüyü yuxular) ertəsi gün olduğu kimi gerçəkləşirdi.

2. Mələyin vəhy gətirməsi. Vəhyi daşıyan Cəbrail ya olduğu kimi Peyğəmbərə görünərək, ya insan şəklinə bürünərək, ya da görünmədən Peyğəmbərə vəhy gətirmişdir. Hz. Məhəmməd (s.a.s.) üç kərə bu yolla vəhy almışdır.

3. Vasitəsiz vəhy. Uca Allah (c.c.) birbaşa peyğəmbərə xitab edərək, onun qəlbində bir bilgi yaradaraq vəhy etmişdir. Hz. Musa Tur dağında, hz. Məhəmməd (s.a.s.) Meracda belə vəhylər almışdır. Quranda buna açıq işarə edilmişdir:

وَمَا كَانَ لِبَشَرٍ أَن يُكَلِّمَهُ اللَّهُ إِلَّا وَحْياً أَوْ مِن وَرَاء حِجَابٍ أَوْ يُرْسِلَ رَسُولاً فَيُوحِيَ بِإِذْنِهِ مَا يَشَاءُ إِنَّهُ عَلِيٌّ حَكِيمٌ

(Şura, 42/51)

«Bununla bərabər heç bir insan üçün mümkün deyildir ki, Allah onunla başqa surətdə (doğrudan doğruya) danışsın. Ancaq vəhylə, ya bir pərdə arxasından, ya da bir Peyğəmbər göndərib icazəsi ilə ona dilədiyini vəhy etdirməsi müstəsna! Çünki, O, çox ucadır, hökm və hikmət sahibidir».

---

[253] İslamda inanc esasları (hazırlayanlar: Bekir Topaloğlu, Şevki Yavuz, İlyas Çelebi), İstanbul, 2002, s. 162.

Vəhy bir gerçəklikdir, o, hər zaman doğrudur, vəhydə yalan olmaz, vəhyi ancaq peyğəmbərlər ala bilər, vəhy peyğəmbərliyin əsasıdır. **Deməli, qüdrət sahibi Allahdan (c.c.) vəhy almaqla nemətləndirilmiş hz.Məhəmməd (s.a.s.) mükəmməl bir elm sahibidir, onun ümmi olması ilə öyrətməsi, insanları aydınlatması arasında heç bir ziddiyyət yoxdur. Hz. Nizaminin sözləri ilə desək, hz. Məhəmməd (s.a.s.) uca Allahdan (c.c.) «kamal fərmanı» almış müəllimdir. Qurani-Kərim hz.Məhəmmədi (s.a.s.) «Hadi» (doğru yolu göstərən), «Nur» (insanları mənəvi qaranlıqdan qurtaran bir nemət), «Safiullah» (ən mükəmməl insan), «Sirac» (sönməyən, əbədi yanan çıraq), «Alim», «müəllim» adlandırır.**

Uca Allah Qurani-Kərimdə «ümmi» Peyğəmbərinə verdiklərini belə anladır:

وَلَوْلاَ فَضْلُ اللّهِ عَلَيْكَ وَرَحْمَتُهُ لَهَمَّت طَّآئِفَةٌ مُّنْهُمْ أَن يُضِلُّوكَ وَمَا يُضِلُّونَ إِلاُّ أَنفُسَهُمْ وَمَا يَضُرُّونَكَ مِن شَيْءٍ وَأَنزَلَ اللّهُ عَلَيْكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَعَلَّمَكَ مَا لَمْ تَكُنْ تَعْلَمُ وَكَانَ فَضْلُ اللّهِ عَلَيْكَ عَظِيماً

(Nisa, 4/113)

«Allahın lütf və rəhməti üzərində olmasaydı, onlardan bir qrup səni belə hökmdə haqdan çaşdırmağı planlaşdırmışdılar. Halbuki, onlar yalnız özlərini çaşdırırlar, sənə heç bir zərər verə bilməzlər. Necə edə bilərlər ki, Allah sənə kitab və hikməti endirməkdə və bilmədiklərini sənə bildirməkdədir. Həm də Allahın sənin üzərində olan lütfü çox böyükdür».

قُلْ إِنَّمَا أَنَا بَشَرٌ مِّثْلُكُمْ يُوحَى إِلَيَّ أَنَّمَا إِلَهُكُمْ إِلَهٌ وَاحِدٌ فَاسْتَقِيمُوا إِلَيْهِ وَاسْتَغْفِرُوهُ وَوَيْلٌ لِّلْمُشْرِكِينَ

(Fussilət, 41/6)

«De ki: mən sırf sizin kimi bir bəşərəm. Ancaq mənə ilahınızın bir tək ilah olduğu vəhy edilir. Elə isə artıq ancaq

ona yönəlin. Onun bağışlamasını istəyin. Vay müşriklərin halına».

## DİVAN ƏDƏBİYYATINDA PEYĞƏMBƏRİN ÜMMİLİYİNİN TƏQDİMİ

Hz. Məhəmmədin (s.a.s.) ümmi olması divan ədəbiyyatında da çeşidli yönlərdən açıqlanmışdır. Divan şairləri «ümmi» qavramının «anadan olduğu kimi qalan», «tər-təmiz» anlamından çıxış edərək bu anlayışın işığında hz.Məhəmmədi (s.a.s.) şərh etmişlər. **Onlara görə hz. Məhəmməd (s.a.s.) ümmi olan alimdir. Bu ad onun Peyğəmbərliyinin dəlilidir, əslində, ümmilikdə alimlik bir möcüzədir.** «Natlarda Onun okuyup yazmadığı halde Lövhi-Mahfuzda yazılı ilahi ilimlere vakif olduğu, yazı tahtasıyla kaleminin Levhi-Mahfuz ve kalem olduğu, qayıb kitabını talim edilmeden ezberledigi, ümmi olmasına rağmen, sözlerinin Kitabullah olan Kurani-Kerim oluşu, ümmül-kitab da denilen Kurani-Kerim mucizesiyle asırlardır nice alim, şairi, belaqat ehlini aciz bıraktığı, kendisine ümmi, deyilmesine rağmen, arif və ümmül-maarif olan peyğamberin tek öyreticisinin cenabı-Hak oluşu dile getirilir».[254]

**Şeyxi:**
Rahmen ikən müallimün Ümm, kodun adun,
Sultan iken dü kevne kabacendürür aba.[255]
(Müəllimin Rəhman (Allah) ikən adını ümmi qoydun.
İki dünyada sultan olduğun halda əba geyinirsən)

**Yəhya Bəy:**
Ulumi-aleme allam u vakif,
Adı Ümmi, vəli Ümmül-Maarif.[256]

---

[254] Emine Yeniterzi, göstərilən qaynaq, s. 201.
[255] Emine Yeniterzi, göstərilən qaynaq, s. 201.

(Aləmlərin elmlərini bilirsən. Adın «Ümmi»dir,
ancaq maarifin anasısan)

**Nəccarzadə Rıza:**
Alim – Ümmi lakab gencine-i Ümmül – Kitab,
Oldı her nutkında mahfi bir kitab-i müstətab.[257]
(«Ümmi» ləqəbli alimsən, Kitabların anasının
xəzinəsisən. Hər nitqində bir kitab gizli oldu).

**Ziya Paşa:**
Ümmidir egerçi ol melek-hu,
İlmiyle cihanı kıldı memlu.[258]
(O mələyin adı «Ümmi» olsa da, elmi ilə cahanı
əhatə etdi)

Ümmi kı şeriatinde taban,
Ahkam-i hukuk-i nevi-insan.[259]
(Elə bir ummidir ki, onun şəriətində insan üçün
hüquqi ehkamlar var)

## ONUN FƏSAHƏTLİ DİLİ ÜRƏKLƏRİ OXŞAYIRDI

Hz.Nizami onuncu beytin birinci misrasında hz. Mə həmmədin (s.a.s.) «ümmi» olduğunu onun «fəsahətli diliylə» birgə vurğulayıb. Şair deyir ki, o, ümmidir, ancaq gözəl danışıq qabiliyyəti var.

Hz.Nizaminin «ümmiliyi» «fəsahətli dillə» birgə təqdim etməsinin iki səbəbi var. Şair öncə hz.Məhəmmədin (s.a.s.) ümmiliyini adi insanların ümmiliyindən ayırır. Misradakı «fəsahətli dil» anlayışı onun elmli olduğuna işarə edir. Adətən gözəl danışmaq elmli olmaq əlaməti sayılır.

---

256 Emine Yeniterzi, göstərilən qaynaq, s. 201.
257 Emine Yeniterzi, göstərilən qaynaq, s. 201.
258 Emine Yeniterzi, göstərilən qaynaq, s. 201.
259 Emine Yeniterzi, göstərilən qaynaq, s. 201.

Misrada «fəsahətli dil» «oxumaq, yazmaq» anlayışının alternativdir, onu əvəz edir. Elmli olmağın bir göstəricisi oxumaq, yazmaqdırsa, biri də gözəl danışmaqdır.

Misradakı «fəsahətli dil» anlayışı onun elminin oxumaq, yazmaq yolu ilə deyil, vəhy yolu ilə alındığına da işarə edir. Vəhy ona pıçıltı ilə gəldi, o da aldıqlarını gözəl bir dillə çatdırdı.

Misradakı «fəsahətli dil» anlayışı Quranın bəlağətinə də işarə edir, gözəl danışmağın önəminə də diqqəti çəkir. Hz. Nizami «fəsahətli dil» ifadəsi ilə gerçəyi deyir, hz. Məhəmmədə (s.a.s.) yönələcək hücumları zərərsizləşdirir.

Hz. Nizaminin beytin birinci misrasında «fəsahətli dil» deyimi ilə işarə etdiyi ikinci məsələ hz.Məhəmmədin (s.a.s.) gözəl danışığının olmasıdır. «Fəsahətli dil» doğru danışmağı, yerində danışmağı, nitq mədəniyyətinin bütün ölçülərinə cavab verən gözəl, inandırıcı danışıq üslubunu nəzərdə tutur.

Qaynaqlarda hz.Məhəmmədin (s.a.s.) fəsahətli dilinin çoxsaylı örnəkləri var. Hz.Məhəmməd (s.a.s.) ünsiyyətdə olacağı adamların yanına gedərkən təmiz, səliqəli geyinərdi.

İbnü Sad bildirir ki, Rəsulullahın iki parçadan ibarət olan geyimi var idi. Xirqəsi Yəmən, alt qismdə geyilənlər isə Omman işi idi. O, Ommandan gətirilmiş paltarı cümə və bayramlarda geyinər, sonra isə adi paltarında gəzərdi.[260]

Ancaq Peyğəmbər xitabət üçün ayrıca bir paltar seçməmişdir. Hz.Məhəmməd (s.a.s.) bir hədisində belə buyurur: «Tapa bilən bir kimsə iş paltarından başqa Cümə günü üçün bir paltar əldə etsə, nə zərəri olur».[261]

Hz.Məhəmmədin (s.a.s.) saçı qulağına, bir sıra hallarda isə çiyinlərinədək tökülmüş, o, saç-saqqalını səliqəli

---

[260] Ahmet Lütfi Kazançı, Peyğamber efendimizin hitabeti, İstanbul, 1980, s. 44.
[261] Ahmet Lütfi Kazançı, Peyğamber efendimizin hitabeti, İstanbul, 1980, s. 44.

saxlamışdır. O, başına sarıq sarıyar, gözəl ətirdən istifadə edərdi.[262]

Hz.Məhəmməd (s.a.s.) minbərdə danışarkən əlində əsa, hərb meydanında danışarkən isə yay tutmuşdur, onlara söykənmişdir.[263]

Hz.Məhəmmədin (s.a.s.) gözəl görünüşü, səsinin tonu, incəliyi hər zaman dinləyənlərə təsir etmişdir. Qurani-Kərim də hz.Məhəmmədin (s.a.s.) insanlarla yumşaq davrandığını, onlarla gözəl danışdığını öyür:

فَبِمَا رَحْمَةٍ مِّنَ اللّهِ لِنتَ لَهُمْ وَلَوْ كُنتَ فَظّاً غَلِيظَ الْقَلْبِ لاَنفَضُّواْ مِنْ حَوْلِكَ فَاعْفُ عَنْهُمْ وَاسْتَغْفِرْ لَهُمْ وَشَاوِرْهُمْ فِي الأَمْرِ فَإِذَا عَزَمْتَ فَتَوَكَّلْ عَلَى اللّهِ إِنَّ اللّهَ يُحِبُّ الْمُتَوَكِّلِينَ

(Ali-İmran, 3/159)

«(Ey Rəsulum!) Allahın mərhəməti səbəbinə sən onlarla yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq sən onları əfv et, onlar üçün bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən, Allah təvəkkül edənləri sevər!».

Hz.Məhəmməd (s.a.s.) dinləyicilərin dinləmək istədikləri vaxtı doğru təsbit edər, səs tonunu doğru seçərdi, dinləyicinin sayına və mövzuya görə səsinin tonu dəyişərdi. O, danışanda ayağa qalxmış, hündür bir yerə çıxmışdır.

Abdullah b. Ömər rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Şanı uca Allah qiyamət günü göyləri toplayıb yığar, sonra sağ əlinə alar: «Məlik mənəm. Haradadır cabbarlar, haradadır özündən razı olanlar?», - deyər. Sonra yerləri sol əlində toplayıb bükərək deyər: «Məlik mənəm. Haradadır

---

[262] Ahmet Lütfi Kazançı, Peyğamber efendimizin hitabeti, İstanbul, 1980, s. 44.
[263] Ahmet Lütfi Kazançı, Peyğamber efendimizin hitabeti, İstanbul, 1980, s. 45.

cabbarlar, haradadır özündən razı olanlar?». Rəsulullah (s.a.s.) bunları söyləyərkən barmaqlarını açıb yığır, «Məlik mənəm…» deyərək anladırdı. Minbərə baxdım. Minbər kökündən sarsılmaqda idi. O dərəcədə ki, Rəsulullah (s.a.s.) ilə birlikdə minbər devriləcək deyə qorxmağa başladım».[264]

Hz.Məhəmməd (s.a.s.) danışarkən jestlərdən də istifadə etmişdir. «Mömin başqa mömin üçün bir-birinə dəstək olan bir bina kimidir», deyərkən barmaqlarını bir-birinə keçirmiş,[265] «Mən qiyamət ilə sizin aranızda bu qədər məsafə qaldığı bir zamanda nübüvvət vəzifəsi ilə göndərildim», deyərkən şəhadət barmağı ilə orta barmağının arasını yüngülcə açaraq göstərmiş, «Ay belə, belə, belədir», deyərkən iki əlinin on barmağını göstərib üç işarə ilə ayın otuz gün olduğunu anlatmışdır. Hz.Məhəmməd (s.a.s.) Muaz b. Cəbələ nəsihət verərkən dilini əli ilə tutaraq: «Bunu qoru», demiş, «Cənnət qapısının halqasını ilk dəfə tutan və çalan mən olacağam», deyərkən əli ilə bir qapı halqasını tutub çalar kimi etmişdir.[266]

Hz.Məhəmməd (s.a.s.) danışarkən mimikadan da istifadə etmişdir. Kab b. Malik deyir ki, Rəsulullah (s.a.s.) sevindiyi zaman üzü nurlanır, sanki ay parçası olurdu. Biz onun bu durumunu anlardıq.

Enes b. Malik anladır ki, pis bir şey gördüyü zaman xoşlanmadığını sözə başlamadan öncə üzündən anlardıq.[267]

Hz.Məhəmməd (s.a.s.) danışarkən çox zaman baxışlarını göy üzünə çevirmişdir. O, oturaraq, ayaq üstə, xurma kötüyünə söykənərək, kürsüdə danışmışdır. Onun danışığında yeri gəldikcə həyəcana, qorxuya yer verilmişdir.

---

[264] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 49.
[265] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 51.
[266] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 51.
[267] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 51.

O, ciddi bir mövzunu belə anladır: «Mənimlə insanların halı od qalayan bir kimsənin halına bənzər. Atəş yanıb ətrafını parlatdığı zaman pərvanələr və başqa həşərat atəşə atılmağa başlarlar. Adam onları uzaqlaşdırmağa çalışır. Ancaq onlar adama qalib gəlirlər və atəşə atılırlar. Mən sizi atəşdən çəkə bilmək üçün kəmərlərinizdən tutub asılıram… «buraya gəlin, atəşdən qurtulun, buraya gəlin, atəşdən qurtulun» deyirəm, siz isə əlimdən qurtulub ona atılmaqdasınız».[268]

Hz. Məhəmmədin (s.a.s.) nitq mədəniyyətinin əsasını səmimiyyət, hədəf aydınlığı, inanc, doğruya bağlılıq, bilgi vermək, suallara açıq olmaq, üz tutduğu auditoriyanı tanımaq, söz ilə əməl birliyi, etimad, dilə hakim olmaq, dinləməyi bacarmaq, cəsarət, gözəl əxlaq təşkil edir.

O, hər zaman səmimi olmağı üstün tutmuşdur. Qiyamətlə bağlı sual soruşulanda «Bu məsələdə sorulan sorandan daha bilikli deyildir», «Mən bu təbliğ vəzifəmdən dolayı sizdən bir maaş gözləmirəm. Mənim mükafatım aləmlərin Rəbbi olan Allaha aiddir», deməyi bacarmış, yalançı sözləri tənqid etmişdir: «İnəyin gövşəməsi kimi dilini sağa, sola çevirərək bəlağət göstərənlərə Allah lənət edər».[269]

Hz.Məhəmmədin (s.a.s.) hər çıxışının, söhbətinin dəqiq, ölçülüb-biçilmiş hədəfi olmuşdur. O, müraciət etdiyi, üz tutduğu ünvanı dəqiq tanımış, onun ehtiyacını bilmiş və bu ehtiyaca uyğun cavab vermişdir. Məsələn, «Əməllərin ən fəzilətlisi hansıdır?», sualına soruşanın durumuna görə: «Az da olsa, davamlı olanıdır», «Allah üçün sevmək, Allah üçün sevməməkdir», «Oruca davam et, çünki bənzəri olmayan bir ibadətdir» kimi fərqli cavablar vermişdir. [270]

---

[268] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 63.
[269] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 74.
[270] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 87.

Fəsahətli danışan şəxsin kimliyi də önəmlidir. Hz. Məhəmməd (s.a.s.) doğru danışan, sədaqətli bir insan olduğundan bir kimsə onu yalançılıqda ittiham edə bilməmişdir. Quran da onun bu özəlliyinə işarə edir:

قَدْ نَعْلَمُ إِنَّهُ لَيَحْزُنُكَ الَّذِي يَقُولُونَ فَإِنَّهُمْ لاَ يُكَذِّبُونَكَ وَلَكِنَّ الظَّالِمِينَ بِآيَاتِ اللّهِ يَجْحَدُونَ

(Ənam, 6/33)

«Bilirik ki, onların (Quran barəsində) dedikəri söz səni çox kədərləndirir. Həqiqətdə isə onlar səni yalançı hesab etmirlər. Ancaq o zalımlar Allahın ayələrini inadla inkar edirlər».

Hz.Məhəmməd (s.a.s.) danışarkən dilə hakim olmuş, hər sözü ölçüb-biçmiş, danışanı da dinləməyi bacarmışdır.

Hz.Məhəmmədin (s.a.s.) danışıq üslubu da son dərəcə gözəl olmuşdur. O bu məsələdə də ilahi buyruğa uymuşdur:

أَمْ لَهُمْ نَصِيبٌ مِّنَ الْمُلْكِ فَإِذاً لاَّ يُؤْتُونَ النَّاسَ نَقِيرا

(Nisa, 4/53)

«Yoxsa onların mülkdən bir payı var? Əgər belə olsaydı, onlar insanlara xurma çərdəyinin bir tumurcuğunu belə verməzdilər».

**Onun fəsahətli dilinin prinsipləri bunlardır: az söz danışmaq, az sözlə çox məna ifadə etmək, sözləri diqqətlə seçmək.** Əbu Hureyrədən (r.a.) belə rəvayət edilir: «Hz.Məhəmməd (s.a.s.) belə buyurdu: «İnsan heç əhəmiyyət vermədən bir kəlmə söylər, o söz səbəbiylə cəhənnəmdə yetmiş il sürəcək olan dərin bir çuxura yuvarlanar».[271]

Başqa bir hədisdə hz.Məhəmməd (s.a.s.) belə buyurur: «Sizdən biri «qulum» deyə xitab etməsin. Çünki hamınız Allahın qulusunuz. Qadınlarınızın hamısı da Allahın

[271] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 113.

cariyələridir. Bu səbəblə köləlәrinizə xitab edərkən «oğlum, qızım, igidim, xanım, qızım» desin. Kölələrə də: «Sizdən biri sahibinə «Rəbbim, Mövlam» deməsin, çünki, sizin Rəbbiniz, Mövlanınız Allahdır. Bunun yerinə «böyüyüm» (əfəndim) desin».[272]

Hz.Məhəmməd (s.a.s.) danışarkən sözləri dənə-dənə, bir-bir demişdir. «Rəsulullah (s.a.s.) sözlərini dənə-dənə söylərdi. Belə ki kəlmələrini saymaq istəyən bir kimsə saya bilərdi».[273]

Hz.Məhəmməd (s.a.s.) az danışmağa üstünlük vermişdir: «Az danışmağın, sözü uzatmamağın faydalı olacağı qənaətinə vardım. Çünki qısa-az söz faydalıdır», «Kişinin namazının uzun, xütbəsinin qısa olması bilgi və anlayışının əlamətidir. O halda namazı uzadın, xütbəni qısa edin. Heç şübhə yox ki, bəyanda qəlblərə işləyən bir qüvvət vardır», «Biz az sözlü kimsələrik».[274]

Hz.Məhəmmədin (s.a.s.) yazdıraraq göndərdiyi müraciətlər də çox təsirlidir. Onun Rum məliki Herakla göndərdiyi məktubu oxuyaq:

«Rəhman və Rəhim olan Allahın adıyla. Allahıq qulu və Rəsulu Məhəmməddən Rumun böyüyü Herakla: Salam hidayətə tabe olanadır.

Mən səni İslam davasına çağırıram. Müsəlman ol, qurtularsan. Allah da əcrini, mükafatını iki qat olaraq verər. Üz çevirib, iman etməsən, yurdundakı əkinçilərin günahı sənə aiddir. «Ey əhli-kitab, gəlin aramızda bərabər olan bir kəlmə üzərində birləşək. Allahdan başqasına ibadət etməyək. Ona heç bir şeyi ortaq qoşmayaq. Bir qismimiz başqa bir

---

[272] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 113.
[273] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 109.
[274] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 109.

qismini Allahdan ayrı olaraq «rəbblər» deyə qəbul etməsin… Əgər üz çevirərlərsə, deyin ki, şahid olun biz müsəlman kimsələrik».[275]

Hz.Məhəmmədin (s.a.s.) «fəsahətli dili»ndə gözəl müraciət etiketləri də var. O, insanlara adı ilə, atasının adı ilə, ləqəbləriylə, «ey Adəm oğlu», «ey Allahın qulları», «ey insanlar», «ey Məhəmmədin ümməti», «ey müsəlman xanımlar», «ey qadınlar qrupu», «ey gənclər» kimi ümumi ifadələrlə müraciət etmişdir. O, bir sıra hallarda insanlara peşələri və hallarına uyğun bir biçimdə müraciət etmişdir. Məsələn: «ey xəndək əhli», «ey tüccarlar», «ey dili ilə müsəlman olan və qəlbinə iman işləməyənlər topluluğu». Hz. Məhəmməd (s.a.s.) insanları eləcə də bağlı olduqları qəbilə adları, ya da qohumluq əlaqələri ilə çağırmışdır. Məsələn: «ey nəccar oğulları», «ey Rəsulullahın əmisi», «ey Rəsulullahın xalası, qızı».[276]

Hz.Məhəmmədin (s.a.s.) «fəsahətli dili» ilə bağlı hər zaman gözəl sözlər söylənmişdir. Cahiz: «Rəsulullah (s.a.s.) bəlağətə ehtiyac duyarsa, bəlağət əhlinin ən üstünü, xitabətə lüzum olarsa, xətiblərin ən böyüyü olardu».[277]

İbnül-Kayyum əl- Cevziyye: «Rəsulullah (s.a.s.) xalqın ən fasihi, sözü ən gözəl, danışığı ən rahat, dili ən dadlı olanı idi. O dərəcədə ki, onun sözü qəlblərə hakim olur, ruhlara işlərdi. Buna düşmənləri belə şahid olurdu. Danışdığı zaman açıq danışır, kəlmələri saymaq istəyən saya bilərdi. Bununla bərabər o, nə ağılda tutulması mümkün olmayan bir tələskənin aldadıcı sözləri, nə də kəlamının arasına fasilələrin

---

[275] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 276.
[276] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 276.
[277] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 144.

yerləşdiyi sözlərdir. Gerçək budur ki, onun yolu ən gözəl danışma yolunun özüdür».[278]

Əl-Əbraşi: «O hər qəbiləyə öz ləhcəsi ilə müraciət edər, onların məhəlli dil və ləhcəsi ilə danışardı».[279]

Cahiz: «… Geniş danışılacaq yerlərdə geniş ibarələrlə danışmış, az söz gərəkən yerlərdə isə az sözlə kifayətlənmişdir. Az işlənən yad kəlmələri tərk etmiş, küçə ağzı ilə danışmaqdan uzaq olmuşdur. Mütləq bir hikmətə bağlı olan sözü söyləmiş, ismət vəsfinin və ilahi dəstəyin əhatə etdiyi, ilahi yardımın asanlıq verdiyi bir kəlamdan başqasını danışmamışdır. O, Allahın sevgi qatdığı, məqbul olunmaq pərdəsini örtdüyü, dadlılıqla heybət sifətini bir araya gətirdiyi, az ancaq anlaşılır məna halına gətirdiyi sözdür. Təkrarlamağa, ya da dinləyicinin təkrarlama istəyinə möhtac olmadığı bir kəlməsinin belə yersiz düşmədiyi, mükəmməl tələffüz edilmiş, dəlili çürüməmiş, heç bir düşmənin qarşısında dura bilmədiyi, heç bir xətibin susdura bilmədiyi sözdür. Rəsulullah (s.a.s.) uzun xütbələrə qısa sözlərlə qarşılıq verir, ancaq haqq və gerçək olanı dəlil gətirir, aldatma yoluna girmir, qaş-göz işarəti etmir (qarşısındakını ələ salmır), cavab vermək üçün gecikmədiyi kimi, tələsmir, nə usandırır, nə də sözü anlamayacaq qədər qısaldır. Heç kimsə ondan daha faydalı, daha mötədil, daha oturaqlı bir söz eşitməmişdir».[280]

«Rəsulullahın kəlamı lüzumsuz və batil olan hər şeydən uzaqdır. Onun sözü ya Quranı açıqlamaq, ya bir hökmü təsdiq, ya bir xeyir işə dəlalət, ya da bir şeyə nifrət hissi yaratmaq üçün, ya da insanların dini və dünyəvi fayda tapacağı bir hikməti ifadə etməklə bağlı idi. Üstəlik fəsahət, ecaz, bəyan xüsusunda Qurandan sonra ikinci sıranı tutan gözəl bir ibarə ilə dilə gətirmişdir».[281]

---

[278] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 145.
[279] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 145.
[280] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 145.
[281] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 145.

Tomas Qarliyle: «Rəsulullah (s.a.s.) etdiyi hər işdə, söylədiyi hər sözdə və düşündüyü hər şeydə ixlasın, haqqa bağlılığın və ədalətin bir örnəyi idi. Daima düşünən, sükutu sevən, ehtiyac olmadıqca danışmayan bir insan idi. Danışdığı hikmət, düşündüyü doğru və tam mənasıyla səmimi idi».[282]

Əl-Akkad: «Rəsulullah (s.a.s.)ın bəyan tərzini anlatmaq üçün söylənən sözlərin ən doğrusu, həndəsə alimlərinin «düz xətt» anlayışı üçün söylədiyi bu tərif olmalıdır: iki nöqtəni birləşdirən ən yaxın və qısa yol. Məqsədi bəyan üçün Rəsulullahın üslubundan daha qısa və doğru bir üslub yoxdur. Bir kəlam ki, onda məcburiyyət yox, anlaşılması çətin ifadə yox, kənarda, köşədə qalmış qərib kəlmədən istifadə etmək zövqü yox. …Sözlərinin tamamında da, dinləyiciyə yad görünən, bilinməyən, açıqlama, təkrar etdirmə ehtiyacını hiss etdirəcək bir cəhət yox. Bunun sirri isə Rəsulullahın dinləyənə təbliğ məqsədini daşıması, özü ilə dinləyən arasına yad bir söz, yad bir məna girməsini əsla arzu etməməsidir. Rəsulullahın (s.a.s.) kəlamını üç dəfə təkrarlaması bundandır. Zorakı bir üslubu gerçəkləşdirməkdən və bəlağətiylə öyünməkdən nifrət etməsi də yenə buna görədir».[283]

Hz. Məhəmmədin (s.a.s.) «fəsahətli dili»nin təsir gücünü onun mübarək hədisləri ilə göstərək. Əbu Məcih İrbaz ibni Sariyə (r.a.) belə dedi: «Rəsulullah (s.a.s.) bizə çox təsirli bir öyüd verdi. Bu öyüddən dolayı qəlblər ürpərdi, gözlər yaşardı. Bizlər:

- Ey Allahın Rəsulu! Bu öyüd sanki ayrılmaq üzərə olan birinin öyüdünə bənzəyir, barı bizə bir tövsiyə ver.

Rəsulullah (s.a.s.):

---

[282] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 146.
[283] Ahmet Lütfi Kazançı, göstərilən qaynaq, s. 146.

- Sizə, Allaha çox sayğı duymanızı, başınıza bir həbəşli kölə belə əmir olsa, onu dinləyib itaət etməyinizi tövsiyə edirəm. Məndən sonra sağ qalıb uzun bir həyat sürənlər çox ixtilaflar görəcəklər. O zaman sizin üzərinizə düşən mənim sünnətimə və doğru yolda olan dörd xəlifənin sünnətinə sarılmanızdır. Bu sünnətlərə sıx sarılın. Sonralar ortaya çıxarılmış bidətlərdən şiddətlə qaçın. Çünki, hər bidət dəlalətdir, sapıqlıqdır, buyurdu».[284]

Hz.Aişə (r.a.) belə buyurdu: «Rəsulullahın (s.a.s.) danışığı hər kəsin anlayacağı şəkildə açıq idi».[285]

Hz.Aişə (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) sizin etdiyiniz kimi tez-tez danışaraq sözlərini arxa-arxaya calamazdı».[286]

Hz.Enes (r.a.) buyurur: «Peyğəmbər (s.a.s.) sözünün yaxşı anlaşılması üçün sözünü üç dəfə təkrar edərdi. Bir topluluğun yanına varıb onları salamlayacağı zaman üç dəfə salam verirdi».[287]

Əbu Vail Şakik ibni Sələmə belə buyurur: «İbn Məsud (r.a.) bizə pərşənbə günləri vəz edərdi. Adamın biri ona:

- Əbu Aburrahman! Kaş bizə hər gün vəz edəsən.

İbn Məsud ona bunları söylədi:

- Sizi usandırmamaq üçün hər gün vəz etmirəm. Rəsulullah (s.a.s.) da yorulub bezməyəsiniz deyə, dinləməyə istəkli olduğunuz günləri seçərdi».[288]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Allah gözəl səsli bir Peyğəmbərin Quranı

---

[284] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 553-554.
[285] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 118.
[286] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 118.
[287] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 117 .
[288] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 124.

avazla, yüksək səslə oxumasından xoşnud olduğu qədər heç bir şeydən məmnun olmamışdır».[289]

Əbu Musa əl-Əşari (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Şübhəsiz, Davuda verilən gözəl səslərdən bir nəğmə də sənə verilmişdir».[290]

Bəra ibni Azib (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) yatsı namazında «Vət-tini vəz-zeytuni» surəsini oxuyarkən dinlədim. Ondan daha gözəl səsli bir kimsə eşitmədim».[291]

İbn Ömər (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s) belə buyurdu: «Allahı anmadan çox danışmayın. Allahı zikr etmək dışında çox söz söyləmək qəlbi qatılaşdırır. Sərt qəlbli olanların isə Allahdan ən uzaq kimsələr olduğu qətidir».[292]

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə buyurdu: «İnsan oyananda bütün orqanları dilə baş vurur və ona belə deyirlər: bizim haqqlarımızı qorumaqda Allahdan qorx. Biz ancaq sənin söylədiklərinə görə cəza görürük. Biz sənə bağlıyıq. Əgər sən doğru olsan, biz də doğru oluruq. Əgər sən əyilər, yoldan çıxarsan, biz də sənə uyar, sənin kimi oluruq».[293]

Bu deyilənlərin işığında hz. Nizaminin hz. Məhəmmədi (s.a.s.) «fəsahətli dili olan ümmi» adlandırmasının səbəbi tam aydın olur. Bəlli olur ki, bu dəyərləndirmə sadəcə sevgidən doğan bir öygü deyil, gerçək qaynaqları olan və Allahın (c.c.) Peyğəmbərinə verdiyi bir nemətdir. Allahın bu iki neməti («fəsahətli dil» və «ümmi olmaq») hz.Məhəmmədi (s.a.s.) gücləndirir. «Ümmi olmaq» onun peyğəmbərliyinin dəlilinə çevrilir, «fəsahətli dil» isə ilahi elmə sahib olduğuna işarə edir

---

[289] Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 117.
[290] Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 119.
[291] Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 121.
[292] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 445.
[293] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 449.

və təbliğ vəzifəsini gerçəkləşdirməyə yol açır. Biz bu gün deyə bilərik ki, hz.Məhəmmədin (s.a.s.) «fəsahətli dili» nitq mədəniyyəti anlayışının bütün tələblərinə uyğundur və Quranın bənzərsiz üslubundan yaranmışdır.

Hz.Nizami beytin ikinci misrasında hz.Məhəmmədin (s.a.s.) müqayisə obyektlərini seçir. Şair bu dəfə hz.Məsihlə (s.a.s.) bərabər hz.Adəmi (s.a.s.) də müqayisə tərəfinə çevirir. Şair bu beytdə də «əlif» və «mim» hərflərindən yararlanır. Ancaq şair bu misrada «əlif» və «mim»i başqa anlamda dəyərləndirir.

Biz ötən beytin şərhində hz.İsanın (s.a.s.) din tarixində, ayrıca olaraq İslam dinindəki yerini açıqladıq. Onuncu beytin mətnindən göründüyü kimi, şair hz.Adəmin (s.a.s.) də adını bir müqayisə tərəfi kimi çəkir. Beytin birinci misrasında, müqayisənin birinci tərəfində «fəsahətli dili» olan, «ümmi» hz.Məhəmməd (s.a.s.), ikinci misrasında, müqayisənin ikinci tərəfində isə hz.Adəm (s.a.s.) və hz.Məsih (s.a.s.) var. Deməli, şair bu beytdə hz. Məhəmmədin (s.a.s.) «ümmi» olmasını şərh etmək məqsədilə iki peyğəmbərin adını çəkib. Şair birinci misrada «fəsahətli dil» anlayışı ilə «ümmilik» məsələsinin çərçivəsini cızır, hz.Məhəmmədin (s.a.v) ilahi elm neməti ilə şərəfləndirildiyini, onun müəlliminin uca Allah (c.c.) olduğunu önə çəkir, ikinci beytdə isə bu anlamda onu iki peyğəmbərlə tutuşdurur.

## HƏZRƏT ADƏMİN (s.a.s.) DİNDƏKİ YERİ

Hz.Nizaminin çatdırmaq istədiyi mənanı tam qavramaq üçün hz.Adəmin (s.a.s.) dindəki yerinə baxaq. O, ilk yaradılmış insandır, o, ilk peyğəmbərdir, o, ilk cənnətə daxil ediləndir, o, cənnətdən çıxarılandır, o, insanların ulu atasıdır, o, xəta edəndir, o, tövbə edəndir, o, tövbəsi qəbul olunandır.

Uca Allah (c.c.), hz.Adəm (s.a.s.) adı ilə çox məsələləri insanlara anlatmışdır. Sırası ilə bu məsələlərə baxaq.

Uca Allah Quranda belə buyurur:

وَإِذْ قَالَ رَبُّكَ لِلْمَلاَئِكَةِ إِنِّي جَاعِلٌ فِي الأَرْضِ خَلِيفَةً قَالُواْ أَتَجْعَلُ فِيهَا مَن يُفْسِدُ فِيهَا وَيَسْفِكُ الدِّمَاء وَنَحْنُ نُسَبِّحُ بِحَمْدِكَ وَنُقَدِّسُ لَكَ قَالَ إِنِّي أَعْلَمُ مَا لاَ تَعْلَمُونَ وَعَلَّمَ آدَمَ الأَسْمَاء كُلَّهَا ثُمَّ عَرَضَهُمْ عَلَى الْمَلاَئِكَةِ فَقَالَ أَنبِئُونِي بِأَسْمَاء هَـؤُلاء إِن كُنتُمْ صَادِقِينَ . قَالُواْ سُبْحَانَكَ لاَ عِلْمَ لَنَا إِلاَّ مَا عَلَّمْتَنَا إِنَّكَ أَنتَ الْعَلِيمُ الْحَكِيمُ .قَالَ يَا آدَمُ أَنبِئْهُم بِأَسْمَآئِهِمْ فَلَمَّا أَنبَأَهُمْ بِأَسْمَآئِهِمْ قَالَ أَلَمْ أَقُل لَّكُمْ إِنِّي أَعْلَمُ غَيْبَ السَّمَاوَاتِ وَالأَرْضِ وَأَعْلَمُ مَا تُبْدُونَ وَمَا كُنتُمْ تَكْتُمُونَ . وَإِذْ قُلْنَا لِلْمَلاَئِكَةِ اسْجُدُواْ لآدَمَ فَسَجَدُواْ إِلاَّ إِبْلِيسَ أَبَى وَاسْتَكْبَرَ وَكَانَ مِنَ الْكَافِرِينَ

(Bəqərə, 2/30-34)

«Və düşün ki, Rəbbin mələklərə: «Mən yer üzündə şübhəsiz bir xəlifə seçəcəyəm», dediyi vaxt: «A! … Orada pozğunçuluq çıxaracaq və qanlar tökəcək bir məxluqu yaradacaqsan. Biz həmdinlə təsbih və səni öyüb durarkən!», - dedilər. «Şübhəsiz ki, mən sizin bilməyəcəyiniz şeyləri bilirəm», buyurdu. Və Adəmə bütün isimləri öyrətdi. Sonra o aləmləri mələklərə göstərib, «davanızda doğru isəniz, mənə bunları adları ilə xəbər verin», buyurdu. «Hər şeydən münəzzəhsən, ya Rəbb, bizim üçün sənin bizə bildirdiyindən başqa elm yoxdur (bilmirik). Şübhəsiz ki, hər şeyi bilən, alim və hakim ancaq sənsən», dedilər. Allah: «Ey Adəm, bunlara onları isimləri ilə xəbər ver», buyurdu. Bu əmr üzərinə Adəm onlara adları ilə bunları xəbər verəndə Allah: «Mən sizə göylərin və yerin qeyblərini bilirəm, sizin açıqladığınızı da, gizlədiyinizi də bilirəm deməmişdimmi?», - buyurdu. O zaman mələklərə «Adəm üçün səcdə edin», dedik. Dərhal

səcdə etdilər. Ancaq İblis imtina etdi, qüruruna sığışdırmadı. Onsuz da o, kafirlərdən idi».

Bu ayələrdən aydın görünür ki, qadir Allah (c.c.), Adəmi (s.a.s.) yaradır və ona elm verir, «əşyaların adını öyrədərək» onu mələklərdən üstün edir və mələklərin ona səcdə etməsini, yəni Adəmin (s.a.s.) üstünlüyünü qəbul etmələrini də onun elmi ilə izah edir. Adəm aləmlərdəki əşyaların elmini bilir, o, sizdən üstündür.

«Əşyaların adını bilmək» anlayışı təfsirlərdə insana «fitri olaraq verilmiş mühakimə gücü» kimi də yozulmuşdur. «Bütün dilçilərə görə ad termini «bir maddənin, bir hadisənin, ya da bir keyfiyyətin bilgisini təmsil edir. Fəlsəfi termin olaraq isə ad «qavram»a işarə edir. Buradan hərəkətlə «bütün adların bilgisi» bu anlam içində məntiqi tanıma, yəni qavramlarla düşünmə gücünə dəlalət edir. Burada Adəm bütün bir insan soyunu təmsil edir…»[294]

Deməli, insan qavramlarla düşünmə gücünə görə mələklərdən üstündür. Onun doğru ilə yalan arasında seçim etmək gücü və məsuliyyəti var.

Daha sonra Quran belə buyurur:

وَقُلْنَا يَا آدَمُ اسْكُنْ أَنتَ وَزَوْجُكَ الْجَنَّةَ وَكُلاَ مِنْهَا رَغَداً حَيْثُ شِئْتُمَا وَلاَ تَقْرَبَا هَـذِهِ الشَّجَرَةَ فَتَكُونَا مِنَ الْظَّالِمِينَ . فَأَزَلَّهُمَا الشَّيْطَانُ عَنْهَا فَأَخْرَجَهُمَا مِمَّا كَانَا فِيهِ وَقُلْنَا اهْبِطُواْ بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ وَلَكُمْ فِي الأَرْضِ مُسْتَقَرٌّ وَمَتَاعٌ إِلَى حِينٍ . فَتَلَقَّى آدَمُ مِن رَّبِّهِ كَلِمَاتٍ فَتَابَ عَلَيْهِ إِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ

(Bəqərə, 2/35-37)

«Dedik ki: «Ey Adəm, sən və arvadın cənnətdə oturun, ikiniz də ondan dilədiyiniz yerdə bol-bol yeyin, ancaq bu

[294] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 11-12.

ağaca yaxınlaşmayın, yoxsa həddi aşan zalimlərdən olarsınız». Bunun üzərinə şeytan onları oradan azdırdı. İkisini də içində olduqları cənnətdən çıxartdı. Biz də: «Bəziniz bəzinizə düşmən olaraq enin, sizin üçün orada bəlli bir zamanadək bir qalma yeri və bir qismət vardır», dedik. Adəm Rəbbindən bir sıra bilgilər aldı, Ona yalvardı. O da tövbəsini qəbul edib, ona yenə baxdı. Şübhəsiz ki, O, tövbəni çox qəbul edən, çox bağışlayandır».

Hz.Adəm (s.a.s.) uca Allahın (c.c.) əmanətini qoruya bilmir, qadağan olunmuş meyvədən yeyir və cənnətdən çıxarılır.

Hz.Adəm (s.a.s.) uca Allahın (c.c.) seçdiyi, nemət verdiyi qullarındandır. Ancaq o, xəta etdi, Allahın əmrindən çıxdı, şeytanın «əbədi ağac», «çökməyən bir səltənət» vədləri, yəni tamah və şöhrət duyğusu onu çaşdırdı:

فَأَكَلَا مِنْهَا فَبَدَتْ لَهُمَا سَوْآتُهُمَا وَطَفِقَا يَخْصِفَانِ عَلَيْهِمَا مِن وَرَقِ الْجَنَّةِ وَعَصَى آدَمُ رَبَّهُ فَغَوَى

(Taha, 20/121)

«Bunun üzərinə ikisi də ondan (qadağan olunmuş meyvədən) yedilər. Dərhal onların ayıb yerləri göründü. Üzərilərini cənnət yarpaqları ilə örtməyə başladılar. Adəm Rəbbinin əmrindən çıxdı və çaşdı».

Qurani-Kərimdə uca Allah (c.c.) hz.İsa (s.a.s.) ilə hz.Adəmin (s.a.s.) adını bir arada çəkir:

إِنَّ مَثَلَ عِيسَى عِندَ اللّهِ كَمَثَلِ آدَمَ خَلَقَهُ مِن تُرَابٍ ثِمَّ قَالَ لَهُ كُن فَيَكُونُ

(Ali-İmran, 3/59)

«Allah yanında İsa da Adəm kimidir. Allah onu torpaqdan yaratdı, sonra ona «ol!»,-dedi, o da oldu».

Təfsirçilərə görə, bu ayə hz.İsanı (s.a.s.) ilahiləşdirən xristian doktirinasına qarşıdır. Bu ayə ilə Allah (c.c.),

hz.İsanın (s.a.s.) da hz.Adəm (s.a.s.) kimi torpaqdan yaradıldığını və sonu olduğunu vurğulamışdır.

## YASAQ MEYVƏNİN YOZUMU

Təfsirçilər yasaq meyvəni yedikdən sonra Adəm və Həvvanın «çılpaqlıqlarının fərqinə varmasını» və şeytanın onları aldatmaq üçün istifadə etdiyi «sonsuzluq ağacı»nı da fərqli yönlərdən şərh etmişlər. Bu təfsirlərə görə, Adəm və Həvva yasağa toxunduqdan sonra çılpaq olduqlarını hiss edirlər. Bu simvolik ağac isə Tövratda «həyat ağacı», «yaxşı ilə pisi bilmə ağacı» kimi dəyərləndirilir. Quranda şeytan bu ağacdan «sonsuzluq, ya da əbədi həyat ağacı» kimi danışır. Adəm və Həvva bu yasaq ağacın meyvəsindən daddılar. Ancaq ölümsüzlük qazana bilmədilər. Quran bu ağacla bağlı geniş bilgi vermir, sadəcə olaraq bu ağacı «ölümsüzlük ağacı» adlandıranın şeytan olduğunu vurğulayır. «Buna dayanaraq deyə bilərik ki, yasaq ağac Yaradıcının insanın istək və hərəkətləri üçün qoyduğu sınırları, yəni insanın Allah vergisi öz təbiətini məcbur edib pozmadan aşa bilməyəcəyi sınırları simvollaşdıran bir misaldır. İnsanın yer üzündə əbədiyyət arzu etməsi, heç bir əsası olmadan ölümü, ölümdən sonrakı dirilişi və buna bağlı olaraq da, Quranın «axirət», ya da «başqa dünya» olaraq tanıtdığı gerçəkliyi inkar etməsi deməkdir. Bu arzu, ya da bu həvəs şeytanın «çöküşü olmayan bir gücə, ya da hakimiyyətə» çatmağın, başqa sözlə bütün sınırlandırılmalardan, bu yolla da sonda insan həyatına gerçək anlam və hədəf qazandıran tək Allah qavramından «sıyrılma»nın insanın əlində olduğu məsələsi ilə yaxından bağlıdır».[295]

Bu ayə və təfsirlərdə hz.Adəmin (s.a.s.) gerçək portreti və hz.Adəm (s.a.s.) yolu ilə uca Allahın (c.c.) insanlığa

[295] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 642.

verdiyi ilahi bilgilər var. İnsan Allahın (c.c.) varlığına və birliyinə inanmalı, Allahın (c.c.) buyruqlarını (əmr və yasaqlarını) yerinə yetirməli, əbədi hakimiyyətin Allaha (c.c.) məxsusluğunu anlamalıdır. Bu anlayış insanın fitrəti üzrə yaşaması deməkdir. Pozulan hər bir ilahi yasaq insanı fitrətindən uzaqlaşdırır, bu yolla da insan yaradılış mahiyyətini itirir və ilahi cəzanı özü qazanır.

Hz.Məhəmməd (s.a.s.) hədislərində bir sıra məqsədlərə uyğun olaraq hz. Adəmin (s.a.s.) adını çəkib, onunla bağlı məsələləri aydınlaşdırıb. Bir sıra hədislərə baxaq.

Hz.Məhəmməd (s.a.s.) gözəl salam verməyin və verilən salamı sevgi ilə cavablandırmağın önəmini göstərmək üçün uca Allahın (c.c.) hz.Adəmə (s.a.s.) salamlaşmağı necə öyrətdiyini şərh edib. Bilindiyi kimi, Qurani-Kərimdə də salamlaşma biçimi ayə ilə təsbit olunmuşdur:

وَإِذَا حُيِّيْتُم بِتَحِيَّةٍ فَحَيُّواْ بِأَحْسَنَ مِنْهَا أَوْ رُدُّوهَا إِنَّ اللّهَ كَانَ عَلَى كُلِّ شَيْءٍ حَسِيباً

«Sizə salam verildiyi zaman onu daha gözəl alın, ya da (eyni ilə sahibinə) qaytarın! Şübhəsiz, Allah hər şeyi hesaba alandır».

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə dedi: «Uca Allah Adəmi (s.a.s.) yaradanda ona: - Get, mələklərə salam ver və sənin salamına necə qarşılıq verəcəklərini də gözəl dinlə. Çünki sənin və sənin uşaqlarının salamı o olacaq.

Adəm (s.a.s.):

- Əs-Səlamü əleyküm, dedi.

Mələklər:

- Əs-Səlamü əleykə və rəhmətullah, deyərək qarşılıq verdilər. Onun salamına «və rəhmətullahi» əlavə etdilər».[296]

---

[296] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 410-411.

Bu hədisdə hz.Məhəmməd (s.a.s.) salamın ilkliyini, önəmini hz.Adəmin (s.a.s.) ilkliyi ilə anladır. Deməli, insanlararası münasibətdə salamın ayrıca yeri var.

Hz.Məhəmmədin (s.a.s.) hədislərindən hz.Adəmin (s.a.s.) şəfaət haqqının olmadığı bilinir.

Hz.Məhəmməd (s.a.s.) bir hədisində Dəccalın necə böyük bir təhlükə olduğunu göstərmək üçün hz.Adəmin (s.a.s.) adından yararlanır. İmran İbni Husayn (r.a.) Rəsulullahın (s.a.s.) belə dediyini eşitdiyini söyləyir: «Hz.Adəmin yaradıldığı zamandan qiyamətin qopacağı ana qədər Dəccaldan daha böyük bir fitnə yoxdur».[297]

Hz.Məhəmməd (s.a.s.) bir sıra hədislərində hz. Adəmin (s.a.s.) yaradılışını şərh edib. Əbu Hureyrə (r.a.) rəvayət edir: «Bir gün Rəsulullah (s.a.s.) əlimi tutaraq belə buyurdu: Allah torpağı cuma ertəsi günü yaratdı. Oradakı dağları bazar günü, ağacları bazar ertəsi günü, sevilməyən şeyləri ikinci gün, nuru çərşənbə günü yaratdı. Heyvanları yer üzünə pərşənbə günü yayıb dağıtdı. Adəmi yaradılanların sonuncusu olaraq cümə gününün son saatlarında, axşamüstü ilə axşam arasında yaratdı».[298]

Bu hədisdə hz.Məhəmməd (s.a.s.) hz.Adəmin (s.a.s.) yaradılışınadək görülmüş işləri sadalamış, hz. Adəmin (s.a.s.) və onun nəslinin yaşaması üçün zəruri olan nəsnələrin yaradıldığını bildirmişdir. Bununla birgə, hz.Məhəmməd (s.a.s.) Qurani-Kərimdə kainatın yaradılışı ilə bağlı olan ayələrə açıqlıq gətirmişdir. Quran belə buyurur:

وَلَقَدْ خَلَقْنَا السَّمَاوَاتِ وَالْأَرْضَ وَمَا بَيْنَهُمَا فِي سِتَّةِ أَيَّامٍ وَمَا مَسَّنَا مِن لُّغُوبٍ

(Qaf, 50/38)

---

[297] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 462.

[298] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 535-536.

«And olsun biz, göyləri, yeri və ikisi arasında olanları altı günə yaratdıq. Bizdə heç bir yorğunluq olmadı».

قَضَاهُنَّ سَبْعَ سَمَاوَاتٍ فِي يَوْمَيْنِ وَأَوْحَى فِي كُلِّ سَمَاء أَمْرَهَا
وَزَيَّنَّا السَّمَاء الدُّنْيَا بِمَصَابِيحَ وَحِفْظاً ذَلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِ
(Fussilət, 41/12)

«Allah onları yeddi göy olaraq iki gündə əmələ gətirdi. O, hər bir göyün işini özünə vəhy edib bildirdi. Biz aşağı göyü qəndillərlə bəzədik və qoruduq. Bu, yenilməz qüvvət sahibi olan, bilən Allahın təqdiridir!».

Hz.Məhəmməd (s.a.s.) başqa bir hədisində hz.Adəmlə bağlı məsələlərə bir az da açıqlıq gətirir.

Əbu Hureyrə (r.a.) rəvayət edir. Rəsulullah belə buyurdu: «Üzərinə günəş doğan ən xeyirli gün cümə günüdür. Adəm o gün yaradıldı, o gün cənnətə qoyuldu və yenə o gün cənnətdən çıxarıldı».[299]

Hz.Məhəmməd (s.a.s.) hz.Adəmin (s.a.s.) tövbəsinin də bu gün qəbul ediləcəyini, qiyamətin də cümə günü qopacağını buyurmuşdur.[300]

Hz.Məhəmməd (s.a.s.) bir hədisində hz. Adəmin (s.a.s.) arvadı Həvvanın, başqa birində də oğlunun adını çəkir. Əbu Hureyrə (r.a.) rəvayət edir. Hz.Məhəmməd (s.a.s.) belə buyurdu: «İsrail oğulları olmasaydı əhd pozulmazdı, Həvva olmasaydı qadın ərinə haqsızlıq (xəyanət) etməzdi».[301]

Abdullah b. Məsud (r.a.) rəvayət edir. Rəsulullah (s.a.s.) belə buyurdu: «Haqsız yerə öldürülən hər kimsənin

---

[299]Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 364.
[300]Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 366.
[301] Sahihi-Buxari, göstərilən qaynaq, s. 404.

qanından Adəmin ilk oğlunun üzərinə bir hissə düşər. Çünki o, öldürmə işini ilk olaraq ortaya qoyandır».[302]

Bu hədisdə də hz.Məhəmməd (s.a.s.) hz.Adəmin (s.a.s.) oğlu Qabilə işarə edir.

Hz.Məhəmməd (s.a.s.) bir hədisində hz.Adəmin (s.a.s.) axirətdəki vəzifəsindən danışır. Əbu Səid əl-Hudri (r.a.) hz.Peyğəmbərin (s.a.s.) belə buyurduğunu rəvayət edir: «Uca Allah: «Ey Adəm», deyə buyurur. O da: «Əmr et. Allahım, mən sənin sayəndə xoşbəxtliyi əldə edərəm. Yaxşılıq sənin əlindədir», deyir. Allah: «Cəhənnəmdəkiləri seçib çıxar!», buyurur. O da: «Cəhənnəmdəkilərin sayı nə qədərdir?», deyir. Allah: «Hər min adamdan, doqquz yüz doxsan doqquz!», buyurur. Bu vaxt (qorxudan) uşağın başı ağarır, bütün hamilələr uşağını düşürür. Sərxoş olmadıqları halda insanları sərxoş kimi görürsən. Ancaq Allahın əzabı çox şiddətlidir. Oradakı səhabələr: «Ey Allahın Rəsulu, geriyə qalan bir xalqımız ola bilər?», dedilər. Rəsulullah: «Sevinin ki, sizdən bir kimsəyə, Yəcuc və Məcucdan min kişi düşər», buyurdu. Sonra belə buyurdu: «Canım əlində olan Allaha and içirəm ki, mən sizin cənnətliklərin dörddə biri olmağınızı umuram». Biz bu müjdədən dolayı «Allahu Əkbər», dedik. Bunun üzərinə: «Sizin cənnətliklərin üçdə biri olmağınızı umaram», buyurdu. Biz yenə «Allahu Əkbər», dedik. Bu dəfə: «Sizin cənnətliklərin yarısı olmağınızı umuram», buyurdu. Biz yenə «Allahu Əkbər» dedik. Ardından: «Siz (sayca) oradakı insanlar arasındakı ağ bir öküzün dərisindəki ancaq qara bir tük qədərsiniz. Ya da qara bir öküzün dərisindəki ağ bir tük qədərsiniz», buyurdu».[303]

---

[302] Sahihi-Buxari, göstərilən qaynaq, s. 404.
[303] Sahihi-Buxari, göstərilən qaynaq, s. 406-407.

Hz.Məhəmməd (s.a.s.) bir hədisində də hz.Adəmin görünüşünü anlatmışdır. Əbu Hureyrə (r.a.) rəvayət edir. Hz.Məhəmməd (s.a.s.) belə buyurdu: «Allah Adəmi altmış arşın boyunda yaratmış və: «Get buradakı mələklərə salam ver, onların sənə verdikləri salamı, sənin salamınla zürriyətinin salamını dinlə», buyurdu. O da: «Əs-Səlamu-Əleykum» (Salam üzərinizə olsun), dedi. Onlar: «Əs-Səlamü Əleykə və rəhmətullahi» (Salam və Allahın rəhməti sənin üzərinə olsun) deyərək «Və rəhmətullahi» əlavəsini artırdılar. Cənnətə girən hər kəs Adəm surətində olacaqdır. Məxluqat (ilk yaradılışdan) bu anadək sürəkli azalmaqdadır».[304]

Hz.Məhəmməd (s.a.s.) bir hədisində də insanlığın hz. Adəmin (s.a.s.) nəslindən olduğunu buyurur: «Baxın, Allah atalarını ucaltmağa yönəlmiş cahiliyyə şirkinin qürurunu sizdən uzaqlaşdırdı. İnsan, ya Allaha qarşı sorumluluğunun bilincində olan bir mömin, ya da çarəsiz bir günahkardır. Bütün insanlar hz. Adəmin övladlarıdır. Hz. Adəm də palçıqdan yaradılmışdır».[305]

## DİVAN ƏDƏBİYYATINDA HƏZRƏT ADƏM (s.a.s.)

Divan ədəbiyyatında da hz.Adəm (s.a.s.) çeşidli yöndən təsvir edilmişdir. Divan şeirində onun adı, həm Adəm, həm də ilk insan olduğundan Əbul-Bəşər kimi verilmişdir. Divan şairləri hz.Adəmi 3 surət baxımından yaradılan ilk, hz.Məhəmmədi (s.a.s.) isə yaradılan ruh olaraq təqdim edirlər. Yəni hz. Adəmə hz. Məhəmmədə (s.a.s.) görə həyat verilmişdir.

**Kamal Paşazadə:**

---

[304] Sahihi-Buxari, göstərilən qaynaq, s. 403.
[305] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 1058.

Adem irişmemiş idi bin erbain ile,
Sen bir gicede irdügine bil ki dahi kem.[306]
(Sənin bir gecəyə əldə etdiyini Adəm qırx min ilə
əldə edə bilmədi).

Divan şeirində uca Allahın (c.c.) hz.Adəmi (s.a.s.) yer üzündə xəlifə seçməsi, ona elm verməsi, mələklərin Adəmə (s.a.s.) səcdə etməsi təsvir olunur. Şairlər hz.Adəmin (s.a.s.) buğda dənəsi yeyərək cənnətdən çıxarılmasını, yer üzünə enməsini də şeirlərə mövzu seçmişlər.

**Əhməd Rəmzi Ağürək:**
Duydu teşrifin senin dünyaya tercih eyledi,
Əbul-Beşer cennetdeki zevk u safanın üstüne.[307]
(Adəm hz.Məhəmmədin (s.a.s.) yer üzünə gələcəyini
duydu və cənnətdəki zövqdən, səfadan imtina etdi).

**Şeyxi:**
Hem hirmeni-şefaatünun huşe-çinidür,
Adəm ki, dane hırsı ile eyledi hata.[308]
(Adəm hz. Məhəmmədin (s.a.s.) şəfaət xırmanından bir dənə almaq üçün bu buğda dənəsi xətasını etmişdir).

**Şəhri:**
Olmasa cebini-Bul-Beşerde,
Envari- şefaatün hüveyda.
Olmazdı sücudi-tevbe-nakı,
Makbuli-Cenabi-Zati-Yekta.[309]

---

[306] Emine Yeniterzi, göstərilən qaynaq, s. 328.
[307] Emine Yeniterzi, göstərilən qaynaq, s. 328.
[308] Emine Yeniterzi, göstərilən qaynaq, s. 329.
[309] Emine Yeniterzi, göstərilən qaynaq, s. 329.

(Bəşərin atasının–Adəmin alnında şəfaət nurları aşkar olmasa idi (Hz. Məhəmmədin (s.a.s.) şəfaətinin), tövbə səcdəsi zatı tək olan Allahın hüzurunda qəbul olunmazdı)

Divan şairləri demək olar ki, bütün anlarda hz.Adəmlə (s.a.s.) bağlı məsələləri hz.Məhəmmədlə (s.a.s.) bağlı şəkildə şərh etmişlər. Divan şeirinin ortaya qoyduğu inanc budur ki, hər şey, o sıradan hz.Adəm (s.a.s.) hz.Məhəmmədin (s.a.s.) nurundan yaranıb, ilk olan hz.Məhəmmədin (s.a.s.) ruhudur. Hz.Adəmin (s.a.s.) tövbəsi hz.Məhəmmədin (s.a.s.) xatirinə qəbul olunub.

Biz Quranın, hədislərin, divan ədəbiyyatının işığında, bu qaynaqların verdiyi bilgilər araçlığı ilə hz.Nizaminin beytini bir də oxuyaq:

**O (Məhəmməd), öz fəsahətli diliylə ümmi olub,**
**Ancaq öz «Əlif»i ilə Adəmdən, «mim» ilə isə Məsihdən ön olub.**

## BEYTİN BƏDİİ BİÇİMİ VƏ ƏDƏBİ YÜKÜ

Biz öncəki beytlərdə hz.Nizaminin hərflərin şəkli və məna özəlliklərindən yararlandığını şərh etmişdik. Şair bu beytdə «əlif» və «mim» hərflərindən başqa çalarda istifadə edib, bu hərflərə başqa məna yükləyib. Bilindiyi kimi, hz.Adəm (s.a.s.) adı «əlif» hərfi ilə, «Məsih» (s.a.s.) adı isə «mim» hərfi ilə başlayır. «Əhməd» adında isə bu hərfin hər ikisi var. Hz.Nizaminin hz.Məhəmmədlə (s.a.s.) bağlı müqayisə tərəfi olaraq hz.Adəmlə (s.a.s.) hz.İsanı (s.a.s.) seçməsinin bir səbəbi də budur. Yəni hz. Məhəmməd (s.a.s.) bu iki peyğəmbərin, eləcə də bütün peyğəmbərlərin gətirdiklərini özündə birləşdirir və onları tamamlayır.

Beytin ikinci misrasındakı «əlif» və «mim» hərfləri isə elm anlayışını ifadə edir. Bu şərhin, bu görüşün bir neçə dəlili var. Öncə onu deyək ki, hərf tanımaq oxumaq, yazmaq, savad, bilik anlayışlarını da ifadə edir. Savadsız adama «o hərf tanımır» deyirlər. Bundan başqa hərf, əlifba hər şeyin əsası, başlanğıcı kimi də dəyərləndirilir. Xalq içində «bir işin, bir elmin əlifbası» deyimi də var.

**Başqa bir dəlil də odur ki, hz. Nizami «əlif», «mim» hərflərinin daşıdığı mənanı «ümmilik», «fəsahətli dil» anlayışları ilə bir arada vermişdir. Yəni hz.Məhəmməd (s.a.s.) ilahi elmə sahibdir, onun müəllimi uca Allahdır, onun oxuma-yazmaya ehtiyacı yoxdur, yaradılışı ən yaxşı, ən doğru oxuyan, dəyərləndirən odur, onun insanlıq üçün gətirdiyi həyat və axirət ölçüləri daha üstündür.**

Bir az da dərinə getsək, bu iki beytin bizə verdiyi bilgi budur: hz.Məhəmmədin (s.a.s.) elmi, ilahi qaynaqlı gətirdikləri, hz.Adəmə (s.a.s.) və hz.İsaya (s.a.s.) verilmiş ilahi nemətdən daha öndədir. Uca Allah (c.c.) hər peyğəmbərə eyni vəzifəni versə də, hər birinə fərqli imkanlar və ilahi bilgini ayrı-ayrı yollarla təqdim etmək özəlliyi bəxş etmişdir. Məsələn, hz.Adəmdən (s.a.s.) bir kitab qalmayıb, ancaq onun davranışları ilə uca Allah (c.c.) insanlığa çoxsaylı mesajlar vermişdir. Hz.Adəmin (s.a.s.) yaradılması, ona isimlərin öyrədilməsi, mələklərə səcdə əmri, şeytanın səcdədən imtinası, Adəmin (s.a.s.) cənnətdə yerləşdirilməsi, yasaq meyvə yeməsi, oradan çıxarılması, tövbəsi, arvadı, oğlanları, bir sözlə bütün addımları fərqli ilahi bilgiləri insanlığa çatdırır.

Uca Allah varlıq və birlik düşüncəsini, insanlıq üçün həyat və axirət ölçülərini hz.İsanın (s.a.s.) simasında başqa bir yöndən hz.Məhəmmədin (s.a.s.) şəxsiyyətində isə ayrı bir

biçimdə təqdim edir. Hz.Nizami bu beytin işığında hz. Məhəmmədin (s.a.s.) elmi, gətirdiyi nemət təhrifə uğramadı, son və ən mükəmməli oldu düşüncəsini də yaradır.

Hz.Nizaminin şərh etdiyimiz beytində göstərdiyimiz ortamı, elm ab-havasını, Allahın (c.c.) verdiyi nemətlərin birliyi və fərqliliyini müqayisə imkanını yaradan detallar da ortaya qoyur. Bu detallar elm, bilik düşüncəsi yaradır. Bu ortamı yaradan naxışlara baxaq: «fəsahətli dil», «əlif», «mim». Bunların hər üçü elmlə bağlıdır.

**Hz. Nizami beytin poetik quruluşunda əksliklərdən də uğurla yararlanıb. Bir yanda «fəsahətli dil», o biri yanda «ümmilik», bir yanda ilk insan və peyğəmbər, o biri yanda Lövhi-Məhvuzda adı ilk yazılan, ruhu ilk yaradılan hz.Məhəmməd (s.a.s.), həm ilk olmaq, həm son olmaq.**

Hz.Nizami bu beytdə də müqayisə yolundan yararlanaraq gerçəkləri anlatmışdır. Şairin bu beytə yerləşdirdiyi «sirlərdən» (mənalardan) biri də budur ki, o, anlayışlar, müqayisələr, adlar, hərflər yolu ilə Allahı (c.c.) onun sevgili peyğəmbərlərini tanıdır, bizi Quran, hədis öyrənməyə yönəldir.

Deməli, hz.Nizamini öyrənmək Allahı (c.c.) tanımağın, bu dünyada və axirətdə xoşbəxt yaşamağın yollarından biridir.

## ON BİRİNCİ BEYTİN ŞƏRHİ: O, «ƏLİF» KİMİ ÖZ ƏHD VƏ VƏFASINA DÜZ OLMUŞ

Hz. Nizami nətin on birinci beytindən hz. Məhəmmədin (s.a.s.) əxlaqi özəlliklərini təqdim etməyə başlayır. Öncə onun əhd və vəfasına sadiq olmaq kimi gözəl əxlaqından danışır:

همچو الف راست به عهد و وفا
اول و آخر شده بر انبيا

***«Əlif» kimi öz əhd və vəfasına düz olmuş,***
***Və bütün Peyğəmbərlərdən ön və son olmuş.***[310]

Bu beytdə hz. Nizami başlıca ideyanı «əhd» və «vəfa» anlayışları üzərində vermişdir. Bu iki anlayış Peyğəmbərlərin, mömin insanların gözəl əxlaqının göstəricisidir. İnsanlar arasında, toplumda etimad qazanmağın tək yolu da əhdə vəfalı olmaqdır.

### «ƏHD» ANLAYIŞI

«Əhd» qeydə alınmış şifahi, ya da yazılı anlaşma deməkdir. «Vəfa» və «ifa» sözləri də sözlü, yazılı anlaşmanı olduğu kimi yerinə yetirmək deməkdir. Deməli, «əhd» və «vəfa» anlayışlarında iki məna birləşmişdir. Biri söz vermək, anlaşmaq, biri də icra etmək, yerinə yetirmək. Bu iki iş bir arada olarsa, verilən vəd yerinə yetirilərsə, insan Allah (c.c.) qatında, insanlar arasında, toplumda inam qazana bilər.

Bizim hər birimizin uca Allah (c.c.), mübarək Peyğəmbər (s.a.s.), Vətən, millət, ailə, dost, müsəlman, insanlar, torpaq, su, hava, gül, səma, eləcə də hər şey qarşısında vəfa borcumuz var. «İctimai nizamın teşekkülünde ve devamında ahde vefanın, mühim bir yeri vardır. Zira fert ve cemiyyet

---
[310] Nizami Gəncəvi, Sirlər Xəzinəsi, göstərilən qaynaq, s. 26.

hayatının gelişmesi karşılıqlı münasibetlere, bunlar da çeşitli anlaşma ve sözleşmelere bağlıdır. Bunlar olmaksızın ictimai ve iktisadi hayatın gelişmesi ve devam etmesi mümkün deyildir. Bu sebeple, insanın şikayetlerinin önemli bir kısmı ve işlerin aksamasının temel sebebi, umumiyyetle, ahde vefasızlıktır. Yapılan akde uymayı istemek kazanılmış bir hak, onu yerine getirmek de kabul edilmiş bir vazifedir. Verdiyi sözü tutmayan kimse, karşı tarafın hakkını ödememiş ve kendi vazifesini de yerine getirmemiş olur».[311]

## QURANİ-KƏRİMDƏ VƏFA ANLAYIŞI

Uca Allah Qurani – Kərimdə əhdə vəfa etməyi buyurur:

يَا بَنِي إِسْرَائِيلَ اذْكُرُواْ نِعْمَتِيَ الَّتِي أَنْعَمْتُ عَلَيْكُمْ وَأَوْفُواْ بِعَهْدِي أُوفِ بِعَهْدِكُمْ وَإِيَّايَ فَارْهَبُونِ

(Bəqərə, 2/40)

«Ey İsrail oğulları, sizə verdiyim nemətimi xatırlayın, mənə verdiyiniz sözü tutun ki, mən də sizə verdiyim əhdi yerinə yetirim. Və sadəcə məndən qorxun».

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَوْفُواْ بِالْعُقُودِ أُحِلَّتْ لَكُم بَهِيمَةُ الأَنْعَامِ إِلاَّ مَا يُتْلَى عَلَيْكُمْ غَيْرَ مُحِلِّي الصَّيْدِ وَأَنتُمْ حُرُمٌ إِنَّ اللّهَ يَحْكُمُ مَا يُرِيدُ

(Maidə, 5/1)

«Ey iman gətirənlər! Əhdlərə sadiq olun. İhramda olarkən ov sizə qadağan edilməklə adları çəkiləck heyvanlar müsətəsna olaraq, qalanları sizə halal edildi. Şübhəsiz, Allah istədiyini hökm edər!».

وَلاَ تَقْرَبُواْ مَالَ الْيَتِيمِ إِلاَّ بِالَّتِي هِيَ أَحْسَنُ حَتَّى يَبْلُغَ أَشُدَّهُ وَأَوْفُواْ بِالْعَهْدِ إِنَّ الْعَهْدَ كَانَ مَسْؤُولاً

(İsra, 17/34)

[311] Üsve-i-Hasene, Kullukta-Ahlakta-Adabda en güzel insan (Doç. dr. Ömer Çelik, Dr. Mustafa Öztürk, Murat Kaya), İstanbul, 2003, cö. I.

«Yetim malına da yetkinlik yaşına çatanadək ancaq ən gözəl bir şəkildə yaxınlaşa bilərsiniz. Əhdi də yerinə yetirin. Çünki verilən sözdə sorumluluq vardır».

إِنَّ الَّذِينَ يُبَايِعُونَكَ إِنَّمَا يُبَايِعُونَ اللَّهَ يَدُ اللَّهِ فَوْقَ أَيْدِيهِمْ فَمَن نَّكَثَ فَإِنَّمَا يَنكُثُ عَلَى نَفْسِهِ وَمَنْ أَوْفَى بِمَا عَاهَدَ عَلَيْهُ اللَّهَ فَسَيُؤْتِيهِ أَجْراً عَظِيماً

(Fəth, 48/10)

«Hər halda, şübhəsiz, sənə biət edənlər, ancaq Allaha biət etmişlərdir. Onun üçün kim əhdini pozub yoldan çıxarsa, ancaq öz əleyhinə çıxmış olar. Kim də Allaha verdiyi sözü yerinə yetirərsə, Allah da ona böyük bir mükafat verəcəkdir».

مِنَ الْمُؤْمِنِينَ رِجَالٌ صَدَقُوا مَا عَاهَدُوا اللَّهَ عَلَيْهِ فَمِنْهُم مَّن قَضَى نَحْبَهُ وَمِنْهُم مَّن يَنتَظِرُ وَمَا بَدَّلُوا تَبْدِيلاً

(Əhzab, 33/23)

«Möminlərdən elə ərlər vardır ki, Allaha verdikləri əhdə sədaqət göstərdilər. Kimi əhdini yerinə yetirdi (şəhid oldu), kimi də (şəhidliyi) gözləməkdədir. Onlar heç, bir şəkildə verdikləri sözü dəyişdirmədilər».

وَأَوْفُواْ بِعَهْدِ اللّهِ إِذَا عَاهَدتُّمْ وَلاَ تَنقُضُواْ الأَيْمَانَ بَعْدَ تَوْكِيدِهَا وَقَدْ جَعَلْتُمُ اللّهَ عَلَيْكُمْ كَفِيلاً إِنَّ اللّهَ يَعْلَمُ مَا تَفْعَلُونَ . وَلاَ تَكُونُواْ كَالَّتِي نَقَضَتْ غَزْلَهَا مِن بَعْدِ قُوَّةٍ أَنكَاثاً تَتَّخِذُونَ أَيْمَانَكُمْ دَخَلاً بَيْنَكُمْ أَن تَكُونَ أُمَّةٌ هِيَ أَرْبَى مِنْ أُمَّةٍ إِنَّمَا يَبْلُوكُمُ اللّهُ بِهِ وَلَيُبَيِّنَنَّ لَكُمْ يَوْمَ الْقِيَامَةِ مَا كُنتُمْ فِيهِ تَخْتَلِفُونَ

(Nəhl, 16/91-92)

«Bir də anlaşma əldə etdikdə Allahın əhdini yerinə yetirin və sağlamca içdiyiniz andları pozmayın. Necə olur ki, ona Allahı şahid tutmuşdunuz. Şübhə yox ki, Allah nə edirsiniz, hamısını bilir. Və bir ümmət başqa bir ümmətdən daha çox olduğu üçün andlarınızı aranızda aldatma vəsiləsi edərək ipliyini (yumağını) qat-qat böyütdükdən sonra sökməyə çalışan qadın kimi olmayın. Allah sizi bununla

imtahan edər və əlbəttə, O, ixtilaf etdiyiniz şeyləri qiyamət günü sizə şübhəsiz açıqlayacaqdır».

وَمَا وَجَدْنَا لأَكْثَرِهِم مِّنْ عَهْدٍ وَإِن وَجَدْنَا أَكْثَرَهُمْ لَفَاسِقِينَ

(Əraf, 7/102)

«Onların çoxunda əhdə vəfa görmədik. Bu bir gerçək ki, onların çoxunu yoldan çıxan fasiq kimsələr gördük».

Uca Allah (c.c.) mömin insanın özəlliklərini sayarkən onların əhdə vəfa göstərdiklərini buyurur və onları cənnətlə müjdələyir:

الَّذِينَ هُمْ فِي صَلَاتِهِمْ خَاشِعُونَ . وَالَّذِينَ هُمْ عَنِ اللَّغْوِ مُعْرِضُونَ . وَالَّذِينَ هُمْ لِلزَّكَاةِ فَاعِلُونَ . وَالَّذِينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَ . إِلَّا عَلَى أَزْوَاجِهِمْ أوْ مَا مَلَكَتْ أَيْمَانُهُمْ فَإِنَّهُمْ غَيْرُ مَلُومِينَ . فَمَنِ ابْتَغَى وَرَاء ذَلِكَ فَأُوْلَئِكَ هُمُ الْعَادُونَ . وَالَّذِينَ هُمْ لِأَمَانَاتِهِمْ وَعَهْدِهِمْ رَاعُونَ . وَالَّذِينَ هُمْ عَلَى صَلَوَاتِهِمْ يُحَافِظُونَ . أُوْلَئِكَ هُمُ الْوَارِثُونَ . الَّذِينَ يَرِثُونَ الْفِرْدَوْسَ هُمْ فِيهَا خَالِدُونَ

(Möminin, 23/2-11)

«Onlar kı, namazlarında huşu içindədirlər, onlar kı, faydasız və boş sözə baxmazlar, onlar kı, zəkat vermək üçün çalışırlar, onlar kı, namuslarını qoruyurlar. Onlar kı, əmanətlərinə və əhdlərinə riayət edərlər. Onlar kı, namazlarını qoruyarlar, əsl varislər onlardır. Onlar Firdövsə varis olacaq, orada əbədi qalacaqlar».

Qüdrət sahibi Allah (c.c.) başqa ayələrdə də əhdə vəfa göstərənləri cənnətlə müjdələyir, bu əhdi pozanları isə cəhənnəmlə xəbərdar edir:

الَّذِينَ يُوفُونَ بِعَهْدِ اللّهِ وَلاَ ينقُضُونَ الْمِيثَاقَ .وَالَّذِينَ يَصِلُونَ مَا أَمَرَ اللّهُ بِهِ أَن يُوصَلَ وَيَخْشَوْنَ رَبَّهُمْ وَيَخَافُونَ سُوءَ الحِسَابِ . وَالَّذِينَ صَبَرُواْ ابْتِغَاء وَجْهِ رَبِّهِمْ وَأَقَامُواْ الصَّلاَةَ وَأَنفَقُواْ مِمَّا رَزَقْنَاهُمْ سِرّاً وَعَلاَنِيَةً

وَيَدْرَؤُونَ بِالْحَسَنَةِ السَّيِّئَةَ أُوْلَئِكَ لَهُمْ عُقْبَى الدَّارِ . جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا وَمَنْ صَلَحَ مِنْ آبَائِهِمْ وَأَزْوَاجِهِمْ وَذُرِّيَّاتِهِمْ وَالمَلاَئِكَةُ يَدْخُلُونَ عَلَيْهِم مِّن كُلِّ بَابٍ . سَلاَمٌ عَلَيْكُم بِمَا صَبَرْتُمْ فَنِعْمَ عُقْبَى الدَّارِ

(Rəd, 13/20-24)

«Onlar ki, Allahın əhdini yerinə yetirirlər və verdikləri sözü pozmazlar. Onlar kı, Allahın uyulmasını əmr etdiyi hüquqa əməl edərlər, Rəbblərinə sayğı göstərərlər, hesabın pisliyindən qorxarlar. Onlar kı, Rəbblərinin rizasını qazanmaq üçün səbr edərlər, namazı doğru qılarlar, onlara verdiyimiz ruzilərdən gizli, açıq verərlər, pisliyi yaxşılıqla dəf edərlər, dünya həyatının yaxşı sonu onlarındır. Ədn cənnətlərinə atalarından, xanımlarından, övladlarından əməli saleh olanlarla bərabər girəcəklər. Mələklər də hər qapıdan yanlarına girib belə deyəcəklər: «Səbr etdiyiniz üçün salam sizə, axirət yurdu nə gözəldir».

Uca Allah (c.c.) əhdi pozanların aqibətinin isə cəhənnəm olacağını buyurur:

وَالَّذِينَ يَنقُضُونَ عَهْدَ اللّهِ مِن بَعْدِ مِيثَاقِهِ وَيَقْطَعُونَ مَا أَمَرَ اللّهُ بِهِ أَن يُوصَلَ وَيُفْسِدُونَ فِي الأَرْضِ أُوْلَئِكَ لَهُمُ اللَّعْنَةُ وَلَهُمْ سُوءُ الدَّارِ

(Rəd, 13/25)

«Ancaq Allahın əhdini misaq ilə təsdiq etdikdən sonra pozanlara və Allahın bağlanmasını istədiyi bağları (qohumluq bağlarını) qoparanlara və yer üzünü fəsada verənlərə isə lənət olsun! Yurdun pisi də (cəhənnəm) onlarındır».

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) VƏFASI

Hz.Nizami beytdə hz.Məhəmmədin (s.a.s.) «əhd və vəfasına» düz olduğunu bildirir. Biz bu anlayış işığında hz.Məhəmmədin (s.a.s.) əhd və vəfasını bir neçə yerə ayıra bilərik. Peyğəmbərin (s.a.s.) uca Allah (c.c.) qarşısındakı əhd və vəfası, onun insanlar qarşısındakı əhd və vəfası.

Peyğəmbərin, insanların Allah (c.c.) qarşısındakı əhdini, vəfasını pozması toplumun, ilahi nizamın dağılması demək olduğu kimi, bu əhdin yerinə yetirilməsi də azadlıq, hər iki dünyada xoşbəxtlik deməkdir.

Öncə hz. Məhəmmədin (s.a.s.), eləcə də peyğəmbərlərin uca Allah (c.c.) qarşısındakı əhd və vəfa anlayışını şərh edək. Qurani-Kərimdə uca Allah (c.c.) peyğəmbərdən söz aldığını buyurur:

وَإِذْ أَخَذَ اللّهُ مِيثَاقَ النَّبِيِّيْنَ لَمَا آتَيْتُكُم مِّن كِتَابٍ وَحِكْمَةٍ ثُمَّ جَاءكُمْ رَسُولٌ مُّصَدِّقٌ لِّمَا مَعَكُمْ لَتُؤْمِنُنَّ بِهِ وَلَتَنصُرُنَّهُ قَالَ أَأَقْرَرْتُمْ وَأَخَذْتُمْ عَلَى ذَلِكُمْ إِصْرِي قَالُواْ أَقْرَرْنَا قَالَ فَاشْهَدُواْ وَأَنَاْ مَعَكُم مِّنَ الشَّاهِدِينَ فَمَن تَوَلَّى بَعْدَ ذَلِكَ فَأُوْلَـئِكَ هُمُ الْفَاسِقُونَ

(Ali-İmran,3/81-82)

«Allah vaxtı ilə Peyğəmbərdən söz almışdı. Belə buyurmuşdu: «And olsun ki, sizə kitab və hikmətdən hər nə verdimsə, sonra sizə yanınızdakını təsdiq edən bir Peyğəmbər gələndə ona mütləq inanacağınız və ona yardımçı olacaqsınız. Bunu qəbul etdinizmi? Bunun üzərinə ağır əhdimi boynunuza aldınızmı?», buyurdu. Onlar: «Qəbul etdik», dedilər. Allah da: «Elə isə şahid olun, mən də sizinlə bərabər şahidlik edənlərdənəm!», buyurdu. Deməli ki, bunun arxasından hər kim dönərsə, onlar artıq dindən çıxmış günahkarlardır, fasiqlərdir».

**Quran işığında «əhd», «vəfa», «anlaşma» qavramları insanın Allaha (c.c.) olan inancına görə bütün vəzifələrini, məsuliyyətini, bu inanca görə Allah (c.c.) və insan qarşısında üzərinə götürdüyü əxlaqi, hüquqi, ictimai öhdəlikləri əhatə edir. Əhd, anlaşma iki və çoxtərəfli olur, tərəflərin qarşılıqlı münasibətlərini yoluna qoyur.**

Təfsirçilərə görə, andlaşma üç yerə ayrılır: Allah ilə insan arasındakı andlaşma (insanın Allah qarşısındakı sorumluluğu); insan ilə öz ruhu arasındakı andlaşma (insan özü ilə barış içində yaşayanda başqaları ilə də barış içində olur və ədalət yerini tutur); fərd ilə toplumun başqa üzvləri arasındakı andlaşma. Bununla da uca Allah (c.c.) insanın əxlaqi, sosial, ictimai məsuliyyətinin çərçivəsini cızır. «Allaha qarşı təhəddüd (ənənəvi olaraq «Allahın əhdi» kimi çevirilir) burada («Bəqərə» surəsinin 27-ci ayəsi nəzərdə tutulur – S. H.) açıqca insanın özünə yaradılışdan verilən ağlı və maddi nemətləri Allahın istədiyi şəkildə istifadə etməsi yolundakı əxlaqi sorumluluğuna işarə edir. Bu sorumluluğun varlığı ağıl nemətindən qaynaqlanır. Ağıl neməti doğru istifadə edildiyində, insanı öz davranışları ilə bağlı olaraq Allahın iradəsini tədricən qavramağa yönəldir».[312]

**Qurana görə, insanın sorumluluqları içərisində, «əhd»ləri sırasında ailə, yetim, yoxsul qarşısındakı öhdəliklər, qonşular arasındakı qarşılıqlı haqq və vəzifələr kimi insanlararası münasibətdən doğan bütün əhdlər, insanlar arasındakı islami qardaşlığın ortaya çıxardığı mənəvi, dünyəvi öhdəliklər də var.** «İnsan yaradılmış aləmin bağlı olduğu hədəf birliyinin fərqində olub, buna qarşı duyarlı qalması yönündəki mənəvi sorumluluğunu və bu nöqtədən hərəkətlə – Raziyə görə – bütün canlılara qarşı sevgi və şəfqətli davranması yönündəki əxlaqi sorumluluğunu da bilməlidir».[313]

Qurana görə, uca Allah (c.c.) insana hansı neməti verirsə, ondan sorumlu tutur. Göz bir nemətdir. Onun sahibi pis şeylərə baxmaqdan çəkinirsə, gözünün nurunu elm

---

[312] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 9-10.
[313] Məhəmməd Əsəd, göstərilən qaynaq, s. 491.

öyrənməyə, başqa faydalı şeylərin öyrənilməsinə sərf edirsə, Allah (c.c.) qarşısındakı əhdinə vəfa etmiş olur. Qulaq qeybət eşitmirsə, dil yalan danışmırsa, diş, əl harama toxunmursa, ayaq haram işlərə yönəlmirsə, Allahın əhdinə vəfa etmiş sayılır. Ya da su bir nemətdir, torpaq, hava bir nemətdir, heyvanlar, ağaclar, çiçəklər bir nemətdir. İnsan onları qoruyursa, təyinatına uyğun istifadə edirsə, Allahın (c.c.) əhdinə vəfa etmiş olur.

Biz öncə hz.Nizaminin beytinin işığında hz. Məhəmmədin (s.a.s.) uca Allah (c.c.) qarşısındakı əhdə vəfasına baxaq. Qüdrət sahibi Allah (c.c.) «əhdə vəfa» nümunəsi olaraq insanlara Peyğəmbər göndərir və onu «gözəl örnək» adlandırır:

لَقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ اللَّهِ أُسْوَةٌ
حَسَنَةٌ لِّمَن كَانَ يَرْجُو اللَّهَ وَالْيَوْمَ الْآخِرَ وَذَكَرَ اللَّهَ كَثِيراً

(Əhzab, 33/21)

«And olsun ki, sizin üçün – Allaha və axirət gününə qovuşacağını uman və Allahı çox zikr edənlər (mömin) üçün Rəsulullahda ən gözəl bir örnək vardır».

Uca Allahın peyğəmbəri seçilməzdən öncə də hz. Məhəmməd (s.a.s.) insanlar arasında «Məhəmmədül-Əmin» kimi tanınırdı. İnsanlar onu əhdinə vəfa göstərən bir insan kimi sevirdilər.

Uca Allah hz. Məhəmmədi (s.a.s.) insanlara belə təqdim edir:

وَإِنَّ لَكَ لَأَجْراً غَيْرَ مَمْنُونٍ وَإِنَّكَ لَعَلى خُلُقٍ عَظِيمٍ

(Qələm, 68/3-4)

«Ey Rəsulum! Şübhəsiz ki, sənin üçün tükənməyən bir mükafat vardır. Sözsüz ki, sən böyük bir əxlaq üzərindəsən».

لَقَدْ جَاءكُمْ رَسُولٌ مِّنْ أَنفُسِكُمْ عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُم
بِالْمُؤْمِنِينَ رَؤُوفٌ رَّحِيمٌ

(Tövbə, 9/128)

«And olsun ki, sizə içinizdən elə bir Peyğəmbər gəldi ki, çox izzətlidir. Sıxıntıya düşməyiniz ona çox ağır gəlir, üstünüzdə titrər, möminlərə çox mərhəmətli və şəfqətlidir».

Əhdə vəfalı olmaq yüksək əxlaqın göstəricisidir. Hz. Məhəmməd (s.a.s.) uca Allah (c.c.) qarşısındakı bütün öhdəliklərini şərəflə yerinə yetirdi, borcunu ödədi. Əhdə vəfalı olmaq fədakarlıq və cəsarət deməkdir. O, insanların ən fədakarı idi. Gecələr ayaqları şişənədək namaz qılardı, Allahı (c.c.) hamıdan çox zikr edərdi, Allah (c.c.) qarşısındakı əhdini bir an belə olsun unutmazdı. Bir yəhudi alimi hz. Məhəmmədin (s.a.s.) vəfa, inam təlqin edən mübarək, nurlu, təmiz üzünə baxıb: «Bu üz əsla yalan söyləməz», demiş və müsəlman olmuşdu.[314]

Hz.Məhəmmədin (s.a.s.) əhdinə vəfalı olması ilə bağlı çoxsaylı hədislər var. Bunlardan bir neçəsinə baxaq:

«Peyğəmbər (s.a.s.) uca Allahın: «Mən qiyamət günü bu üç (qism) insanın düşməniyəm», buyurduğunu bildirmiş, ilk olaraq da Allah adına and içdikdən sonra sözündən dönən insanı zikr etmişdir».

Başqa bir hədisində verdiyi sözdən dönən kimsənin bu xasiyyəti tərk edənədək münafiqlikdən bir sifət daşıdığını bildirmişdir.

Başqa bir mübarək hədisində də belə kimsələrin qiyamət günündə qarşılaşacaqları acı mənzərəni təsvir etmişdir: «Qiyamət günü əhdinə vəfa göstərməyən kimsələrin arxasında bir bayraq olacaq və vəfasızlığı ölçüsündə o bayraq yüksələcəkdir».[315]

---

[314] Üsve-i-Hasene, göstərilən qaynaq, s. 25.
[315] Üsve-i-Hasene, göstərilən qaynaq, s. 279.

Hz.Məhəmməd (s.a.s.) hədislərinin birində uca Allahı (c.c.) «əhli-vəfa» deyə tanıtmışdır: «Allahım! Filan oğlu filan Sənə əmanətdir və Sənin təminatın altındadır. Artıq onu qəbir fitnəsindən və cəhənnəm əzabından qoru. Sən sözündə duran (əhli-vəfa) və həmdə layiq olansan».[316]

Hz.Məhəmməd (s.a.s.) özünün uca Allaha (c.c.) qul olduğunu «əhdə vəfa» anlayışı ilə ifadə edib: «Allahım! Mən Sənin qulunam. Gücüm yetdiyi qədər əhdinə və vədinə sədaqət göstərirəm».[317]

Hz.Məhəmməd (s.a.s.) uca Allah (c.c.) qarşısında əhdinə vəfalı olduğu kimi insanlararası münasibətlərdə də sözünə sadiq idi. Ona görə, insanlar arasında, toplumda inam qazanmağın, toplumun əxlaqını qorumağın yolu əhdə vəfa göstərməkdir. O, verdiyi sözü yerinə yetirdiyinə görə hamı onu sevdi, ona inandı, adi olmayan şeylər danışanda, peyğəmbərliyini bəyan edəndə belə, səmimi insanlar onun doğru dediyini düşündülər.

Gəlin, hədislər yolu ilə onun bu inamı necə qazandığına baxaq. Əshabdan Abdullah b. Əbil-Hamsa rəvayət edir. «Hz.Peyğəmbərlə (s.a.s.) bir alış-veriş etmişdim. Ona borclu qaldım, bir az gözləsə, tez gətirəcəyimi vəd edərək getdim. Ancaq verdiyim sözü unutdum. Üç gün sonra xatırlayıb danışdığımız yerə gələndə onun eyni yerdə gözlədiyini gördüm. Məni görəndə sadəcə:

Ey dəliqanlı! Mənə əziyyət etdin, üç gündür burada səni gözləyirəm, buyurdu».[318]

Huzeyfə (r.a.) rəvayət edir: «Atam Hüseyl ilə bərabər yola çıxmışdıq. Qureyş kafirləri bizi tutdular və:

---

316 Üsve-i-Hasene, göstərilən qaynaq, s. 280.
317 Üsve-i-Hasene, göstərilən qaynaq, s. 280.
318 Üsve-i-Hasene, göstərilən qaynaq, s. 280.

- Siz, şübhəsiz, Məhəmmədin sırasına qoşulmaq istəyirsiniz, dedilər.

Biz də:

- Xeyr, Mədinəyə bu səbəblə deyil, başqa bir iş üçün gedirik, dedik.

Onlar bizdən Peyğəmbərin yanında yer alıb onunla birlikdə savaşmayacağımızla bağlı Allah adına söz aldılar. Mədinəyə gəlib durumu Rəsulallaha dedik. O:

- Gedin. Biz sizin verdiyiniz sözü tutar, onlara qarşı da Allahdan yardım istəyərik!, buyurdu. Mənim Bədir hərbində iştirak etməməyimin səbəbi budur».[319]

Xudeybiyə razılaşmasının şərtlərindən biri Məkkədən Mədinəyə qaçan insanların geri verilməsi ilə bağlı idi. Anlaşmanın imzalanacağı bir anda Qureyş təmsilçisi Süheyl bin Amrın oğlu Əbu Cendel (r.a.) ayaqlarındakı zəncirləri sürüyərək yavaş-yavaş Peyğəmbərin (s.a.s.) yanına gəldi. Əbu Cendel (r.a.) müsəlman olduğu üçün müşriklərdən çox işgəncə görmüşdü. Bir fürsət taparaq əllərindən qaçmış və özünü müsəlmanların arasına atmışdı. Süheyl anlaşmaya uyğun olaraq ilk geri qaytarılacaq kimsənin oğlu olduğunu söylədi və əlindəki sopayla Əbu Cəndəlin üzünə vurdu. Olanlara hüzünlə baxan hz.Məhəmməd (s.a.s.) Əbu Cəndəlin andlaşmadan xaric qalmasını, onu Peyğəmbərə (s.a.s.) bağışlanmasını Süheyldən xahiş etdi. Ancaq müşrik bunu qəbul etmədi. Əbu Cəndəl (r.a.) müşriklərə təslim edilərkən fəryadlarla müsəlmanlara yalvarırdı, yardım istəyirdi. Müsəlmanlar ağlamağa başladılar. Allahın Rəsulu:

- Ey Əbu Cəndəl! Bir az daha səbr et, döz! Uca Allahdan bunun mükafatını istə! Heç şübhəsiz, uca Allah sən və yanında olan zəif, kimsəsiz müsəlmanlar üçün bir genişlik

[319] Üsve-i-Hasene, göstərilən qaynaq, s. 282.

və çıxış yolu yaradacaq. Biz bu qövmlə bir barış anlaşması imzalamış və bu yolda onlara Allahın əhdi ilə söz vermişik. Onlar da bizə Allahın əhdi ilə söz verdilər. Sözümüzə vəfasızlıq edə bilmərik. Verdiyimiz sözü yerinə yetirməmək bizə yaraşmaz».[320]

Enes (r.a.) rəvayət edir: «Əmim Enes bin Nadir Bədir savaşında iştirak etməmişdi. Bu ona çox ağır gəldi:

- Ey Allahın Rəsulu! Müşriklərlə etdiyin savaşda iştirak edə bilmədim. Əgər uca Allah müşriklərlə olacaq bir savaşda olmağı mənə qismət edərsə, nələr edəcəyimi görəcəkdir.

O, Uhud savaşına qatıldı. Müsəlmanların səfləri dağılanda, dostlarını nəzərdə tutaraq «Allahım, bunların etdiklərinə görə səndən üzr istəyirəm», dedi. O, müşrikləri nəzərdə tutaraq «Bunların etdiklərindən də uzaq olduğumu bildirirəm», dedi. İrəli getdi, Səd b. Muazla qarşılaşdı, ona:

« - Ey Səd! İstədiyim cənnətdir. Kəbənin Rəbbinə and içirəm ki, Uhudun ətəklərindən bəri hey o cənnətin qoxusunu alıram», dedi.

Səd: «Mən onun etdiyini edə bilmədim, ey Rəsulullah», dedi.

Onu şəhid edilmiş olaraq tapdıq. Bədənində səksəndən çox qılınc, süngü, ox yarası var idi. Müşriklər onun üzvlərini kəsmişdilər. Ona görə onu kimsə tanımadı. Sadəcə bacısı barmaq uclarından tanıdı. Bu ayə əmim və onun kimilərlə bağlı nazil oldu:

مِنَ الْمُؤْمِنِينَ رِجَالٌ صَدَقُوا مَا عَاهَدُوا اللَّهَ عَلَيْهِ فَمِنْهُم مَّن قَضَى نَحْبَهُ وَمِنْهُم مَّن يَنتَظِرُ وَمَا بَدَّلُوا تَبْدِيلاً

(Əhzab, 33/23)

[320] Üsve-i-Hasene, göstərilən qaynaq, s. 282.

«Möminlər içində elə igidlər var ki, Allaha verdikləri sözlərinə sədaqət göstərdilər. Onlardan kimi əhdini yerinə yetirdi (döyüşdü, şəhid oldu), kimi də (sırasını) gözləməkdədir. Bunlar əsla sözlərini dəyişdirməmişlər».

Əhdə vəfa hz.Məhəmmədin (s.a.s.) əxlaq anlayışının ayrılmaz tərkib hissəsidir. Bir insanın, bir toplumun uğuru, mənəvi sağlamlığı Allahı (c.c.), özü, toplumu ilə barış içində yaşamasına bağlıdır. Bu da ancaq əhdə vəfa ilə ola bilər. İnsan doğru olanı tanıyanda, ona sarılanda, gözəl əxlaq demək olan İslamı olduğu kimi qavrayanda onun əhdinə vəfasız olması mümkün deyil.

Bizcə, böyük hədəflərə doğru getməyin, inkişafın, azadlığın yolu Allahı (c.c.) tanımaq və ona sevərək təslim olmaqdır. Allahla (c.c.) öz aranda əhd bağladınsa (əslində, niyyətin bir mənası da budur), ona vəfa göstərdinsə, bu andlaşmaya uyğun olmayan hər şeydən imtina etdinsə, qurtuluşun yolunu tapdın.

Namazdakı Allahla (c.c.) qul arasındakı əhdə vəfa ölçüsü yaradanı ürəkdən sevərək, Allahdan (c.c.) başqa hər şeyi unudaraq qılmandır. Orucdakı əhdə vəfa onu Allah (c.c.) rizası üçün bütün əzaların və varlığınla tutmandır. Elmdəki əhdə vəfa ölçüsü doğrunu yazmaq və fədakarlıqdır. Müəllimlikdəki əhdə vəfa insan yolunda, gerçəyi öyrətmək yolunda bir şam kimi yanmaqdır. İşığı, enerjisi olmayan ölü namazlar, ölü oruclar, ölü elmlər faydasızdır.

**Qurana görə, əhdə vəfa insanın fitrətinin qorunma vasitəsidir. Əhdə vəfa pozulanda insanın fitrəti də pozulur, o, haram məkanına girir, əxlaq çürüyür və insan yaradılış mahiyyətini itirir. İnsan əhdinə vəfasızlıq etdisə, ilk sırada onun ruhu çirklənir və bədəni ölçülərini dəyişir.** Hz.Məhəmmədin (s.a.s.): «Yalan danışmayın,

gözəlliyiniz itər» hədisinin bir hikməti də budur. Çünki yalan danışmaq əhdə vəfasızlıqdır, ilahi ölçünü pozmaqdır. İnsan öz fitrətini pozandan sonra isə toplumdakı ölçülər də dəyişir, hamı bir-birini aldadır, insan köləyə çevrilir.

**Deməli, əhdə vəfa fitrətə uyğun yaşamaq deməkdir. Bu isə fədakarlıqla ola bilər**.

## ƏHDƏ VƏFA İMAN ÖLÇÜSÜDÜR

Deməli, hər şeyin başı əxlaqdır, əhdə vəfadır. Baxın, uca Allah (c.c.) sevdiyi peyğəmbərinə nə buyurur:

وَإِنَّكَ لَعَلى خُلُقٍ عَظِيمٍ

(Qələm, 68/4)

«Şübhəsiz ki, sən böyük bir əxlaq üzərəsən».

Hz.Aişə (r.a.) buyurur ki, hz.Məhəmmədin (s.a.s.) əxlaqı Qurandır. Hz.Məhəmməd (s.a.s.) özü isə belə buyurur:

«Allahım! Yaradılışımı gözəl etdiyin kimi əxlaqımı da gözəlləşdir. Ey Rəbb! Məni əxlaqın ən gözəlinə qovuşdur! Şübhəsiz, ona qovuşduracaq olan ancaq Sənsən!»[321]

Hz.Məhəmməd (s.a.s.) yaxın qohumlarına vəfa göstərərək onları xəbərdar edir. Əbu Hureyrə (r.a.) rəvayət edir: «Yaxın qohumlarını xəbərdar et!» ayəsi nazil olanda Rəsulullah (s.a.s.) Qureyş qəbiləsini toplantıya çağırdı. Onlar da gəldilər. Peyğəmbər (s.a.s.) kiminə ümumi, kiminə də özəl olaraq belə xitab etdi:

«Ey Abdüşəms oğulları! Ey Kab ibni Lüey oğulları! Özünüzü cəhənnəmdən qurtarın!

Ey Abdümənaf oğulları! Özünüzü cəhənnəmdən qurtarın!

Ey Haşim oğulları! Özünüzü cəhənnəmdən qurtarın!

[321] Üsve-i-Hasene, göstərilən qaynaq, s. 62.

Ey Abdülmutallib oğulları! Özünüzü cəhənnəmdən qurtarın!

Ey Fatma! Özünü cəhənnəmdən qurtar! Çünki sizi Allahın əzabından qurtarmağa mənim gücüm yetməz. Ancaq aramızdakı qohumluq bağı səbəbiylə sizinlə əlaqəmi kəsməyəcəyəm».[322]

Hz.Məhəmməd (s.a.s.) heç kimi şəxsi işlərinə görə döymədi, cəzalandırmadı. Ancaq Allaha (c.c.) olan əhdini pozanlardan, ilahi yasağı çiynəyənlərdən intiqam aldı, onları cəzalandırdı. Hz. Aişə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) Allah yolunda savaşmaq xaricində, nə bir qadına, nə bir xidmətçiyə, qısacası, heç bir kimsəyə əliylə vurmadı. Özünə pislik edən kimsədən intiqam almağa girişmədi. Ancaq Allahın yasaq etdiyi şeylər çiynənəndə O, yasağı pozandan Allah adına intiqam aldı».[323]

Biz dedik ki, əhdə vəfa Peyğəmbər (s.a.s.) əxlaqının bir parçasıdır. O, bir insanın mömin olub olmamasını tərif edərkən əhdə vəfanı başlıca ölçülərdən biri kimi qəbul etmişdir. Abdullah ibni Amr İbnil-As (r.a.) rəvayət edir. Nəbi (s.a.s.) belə buyurdu: «Dörd xasiyyət vardır ki, bunlar kimdə olsa, o insan tam münafiq olur. Kimdə də bu xasiyyətlərdən biri olarsa, onu tərk edincəyə qədər o kişidə münafiqlikdən bir sifət olmuş olur:

- ona bir şey əmanət edildiyi zaman ona xəyanət edər;
- danışanda yalan söylər;
- söz versə, sözündən dönər:
- düşmənlikdə həddi aşar, haqsızlıq edər»[324]

---

[322] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 458-459.
[323] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 596.
[324] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s.559-600.

Əbu Hureyrə (r.a.) rəvayət edir: Nəbi (s.a.s.) uca Allah belə buyurdu demişdir: «Mən qiyamət günü bu üç (qrup) insanın düşməniyəm:

- mənim adıma and içdikdən sonra sözündən dönən insan;
- azad bir insanı kölə kimi satıb pulunu yeyən insan;
- pulla bir işçi tutub işini gördürən və işçinin pulunu verməyən insan».[325]

Uca Allah (c.c.) və onun sevimli Peyğəmbəri (s.a.s.) əhdə vəfa anlayışına sirr saxlamağı da daxil etmişdir. Uca Quran belə buyurur:

وَأَوْفُواْ بِعَهْدِ اللّهِ إِذَا عَاهَدتُّمْ وَلاَ تَنقُضُواْ الأَيْمَانَ
بَعْدَ تَوْكِيدِهَا وَقَدْ جَعَلْتُمُ اللّهَ عَلَيْكُمْ كَفِيلاً إِنَّ اللّهَ يَعْلَمُ مَا تَفْعَلُونَ

(Nəhl, 16/91)

«Əhd etdiyiniz zaman Allaha verdiyiniz əhdi yerinə yetirin. Allahı özünüzə zamin edib möhkəm and içdikdən sonra onu pozmayın. Həqiqətən, Allah nə etdiyinizi bilir!».

Hz.Məhəmməd (s.a.s.) bir hədisində sirr saxlamağın önəminə diqqəti çəkir. Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir. Rəsulullah belə buyurdu: «Qiyamət günündə uca Allaha görə ən fəna insan, qarısı ilə məhrəmiyyətini paylaşdıqdan sonra onun sirrini ifşa edən kimsədir».[326]

Hz. Məhəmmədin (s.a.s.) ölçülərinə görə əhdə vəfanın bir ölçüsü də doğru sözlü olmaqdır. Bu əxlaq ölçüsünün də qaynağı Qurandır. Uca Quran belə buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ اتَّقُواْ اللّهَ وَكُونُواْ مَعَ الصَّادِقِينَ

(Tövbə, 9/119)

---

[325] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s.601.
[326] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s.602.

«Ey insanlar! Allaha qarşı sayğılı olun və özü, sözü doğru olanlarla yanaşı durun».

إِنَّ الْمُسْلِمِينَ وَالْمُسْلِمَاتِ وَالْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَالْقَانِتِينَ وَالْقَانِتَاتِ وَالصَّادِقِينَ وَالصَّادِقَاتِ وَالصَّابِرِينَ وَالصَّابِرَاتِ وَالْخَاشِعِينَ وَالْخَاشِعَاتِ وَالْمُتَصَدِّقِينَ وَالْمُتَصَدِّقَاتِ وَالصَّائِمِينَ وَالصَّائِمَاتِ وَالْحَافِظِينَ فُرُوجَهُمْ وَالْحَافِظَاتِ وَالذَّاكِرِينَ اللَّهَ كَثِيراً وَالذَّاكِرَاتِ أَعَدَّ اللَّهُ لَهُم مَّغْفِرَةً وَأَجْراً عَظِيماً

(Əhzab, 33/35)

«Həqiqətən, Allah məhz müsəlman kişilər və qadınlar, mömin kişilər və qadınlar, müti kişilər və qadınlar, doğru danışan kişilər və qadınlar, səbirli kişilər və qadınlar, təvazökar kişilər və qadınlar, sədəqə verən, oruc tutan kişilər və qadınlar, ayıb yerlərini qoruyub saxlayan kişilər və qadınlar və Allahı çox zikr edən kişilər və qadınlar üçün bağışlanma və böyük bir mükafat hazırlamışdır!».

طَاعَةٌ وَقَوْلٌ مَّعْرُوفٌ فَإِذَا عَزَمَ الْأَمْرُ فَلَوْ صَدَقُوا اللَّهَ لَكَانَ خَيْراً لَّهُمْ

(Məhəmməd,47/21)

«Ancaq (onların vəzifəsi) itaət və gözəl sözdür. Allaha qarşı doğru və səmimi davransa idilər, özləri üçün daha yaxşı olardı».

Hz.Məhəmmədin (s.a.s.) hədislərində də doğruluq, səmimiyyət əhdə vəfalı kimsələrin əxlaqıdır.

Əbu Musa əl-Əşari (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Allahın mənimlə göndərmiş olduğu hidayət və elm yer üzünə yağan bol yağmur kimidir. Yağmurun yağdığı yerin bir bölümü verimli bir torpaqdır:

yağmur suyunu əmər, bol çəmən və ot bitirir. Bir qism də suyu əmməyib üstündə saxlayan yararsız bir yerdir. Allah burada toplanan sudan insanları faydalandırır. Həm özləri içər, həm də heyvanlarına su verər və əkinlərini o su ilə suvararlar. Yağmurun yağdığı bir yer daha vardır ki, düz və heç bir bitki bitirməyən çox yararsız bir yerdir. Nə su tutar, nə də ot bitirər. Məhz bu, Allahın dinində anlayışlı olan və Allahın mənimlə göndərdiyi hidayət və elm özünə fayda verən, onu həm öyrənən, həm öyrədən kimsə ilə, buna başını qaldırıb qulaq verməyən, Allahın mənimlə göndərdiyi hidayəti qəbul etməyən kimsənin bənzəridir».[327]

## DİVAN ŞEİRİNDƏ HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) VƏFASI

Hz.Məhəmmədin (s.a.s.) əhdə vəfası divan şeirinə də mövzu olmuşdur. Nətlərdə o, «əmini-bargahi məallah», «əmini-gənci-Haqq», «əmini-şerü hikmət», «əmini-sirri-tənzil», «əmini-vəhyi-mübin» kimi adlarla anılmış, onun əhdə vəfası öyülmüşdür:

**Füzuli:**

Vəsfi-Cəbrayili-Əmin etmiş qəbuli-xitmətin,
Sirri-haqq kəşfinə onunla yetib fərman sana.[328]

(Allahın vəhy gətirməklə vəzifələndirdiyi Cəbrailin «əmin» sifəti, vəhyi alan hz.Məhəmmədə də aiddir. O, bu yolla, bu adla Haqqın sirrini açıb)

**Ayni:**

Kıl şəfaət ümmətindən Ayniye-biçareye,
Ey Emini-Hazreti-Mevla Habibi-Kibriya.[329]

---

327 Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 559-570.
328 Emine Yeniterzi, göstərilən qaynaq, s. 175.
329 Emine Yeniterzi, göstərilən qaynaq, s. 175.

(Ey Allahın böyük dostu, Allahın inandığı, əmin olduğu hz. Məhəmməd (s.a.s.), sənin ümmətindən olan çarəsiz Ayniyə şəfaət et)

**Mehmed:**
Sıfatı Sadıkul-Vadül-Əmindür,
Siracül-Evvelin ü Ahirindür.[330]
(Onun sifəti vədinə, əhdinə sadiq olandır. O, əvvəl və axırın yanar çırağıdır)

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) ƏHDƏ VƏFASI

Hz.Nizami on birinci beytin birinci misrasında hz. Məhəmmədin (s.a.s.) doğruçuluğunu, əmanəti qorumasını, uca Allah (c.c.), öz ruhu və insanlıq qarşısındakı sədaqətini onun əxlaqının təməllərindən biri olan əhdə vəfa ilə ifadə etmişdir. Bu ilahi əxlaq ölçüsü hz. Məhəmmədə (s.a.s.) güc qazandırmış, onu sevdirmiş, insanları ona bağlamış, insanlar könlünü ona etibar etmiş, bu uca özəllik düşmənlərini susdurmuşdur.

Hz.Nizami, hz.Məhəmmədin (s.a.s.) əhdinə vəfasının davamlı olduğunu, heç vaxt, heç bir şəraitdə əhdindən dönmədiyini ifadə etmək üçün «əlif» hərfinin yazılış şəklindən istifadə etmişdir. Şair bu nətdə «əlif»dən hz.Məhəmmədin (s.a.s.) ilk olduğunu, «kamal fərmanı» aldığını, onun müəlliminin uca Allah (c.c.) olduğunu, ilahi elmə yiyələndiyini və əhdinə vəfalılığını bildirmək üçün istifadə etmişdir. «Əlif» düz yazıldığından, əyilmədiyindən hz.Məhəmmədin (s.a.s.) əhdə vəfasını gözəl anlatmışdır.

[330] Emine Yeniterzi, göstərilən qaynaq, s. 196.

Hz.Nizami bu beytdə də Qurandan, hədisdən süzülüb gələn ideyanı əyaniləşdirmişdir.

Hz. Nizami beytin ikinci misrasında hz. Məhəmmədin (s.a.s.) ilk və son olduğunu daha açıq bir biçimdə təqdim etmişdir:

**«Və bütün Peyğəmbərlərdən ön və son olmuş»**

Biz öncəki beytlərin şərhində ilk və son peyğəmbər anlayışlarını geniş şərh etmişik. Ancaq bu beytdə maraqlı cəhət odur ki, hz. Nizami bu anlayışı əhdə vəfa əxlaqi ölçüsü ilə bir arada dilə gətirmişdir. Bunun bir anlamı varmı? İlk misradakı «əlif» ilklik anlayışını zaman baxımından ifadə etdiyi kimi, bu misrada da dəyər, keyfiyyət olaraq ifadə edir. Yəni hz. Məhəmməd (s.a.s.) ilk və son peyğəmbər olduğu kimi bütün ölçülərdə, o sıradan əhdə vəfada da ilkdir, sondur, bu məsələdə də onun kimi olan yoxdur. Onun əhdə vəfası bu anlayışın son ölçüsüdür. O, hər şeyi tamamladığı kimi («Mən gözəl əxlaqı tamamlamaq üçün göndərildim») «əhdə vəfa» qavramının yükünü tamamladı, son həddi müəyyən etdi.

Təbii ki, bütün peyğəmbərlər əhdə vəfalıdır. Ancaq hz.Məhəmməd (s.a.s.) əhdə vəfanın son həddidir.

**Hz. Nizaminin ilk və son anlayışını sıx-sıx, ayrı-ayrı yollarla təkrar etməsinin hikməti bir də onunla bağlıdır ki, o, peyğəmbərləri bir silsilə kimi, bir işin ayrı-ayrı mərhələləri kimi görür.** Bu ilahi vəzifənin ən son daşıyıcısı hz.Məhəmməd (s.a.s.) olduğundan ona ayrıca yer ayırır, ona uymağı, ona yönəlməyi istəyir. Allahın (c.c.) dinini son peyğəmbər hz.Məhəmmədlə (s.a.s.) tamamlamasını əhdə vəfanın zirvəsi sayır, uca Allahın (c.c.) peyğəmbərə olan inamının ölçüsü hesab edir.

Allah (c.c.), hz.Məhəmmədi (s.a.s.) seçdi, onu sevdi, ona «dostum» dedi, ona tam etibar etdi və ilahi kitabı ona əmanət olaraq endirdi. İnamın qarşılığı da əhdə vəfadır.

Hz.Məhəmməd (s.a.s.) də peyğəmbərlər silsiləsini tamamladığını çox obrazlı bir biçimdə bildirib. Əbu Hureyrə (r.a.) rəvayət edir: «Hz.Peyğəmbər (s.a.s.) belə buyurdu: «Mənim misalım ilə başqa peyğəmbərlərin misalı köşədə bir kərpiclik yer boş qalmaqla ən gözəl və ən yaxşı şəkildə bir ev tikən kimsəyə bənzəyir. İnsanlar içini dolaşmağa başlayıb bu kimsəyə heyrət edərək: «Bura bir kərpic qoyulması lazım deyilmi?», - deyərlər. Mən məhz o, kərpicəm, mən peyğəmbərlərin sonuncusuyam».[331]

Hz.Nizami əhdə vəfa anlayışını toplumun sağlam yaşamasının başlıca şərtlərindən biri sayıldığından bu qavramın, bu əxlaqi ölçünün gerçək anlamını vermişdir, onun Allah buyruğu, peyğəmbər əxlaqı olduğunu açıqlamışdır. İnsanları bu ilahi əxlaqa sahib çıxmağa çağırmışdır. Gerçəkdən də insanlar əhdə vəfa göstərsələr, bütün pisliklər aradan qalxar, insan Allah, insanlararası və insan toplum münasibətləri yoluna düşər.

Bütün Peyğəmbərlərin gözəlliklərini özündə birləşdirən hz.Məhəmmədin (s.a.s.) əhdə vəfasını onun ilk və son olması ilə bir arada ifadə edən hz.Nizaminin bir məqsədi də var. Şair bu beytdə, əslində, hz.Məhəmməd (s.a.s.) yolu ilə bütün peyğəmbərlərin mübarək sözünü bizə çatdırır. «Əhdə vəfa» bütün elçilərin ortaq dəyəridir. Onlar bizdən əhdə vəfa istəyirlər. Çünki son olmaq həm də öncəkilərin və sonrakıların yükünü öz üzərinə götürmək deməkdir. Öncəki peyğəmbərlər və sonrakı insanlar qarşısındakı əhdə vəfa hz.Məhəmmədin (s.a.s.) ilahi vəzifəsinin tərkib hissəsidir.

---

[331]Sahihi-Buxari, göstərilən qaynaq, s. 433.

Əhdə vəfa anlayışı bir də vəziyyətlə bağlı bir qavramdır. Səndən öncəki bir irsə sahib olur, sonra onu sənə vəsiyyət edir. Sənin əhdə vəfan bu əmanətə olan sədaqətlə ölçülür. Talha b. Musarrif belə deyir: «Abdullah b. Əbu Əvfaya (r.a.) : «Hz. Peyğəmbərin (s.a.s.) bir vəsiyyəti oldumu?», - dedim. O da: «Xeyr», dedi. Mən: «Bu necə ola bilər? Vəsiyyət etmək insanlara əmr olunmuşdur», dedim. O da: «Allahın kitabına sarılmağı vəsiyyət buyurdu», dedi».[332]

Deməli, uca Allah (c.c.) bizim qurtuluşumuz xatirinə bizdən əhdə vəfa tələb edir, hz.Məhəmməd (s.a.s.) bu dünya və axirət xoşbəxtliyimiz üçün bizdən əhdə vəfa istəyir. Hz. Nizami (s.a.s.) insan kimi yaşamaq üçün bizi Allaha (c.c.) və Peyğəmbərə (s.a.s.) vəfa göstərməyə çağırır.

---

[332] Sahihi-Buxari, göstərilən qaynaq, s. 339-340.

## ON İKİNCİ BEYTİN ŞƏRHİ: O, «OL!» PƏRGARININ ƏN İŞIQLI NÖQTƏSİDİR

Hz. Nizami nətin on ikinci beytində hz. Məhəmmədi (s.a.s.) başqa bir yöndən təqdim edir.

نقطه روشن تر پرگار کن
نکته پرگار ترین سخن

***O, (Məhəmməd) «Ol!» pərgarının ən işıqlı nöqtəsidir,***
***O, ən böyük sözün (kainatın sözünün) nöqtəsidir.***[333]

Öncə onu deyək ki, fars dilindən tərcümədə bu beyt belə verilmişdir:

***O, (Allahın buyruğu ilə) yaranmış dairənin (kainatın) ən işıqlı nöqtəsidir,***
***O, bütün deyilmiş sözlərin ən (gözəl) nöqtəsidir.***[334]

## HƏZRƏT NİZAMİNİN XƏYAL GÜCÜ

Bu beytdə də hz. Nizami üslubuna sadiq qalaraq ideyanı əyaniləşdirən, onu görümlü edən obrazdan istifadə etmişdir. Öncəki beytlərdə olan «əlif», «lövhə», «dal», «mim», «günbəz», «turunc», «möhür», «Ay», «zəbərcəd daşlı qaş», «halqa», «sahəölçən» kimi hz.Məhəmmədi (s.a.s.) və onun ilahi missiyasını təqdim edən obrazları bu beytdə «Ol!» «pərgarı» və «nöqtə» obrazı əvəz etmişdir. Hz.Nizami bu iki mükəmməl obrazı böyük mənalarla yükləmişdir. O, bu obrazlarla kainatın yaradılışını, hz.Məhəmmədin (s.a.s.) bu yaradılışdakı yerini göstərmişdir.

## HƏZRƏT MƏHƏMMƏD (s.a.s.) KAİNATIN DAYAQ NÖQTƏSİDİR

Bilindiyi kimi, pərgar bir alətdir. Ondan dairə, çevrə çəkmək üçün istifadə edirlər. Hz.Nizami bu aləti adilikdən

---

[333] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.
[334] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.

çıxararaq ondan yaradılışı anlatmaq üçün istifadə etmişdir. **Misrada «Ol! pərgarı»nın sahibi Allahdır (c.c.), bu pərgarla çəkilən dairə kainatdır. Deməli, kainatın yaradıcısı Allahdır (c.c.). Adından da göründüyü kimi pərgarın qolları var. Bu qolların biri dayaq nöqtəsinə dayanaraq dairə, çevrə çəkə bilir. Hz.Nizaminin düşüncəsində hz.Məhəmməd (s.a.s.) kainatın yaradılışının dayaq nöqtəsidir. Bu dayaq, söykəniləcək nöqtə olmasa, kainatın yaradılışı mümkün deyil.**

## «YASİN» SURƏSİNİN 82-Cİ AYƏSİ

Əslində, hz.Nizami bütün nət boyu bir ideyanı ayrı-ayrı yönlərdən, ayrı-ayrı obrazlarla təqdim etmişdir. O, hz. Məhəmmədin (s.a.s.) ilk və son peyğəmbər olduğuna, qüdrət sahibi Allahın (c.c.) aləmləri onun xatirinə yaratdığına inanan şairdir. Hz. Nizami bu beytin birinci misrasında Qurani-Kərimdə dünyanın yaradılışını anladan ayələri, ayrıca olaraq «Yasin» surəsinin 82-ci ayəsini şərh etmişdir. Qurani-Kərimdə kainatın yaradıcısının Allah (c.c.) olduğu sıx-sıx vurğulanır:

أَوَلَمْ يَنظُرُواْ فِي مَلَكُوتِ السَّمَاوَاتِ وَالأَرْضِ وَمَا خَلَقَ اللّهُ مِن شَيْءٍ
وَأَنْ عَسَى أَن يَكُونَ قَدِ اقْتَرَبَ أَجَلُهُمْ فَبِأَيِّ حَدِيثٍ بَعْدَهُ يُؤْمِنُونَ

(Əraf, 7/185)

«Məgər onlar göylərin və yerin mülkünə, Allahın yaratmış olduğu hər şeyə əcəllərinin yaxınlaşması ehtimalına diqqət yetirib düşünmürlərmi? Artıq buna (Qurana) inanmadıqdan sonra hansı kəlama inanacaqlar?».

تَبَارَكَ الَّذِي بِيَدِهِ الْمُلْكُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ . الَّذِي خَلَقَ الْمَوْتَ وَالْحَيَاةَ
لِيَبْلُوَكُمْ أَيُّكُمْ أَحْسَنُ عَمَلاً وَهُوَ الْعَزِيزُ الْغَفُورُ الَّذِي خَلَقَ سَبْعَ سَمَاوَاتٍ
طِبَاقاً مَّا تَرَى فِي خَلْقِ الرَّحْمَنِ مِن تَفَاوُتٍ فَارْجِعِ الْبَصَرَ هَلْ تَرَى مِن
فُطُورٍ ثُمَّ ارْجِعِ الْبَصَرَ كَرَّتَيْنِ يَنقَلِبْ إِلَيْكَ الْبَصَرُ خَاسِأً وَهُوَ حَسِيرٌ

(Mülk, 67/1-4)

«Hökm əlində olan Allah nə qədər ucadır. O, hər şeyə qadirdir! Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq üçün ölümü və həyatı yaradan Odur. O, yenilməz qüvvət sahibidir, bağışlayandır. Yeddi göyü qat-qat yaradan da Odur. Sən rəhmanın yaratdığında heç bir uyğunsuzluq görə bilməzsən. Bir gözünü qaldırb bax, heç orada bir yarıq görə bilərsənmi?!»

Qurani-Kərimin «Yasin» surəsinin 82-ci ayəsində uca Allah (c.c.) kainatı «Ol» əmri ilə yaratdığını buyurur:

أَوَلَيْسَ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ بِقَادِرٍ عَلَى أَنْ يَخْلُقَ مِثْلَهُم بَلَى
وَهُوَ الْخَلَّاقُ الْعَلِيمُ إِنَّمَا أَمْرُهُ إِذَا أَرَادَ شَيْئاً أَنْ يَقُولَ لَهُ كُنْ فَيَكُونُ
فَسُبْحَانَ الَّذِي بِيَدِهِ مَلَكُوتُ كُلِّ شَيْءٍ وَإِلَيْهِ تُرْجَعُونَ

(Yasin, 36/81-83)

«Göyləri və yeri yaradan, onlar kimisini yaratmağa qadir deyildirmi? Əlbəttə, qadirdir. Çünki O, hər şeyi yaradandır, hər şeyi biləndir. Onun əmri bir şeyi diləyincə ona sadəcə «Ol!» deməkdir. O da həmən olur. O halda hər şeyin mülkü və idarəsi qüdrət əlində olan Allah (nöqsanlıqlardan) uzaqdır. Siz ancaq Ona qaytarılacaqsınız».

Bilindiyi kimi, «Yasin» surəsi Məkkədə nazil olmuşdur. Bu surə 83 ayədir. Qurani-Kərimin 36-cı surəsi nüzul sırasına görə 41-ci surədir. Adı ərəb əlifbasının «ya» və «sin» hərflərinin birləşməsindən yaranmışdır. Bu adın anlamı ilə bağlı iki görüş var. Bir sıra təfsirçilərə görə bu ad Quranın başqa ayələrində də olan gizli, şifrəli, anlamını ancaq Allahın bildiyi (c.c.) hərf birləşməsidir. Başqa alimlərə görə isə «Yasin» iki ayrı hərf deyil, anlamı olan bir sözdür və «Ey, insan» deməkdir. Bu təfsirçilərə görə «… burada kendisine

hitap edilen kişi ise hz.Muhammeddir. Hatta Said b. Cubeyrden bunun Resulullah isimlerinden biri olduğu da rivayet edilmişdir. Bu kelimenin Allah isimlerinden biri olup burada o isme yemin edildiyi, söze başlama ifadesi ve Kuranın isimlerinden olduğu görüşleri de vardır».[335]

«Yasin» surəsinin çox oxunmasının, ona ayrıca yer verilməsinin anlamı onunla bağlıdır ki, Qurani-Kərimin bu mübarək surəsində islam dininin dayaqları açıqlanmışdır. Quranın canı olan Allahın (c.c.) birliyi, peyğəmbərlik və axirət anlayışları bu surədə yer tutmuşdur:

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ
يس . وَالْقُرْآنِ الْحَكِيمِ . إِنَّكَ لَمِنَ الْمُرْسَلِينَ . عَلَى صِرَاطٍ مُّسْتَقِيمٍ
(Yasin, 36/1-4)

«Rəhman və Rəhim olan Allahın adı ilə. Ya-sin. Hikmət dolu Qurana and olsun. Ki sən şübhəsiz doğru bir yolda yürümək üzərə göndərilmiş peyğəmbərlərdən birisən…».

إِنَّا نَحْنُ نُحْيِي الْمَوْتَى وَنَكْتُبُ مَا قَدَّمُوا وَآثَارَهُمْ وَكُلَّ شَيْءٍ أحْصَيْنَاهُ فِي إِمَامٍ مُبِينٍ
(Yasin, 36/12)

«Şübhəsiz, ölüləri dirildəcək olan bizik. Onların gələcək üçün etdikləri hər şeyi və qoyduqları hər izi də yazmaqdayıq. Onsuz da biz hər şeyi açıq bir ana kitaba qeyd etmişik».

فَسُبْحَانَ الَّذِي بِيَدِهِ مَلَكُوتُ كُلِّ شَيْءٍ وَإِلَيْهِ تُرْجَعُونَ
(Yasin, 36/83)

«Hər şeyin hakimiyyəti öz əlində olan Allah bütün qüsurlardan uzaqdır və hamınız sonunda ona qaytarılacaqsınız».

---

[335] Kuran yolu, göstərilən qaynaq, c. IV, s. 425.

«Yasin» surəsinin bu və başqa ayələrində Allahın (c.c.) birliyi, peyğəmbərlik və axirət kimi dinin üç başlıca təməli şərh olunmuşdur. Bundan başqa, hz.Məhəmməd (s.a.s.) «Yasin» surəsi ilə bağlı belə buyurmuşdur: « «Yasin» surəsi Quranın qəlbidir, «Fatihə» surəsi Quran surələrinin ən fəzilətlisidir, «Ayətül-Kürsi» Quran ayələrinin əfəndisidir, «Qul hüvəllahü əhəd» surəsi Quranın üçdə birinə bərabərdir».[336]

Səhabələrdən İbn Abbas (r.a.) bu surənin son ayəsi ilə bağlı belə buyurur: «Yasin»in və onu oxumağın nə üçün bu qədər fəzilətli olduğunu bilmirdim. Deməli, bu ayədən (son ayədən) ötrü imiş».[337]

Hz. Nizaminin beytin birinci misrasında işarə etdiyi, «Ol! pərgarı» adlandırdığı Quranın 82-ci ayəsinin də fərqli təfsirləri var. Bu ayəni bir də oxuyaq:

إِنَّمَا أَمْرُهُ إِذَا أَرَادَ شَيْئاً أَنْ يَقُولَ لَهُ كُنْ فَيَكُونُ

(Yasin, 36/82)

«Onun əmri bir şeyi diləyəndə ona sadəcə «Ol!» deməkdir. O da o an olur».

Ayədəki «Ol!» əmri ilə bağlı «Zemahşeri buradakı ifadenin Allah Tealanın evrendeki egemenliginin mutlak olduğunu, irade buyurduğu bir şeyi gerçekleşdirmek için vasitaya ihtiyacının bulunmadığını ve Onun haqqında çetinlik, yorğunluk kibi yaratılmışlara ait kusurların düşünülemeyeceyini vurğulayan mecazi bir anlatım olduğu kanaatindedir. Katade bu ayetin tefsiriyle ilgili olaraq Arap dilinde «kün» (ol) demekten daha kolay bir ifade bulunmadığını belirtir».[338]

---

336 Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 92.
337 Kuran yolu, göstərilən qaynaq, c. IV, s. 424.
338 Kuran yolu, göstərilən qaynaq, c. IV, s. 456.

Başqa yorumlara görə, qüdrət sahibi Allah (c.c.) «Ol!» əmri verərkən ruhlar və cisimlər aləmi, bitkilər, heyvanlar və insanlar yaradılmışdır. Bu ayə «kon», «kon fəkan», ya da «kaf və nun» rəmzləri ilə də şərh edilmişdir.

Uca Allahın «Ol!» əmri təkcə «Yasin» surəsində deyil, bir sıra başqa surələrdə də ifadə edilmişdir:

بَدِيعُ السَّمَاوَاتِ وَالأَرْضِ وَإِذَا قَضَى أَمْراً فَإِنَّمَا يَقُولُ لَهُ كُن فَيَكُونُ

(Bəqərə, 2/117)

«O, göylərin və yerin yoxdan var edicisidir. O, bir işin olmasını istədikdə ona yalnız «Ol!» deyər. O da o an olar».

قَالَتْ رَبِّ أَنَّى يَكُونُ لِي وَلَدٌ وَلَمْ يَمْسَسْنِي بَشَرٌ قَالَ كَذَلِكِ اللّهُ يَخْلُقُ مَا يَشَاءُ إِذَا قَضَى أَمْراً فَإِنَّمَا يَقُولُ لَهُ كُن فَيَكُونُ

(Ali-İmran, 3/47)

«Məryəm: «Ey Rəbbim mənə bir bəşər toxunmadığı haldı necə uşağım ola bilər», dedi. Allah: «Allah nəyi diləsə, yaradar. O, bir əmri istəyəndə sadəcə ona «Ol!» deyər, o da olar», buyurdu».

إِنَّ مَثَلَ عِيسَى عِندَ اللّهِ كَمَثَلِ آدَمَ خَلَقَهُ مِن تُرَابٍ ثِمَّ قَالَ لَهُ كُن فَيَكُونُ

(Ali-İmran, 3/59)

«Doğrusu, Allah yanında İsanın durumu Adəmin durumu kimidir. Onu torpaqdan yaratdı, sonra da Ona «Ol!» dedi. O da o an oldu».

وَهُوَ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالأَرْضَ بِالْحَقِّ وَيَوْمَ يَقُولُ كُن فَيَكُونُ قَوْلُهُ الْحَقُّ وَلَهُ الْمُلْكُ يَوْمَ يُنفَخُ فِي الصُّوَرِ عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ وَهُوَ الْحَكِيمُ الْخَبِيرُ

(Ənam, 6/73)

«Göyləri və yeri haqqıyla yaradan odur. Bir şeyə «Ol!» dediyi gün o an olur. Onun dediyi haqqdır. «Sur»a üfü-

rüldüyü gün də mülk ancaq Onundur. O, gizlini və açığı biləndir. O, hikmət sahibidir və hər şeydən xəbərdardır».

إِنَّمَا قَوْلُنَا لِشَيْءٍ إِذَا أَرَدْنَاهُ أَن نَّقُولَ لَهُ كُن فَيَكُونُ

(Nəhl, 16/40)

«Biz bir şeyi dilədiyimiz zaman ona sözümüz sadəcə «Ol!» demək olur, o da o an olur».

مَا كَانَ لِلَّهِ أَن يَتَّخِذَ مِن وَلَدٍ سُبْحَانَهُ إِذَا قَضَى أَمْراً فَإِنَّمَا يَقُولُ لَهُ كُن فَيَكُونُ

(Məryəm, 19/35)

«Allahın oğlu olması heç bir zaman olan bir şey deyildir. O, bundan uzaqdır. O, bir şeyin olmasını diləyərsə, ona «Ol!» deyər, o da olar».

هُوَ الَّذِي يُحْيِي وَيُمِيتُ فَإِذَا قَضَى أَمْراً فَإِنَّمَا يَقُولُ لَهُ كُن فَيَكُونُ

(Mömin, 40/68)

«O həm dirildir, həm öldürür. O, bir şey etmək (yaratmaq) istədikdə ona sadəcə «Ol!» deyər, o da olur».

Təsəvvüf məktəbi də bu «Ol!» əmrini və hz. Məhəmmədin (s.a.s.): «Mən bir gizli xəzinə idim. Bilinmək istədim və xalqı (varlıq aləmlərini və insan) yaratdım» hədisini (bu hədisin səhih olmadığını bildirənlər də var) şərh edərkən fərqli görüş ifadə etmişdir. Onlara görə, bütün varlıq Allahı (c.c.) tanımaq üçün yaradılıb. Bu hədisdə işarə edilən «gizlin xəzinə» Allahın (c.c.) birliyidir, o batinlərin batinidir. Onun bir adı da həqiqəti-Məhəmmədiyədir. O, bütün varlıqlardan öncə yaradıldığı üçün ona həqiqətlərin həqiqəti deyilir.

Təsəvvüf məktəbinə görə, uca Allah (c.c.) öz birliyini görmək üçün hz. Məhəmmədi (s.a.s.), Onun nurundan da bütün varlıq aləmlərini və insanı yaratmışdır. Hz.Peyğəmbər (s.a.s.), həqiqəti-Məhəmmədiyə olmasa idi, uca Allah (c.c.) cövhərlərini üzə çıxarmazdı. İlk yaradılan cövhər, Allahın

(c.c.) ilk təcəllisi hz.Peyğəmbərin nurudur. Bu nur hz. Adəmdən (s.a.s.) başlayaraq bütün peyğəmbərlərə keçmiş, sonda hz.Məhəmməd də (s.a.s.) görünmüşdür. O, uca Allaha (c.c.) bir ayna olmuşdur.

## DİVAN ƏDƏBİYYATINDA «OL!» ƏMRİ

Bu deyilən anlamı, «Ol!» əmrini anladan şeirlərə baxaq:

**Saleh Baba:**

Senin şanında geldi «kün» hitabı,
Muallimsin begim yüz dörd kitabı.[339]

(«Ol!» əmri aləmlərin yeganə yaradılış səbəbi olan hz. Məhəmmədin (s.a.s.) şanını bildirmək üçün gəlmişdir. O, bir öyrədicidir).

**Rəvaniyə** görə «kon» (ol) əmri olmaq mənasındakı «kövn» məsdərindən yaranıb. Bu isə iki aləm (kövneyn), cisimlər və ruhlar aləmi olan dünya və axirətdir. Bu iki dünyanın «ol!» əmri ilə yaradılmasındakı bircə məqsəd hz.Məhəmməddir (s.a.s.).

**Rəvani:**

Bu dünya oldı iki harf ile zeyn,
«Ol» olmasaydı, olmaz idi kevneyn.[340]

(Bu dünya iki hərflə yaradıldı. Hz. Məhəmməd olmasa idi, aləm yaranmazdı, bu dünya və axirət olmazdı, o, iki dünyanın şərəfidir)

**Qara Fəzli:**

Zübde-i «kün fekan» Muhammeddür,
Gevher-i lamekan Muhammeddür.[341]

---

[339] Emine Yeniterzi, göstərilən qaynaq, s. 97.
[340] Emine Yeniterzi, göstərilən qaynaq, s. 97.
[341] Emine Yeniterzi, göstərilən qaynaq, s. 97.

(«Ol!» əmri ilə gələn hz.Məhəmməddir (s.a.s.). Məkansız gövhər hz. Məhəmməddir (s.a.s.). «Ol!» əmrinin verilməsinin səbəbi və məqsədi hz. Məhəmməddir (s.a.s.).

**Şəhri:**

Sen olmasan, ol «kenz-i mahfi»,
İtmezdi cevahirin nümayan.[342]

(Sən olmasa idin, o gizli xəzinə (yuxarıdakı hədisə işarə) öz cəvahirini göstərməzdi).

**Niyazi-Misri:**

Zuhur-i kainatun madinisin, ya Resulullah,
Rumuz-i «küntü kenz»ün mahzenisin, ya Resulullah.[343]

(Ey Allahın elçisi, sən kainatın yaradılışının rəmzlərini (elmini) bilən tək insansan).

**Osman Kəmali:**

Rumuz-i «küntü kenz»in gevheri zat-ı şerifindir,
Melaz u melce-i üftadegansın, ya Resulullah.[344]

(Ey Allahın elçisi, sən gizli xəzinənin sirlərinin cövhərisən. Bu cövhər nuri- Məhəmməddir (s.a.s.). Yəni, Allahın gizli xəzinələrinin sirləri, onların mənaları hz.Məhəmmədlə (s.a.s.) üzə çıxmışdır).

**Nəsimi:**

«Küntü kenz»ün mənası səndən açıldı aləmə,
Ey bəyanun ilm içində həm dəlil ü rəhnüma.[345]

---

[342] Emine Yeniterzi, göstərilən qaynaq, s. 151.
[343] Emine Yeniterzi, göstərilən qaynaq, s. 151.
[344] Emine Yeniterzi, göstərilən qaynaq, s. 152.
[345] Emine Yeniterzi, göstərilən qaynaq, s. 152.

(Gizli xəzinənin mənası səndən aləmə açıldı, Sən, Allahın varlığının dəlili və doğru yolu göstərənsən).

**Şeyxoğlu Mustafa:**

Ki yani gizlü genci çü zahir,
Muhammed bunda evveldür hem ahır.[346]

(Gizli xəzinə göründü. Məhəmməd (s.a.s.) peyğəmbərlik silsiləsinin sonudur, ancaq o, yaradılışda ilkdir).

«Yasin» surəsinin təkcə 82-ci ayəsi deyil, bu surənin adı da hz.Məhəmmədin (s.a.s.) başqa adları ilə birlikdə anılır. Divan şairləri «Yasin» surəsini uca Allahın (c.c.) hz.Məhəmmədə (s.a.s.) müraciəti kimi dəyərləndirirlər:

**Mehmed:**

Nida oldı anna Levlak tayın,
Sena yazıldı hem «Ta-Ha»vü «Ya-sın».[347]

(Ona (hz. Məhəmmədə) «Sən olmasan, sən olmasan, fələkləri yaratmazdım» nida olundu. «Taha» və «Yasin» sənə yazıldı).

**Füzuli:**

Necə təqrir edəyim vəsfini ol şahin kim,
Ana vassaf ola «Yasin» ü muarrif «Ta-Ha».[348]

(O şahın (hz. Məhəmmədin (s.a.s.) gözəlliyini necə vəsf edim. Onu «Yasin» və «Taha» vəsf etmişdir).

**İffət Bursəvi:**

---

[346] Emine Yeniterzi, göstərilən qaynaq, s. 152.
[347] Emine Yeniterzi, göstərilən qaynaq, s. 202.
[348] Emine Yeniterzi, göstərilən qaynaq, s. 202.

Kıldı envar-i cebinünden tecelli zat-ı Hak,
Aleme mırat-i vahdetdür cemal-i Mustafa.[349]

(Uca Allah (c.c.) zatının nurundan yaratdı. Hz. Məhəmmədin (s.a.s.) gözəl üzü aləmin birlik güzgüsüdür.)

Hz. Nizaminin beytinin birinci misrasındakı «Ol pərgarı» anlayışı Quranda, hədislərdə, divan, təsəvvüf ədəbiyyatında ifadə olunmuş mənalarla üst-üstə düşür. «Ol pərgarı» kürə şəklində olan aləmi yaradır. «Ol pərgarı»nın dayaq nöqtəsi, hz. Nizaminin ifadə etdiyi kimi «ən işıqlı nöqtəsi» hz.Məhəmməddir (s.a.s.). Bu «ən işıqlı nöqtə»dən bütün aləmə işıq yayılır, bu dayaq nöqtəsindən aləm nura boyanır.

## HƏZRƏT NİZAMİNİN NÖQTƏYƏ VERDİYİ MƏNA

**Hz. Nizami bir beytdə iki dəfə nöqtə sözü işlətmişdir. Nöqtə bir şeyin sonu demək olduğu kimi, bir məsələnin canı, icmalı da deməkdir. Hz. Nizami beytin birinci misrasında «nöqtə» anlayışının dayaq, əsas mənalarını önə çəkmişdir. İkinci misrada isə «nöqtə» anlayışı deyilmiş bütün sözlərin sonu və ən gözəli olan Quranı və uca Allahın (c.c.) son peyğəmbəri olan hz. Məhəmmədi (s.a.s.) təmsil edir.**

Bilindiyi kimi, uca Allah (c.c.) Qurani-Kərimi göndərməklə insanlıq üçün son sözünü tamamlamış oldu. Bu son ilahi sözü çatdırmaq da son peyğəmbər hz.Məhəmmədə (s.a.s.) nəsib oldu. Ondan sonra peyğəmbər gəlməyəcək. Peyğəmbərlik silsiləsi hz.Məhəmmədlə (s.a.s.) tamamlanmışdır. Bu özəlliyinə görə, hz. Məhəmmədin

[349] Emine Yeniterzi, göstərilən qaynaq, s. 233.

(s.a.s.) bir adı da «Xatəm»dir. «Xatəm» sözü həm son, həm də möhür anlamındadır. Hz. Nizaminin beytində işlənən «ən işıqlı nöqtə», «ən gözəl nöqtə» xatəm, axır anlayışlarını da ehtiva edir, hz.Məhəmmədin (s.a.s.) yetkinliyini, onun gətirdiyi ilahi mesajın tamlığını, qiyamətədək sürəcəyini anladır. O, ən gözəl sözün, ən doğru sözün – Qurani-Kərimin son nöqtəsidir. Qurani-Kərim Allah kəlamıdır. Kəlam da uca Allahın sifətlərinin sonuncusudur:

حُرِّمَتْ عَلَيْكُمُ الْمَيْتَةُ وَالْدَّمُ وَلَحْمُ الْخِنْزِيرِ وَمَا أُهِلَّ لِغَيْرِ اللّهِ بِهِ وَالْمُنْخَنِقَةُ وَالْمَوْقُوذَةُ وَالْمُتَرَدِّيَةُ وَالنَّطِيحَةُ وَمَا أَكَلَ السَّبُعُ إِلاَّ مَا ذَكَّيْتُمْ وَمَا ذُبِحَ عَلَى النُّصُبِ وَأَن تَسْتَقْسِمُواْ بِالأَزْلاَمِ ذَلِكُمْ فِسْقٌ الْيَوْمَ يَئِسَ الَّذِينَ كَفَرُواْ مِن دِينِكُمْ فَلاَ تَخْشَوْهُمْ وَاخْشَوْنِ الْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِي وَرَضِيتُ لَكُمُ الإِسْلاَمَ دِيناً فَمَنِ اضْطُرَّ فِي مَخْمَصَةٍ غَيْرَ مُتَجَانِفٍ لِّإِثْمٍ فَإِنَّ اللّهَ غَفُورٌ رَّحِيمٌ

(Maidə, 5/3)

«Ölü heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə kəsilmiş, boğulmuş, vurulmuş, yıxılaraq ölmüş, vurulub gəbərmiş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilmiş-canı çıxmamış kəsdiyiniz heyvanlar müstəsnadır-dikinə qoyulmuş daşlar üzərində kəsilmiş heyvanlar və fal oxları ilə pay bölmək sizə haram edildi. Bütün bunlar günahdır. Bu gün kafirlər dininizdən əllərini üzdülər. Onlardan qorxmayın, Məndən qorxun! Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq İslamı bəyənib seçdim. Kim aclıq üzündən naçar qalarsa, günaha meyl etmək marağında olmayaraq (zəruri ehtiyacını ödəyəcək qədər bu haram ətlərdən yeyə bilər). Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!».

Təfsirçilərin çoxu bu ayəni Quranın sonuncu ayəsi sayırlar. Bu ayə hz.Məhəmmədin (s.a.s.) vəfatından səksən bir, ya da səksən iki gün öncə, hicrətin onuncu ilində,

Zilhiccə ayının doqquzunda, Cümə günü, günortadan sonra Ərəfatda nazil olmuşdur. Bu ayədən sonra başqa heç bir ilahi buyruq yoxdur.

Son ayədə də uca Allah (c.c.) ilahi buyruqlara təslimiyyəti dinin əsası saydığını bəyan edir: «İnsanın özünü Allaha təslim etməsi (İslam), dinin təməli, ya da təməl prinsipi olaraq qəbul edilmişdir. Bu təslimiyyət yalnız Allaha inanmaqla deyil, eyni zamanda Onun əmrlərinə itaət etməklə tam ifadəsini tapır. Bu isə Quran mesajının tamamlandığının bildirilməsinin nə üçün Peyğəmbərə (s.a.s.) vəhy edilmiş olan son yasal buyruqları («Maidə» surəsinin üçüncü ayəsinin əvvəli nəzərdə tutulur – S.H.) ehtiva edən bir ayə mətninə yerləşdirilməsini açıqlayır».[350]

**Hz.Nizami, əslində, beytdə ilk nöqtə ilə – «Ol! Pərgarının ən işıqlı nöqtəsi» ilə son nöqtəsini – «deyilmiş sözlərin ən gözəl nöqtəsi»ni, bu yolla da ilk və sonu, əvvəl və axırı birləşdirmişdir. O, bu yolla bir daha, başqa bir biçimdə hz.Məhəmmədin (s.a.s.) ilk və son olduğunu ifadə etmişdir. Şairə görə, nübüvvətə giriş də hz.Məhəmməddir (s.a.s.), çıxış da.**

Şair **Nevi** öncəki peyğəmbərləri giriş, hz. Məhəmmədi isə (s.a.s.) nəticə sayır:

Cumleye gerçi zatı Hatimedür,
Garaz ol qayrılar mukaddimedür.[351]

(Hər şeyə (hamıya) sondur, başqaları (öncəki peyğəmbərlər) müqəddimədir).

**Taşlıcalı Yəhya:**

Mustafa vü Muhammed ü Mahmud,

---

[350] Muhammed Esed, göstərilən qaynaq, s. 185.
[351] Emine Yeniterzi, göstərilən qaynaq, s. 180.

Ahmed ü Mürsel ü Habib-i Vədud.
Çar- ismində mim-i temmet var,
Kıldı hatm-i nübüvvetin izhar.[352]

(Sənin dörd adında «mim» hərfi var. Bu peyğəmbərliyin sonunu ifadə etdi. Yəni, «xətm» sözü də bu «mim» hərfi ilə bitir).

Hz.Məhəmmədin (s.a.s.) ilk və son Peyğəmbər olması ilə bağlı ən gözəl şeirlərindən birini də **Xaqani** yazıb:

Sevdi ol nuru «Həbibim» dedi Hak,
Oldu didarına aşiqi-mutlak.
Ana teshir olunup mülk-i şuhud,
İzz ü devletle gelip buldu vücud.
Doldu avaze-i Ahmedle cihan,
Eyledi aşk-i ilahi galeyan.
Cümlenin evvelidir hatm-i rusül,
Dediler anın için «Mehaz-i kül».[353]

(Uca Allah (c.c.) o mübarək nuru sevdi və ona «Həbibim» deyə xitab etdi. Sonra da o sevgilinin gül üzünə aşiq oldu. Bütün yaradılış onun əmrinə verildi və hz.Məhəmməd (s.a.s.) izzət və dövlətlə bu aləmə təşrif buyurdu. Bununla da bütün cahan «Əhməd!, Əhməd!» sədalarıyla doldu . İlahi eşq coşdu, bir sel kimi axdı. Elə buna görə də peyğəmbərlərin sonuncusu olan hz.Məhəmməd (s.a.s.) yaradılmışların ilki oldu və ona «bütün yaradılmışların qaynağı» deyildi).

## BEYTİN BƏDİİ DƏYƏRİ

Hz.Nizami böyük ustalıqla adi şeyləri canlandıraraq onlara böyük məna vermiş və bağlı olduğu ideyanı poetik bir

[352] Emine Yeniterzi, göstərilən qaynaq, s. 180.
[353] Üsve-i-Hasene, göstərilən qaynaq, c. I, s. 54.

biçimdə təqdim etmişdir. **O, pərgarın imkanlarından yararlanaraq hərəkət anlayışı yaratmış, pərgarın cızdığı çevrəni yer kürəsinə, yaradılmış bütün aləmə bənzətmiş, bu yolla da öncəki beytlərdəki «lövhə», «firuzə rəngli kərpicdən tikilmiş səma», «saray behişti», «sahəölçən» kimi məkanlara birini də artırmışdır. Bu «Ol! pərgarı»nın cızdığı çevrə bütün yaradılmışları təmsil edir və yaradılmışlar nuru «Ol! pərgarı»nın dayaq nöqtəsindən – hz.Məhəmməddən (s.a.s.) alır. O dayaq nöqtə olmasa, aləm də yoxdur.**

**Hz.Nizami pərgarın hərəkət imkanından yararlanaraq bütün aləmin qiyamətədək bu nöqtənin başına dönəcəyi fikrini də ifadə etmişdir. O, hamıdan eyni məsafədə dayanır, hər şey ona möhtacdır, insan, toplum bu nöqtəyə yönəldikcə öz fitrətinə uyğun yaşayır.**

Bu an Mövləvilərin əbədi hərəkəti təmsil edən səma rəqsləri yada düşür. Hz.Nizami nöqtəni də iki yöndə dəyərləndirmişdir. Onun təqdimatında nöqtə dayaqdır, onsuz hərəkət yoxdur. Hz.Nizaminin düşüncəsində nöqtə həm də sondur. Bu anlayış içində nöqtə son peyğəmbəri hz.Məhəmmədi (s.a.s.) təmsil edir. Bu düşüncənin işığında, bu duyğunun iqlimində hz.Nizaminin beytini bir də oxuyaq:

***O, (hz. Məhəmməd (s.a.s.) «Ol!» pərgarının ən işıqlı nöqtəsidir,***

***O, bütün deyilmiş sözlərin ən (gözəl) nöqtəsidir.***

Buradakı «işıq», «nur» «Ol! pərgarının» cızdığı çevrəni-aləmi sonsuzadək aydınladacaq.

## ON ÜÇÜNCÜ BEYTİN ŞƏRHİ: ONUN KƏMƏRİNDƏN FƏLƏK BİÇİM TAPDI

Hz. Nizami on üçüncü beytdə hz.Məhəmmədin (s.a.s.) ədəb anlayışını şərh etmişdir.

از سخن او ادب آوازه ای
وز کمر او فلک اندازه ای

***Onun sözlərindən ədəb şöhrət tapdı,***
***Onun kəmərindən fələk biçim tapdı.***[354]

## QURANİ-KƏRİMƏ GÖRƏ SÖZ

Bu beytdə hz. Nizami «söz», «ədəb», «kəmər», «biçim» anlayışları üzərində gözəl bir ev tikmişdir. Bilindiyi kimi, hz.Məhəmmədin (s.a.s.) hər sözü ilahi qaynaqlıdır. O, heç vaxt öz həvəsinə, öz çıxarlarına uyaraq söz danışmadı. Ona görə sözün və davranışın doğruluq ölçüsü Qurandır. Bəs Qurana görə söz nədir? Qurana görə, insanın sözü və əməli ilahi nəzarət altındadır:

مَا يَلْفِظُ مِن قَوْلٍ إِلَّا لَدَيْهِ رَقِيبٌ عَتِيدٌ

(Qaf, 50/18)

«İnsan heç bir söz söyləməz ki, yanında onu gözləyən, yazmağa hazır olan bir mələk olmasın».

ذَلِكَ وَمَن يُعَظِّمْ حُرُمَاتِ اللَّهِ فَهُوَ خَيْرٌ لَّهُ عِندَ رَبِّهِ وَأُحِلَّتْ لَكُمُ الْأَنْعَامُ إِلَّا مَا يُتْلَى عَلَيْكُمْ فَاجْتَنِبُوا الرِّجْسَ مِنَ الْأَوْثَانِ وَاجْتَنِبُوا قَوْلَ الزُّورِ

(Hac, 22/30)

«(Ey insanlar! Həccin sizə vacib olan əməli) budur. Hər kəs Allahın haram buyurduqlarına hörmət etsə, bu, Rəbbi yanında onun üçün xeyirli olar. (Haram olduğu Maidə surəsində) sizə deyilənlərdən başqa, qalan heyvanlar sizə

---

[354] Nizami Gəncəvi, Sirlər Xəzinəsi, göstərilən qaynaq, s. 26.

halal edilmişdir. Belə olduğu təqdirdə murdar bütlərdən qaçın, yalan sözlərdən də çəkinin».

إِنَّ رَبَّكَ لَبِالْمِرْصَادِ

(Fəcr, 89/14)

«Heç şübhəsiz, Rəbbin davamlı görüb gözləməkdədir».

وَالَّذِينَ لَا يَشْهَدُونَ الزُّورَ وَإِذَا مَرُّوا بِاللَّغْوِ مَرُّوا كِرَاماً

(Furkan, 25/72)

«O kəslər ki, yalan yerə şahidlik etməz, faydasız bir şeylə rastlaşdıqları zaman onlardan üz çevirib vüqarla keçər (özünü ləyaqətlə aparıb onlara əhəmiyyət verməz)».

İslam peyğəmbəri doğru danışmağı, doğru sözü bir əxlaq, bir ədəb ölçüsü olaraq təbliğ etmişdir. Ona görə, doğru söz toplumun, insanın halını, ruhi sağlamlığını müəyyən edir. İslama görə, yalan yasaqdır:

قُلْ إِنَّمَا حَرَّمَ رَبِّيَ الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ وَالإِثْمَ وَالْبَغْيَ بِغَيْرِ الْحَقِّ وَأَن تُشْرِكُواْ بِاللّهِ مَا لَمْ يُنَزِّلْ بِهِ سُلْطَاناً وَأَن تَقُولُواْ عَلَى اللّهِ مَا لاَ تَعْلَمُونَ

(Əraf, 7/33)

«De ki: «Rəbbim ancaq açıq və gizli pislikləri, günahı və haqsız yerə sınırı aşmağı, Allaha ortaq qoşmağınızı və Allah haqqında bilmədiyiniz şeyləri söyləmənizi haram qılmışdır».

وَإِذَا فَعَلُواْ فَاحِشَةً قَالُواْ وَجَدْنَا عَلَيْهَا آبَاءنَا وَاللّهُ أَمَرَنَا بِهَا قُلْ إِنَّ اللّهَ لاَ يَأْمُرُ بِالْفَحْشَاء أَتَقُولُونَ عَلَى اللّهِ مَا لاَ تَعْلَمُونَ

(Əraf, 7/28)

«Pislik etdikləri zaman: «Atalarımızı bu yolda gördük». «Allah da bunu əmr etdi», deyənlərə de ki, Allah pisliyi əmr etməz. Allaha qarşı bilmədiyiniz şeylərimi söyləyirsiniz?»

وَقُل لِّعِبَادِي يَقُولُواْ الَّتِي هِيَ أَحْسَنُ إِنَّ الشَّيْطَانَ يَنزَغُ بَيْنَهُمْ إِنَّ الشَّيْطَانَ كَانَ لِلإِنْسَانِ عَدُوّاً مُّبِيناً

(İsra, 17/53)

«Qullarıma söylə: sözün ən gözəlini söyləsinlər, sonra şeytan aralarını pozar. Çünki, şeytan insanın acıq düşmənidir».

يَا نِسَاء النَّبِيِّ لَسْتُنَّ كَأَحَدٍ مِّنَ النِّسَاء إِنِ اتَّقَيْتُنَّ فَلَا تَخْضَعْنَ بِالْقَوْلِ فَيَطْمَعَ الَّذِي فِي قَلْبِهِ مَرَضٌ وَقُلْنَ قَوْلاً مَّعْرُوفاً

(Əhzab, 33/32)

«Sizdən hər kim Allaha və Rəsuluna itaət edib yaxşı işlər görsə, onun mükafatını ikiqat verərik. Biz onun üçün tükənməz ruzi hazırlamışıq».

Allahın (c.c.) sözü Qurandır. O, ən doğru sözdür. Uca Allah (c.c.) ədəbin, əxlaqın ilahi qaynağı olan Quranı, bu ilahi sözü könüllərin şəfası adlandırır:

قُلْ مَن كَانَ عَدُوّاً لِّجِبْرِيلَ فَإِنَّهُ نَزَّلَهُ عَلَى قَلْبِكَ بِإِذْنِ اللّهِ مُصَدِّقاً لِّمَا بَيْنَ يَدَيْهِ وَهُدًى وَبُشْرَى لِلْمُؤْمِنِينَ

(Bəqərə, 2/97)

«De ki: Cəbrailə kim düşmən isə bunu yaxşı bilsin ki, Allahın izni ilə Quranı sənin qəlbinə bir hidayət rəhbəri, öncə gələn kitabları doğrulayıcı, möminlər üçün də müjdəçi olaraq O endirmişdir».

Dinə görə, ilahi sözə, ilahi kitablara, ilahi kitabların sonuncusu olan Qurana inanmaq imanın əsaslarından biridir:

قُلْ يَا أَيُّهَا النَّاسُ قَدْ جَاءكُمُ الْحَقُّ مِن رَّبِّكُمْ فَمَنِ اهْتَدَى فَإِنَّمَا يَهْتَدِي لِنَفْسِهِ وَمَن ضَلَّ فَإِنَّمَا يَضِلُّ عَلَيْهَا وَمَا أَنَاْ عَلَيْكُم بِوَكِيلٍ

(Yunus, 10/108)

«De: «Ey insanlar! Artıq Rəbbinizdən sizə haqq gəlmişdir. Doğru yolu tutan özünə savab, doğru yoldan azan isə özünə günah qazanar. Mən sizə zamin deyiləm!».

وَبِالْحَقِّ أَنزَلْنَاهُ وَبِالْحَقِّ نَزَلَ وَمَا أَرْسَلْنَاكَ إِلاَّ مُبَشِّراً وَنَذِيراً وَقُرْآناً فَرَقْنَاهُ لِتَقْرَأَهُ عَلَى النَّاسِ عَلَى مُكْثٍ وَنَزَّلْنَاهُ تَنزِيلاً قُلْ آمِنُواْ بِهِ أَوْ لاَ

تُؤْمِنُواْ إِنَّ الَّذِينَ أُوتُواْ الْعِلْمَ مِن قَبْلِهِ إِذَا يُتْلَى عَلَيْهِمْ يَخِرُّونَ لِلأَذْقَانِ سُجَّداً وَيَقُولُونَ سُبْحَانَ رَبِّنَا إِن كَانَ وَعْدُ رَبِّنَا لَمَفْعُولاً . وَيَخِرُّونَ لِلأَذْقَانِ يَبْكُونَ وَيَزِيدُهُمْ خُشُوعاً

(İsra, 17/105-108)

«Biz Quranı haqq olaraq endirdik. Səni də ancaq müjdələyici və uyarıcı olaraq göndərdik. Quranı, insanlara bir-bir oxuyasan deyə onu ard-arda endirdik. De ki, siz ona istər inanın, istər inanmayın, bu bir gerçək ki, daha öncə özlərinə elm verilən kimsələrə o Quranı oxuyunca dərhal üzü üstə səcdəyə qapanırlar və «Rəbbimizi təsbih edərik. Rəbbimizin vədi mütləq yerinə yetirilir», deyərlər. Ağlayaraq üzüstə yerə qapanırlar. Quran oxumaq onların hörmətini artırır».

وَإِذَا لَمْ تَأْتِهِم بِآيَةٍ قَالُواْ لَوْلاَ اجْتَبَيْتَهَا قُلْ إِنَّمَا أَتَّبِعُ مَا يُوحَى إِلَيَّ مِن رَّبِّي هَـذَا بَصَآئِرُ مِن رَّبِّكُمْ وَهُدًى وَرَحْمَةٌ لِّقَوْمٍ يُؤْمِنُونَ

(Əraf, 7/203)

«Sən onlara bir ayə gətirmədiyin zaman: «Məgər sən onu öz tərəfindən uydurub düzəltməli deyildin?»,- deyə soruşarlar. De: «Mən ancaq Rəbbimdən mənə vəhy edilənlərə tabe oluram. Bu Rəbbimiz tərəfindən aşkar dəlillərdir. Həm də iman gətirən bir tayfa üçün hidayət və mərhəmətdir».

بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ

قُلْ أُوحِيَ إِلَيَّ أَنَّهُ اسْتَمَعَ نَفَرٌ مِّنَ الْجِنِّ فَقَالُوا إِنَّا سَمِعْنَا قُرْآناً عَجَباً . يَهْدِي إِلَى الرُّشْدِ فَآمَنَّا بِهِ وَلَن نُّشْرِكَ بِرَبِّنَا أَحَداً

(Cin, 72/1-2)

«De ki: Cinlərdən bir topluluğun Quranı dinləyib də: «Gerçəkdən biz doğru yola yönəldən xarüqaladə gözəl bir

Quran dinlədik, ona iman etdik. Artıq Rəbbimizə əsla ortaq qoşmayacağıq», dedikləri mənə vəhy olunmuşdur».

قُلْ هُوَ نَبَأٌ عَظِيمٌ .أَنتُمْ عَنْهُ مُعْرِضُونَ

(Sad, 38/67-68)

«De ki, siz ondan üz çevirirsiniz. Ancaq bu böyük bir xəbərdir».

وَلَوْ جَعَلْنَاهُ قُرْآناً أَعْجَمِيّاً لَّقَالُوا لَوْلَا فُصِّلَتْ آيَاتُهُ أَأَعْجَمِيٌّ وَعَرَبِيٌّ قُلْ هُوَ لِلَّذِينَ آمَنُوا هُدًى وَشِفَاء وَالَّذِينَ لَا يُؤْمِنُونَ فِي آذَانِهِمْ وَقْرٌ وَهُوَ عَلَيْهِمْ عَمًى أُوْلَئِكَ يُنَادَوْنَ مِن مَّكَانٍ بَعِيدٍ

(Fussilət, 41/44)

«Əgər Biz onu özgə bir dildə olan Quran etsəydik: «Məgər onun ayələri müfəssəl izah olunmalı deyildimi?! Bu nədir? (Quran) özgə dildə, (Peyğəmbər isə) ərəbdirmi?!,- deyərdilər. De: «O, iman gətirənlərə hidayətdir və şəfadır. İman gətirməyənlərin isə qulaqlarında karlıq var. O, (Quran) onları kor etmişdir. Onlar (sanki) uzaq bir yerdən çağırılırlar».

Hz.Nizami də hz.Məhəmmədlə (s.a.s.) bağlı «onun sözlərindən ədəb, şöhrət tapdı» deyir. Bütün peyğəmbərlərin, o sıradan hz.Məhəmmədin (s.a.s.) ilahi təyinatlı vəzifəsi bu ilahi sözü – Quranı şərh etmək, onu öyrətməkdir:

يَا بَنِي آدَمَ إِمَّا يَأْتِيَنَّكُمْ رُسُلٌ مِّنكُمْ يَقُصُّونَ عَلَيْكُمْ آيَاتِي فَمَنِ اتَّقَى وَأَصْلَحَ فَلاَ خَوْفٌ عَلَيْهِمْ وَلاَ هُمْ يَحْزَنُونَ

(Əraf, 7/35)

«Ey Adəm oğulları! Sizə öz içinizdən ayələrimi anladacaq peyğəmbərlər gələn zaman kim onlara qarşı

çıxmaqdan çəkinir və özünü islah edərsə, onlara qorxu yoxdur, onlar üzülməyəcəklər».

Nizamiyə görə, Peyğəmbər əxlaqının qaynağı Qurandır. Hz. Aişənin (r.a.) buyurduğu kimi, hz.Məhəmmədin əxlaqı Qurandır.

## HƏZRƏT MƏHƏMMƏDƏ (s.a.s.) GÖRƏ SÖZ

İndi də hz.Məhəmmədin (s.a.s.) dilindən sözün tərifini dinləyək. Abdullah ibni Məsud (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Şübhəsiz ki, sözdə və işdə doğruluq xeyirə və üstün yaxşılığa yönəldir. Yaxşılıq da cənnətə yönəldir. İnsan doğru söyləyə-söyləyə Allah yanında doğruçu kimi qeyd edilir. Yalançılıq yoldan çıxmağa sürükləyir. Yoldan çıxmaq da cəhənnəmə yönəldir. İnsan yalançılığı məslək edəndə Allah yanında çox yalançı kimi yazılır».[355]

İbni Abbas (r.a.) rəvayət edir. Nəbi (s.a.s.) belə buyurdu: «Kim görmədiyi bir yuxunu gördüm deyə anladarsa, axirətdə yerinə yetirməsi mümkün olmayan bir işə, iki arpa dənəsini bir-birinə düyünləmək cəzasına layiq görülür.

Kim bu topluluğun duyulmasını istəmədikləri bir sözü öyrənməyə çalışarsa, qiyamət günü qulaqlarına əridilmiş qurğuşun tökülər.

Kim də hər hansı bir canlının rəsm və heykəlini düzəldərsə, o da qiyamətdə edə bilməyəcəyi halda «buna can ver» deyilərək əzab ediləcək».[356]

«Hər duyduğunu danışması insana yalan olaraq yetər».[357]

---

[355] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 497.
[356] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 507.
[357] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 519.

«Yalan olduğunu zənn etdiyi bir hədisi məndən nəql edən kimsə yalançılardan biridir».[358]

Huzeyfə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Dedi-qodu edən cənnətə girməz».[359]

Hz.Nizami beytin birinci misrasında bildirir ki, hz. Məhəmmədin (s.a.s.) sözlərindən ədəb şöhrət tapdı. Əslində, gözəl ədəbi, xoş əxlaqı yaradan dindir. Dinə görə, ədəbli, əxlaqlı olmaq Allahın (c.c.) buyruğuna uyğun yaşamaq deməkdir. Bizim düşüncə və davranışlarımızın ölçüsü uca Allahın buyruqları, əmr və yasaqlarıdır. Uca Allah (c.c.) Qurani-Kərimdə gözəl ədəbin bütün ölçülərini açıqlamışdır. Şanı uca Quran belə buyurur:

قُلْ إِنَّمَا حَرَّمَ رَبِّيَ الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَابَطَنَ وَالإِثْمَ وَالْبَغْيَ بِغَيْرِ الْحَقِّ وَأَن تُشْرِكُواْ بِاللّهِ مَا لَمْ يُنَزِّلْ بِهِ سُلْطَاناً وَأَن تَقُولُواْ عَلَى اللّهِ مَا لاَ تَعْلَمُونَ

(Əraf, 7/33)

«De ki: Rəbbim ancaq açıq və gizli pislikləri, günahı və haqsız yerə sınırı aşmağı, Allaha ortaq qoşmağı və Allah haqqında bilmədiyiniz şeyləri söyləməyinizi haram qılmışdır».

Uca Allah (c.c.) Qurani-Kərimdə hz. Məhəmmədin (s.a.s.) elçiliyi ilə insanlığa əxlaq, ədəb ölçüləri verir:

- ancaq Allaha (c.c.) qulluq etmək
- ata-anaya hörmət etmək
- qohumun, yolçunun, yoxsulun haqqını vermək
- xəsis və israfçı olmamaq
- zinaya, əxlaqsızlığa yaxınlaşmamaq
- haqsız yerə cana qıymamaq
- yetim malına toxunmamaq

[358] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 519.
[359] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 483.

- vədinə əməl etmək
- alış-verişi doğru etmək
- özündən razı olmamaq
- qeybət etməmək
- elm öyrənmək
- doğru danışmaq
- insanlarla yardımlaşmaq.

Biz bu ölçülərin sayını artıra da bilərik. Qurani-Kərimin «İsra», «Əraf», «Maidə», «Fussilət», «Rum», «Səbə», «İbrahim», «Hud», «Bəqərə», «Ali-İmran» «Cümə», «Əhzab», «Nur», «Tövbə» surələrində bu ədəb, əxlaq ölçüləri ilə bağlı çoxsaylı ayələr var.

Hz.Məhəmməd (s.a.s.) də bu ilahi buyruqlara uyğun ölçülər müəyyən etmişdir.

Abdullah b. Məsud (r.a.) rəvayət edir. Hz.Peyğəmbər (s.a.s.) buyurdu: «Üç insan bir arada olduqda iki insan başqasını, buraxıb öz aralarında danışmasın. Çünki belə etmək onu üzər. Ancaq camaatın qarışıq olması bunun xaricindədir».[360]

Bu hədisdə önə çəkilən ölçü insan ləyaqətinə, insan şərəfinə, insan haqqına verilən dəyəri göstərir.

Abdullah b. Amr (r.a.) söyləyir: «Bir şəxs hz. Peyğəmbərə (s.a.s.) hansı islam davranışı ən xeyirlidir?», - deyə soruşmuşdu. O da: «Yemək yedirtmək, tanıdığına da, tanımadığına da salam vermək», buyurmuşdu.[361]

Əbu Hureyrə (r.a.) rəvayət edir. Hz.Peyğəmbər (s.a.s.): «Kiçik böyüyə, yeriyən oturana, az çoxa salam verər», buyurmuşdur.[362]

[360] Sahihi-Buxari, göstərilən qaynaq, s.616.
[361] Sahihi-Buxari, göstərilən qaynaq, s.615.
[362] Sahihi-Buxari, göstərilən qaynaq, s.615.

Enes (r.a.) rəvayət edir: «Çöldə yaşayan bir kimsə hz.Peyğəmbərin (s.a.v) yanına gəldi.

«Ey Allahın rəsulu, qiyamət nə zaman qopacaq?», - dedi.

«Sənə yazıqlar olsun, qiyamət üçün nə hazırladın?, - buyurdu.

- Qiyamət üçün Allah və Rəsulu sevməkdən başqa heç bir şey hazırlamadım.

- Şübhəsiz ki, sən sevdiyinlə bərabərsən.

- Biz də eləyikmi?, - deyə soruşduq.

- Bəli , dedi»[363]

Əbu Hureyrə (r.a.) rəvayət edir. Hz.Peyğəmbər (s.a.s.): «Allah asqıranı sevər, əsnəyəni sevməz. Biriniz asqıranda «əlhəmdülillah» desə, bunu eşidən hər müsəlman ona «yərhəmükəllah» deməlidir. Əsnəmək isə şeytandandır. Biriniz əsnəyəndə gücü çatdıqca geri qaytarsın. Çünki biriniz əsnəyəndə şeytan gülər».[364]

İmran b. Hüseyn (r.a.) söyləyir. Hz.Peyğəmbər (s.a.s.): «Həya ancaq yaxşılıq gətirir», buyurdu.[365]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.): «Həqiqi qüvvətli rəqiblərini məğlub edən deyildir. Gerçək güclü əsəbiləşəndə özünə hakim olandır», buyurdu».[366]

Əbu Əyyub Ənsari (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.): «Bir kimsənin qardaşı ilə üç gecədən artıq küsülü qalması halal olmaz. Bu iki insan qarşılaşanda biri üzünü bu tərəfə, o birisi o biri tərəfə çevirir, ancaq bunların ən yaxşısı salama başlayıb küsülülüyə son qoyandır».[367]

---

[363] Sahihi-Buxari, göstərilən qaynaq, s.613.
[364] Sahihi-Buxari, göstərilən qaynaq, s.614.
[365] Sahihi-Buxari, göstərilən qaynaq, s.614.
[366] Sahihi-Buxari, göstərilən qaynaq, s.612.
[367] Sahihi-Buxari, göstərilən qaynaq, s.612.

Əbu Hureyrə (r.a.) rəvayət edir. Rəsulullah (s.a.s.): «Zəndən qaçın. Çünki zənn sözün ən yalanıdır. Qulaq oğurluğu etməyin (kimisə pusmayın), gizli, məhrəm mövzuları incələməyin. Almayacağınız malın qiymətini artırmayın. Bir-birinizə həsəd etməyin. Bir-birinizə əsəbiləşməyin. Ey Allahın qulları, qardaş olun».[368]

Hz. Aişə (r.a.) rəvayət edir: «Hz. Məhəmməd (s.a.s.) mənə: «Allah, şübhəsiz, bütün işlərdə yumşaqlıq və asanlığı sevər», buyurdu».[369]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Kim, Allaha və axirət gününə inanırsa, qonşusuna əziyyət verməsin. Kim Allaha və axirət gününə inanırsa, müsafirini qonaq etsin. Kim Allaha və axirət gününə inanırsa, yaxşı şeylər, xeyir söyləsin, ya da sussun».[370]

Hz.Məhəmmədin (s.a.s.) gətirdiyi ədəb ölçüləri sırasında həyalı olmaq da yer tutur. Ona görə, «Həya ancaq xeyir qazandırır», «Həyanın hamısı xeyirdir». Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah belə buyurdu: «İman yetmiş (ya da altmış budaqdan ibarətdir. Bunların ən yüksəyi «la ilahə illallah» demək, ən aşağısı isə insana mane olan şeyləri yoldan qaldırmaqdır. Həya da imanın budaqlarından biridir».[371]

Əbu Səid əl Hudri (r.a.) söyləyir. «Rəsulullah (s.a.s.) örtünmə çağına girmiş bir gənc qızdan daha utancaq idi. Xoşlanmadığı bir şey görəndə bunu üzünə baxanda anlardıq».[372]

Hz.Məhəmmədin (s.a.s.) ədəb anlayışına görə Allahı (c.c.) sevmək ədəbdəndir. Allaha (c.c.) şükr etmək,

---

[368] Sahihi-Buxari, göstərilən qaynaq, s.611.
[369] Sahihi-Buxari, göstərilən qaynaq, s.610.
[370] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 82.
[371] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 83.
[372] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 113.

çətinliklərə səbir etmək, kin, həsəd, xəyanət etməmək, təmiz, namuslu yaşamaq ədəbdəndir.

Quran əmr edir:

لاَ تَمُدَّنَّ عَيْنَيْكَ إِلَى مَا مَتَّعْنَا بِهِ أَزْوَاجاً مِّنْهُمْ وَلاَ تَحْزَنْ عَلَيْهِمْ وَاخْفِضْ جَنَاحَكَ لِلْمُؤْمِنِينَ

(Hicr, 15/88)

«(Kafirlərin) bəzi zümrələrinə verdiyimizə rəğbət gözü ilə baxma, onlardan ötrü kədərlənmə, möminləri qanadının altına al».

Hz.Məhəmməd (s.a.s.) buyurur: «Yarım xurma vermək surətiylə də olsa, özünüzü cəhənnəm atəşindən qoruyun. Bunu tapmayanlar isə gözəl bir sözlə də olsa, özlərini qorusunlar».[373]

Quran xəbər verir:

فَمَن يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ خَيْراً يَرَهُ

(Zilzal, 99/7)

«Kim zərrə qədər xeyir iş etmişsə, onun qarşılığını görəcək».

Hz.Məhəmməd (s.a.s.) buyurur: «Gözəl söz sədəqədir».[374]

Quran xəbər verir:

ادْعُ إِلِى سَبِيلِ رَبِّكَ بِالْحِكْمَةِ وَالْمَوْعِظَةِ الْحَسَنَةِ وَجَادِلْهُم بِالَّتِي هِيَ أَحْسَنُ إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ بِمَن ضَلَّ عَن سَبِيلِهِ وَهُوَ أَعْلَمُ بِالْمُهْتَدِينَ

(Nəhl, 16/125)

«İnsanları hikmətlə, gözəl öyüd-nəsihətlə Rəbbinin yoluna dəvət et, onlarla ən gözəl surətdə mücadilə et. Həqiqətən, sənin Rəbbin yolundan azanları bilən, doğru yolda olanları da tanıyandır!».

---

[373] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 114.

[374] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 115.

Hz.Məhəmməd (s.a.s.) buyurur: «Din qardaşını gülər üzlə qarşılamaqdan ibarət olsa belə heç bir yaxşılığı əsirgəmə».[375]

Quran ədəb ölçüsünün sınırını göstərir:

وَعِبَادُ الرَّحْمَنِ الَّذِينَ يَمْشُونَ عَلَى الْأَرْضِ هَوْناً وَإِذَا خَاطَبَهُمُ الْجَاهِلُونَ قَالُوا سَلَاماً

(Furkan, 25/63)

«Allahın xoş qulları o kimsələrdir ki, yer üzündə sükunətlə hərəkət edirlər, cahillər onlara söz atdığı zaman «səlamətlə» deyib keçirlər».

Hz.Aişə (r.a.) soraq verir: «Hz.Peyğəmbərin kiçik dişi görünəcək şəkildə qəhqəhə ilə güldüyünü heç görmədim. O, sadəcə təbəssüm edərdi».[376]

Quran qonağa münasibətin ədəb ölçüsünü açıqlayır:

هَلْ أَتَاكَ حَدِيثُ ضَيْفِ إِبْرَاهِيمَ الْمُكْرَمِينَ .
إِذْ دَخَلُوا عَلَيْهِ فَقَالُوا سَلَاماً قَالَ سَلَامٌ قَوْمٌ مُّنكَرُونَ .فَرَاغَ إِلَى
أَهْلِهِ فَجَاء بِعِجْلٍ سَمِينٍ .فَقَرَّبَهُ إِلَيْهِمْ قَالَ أَلَا تَأْكُلُونَ

(Zariyat, 51/24-27)

«İbrahimin qarşılanan qonaqlarının xəbəri sənə gəldimi? Onlar İbrahimin yanına gəlmiş, salam vermişdilər. İbrahim də salamı almış, «bunlar yaddırlar», demişdi. Tez ailəsinin yanına gedərək kök bir dana kababı gətirmiş, onların önünə qoyub «buyurub yeməzsinizmi?», - demişdi».

İslam Peyğəmbəri buyurur: «Allaha və axirət gününə iman edən kimsə müsafirini qonaq etsin. Allaha və axirət gününə iman edən kimsə qohumlarına yaxşılıq etsin. Allaha və axirətə inanan kimsə ya faydalı söz söyləsin, ya da sussun».[377]

---

[375] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 115.
[376] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 135.
[377] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 143.

Quran dinləməyi, insanları müjdələməyi təşviq edir:

وَالَّذِينَ اجْتَنَبُوا الطَّاغُوتَ أَن يَعْبُدُوهَا وَأَنَابُوا إِلَى اللَّهِ لَهُمُ الْبُشْرَى فَبَشِّرْ عِبَادِ .الَّذِينَ يَسْتَمِعُونَ الْقَوْلَ فَيَتَّبِعُونَ أَحْسَنَهُ أُوْلَئِكَ الَّذِينَ هَدَاهُمُ اللَّهُ وَأُوْلَئِكَ هُمْ أُوْلُوا الْأَلْبَابِ

(Zumər, 39/17-18)

«Tağuta ibadət etməkdən çəkinib tövbə edərək Allaha tərəf qayıdanları müjdə gözləyir. Bəndələrimə müjdə ver! O kəslərə ki, sözü dinləyib onun ən gözəlinə uyarlar. Onlar Allahın doğru yola yönəltdiyi kimsələrdir. Ağıl sahibləri də elə onlardır!».

إِنَّ الَّذِينَ قَالُوا رَبُّنَا اللَّهُ ثُمَّ اسْتَقَامُوا تَتَنَزَّلُ عَلَيْهِمُ الْمَلَائِكَةُ أَلَّا تَخَافُوا وَلَا تَحْزَنُوا وَأَبْشِرُوا بِالْجَنَّةِ الَّتِي كُنتُمْ تُوعَدُونَ

(Fussilət, 41/30)

«Şübhəsiz: «Rəbbimiz Allahdır!»,-deyən, sonra da düz olan kəslərə mələklər nazil olub: «Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan cənnətlə sevinin!».

فَبَشَّرْنَاهُ بِغُلَامٍ حَلِيمٍ

(Saffat, 37/101)

«Biz də onu yumşaq xasiyyətli bir oğlanla müjdələdik».

Rəsulullah (s.a.s.) da müjdələyir: «Rəsulullah (s.a.s.) Xədicəni (r.a.) cənnətlə, içində heç bir gurultunun duyulmayıb, heç bir yorğunluğun hiss edilməyəcəyi, incidən hazırlanmış bir köşklə müjdələdi».[378]

Uca Allah (c.c.) Quranda yolçuluq, ayrılıq, ölüm ərəfəsində vidalaşmağı, vəsiyyət etməyi, duanı bir ədəb ölçüsü kimi əmr edir:

وَوَصَّى بِهَا إِبْرَاهِيمُ بَنِيهِ وَيَعْقُوبُ يَا بَنِيَّ إِنَّ اللّهَ اصْطَفَى لَكُمُ الدِّينَ فَلاَ تَمُوتُنَّ إَلاَّ وَأَنتُم مُّسْلِمُونَ . أَمْ كُنتُمْ شُهَدَاء إِذْ حَضَرَ يَعْقُوبَ

[378] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 151.

الْمَوْتُ إِذْ قَالَ لِبَنِيهِ مَا تَعْبُدُونَ مِن بَعْدِي قَالُواْ نَعْبُدُ إِلَـهَكَ وَإِلَـهَ آبَائِكَ
إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ وَإِسْحَاقَ إِلَـهاً وَاحِداً وَنَحْنُ لَهُ مُسْلِمُونَ
(Bəqərə, 2/132-133)

«Bunu İbrahim də öz oğullarına vəsiyyət etdi. Yaqub da: «Oğullarım! Allah sizin üçün İslam dinini seçdi. Əsla başqa cür deyil, sadəcə müsəlman olaraq ölün», dedi. «Yoxsa Yaquba ölüm gəldiyi zaman siz orada idiniz? O zaman Yaqub oğullarına «Məndən sonra kimə qulluq edəcəksiniz?», - deyə soruşmuşdu. Onlar da: «Sənin və ataların İbrahim, İsmayıl, İshaqın ilahı olan tək Allaha qulluq edəcəyik. Biz ancaq ona təslim olmuşuq», dedilər».

Rəsulullah (s.a.s.) bu ədəb ölçüsünü belə ifadə edir: «Ey insanlar! Mən də bir insanam. Yaxında Rəbbimin elçisi mənim də yanıma gələcək və mən onun dəvətini qəbul edib gedəcəyəm. Sizə iki önəmli şey əmanət edirəm. Biri, insanı doğruya yönəldən, bir rəhbər və nur olan Allahın kitabı Qurandır. Allahın kitabından yapışın və ona sımsıx sarılın! Sizə bir də əhli-beytimi əmanət edirəm. Allahdan qorxun və əhli-beytimə sayğılı davranın».[379]

Quran məsələlərin həllində məsləhət ölçüsü gətirir:

وَالَّذِينَ اسْتَجَابُوا لِرَبِّهِمْ وَأَقَامُوا الصَّلَاةَ وَأَمْرُهُمْ شُورَى بَيْنَهُمْ وَمِمَّا رَزَقْنَاهُمْ يُنفِقُونَ
(Şura, 42/38)

«O kəslər üçün ki, Rəbbinin dəvətini qəbul edər, namaz qılar, işlərini öz aralarında məsləhət-məşvərətlə görər, onlara verdiyimiz ruzidən sərf edərlər».

[379] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 171.

Hz. Məhəmməd (s.a.s.) də işlərində bu ölçüyə sadiqdir: «Allahım! Sən hər şeyi bildiyin üçün haqqımda xeyirli olanı mənə də bildirməyini, sənin gücün hər şeyə yetdiyi üçün məni uğurlu etməyini və xeyirli olanı nəsib etməyini sənin o böyük kərəmindən niyaz edirəm. Çünki sənin gücün hər şeyə yetər, mənimki yetməz, sən hər şeyi bilirsən, mən bilmərəm. Şübhəsiz, sən görülüb bilinməyənləri də bilirsən».[380]

İslam Peyğəmbəri (s.a.s.) yemək ədəbi müəyyən etdi: «Bəsmələ çək! Sağ əlinlə ye! Hər zaman önündən ye!»[381]

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) YEMƏK ƏDƏBİ

Hz.Məhəmməd (s.a.s.) yeməkdə qüsur axtarmazdı, iştahası varsa, yeyər, canı istəməsə, yeməzdi. Tam əminliklə deyə bilərik ki, O, bütöv bir yemək ədəbi yaratmışdır. O, buyurur ki, yeməyə dəvət edilsəniz, gedin, oruclu olsanız, yemək sahibinə təşəkkür edin, süfrədəkilərin icazəsi olmadan xurmanı iki-iki yeməyin, yeməyi birgə yeyin ki, bərəkəti artsın, yeməyi qabın ortasından deyil, kənarından yeyin, bir yerə söykənərək yemək yeməyin, üç barmaqla yeyin, su içərkən qabın içinə üfürməyin, suyu üç dəfə nəfəs alaraq için, içəndən sonra qabı sağdakına verin, dibi görünən qabdan su için, ayaq üstə su içməyin, xalqa su paylayan ən sonda içsin, təmiz qabdan su için.

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) SEVDİYİ RƏNGLƏR

O, mübarək Peyğəmbər (s.a.s.) geyim ədəblərini buyurur. O buyurur ki, ağ rəng gözəldir. «Ağ rəng paltar

---

[380] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 184.
[381] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 203.

geyin. Çünki ağ daha təmiz və daha xoş görünür. Ölülərinizi də ağ kəfənə bükün».[382]

Bərrə ibni Azib (r.a.) belə buyurur. «Rəsulullah (s.a.s.) ortaboylu idi. Mən onu qırmızı bir paltarda gördüm. Həyatımda Rəsuli-Əkrəmdən daha gözəl heç bir şəxs görmədim».[383]

Yaşıl rəng də hz. Peyğəmbərin (s.a.s.) sevdiyi rənglər sırasındadır. O, paltarın ölçüsü ilə də bağlı ədəb qaydası müəyyənləşdirir: «Heç kimsəyə söymə, heç bir yaxşılığı kiçik görmə, qardaşınla gülərüzlü danış, çünki bu daha bir yaxşılıqdır. Paltarlarının ətəklərini dizinin aşağı tərəfinədək qaldır. Əgər bundan xoşlanmazsan, topuqlarınadək endir. Ancaq paltarını yerdə sürünəcək qədər uzatma, çünki bu özünəvurğunluqdan irəli gəlir. Allah özündən razı olanları sevməz. Əgər bir kimsə səni söyər, ya da səndə olduğunu bildiyi bir şeyə görə səni tənqid edərsə, sən o insan haqqında bildiyin şeylərə görə onu tənqid etmə. Onun bu davranışının vəbalı özünə aiddir».[384]

## PEYĞƏMBƏRİN GEYİM ƏDƏBİ

Gözəl, səliqəli geyinməklə bağlı başqa bir Peyğəmbər (s.a.s.) ölçüsü. «Sizlər qardaşlarınızın yanına gedəcəksiniz. Minik heyvanlarınızı səliqəyə salın, paltarlarınıza çəki düzən verin. İnsanlar arasında üzdəki gözəllik timsalı xal kimi olun. Çünki Allah çirkin görünüşü və pis sözü sevməz».[385]

Bəs gözəl geyinmədəki ədəb ölçüsü hansıdır? «Bir müsəlmanın gözəl geyinməsi paltarlarının ətəklərinin baldırlarını örtəcək şəkildə olmasıdır. Paltarını

---

[382] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 281.
[383] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 283.
[384] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 306.
[385] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 314.

topuqlarınadək uzatmasında bir günah yoxdur. Topuqlarından aşağıda olan hissəsi isə atəşdir. Allah özündən razı olaraq paltarlarının ətəyini yerdə sürüyən kimsənin üzünə baxmaz».[386]

Hz.Məhəmməd (s.a.s.) cır-cındır paltar geyinməyi doğru saymadığı kimi, çox bahalı paltar geyinməyi də yanlış bir davranış hesab edir. Ona görə, hər şeydə orta yol ən doğru yoldur. Hz. Məhəmməd (s.a.s.) ipək parçadan paltar geyinməyi kişilərə qadağan edir. «İpək paltar geyinməyin, ipək paltarı günyada geyən axirətdə geyə bilməz».[387]

Hz.Məhəmməd (s.a.s.) yeni paltar, ayaqqabı alarkən, onu geyinərkən dua etməyi bir ədəb ölçüsü olaraq müəyyənləşdirir. «Allahım! Həmd sənə məxsusdur. Onu mənə sən geyindirdin. Səndən onu xeyirli etməni, məqsədinə uyğun istifadəsinin xeyrini qismət etməyi istəyirəm. Məqsədindən kənar istifadə etməyin şərindən də sənə sığınıram».[388]

## PEYĞƏMBƏRİN YATMAQ ƏDƏBİ

Hz.Məhəmməd (s.a.s.) yatmaq ədəbinin ölçülərini də müəyyən edib. «Yatağına gedəcəyin zaman namaz abdəsti kimi abdəst al, sonra sağ yanın üzərinə yat və bu duanı oxu, bu duanın sözləri yatmamışdan öncə son sözün olsun. Dua: «Allahım! Özümü sənə təslim etdim. Üzümü sənə çevirdim, işlərimi sənə tapşırdım. Rizanı istəyərək, əzabından qorxaraq kürəyimi sənə söykədim, sənə sığındım. Sənə qarşı yenə səndən başqa sığınılacaq yer yoxdur. Endirdiyin kitaba və göndərdiyin peyğəmbərə inandım».[389]

---

[386] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 321.
[387] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 330.
[388] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 347.
[389] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 350.

İslam peyğəmbəri üzü üstə, sol böyrü üstə və şər qarışan vaxt yatmağı qadağan edir.

## PEYĞƏMBƏRİN MƏCLİS ƏDƏBİ

Hz.Məhəmməd (s.a.s.) məclis ədəbinin ölçülərini də bir-bir sıralayıb. Məclisdə oturan bir kimsəni yerindən qaldırıb onun yerində oturmayın, özləri icazə verməsə, iki insanın arasına girməyin. «Bir kimsə cümə günü qüsul abdəsti alar, əlindən gəldiyi qədər təmizlənərsə, ya öz ətrindən, ya da evində olan gözəl ətirdən sürtər, evindən çıxar, iki kişinin arasına girməz, sonra üzərinə fərz olan namazı qılar, imam xütbə oxuyarkən susub onu dinlərsə, o cümə ilə, o birisi cümə arasındakı günahları bağışlanar».[390]

Hz.Məhəmməd (s.a.s.) buyurur ki, məclislərin ən xeyirlisi geniş olanıdır. O, məclisdən çıxarkən gözəl dua oxuyurdu: «Allahım! Bizə günahla aramıza əngəl olacaq qədər qorxundan pay ver. Bizi cənnətinə çatdıracaq qədər itaət qismət elə. Dünya müsibətlərini yüngülləşdirəcək güclü iman ver. Allahım! Bizi yaşatdığın müddətcə qulaqlarımız, gözlərimiz və gücümüzdən faydalandır. Ölümümüzədək onları davamlı et. Bizə zülm edənlərdən qisasımızı sən al. Bizə düşmənlik edənlərə qarşı bizə yardım et. Bizi dinimizdə müsibətə uğratma. Dünyanı ən böyük düşüncəmiz və qayəmiz və elmimizin sonu etmə. Bizə acımayanları bizə rəhbər etmə».[391]

Allahın mübarək elçisi salam ədəbinin ölçülərini də Qurana uyğun müəyyənləşdirib.

Quran belə buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَدْخُلُوا بُيُوتاً غَيْرَ بُيُوتِكُمْ حَتَّى تَسْتَأْنِسُوا

[390] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 373.
[391] Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 381.

وَتُسَلِّمُوا عَلَى أَهْلِهَا ذَلِكُمْ خَيْرٌ لَّكُمْ لَعَلَّكُمْ تَذَكَّرُونَ
(Nur, 24/27)

«Ey iman gətirənlər! Başqalarının evlərinə sahiblərindən icazə almadan və onlara salam vermədən girməyin. Bu sizin üçün daha yaxşıdır. Bəlkə, düşünüb anlayasınız».

وَيَقُولُونَ طَاعَةٌ فَإِذَا بَرَزُواْ مِنْ عِندِكَ بَيَّتَ طَآئِفَةٌ مِّنْهُمْ غَيْرَ الَّذِي تَقُولُ وَاللّهُ يَكْتُبُ مَا يُبَيِّتُونَ فَأَعْرِضْ عَنْهُمْ وَتَوَكَّلْ عَلَى اللّهِ وَكَفَى بِاللّهِ وَكِيلاً
(Nisa, 4/81)

«(Ey Rəsulum!) Onlar: (Sənə) itaət edirik!», deyir, ancaq sənin yanından çıxıb getdikləri zaman onların bir qismi dediyinin əksini fikirləşir. Allah onların niyyətində olanları yazır. Sən onlardan üz çevir, Allaha təvəkkül et! Allahın vəkil olması kifayət edər!».

## PEYĞƏMBƏRİN SALAM ƏDƏBİ

Allahın (c.c.) elçisi bu ilahi təlimata uyğun salam ədəbini tətbiq edir: tanıdığın və tanımadığın hər kəsə salam ver, xəstəni ziyarət et, cənazə törənində iştirak et, asqırana xeyir dilə, zəifə yardım et, məzluma yardımçı ol, salamı yay. «Siz iman etmədikcə cənnətə girə bilməzsiniz, bir-birinizi sevmədikcə də iman etmiş olmazsınız. Etdiyiniz zaman bir-birinizi sevəcəyiniz bir şey söyləyimmi? Aranızda salamı yayın».[392]

[392] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 414.

Hz.Məhəmməd (s.a.s.) salam vermək, salam almaq şəklini də açıqlayıb. O, bir topluluğa yaxınlaşanda üç dəfə salam verərdi, O, gecə bir yerə gedəndə yatanı oyandırmayacaq bir səslə salam verərdi, öncə salam verməyi doğru sayırdı. İmran ibni Husayn (r.a.) rəvayət edir: «Nəbinin (s.a.s.) yanına bir adam gəldi. O, belə dedi:

- Əs-Səlamü əleyküm.

Hz.Peyğəmbər onun salamına eyni şəkildə qarşılıq verdi. O adam oturdu. Nəbi (s.a.s.):

- On savab qazandı, buyurdu.

Sonra bir başqası gəldi, o da:

- Əs-Səlamü əleyküm və rəhmətullah, dedi.

Peyğəmbərimiz ona da eyni qaydada salam verdi. O, insan da oturdu. Hz.Peyğəmbər:

- İyirmi savab qazandı, buyurdu.

Daha sonra bir başqa adam gəldi və:

- Əs-Səlamü əleyküm və rəhmətullah və bərəkatüh, dedi.

Hz.Peyğəmbər (s.a.s.) o kişinin də salamına eyni qaydada salam verdi. Sonra:

- Otuz savab qazandı, buyurdu».[393]

Hz.Məhəmmədin (s.a.s.) salam ədəbi ilə bağlı başqa qaydalar bunlardır: bir şeyə minmiş olan piyada gedənə, yeriyən oturana, az olan çox olanlara, kiçik böyüyə salam versin, evə girəndə salam verin, uşaqlara salam verin, aralarında məhrəm olmadıqca qadınlar kişilərə salam verə bilməz, kişilər qadınlarla toplu olsalar, kişi onlara salam verər, onlar da bu salamı alarlar, bir qadına başqa qadınlar, öz əri, məhrəmləri salam verə bilər, qoca, şəhvət hissindən kəsilmiş qadınlara salam vermək, onların verdiyi salamı

[393] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 422.

almaq olar. Qadınların kişinin verdiyi salamı almaları vacibdir, ancaq salam alarkən səslərini yüksəltməzlər, bir kişiyə salam verən qadın gənc yaşda isə, kişi onun salamına qarşılıq verə bilər, kişi və qadın arasındakı ümumi qaydalar içində dəyərləndirməklə bərabər, salam mövzusunda şəfqət, sayğı və hörmət əsası ön plandadır, kişi və qadın dilənçinin salamına cavab vermək dini bir məcburiyyət deyildir. Çünki dilənçinin salamı, salamda gizlənən sosial və uca qayədən tamamilə məhrumdur, yanlış başa düşülmək qorxusu yoxdursa, qadın kişiyə salam verə bilər, yıxanmaqda olan, abdəst alan kimsənin salama cavab verməsi doğrudur, tək olan gənc qadının kişilərə salam verməsi və alması, eyni qaydada kişilərin də belə bir qadına salam verib almaları doğru deyil, fitnə halı yoxdursa, kişilərdən ibarət bir topluluğun gənc bir qadına salam verib alması doğrudur, kitab əhli olanlarla qarşılaşdıqda müsəlmanın onlara öncə salam verməsi doğru deyil, yoldadırsa, birinin kənara çəkilməsi zəruridirsə, müsəlman olmayanlar kənara çəkilməyə məcbur edilməlidir, yəhudi, xristian salam versə, salamı alınmalıdır, kafirlərin olduğu bir dəstəyə salam vermək doğru deyil, müsəlman, müşrik, kafir bir arada olsa, onlara salam verilə bilər, ancaq ürəyində müsəlmana salam verdiyini niyyət etməlisən, bir camaatın yanına gələndə və ondan ayrılanda salam verməlisən.

Hz.Məhəmməd (s.a.s.) insanlara icazə almaq ədəbini də öyrədib. Bu təlimin də qaynağı Qurandır. Quran belə buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَدْخُلُوا بُيُوتاً غَيْرَ بُيُوتِكُمْ حَتَّى تَسْتَأْنِسُوا
وَتُسَلِّمُوا عَلَى أَهْلِهَا ذَلِكُمْ خَيْرٌ لَكُمْ لَعَلَّكُمْ تَذَكَّرُونَ

(Nur, 24/27)

«Ey iman gətirənlər! Başqalarının evlərinə sahiblərindən icazə almadan və onlara salam vermədən girməyin. Bu sizin üçün daha yaxşıdır. Bəlkə, düşünüb anlayasınız».

وَإِذَا بَلَغَ الْأَطْفَالُ مِنكُمُ الْحُلُمَ فَلْيَسْتَأْذِنُوا كَمَا اسْتَأْذَنَ الَّذِينَ مِن قَبْلِهِمْ كَذَلِكَ يُبَيِّنُ اللَّهُ لَكُمْ آيَاتِهِ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ

(Nur, 24/59)

«Sizdən olan uşaqlar da həddi-buluğa çatanda özlərindən əvvəlkilər kimi izn istəsinlər. Allah öz ayələrini sizə belə izah edir. Allah biləndir, hikmət sahibidir».

Hz.Məhəmməd (s.a.s.) buyurur ki, evə girərkən ev sahibindən icazə alınmalıdır. İcazə istəmək, qapı döymək, zəng çalmaq üç dəfədən çox olmamalıdır, icazəsiz başqasının evinə baxmaq olmaz, icazə alarkən adını deməlisən.

Hz.Məhəmməd (s.a.s.) görüşmək ədəbinin ölçülərini belə müəyyən edir: hörmət məqsədi ilə də olsa, başqasının önündə əyilmək olmaz, görüşənlər paltarlı olsalar, qucaqlaşaraq görüşmək olar, yaşlı bir müsəlmanın əlini öpmək olar, birinin ağzından və yanağından öpmək doğru deyil, qucaqlaşaraq görüşmək doğru bir davranışdır, yoldan gələni, qonağı ayağa qalxaraq qarşılamaq doğrudur, qarşılanan insana gülər üz göstərmək bir müsəlman ədəbidir, uşaqları mərhəmətlə öpmək doğru bir davranışdır.

## XƏSTƏ ZİYARƏTİNİN SAVABI

Hz.Məhəmməd (s.a.s.) xəstə ziyarəti ilə bağlı ədəb ölçüləri də müəyyənləşdirib. Ona görə, xəstəni ziyarət, cənazə törənində iştirak etmək vacibdir, Allah (c.c.) xəstənin ziyarətindən çox xoşlanır, kimliyindən asılı olmayaraq, xəstə

ziyarəti, acları doydurmaq, düşmən əlində olan bir əsri qurtarmaq zəruridir, xəstə bir müsəlmanı ziyarət etmək cənnət nemətləri içində gəzmək deməkdir, din qardaşını ziyarət edən müsəlman üçün yetmiş min mələk dua edər, xəstəyə dua etmək, ona Allahdan (c.c.) şəfa istəmək gözəl bir davranışdır, duanı üç dəfə təkrar etmək doğru bir yanaşmadır, xəstəyə bir sıra ayə, zikr, dua cümlələriylə, Allahın (c.c.) gözəl adları ilə şəfa istəmək doğrudur, xəstə özü də özünə dua etməlidir, xəstənin halını yaxınlarından soruşmaq lazımdır, xəstəyə münasibətdə səbirli olmaq ədəbdəndir.

Hz.Məhəmməd (s.a.s.) ölməkdə olan və ölən insana münasibətdə də ədəb ölçülərini müəyyən edib. Bu ölçülərə görə, son nəfəsdə olan insana «Allahdan başqa Allah yoxdur», dedirtmək böyük savabdır. O, ölən insana belə dua edərdi: «Allahım! Əbu Selemeni bağışla. Dərəcəsini hidayətə çatanlar səviyyəsinə yüksəlt! Geridə qoyduqları üçün də sən ona vəkil ol! Ey aləmlərin Rəbbi! Bizi də, onu da bağışla! Qəbrini genişlət və nurla doldur!».[394]

Ölən insanın yaxınlarına təsəlli vermək, onlara səbir diləmək, dua etmək bir ədəb ölçüsüdür. Ölən insan üçün bağırıb çığıraraq ağlamaq doğru deyil, sakit olmaq, göz yaşı tökmək daha doğru bir davranışdır. Ölən insanı yuyanlar onun hallarını gizlətməlidirlər. Cənazə namazında iştirak etmək böyük savabdır. Ölüm hadisəsini camaata bildirmək, cənazəni tez dəfn etmək də bir ədəbdir. Məzarlıq insanlara nəsihət vermək üçün uyğun yerlərdir, ölü adına dua etmək, sədəqə vermək, xeyirli iş görmək, onu xatırlamaq da bir ədəb ölçüsüdür.

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.)

[394] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 540.

## SƏFƏR ƏDƏBİ

Hz.Məhəmməd (s.a.s.) yolçuluq ədəblərini də öyrədib. O, pərşənbə günləri yola çıxardı, önəmli işlərini günün ilk saatlarında görərdi, o, ən azı üç nəfərlik qruplar halında yolçuluğa çıxmağı tövsiyə etmişdir, onlardan biri başçı seçilməlidir. Yolçuluqda heyvanların haqlarına hörmət etmək, onları yedirtmək, gecə istirahət etmək lazımdır. Yolçuluqda qafilədən ayrılmamaq, yaz mövsümündə gecə yolçuluğa çıxmaq uyğun bir davranışdır. Yol yoldaşına yardım etmək, yola çıxarkən dua etmək, səfərdən tez qayıtmaq, evə gündüz dönmək zəruridir. Bu ədəb ölçülərinə görə, qadının yanında əri olmasa, onunla evlənməsi yasaq olan bir yaxını ilə səfərə çıxması haramdır.

## GÖZƏL AD

Hz.Məhəmməd (s.a.s.) uşaqlara gözəl adlar qoyardı, yanlış, mənasız, uşaqda təkəbbür duyğuları oyadacaq adları dəyişdirərdi. Əbu Musa əl-Əşar (r.a.) rəvayət edir: «Mənim bir oğlum oldu. Onu hz.Peyğəmbərin (s.a.s.) yanına gətirdim. Uşağın adını İbrahim qoydu. Xurma çiynəmini damağına sürtdü, xeyir və bərəkət duası oxudu. Sonra uşağı mənə verdi».[395]

## HƏDİYYƏ SEVGİNİ ARTIRIR

Hz.Məhəmməd (s.a.s.) hədiyyələşməni çox sevərdi, insanları bir-birinə hədiyyə verməyə təşviq edərdi: «Hədiyyələşin, sevginiz artsın», «Hədiyyələşin, çünki hədiyyə qəlbdəki kin və nifrəti yox edər. Heç bir qadın qonşu

[395] Müttefekun aleyh hadisler (tartibçi: Muhammed Fuad Abdülbakı, düzenleme, çeviri, tahriç ve notlar Abdullah Feyzi Kocaer) Konya, 2002, s. 445.

qadına verdiyi hədiyyəni qoyun parçasından bir parça belə olsa, kiçik görməsin».[396]

Hz.Mövlana buyurur ki, bütün Quran ayə-ayə bir ədəb təlimidir. Hz. Məhəmmədin (s.a.s.) əxlaqı, ədəbi Quran olduğundan onun ədəb ölçülərini saymaqla qurtarmaz. O, həyatın bütün sahələri ilə bağlı doğru, faydalı ədəb ölçüləri müəyyən etmişdir. Bu ölçülər diridir, bütün zamanlar üçün yararlıdır.

İndi bu deyilənlərin işığında hz.Nizaminin hz. Məhəmmədin (s.a.s.) ədəb ölçülərini anladan beytini bir də oxuyaq:

***Onun sözlərindən ədəb şöhrət tapdı,***
***Onun kəmərindən fələk biçim tapdı.***

Hz.Nizami beytlərində hz. Məhəmmədin (s.a.s.) varlığını təqdim edərkən onu sonsuz bir məkan içində təsvir edir, onun diriliyini, təliminin yaşamaq gücünü göstərmək üçün bu sonsuz məkanla birgə hərəkət anlayışından da yararlanır. **«Ol! pərgarı», bu pərgarın cızdığı sonsuz məkan, o pərgarın hərəkəti, kainatın daimi dönüşü bütün mənalarla birgə hz.Məhəmmədin (s.a.s.) gətirdiyi nemətin qiyamətədək davam edəcəyini də ifadə edir.**

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ MƏDƏNİYYƏTİN ÖLÇÜSÜ

Hz.Nizami bu beytdə də «Onun sözlərindən ədəb şöhrət tapdı», deyir. **Deməli, hz.Məhəmməd (s.a.s.) fərqli bir toplum tərbiyə etdi, ayrı bir mədəniyyət yaratdı. Bu, vəhydən qaynaqlanan bir mədəniyyətdir. Sevgi, anlaşma, paylaşma, bir-birinə dəyər vermə, bir-birinin haqqını tanıma,**

[396] Üsve-i-Hasene, göstərilən qaynaq, c. 1, s. 482.

**bağışlama, təmizlik, gözəllik üzərində qurulmuş bir mədəniyyət, bir əxlaq, bir ədəb. Mədəniyyət isə həyatla, düşüncə ilə, davranışla bağlı dəyərlərdir. Bu ölçülər bir toplumu başqasından ayıran, onun özəlliklərini müəyyən edən ölçülərdir. Bu ölçülər pozulanda toplum da dağılır.**

Hz.Nizami də hz.Məhəmmədin (s.a.s.) ədəb ölçülərini önə çəkməklə onun yeni, fərqli, ilahi qaynaqlı bir mədəniyyət yaratdığına işarə edib.

Mədəniyyətdə, dəyərlər sistemində ölçü elə önəmli bir məsələdir ki, hz.Nizami beytin ikinci misrasında bu anlayışı «kəmər» sözü ilə ifadə edib:

***Onun kəmərindən fələk biçim tapdı.***

**Bu misrada ədəb, əxlaq, dəyər, mədəniyyət ölçüsü anlayışlarını ifadə etmək üçün hz. Nizami «kəmər», «biçim» (ölçü) sözlərindən istifadə edib. Misradakı «onun kəməri» ifadəsi hz. Məhəmmədin (s.a.s.) ilahi qaynaqlı, vəhlə müəyyən olunmuş dəyərlər sisteminə, mədəniyyət ölçüsünə, ədəb, əxlaq qəlibinə işarə edir. «Kəmər» bir ölçüdür, bir şeyin ölçüsünü müəyyən edən vasitədir, «kəmər» qoruyucudur, «kəmər» həm də gözəllikdir.**

Deməli, hz.Nizaminin yorumunda «kəmər» mədəniyyət üçün ən önəmli şey olan dəyəri, ölçünü təmsil edir. **Ölçü varsa, mədəniyyət də var. «Onun kəmərindən fələk biçim tapdı», yəni o, elə ölçülər yaratdı ki, fələk də biçimini, ölçüsünü, hərəkət yolunu bu kəmərlə – bu ölçü ilə müəyyən etdi.**

Öncəki beytdə deyilir ki, uca Allah (c.c.) varlığı onun xatirinə yaradıb, O, «Ol! pərgarı»nın dayaq nöqtəsidir, bütün aləm bu dayaq nöqtəsinin ətrafında dönür. Bu beytdə isə ideya bir qədər də dərinləşdirilərək fələyin-göylərin öz

ölçüsünü «onun kəməri»nə – onun ölçüsünə görə müəyyən etdiyi bildirilir.

Bilindiyi kimi, göyün hər qatının bir özəlliyi var, hər təbəqə onun üçün müəyyən olunmuş ilahi vəzifə və ölçü içərisində fəaliyyət göstərir. Ancaq bu fərqli təbəqələrin ölçülərini uca Allah (c.c.) müəyyən edir. Hz.Məhəmmədin (s.a.s.) «kəmərinin ölçüsü»nü də uca Allah (c.c.) təyin edib. Onun «kəmərinin ölçüsü», mədəniyyətinin dəyəri pozulanda ilahi ölçü də pozulmuş olur. İlahi ölçüsü pozulmuş insan isə fitrəti pozulmuş insan deməkdir. Hz.Məhəmmədin (s.a.s.) ölçülərindən imtina edən insan kainatdakı nizama, ahəngə düşmən kəsilir. Fitrəti pozulmuş insan vəhşiləşir, hamının və hər şeyin düşməninə çevrilir. Nəticədə, ağaclar kəsilir, sular çirklənir, hava zəhərlənir, torpaq çürüyür, həsəd, paxıllıq, yalan, rüşvət ayaq tutub yeriyir, ilahi nizam pozulur.

Deməli, hz.Nizamiyə görə, kainatın nizam, ölçü içində yaşaması hz.Məhəmmədin (s.a.s.) ilahi qaynaqlı ölçülərinə bağlıdır. **Yerdəki insanın ilahi ölçüsü dəyişəndə fələkdəki, bütün kainatdakı ölçü də dəyişir, insan əxlaqı, ədəbi pozulanda hər şeyin ölçüsü pozulur.**

Biz bir-birinə sıx bağlı bir sistemdə yaşayırıq. Bu ilahi nizamın ən önəmli nöqtəsi insandır. O, ilahi əxlaqla, hz.Məhəmməd (s.a.s.) ölçüsü ilə yaşadıqca Allahla (c.c.) sağlam bir ünsiyyət içində olur, bu dünya və axirət xoşbəxtliyini qazana bilir.

Bu anlayış işığında hz.Məhəmmədin (s.a.s.) Qurana bağlı olaraq müəyyən etdiyi və islam mədəniyyətinin əsaslarını yaradan dəyərlərini, ölçülərini sıralamaq istəyirik:

«Gözəl söz sədəqədir».[397]

«Yumşaq söz sədəqədir».[398]

---

[397] İbn Hanbel, Müsned, II, 312.

[398] Buhari, Edep, 34.

«Qardaşının üzünə təbəssümlə baxmaq sədəqədir».[399]

«Allahın qullarına salam vermək sədəqədir».[400]

«İnsanlara yol göstərmək sədəqədir».[401]

«Yolunu azana yol göstərmək sədəqədir».[402]

«Yolda insanlara əziyyət verən bir şeyi qaldırıb atmaq sədəqədir».[403]

«Bir kimsənin miniyinə minməsi üçün yardımçı olmaq sədəqədir».[404]

«Bir kimsənin yükünü yükləməsi üçün yardımçı olmaq sədəqədir».[405]

«Dolmuş vedrəni qardaşının boş vedrəsinə boşaltmaq sədəqədir».[406]

«Zəif bir insana gücünün yetdiyi qədər yardımçı olmaq sədəqədir».[407]

«Sənət adamlarına yardımçı olmaq sədəqədir».[408]

«Xəstələri ziyarət etməyiniz sədəqədir».[409]

«Torpağa əkdiyiniz hər bitki, hər ağac sizin üçün sədəqədir».[410]

«İnsanın, ya da heyvanların bu bitki və ağacdan yeməsi sizin üçün sədəqədir».[411]

«İnsanlarla xoş davranmaq sədəqədir».[412]

«Uşaqlarınıza yedirtdiyiniz sədəqədir».[413]

---

[399] Tirmizı, IV, 339.
[400] Buhari, Sulh, 11.
[401] İbn Hanbel, Müsned, II, 154.
[402] İbn Hanbel, II, 42.
[403] Buhari, Mezalim, 34.
[404] İbn Hanbel, Müsned, II, 350.
[405] İbn Hanbel, Müsned, II, 316.
[406] Tirmızi, Birr, 36.
[407] İbn Hanbel, Müsned, V, 154.
[408] el-Heysemi, Hilye, VII, 109.
[409] el-Heysemi, Hilye, VII, 109.
[410] İbn Hanbel , Müsned, VI, 362.
[411] İbn Hanbel , Müsned, VI, 362.
[412] İbn Ebid-Dünya, Mudarat, s. 24.
[413] İbn Hanbel , Müsned, VI, 121.

«Həyat yoldaşınıza yedirtdiyiniz sədəqədir».[414]
«Yanınızda çalışanlara yedirtdiyiniz sədəqədir».[415]

«İnsanın öz ailəsi üçün yaşayış təmin etməsi sədəqədir».[416]
«Ən üstün sədəqə insanın elm öyrənməsi və öyrəndiyi elmi müsəlman qardaşına öyrətməsidir».[417]
«Cənazə mərasimində iştirak etmək sədəqədir».[418]
«Yaxşılığı əmr edib, pislikdən çəkindirmək sədəqədir».[419]
«Namaza doğru atdığınız hər addım sədəqədir».[420]
«Allaha həmd etmək sədəqədir».[421]
«Allahı zikr etmək sədəqədir».[422]
«Şərdən uzaq olmaq sədəqədir».[423]
«Doğru olan hər şey sədəqədir».[424]
«İki insanın arasını düzəltmək, iki şəxsin arasında ədalətlə hökm etmək sədəqədir».[425]
«Nitqi qüsurlu olan bir insanın özünü ifadə etməsinə yardımçı olmaq sədəqədir».[426]

---

414 İbn Hanbel , Müsned, VI, 121.
415 İbn Hanbel , Müsned, VI, 121.
416 Buhari, İman, 41.
417 İbn Mace, I, 89.
418 el-Heysemi, Hilye, VII, 109.
419 Ebu Davud, Tatavvu, 12.
420 Buhari, Cihad, 62.
421 Müslim, Musafirin, 84.
422 Ebu Davud, Tatavvu, 12.
423 İbn Ebid-Dünya, Kitabus-Samt, 179.
424 İbn Ebid-Dünya, Kitabul-Havaric, s. 21.
425 Buhari, Sulh, 11.
426 İbn Hanbel, Müsned, V, 154.

## ON DÖRDÜNCÜ BEYTİN ŞƏRHİ: CAHAN TƏKƏBBÜRÜ ONUN BAŞINA DOLMADI

Hz.Nizamiyə görə ilahi düzümü pozan pis xüsusiyyətlərdən biri də təkəbbürdür. Şair bu anlayışı on dördüncü beytdə şərh edib.

کبر جهان گرچه بسر برنکرد
سر به جهان هم به جهان درنکرد

***Cahan təkəbbürü onun başına dolmadı,***
***Ancaq o, cahanda başını cahan qabağında əymədi.***[427]

## TƏKƏBBÜRÜN MƏNASI

Təkəbbür özünü bəyənməkdir, doğru, haqq olanı qəbul etməməkdir, başqalarının haqqını tanımamaqdır. Uca Allah (c.c.) bu nəfsani istəyi Qurani-Kərimdə sərt bir üslubla qadağan buyurmuşdur:

وَلاَ تَمْشِ فِي الأَرْضِ مَرَحاً إِنَّكَ لَن تَخْرِقَ الأَرْضَ وَلَن تَبْلُغَ الْجِبَالَ طُولاً
(İsra, 17/37)

«Yer üzündə qürurlanaraq dolaşma. Belə etməklə sən nə yeri yara bilərsən, nə də boyca yüksəlib dağlara çata bilərsən».

وَلَا تُصَعِّرْ خَدَّكَ لِلنَّاسِ وَلَا تَمْشِ فِي الْأَرْضِ مَرَحاً إِنَّ اللَّهَ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍ
(Loğman, 31/18)

«(Yersiz) bir qürura qapılaraq özünü insanlardan üstün tutma, yer üzündə təkəbbürlə gəzib dolaşma. Unutma ki, Allah təkəbbürlənərək özünü bəyənənləri sevməz».

---

427 Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.

وَنُقَلِّبُ أَفْئِدَتَهُمْ وَأَبْصَارَهُمْ كَمَا لَمْ يُؤْمِنُواْ بِهِ أَوَّلَ مَرَّةٍ وَنَذَرُهُمْ فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ

(Ənam, 6/110)

«Biz onların qəlblərini və gözlərini tərs çeviririk. Öncə inanmadıqları kimi yenə də iman etməzlər. Biz də onları təkəbbürləri içərisində kor və çaşqın buraxırıq».

يَا بَنِي آدَمَ إِمَّا يَأْتِيَنَّكُمْ رُسُلٌ مِّنكُمْ يَقُصُّونَ عَلَيْكُمْ آيَاتِي فَمَنِ اتَّقَى وَأَصْلَحَ فَلاَ خَوْفٌ عَلَيْهِمْ وَلاَ هُمْ يَحْزَنُونَ وَالَّذِينَ كَذَّبُواْ بِآيَاتِنَا وَاسْتَكْبَرُواْ عَنْهَا أُوْلَـئِكَ أَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ

(Əraf, 7/35-36)

«Ey Adəm oğulları! Sizə öz aranızdan mənim xəbərlərimi çatdıran elçilər gələndə kimlər ki, mənə qarşı məsuliyyət hissi duyar, özlərini düzəldərlərsə, onlar üçün qorxu yoxdur, onlar üzülməyəcəklər. Ancaq ayələrimizin yalan olduğunu iddia edənlər və onlara təkəbbürlə yuxarıdan aşağı baxanlar, məhz onlar, orada qalmaqla atəşə girəcək olanlar beləlaridir».

إِنَّ الَّذِينَ عِندَ رَبِّكَ لاَ يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِهِ وَيُسَبِّحُونَهُ وَلَهُ يَسْجُدُونَ

(Əraf, 7/206)

«Bil ki, Rəbbinə yaxın olanlar Ona qulluq etməkdən əsla təkəbbürlənməzlər. Onun ölçüsüz ucalığını öygüylə anar və ancaq onun önündə səcdə edərlər».

إِلَهُكُمْ إِلَهٌ وَاحِدٌ فَالَّذِينَ لاَ يُؤْمِنُونَ بِالآخِرَةِ قُلُوبُهُم مُّنكِرَةٌ وَهُم مُّسْتَكْبِرُونَ لاَ جَرَمَ أَنَّ اللّهَ يَعْلَمُ مَا يُسِرُّونَ وَمَا يُعْلِنُونَ إِنَّهُ لاَ يُحِبُّ الْمُسْتَكْبِرِينَ

(Nəhl, 16/22-23)

«Sizin tanrınız tək Allahdır. Ancaq axirətə inanmayanların qəlbləri bu (gerçəyi) boş bir təkəbbür üzündən qəbul etmirlər. Heç şübhəsiz, onların gizlədiklərini də, açıq göstərdiklərini də Allah bütünlüklə bilir. Dəqiq olan budur ki, O, təkəbbür duyğusuna qapılanları əsla sevməz!».

وَقَالَ مُوسَى إِنِّي عُذْتُ بِرَبِّي وَرَبِّكُم مِّن كُلِّ مُتَكَبِّرٍ لَّا يُؤْمِنُ بِيَوْمِ الْحِسَابِ
(Mömin, 40/27)

«Buna qarşılıq olaraq Musa: «Təkəbbürlənərək hesab gününü rədd edənlərdən sizin də Rəbbiniz, mənim də Rəbbim (olan Allaha) sığınıram», dedi».

وَلَقَدْ جَاءكُمْ يُوسُفُ مِن قَبْلُ بِالْبَيِّنَاتِ فَمَا زِلْتُمْ فِي شَكٍّ مِّمَّا جَاءكُم بِهِ حَتَّى إِذَا هَلَكَ قُلْتُمْ لَن يَبْعَثَ اللَّهُ مِن بَعْدِهِ رَسُولاً كَذَلِكَ يُضِلُّ اللَّهُ مَنْ هُوَ مُسْرِفٌ مُّرْتَابٌ .الَّذِينَ يُجَادِلُونَ فِي آيَاتِ اللَّهِ بِغَيْرِ سُلْطَانٍ أَتَاهُمْ كَبُرَ مَقْتاً عِندَ اللَّهِ وَعِندَ الَّذِينَ آمَنُوا كَذَلِكَ يَطْبَعُ اللَّهُ عَلَى كُلِّ قَلْبِ مُتَكَبِّرٍ جَبَّارٍ
(Mömin, 40/34-35)

«And olsun ki, (Musadan öncə) Yusif də sizə açıq dəlillərlə gəlmişdi. O zaman da Onun sizə gətirdiyi həqiqətə şübhə etmişdiniz. Nəhayət, vəfat edəndə də: «Bundan sonra Allah əsla peyğəmbər göndərməz», - dediniz. Allah həddi aşan şübhəçiləri belə çaşdırır. Onlar ki, özlərinə gələn bir dəlil olmadan Allahın ayələri ilə mücadilə edərlər. Bu həm Allah yanında, həm iman edənlər yanında böyük bir nifrət yaradır. Allah özündən razı olan (təkəbbürlənən) zorbanın qəlbini belə möhürləyər».

إِنَّ الَّذِينَ يُجَادِلُونَ فِي آيَاتِ اللَّهِ بِغَيْرِ سُلْطَانٍ أَتَاهُمْ إِن فِي صُدُورِهِمْ إِلَّا كِبْرٌ مَّا هُم بِبَالِغِيهِ فَاسْتَعِذْ بِاللَّهِ إِنَّهُ هُوَ السَّمِيعُ الْبَصِيرُ
(Mömin, 40/56)

«Allahın xəbərlərini heç bir dəlilləri olmadan sorğu-suala tutanlara gəlincə, onların içində heç bir zaman doyuzdura bilməyəcəkləri bir özünü bəyənmişlik (təkəbbür) duyğusundan başqa bir şey yoxdur. Elə isə sən Allaha sığın. Hər şeyi eşidən, hər şeyi görən Odur!»

Bu ayələrdə uca Allah (c.c.) təkəbbürlü insanın xarakterinin özəlliklərini bir-bir göstərmişdir. Allahın (c.c.) xəbərinə görə, təkəbbürlü insan özünü başqalarından üstün tutur, onun bəsirət gözü (qəlb gözü) tutulur, o, ilahi gerçəklərə inanmır, Allahın (c.c.) ayələrini yalan sayır, ona yuxarıdan aşağı baxır, onda Allah (c.c.) qarşısında məsuliyyət duyğusu yoxdur, o, Allaha (c.c.) baş əymək istəmir, onda Allaha (c.c.) şükr duyğusu ölmüşdür, o, nemətlərin sahibinin Allah olduğunu qəbul etmir, təkəbbürlü insan axirətə də inanmır, təkəbbürlü insan yolunu azır, o, Allahlıq iddiasına düşür, o, hesab gününü inkar edir, o, şübhəçidir, o, dəlilsiz danışır, onun qəlbi möhürlənmişdir, təkəbbür duyğusunu təmin etmək, onu doyurmaq mümkün deyil.

Təkəbbürlü insanların gözünün, qəlbinin, qulağının möhürlənməsi odur ki, onlar doğrunu yalandan ayırd etmək imkanını itirirlər. Onlar Allah qarşısında məsuliyyət duyğusundan məhrum olurlar. Belə insan özündən razı olan kimi azır, o üstün bir gücə ehtiyac hiss etmir, hər bir işi özünün yaratdığını düşünür, ona görə də təkəbbür duyğusunu doyura bilmir, daim şübhə içində olur, əlində olanlarla razılaşmır.

Təkəbbürlü insanın itirdiyi ən dəyərli şey azadlıqdır. İslam anlayışına görə azadlıq dünya sevgisindən qurtulmaqdır. Azadlıq insanın maddi bir gücün təsiri altında olmamasıdır, onun üçün daşla qızılın dəyəri birdir. İnsan ancaq Allaha (c.c.) qul olmaqla azad ola bilər. Sufilərə görə azadlıq qulun dünyəvi və uxrəvi heç bir şeydə gözü olmamasıdır. Təkəbbür, özünü bəyənmə isə insanın Allahdan (c.c.) başqa inandıqlarına qul olmasıdır, bu isə köləlikdir.

Quranda və hədislərdə təkəbbürün haram sayılması da onun törətdiyi fəsadlarla bağlıdır. Uca Allah (c.c.) belə buyurur:

تِلْكَ الدَّارُ الْآخِرَةُ نَجْعَلُهَا لِلَّذِينَ لَا يُرِيدُونَ عُلُوّاً فِي الْأَرْضِ وَلَا فَسَاداً وَالْعَاقِبَةُ لِلْمُتَّقِينَ

(Qəsəs, 28/83)

«Budur, axirət yurdu! Biz onu yer üzündə təkəbbürlü olmayanlar, pozğunçuluq etməyənlərə nəsib edərik. Sonda qazanclı olanlar fənalıqdan uzaq olanlardır».

إِنَّ قَارُونَ كَانَ مِن قَوْمِ مُوسَى فَبَغَى عَلَيْهِمْ وَآتَيْنَاهُ مِنَ الْكُنُوزِ مَا إِنَّ مَفَاتِحَهُ لَتَنُوءُ بِالْعُصْبَةِ أُولِي الْقُوَّةِ إِذْ قَالَ لَهُ قَوْمُهُ لَا تَفْرَحْ إِنَّ اللَّهَ لَا يُحِبُّ الْفَرِحِينَ وَابْتَغِ فِيمَا آتَاكَ اللَّهُ الدَّارَ الْآخِرَةَ وَلَا تَنسَ نَصِيبَكَ مِنَ الدُّنْيَا وَأَحْسِن كَمَا أَحْسَنَ اللَّهُ إِلَيْكَ وَلَا تَبْغِ الْفَسَادَ فِي الْأَرْضِ إِنَّ اللَّهَ لَا يُحِبُّ الْمُفْسِدِينَ قَالَ إِنَّمَا أُوتِيتُهُ عَلَى عِلْمٍ عِندِي أَوَلَمْ يَعْلَمْ أَنَّ اللَّهَ قَدْ أَهْلَكَ مِن قَبْلِهِ مِنَ القُرُونِ مَنْ هُوَ أَشَدُّ مِنْهُ قُوَّةً وَأَكْثَرُ جَمْعاً وَلَا يُسْأَلُ عَن ذُنُوبِهِمُ الْمُجْرِمُونَ . فَخَرَجَ عَلَى قَوْمِهِ فِي زِينَتِهِ قَالَ الَّذِينَ يُرِيدُونَ الْحَيَاةَ الدُّنيَا يَا لَيْتَ لَنَا مِثْلَ مَا أُوتِيَ قَارُونُ إِنَّهُ لَذُو حَظٍّ عَظِيمٍ . وَقَالَ الَّذِينَ أُوتُوا الْعِلْمَ وَيْلَكُمْ ثَوَابُ اللَّهِ خَيْرٌ لِّمَنْ آمَنَ وَعَمِلَ صَالِحاً وَلَا يُلَقَّاهَا إِلَّا الصَّابِرُونَ . فَخَسَفْنَا بِهِ وَبِدَارِهِ الْأَرْضَ فَمَا كَانَ لَهُ مِن فِئَةٍ يَنصُرُونَهُ مِن دُونِ اللَّهِ وَمَا كَانَ مِنَ المُنتَصِرِينَ

(Qəsəs, 28/76-81)

«Harun Musa qövmindən idi. Qövmünə qarşı təkəbbürlənərək zülm etmişdi. Biz ona elə xəzinələr vermişdik ki, açarlarını güclü, qüvvətli bir topluluq zorla daşıyırdı. Onun təkəbbürləndiyini görən qövmü ona belə demişdi:

- Özündən çıxma! Allah təkəbbürlüləri sevməz! Allahın sənə verdiyi bu sərvətlə axirət yurdunu qazanmağa çalış. Dünyadakı qismətini də unutma. Allah sənə yaxşılıq etdisə, sən də başqalarına yaxşılıq et. Yer üzündə fəsad çıxarmağa çalışma. Allah fəsadçıları sevməz.

Harun da cavabında:

- Mən o sərvəti öz biliyimlə qazandım, dedi.

Harun bilmirmi ki, Allah daha öncəki zamanlarda özündən daha güclü, tərəfdarları daha çox neçə nəsilləri həlak etdi. Nələr etdikləri bilindiyi üçün günahkarlardan günahları belə sorulmaz.

Bir gün Harun bütün dəbdəbəsiylə qövmünün qarşısına çıxdı. Dünya həyatını arzulayanlar:

- Haruna verilən kaş bizə də verilsəydi! Doğrusu, o çox şanslı adamdır, dedilər.

Elmi olanlar isə:

- Yazıqlar olsun sizə! İman edib yaxşı işlər edənlərə Allahın verəcəyi savab daha dəyərlidir. Bu mükafata isə ancaq səbir edənlər qovuşar, dedilər. Sonunda biz onu da, sarayını da yerin dibinə keçirdik. Allaha qarşı ona yardım edəcək bir kimsə tapılmadı. Özü də özünü qoruyub qurtaracaq gücdə deyildi».

İslam peyğəmbəri hz.Məhəmməd (s.a.s.) təkəbbürü ən pis xasiyyətlər sırasında sadalayıb. Abdullah ibni Məsud (r.a.) rəvayət edir: «Peyğəmbər (s.a.s.) belə buyurdu:

- Qəlbində zərrə qədər təkəbbür olan kimsə cənnətə girə bilməz.

Səhabələrdən biri:

- İnsan paltar və ayaqqabısının gözəl olmasını arzu edər, dedi.

Hz. Məhəmməd (s.a.s.):

- Allah gözəldir, gözəli sevər. Təkəbbür isə haqqı qəbul etməmək və insanları heçə saymaqdır».[428]

Sələmə ibni Əkva (r.a.) belə rəvayət edir. «Bir adam Rəsulullahın (s.a.s.) yanında sol əliylə yemək yeyirdi. Rəsuli-Əkrəm ona:

- Sağ əlinlə ye!,- buyurdu.

Adam:

- Yeyə bilmirəm, deyə cavab verdi.

Rəsulullah (s.a.s.) adama:

- Yeyə bilmə!, - buyurdu.

Sələmənin dediyinə görə, adam təkəbbüründən belə söyləmişdi. Rəsulullahın (s.a.s.) bəd duasını alanda əlini ağzına apara bilmədi».[429]

Harisə ibni Vəhb (r.a.) rəvayət edir: «Rəsulullahı belə buyurarkən dinlədim:

- Sizə cəhənnəmliklərin kimlər olduğunu söyləyimmi? Onlar sərt qəlbli, qaba, xəsis və özündən razı olaraq yeriyən təkəbbürlü kimsələrdir».[430]

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir. «Peyğəmbər (s.a.s.) belə buyurdu:

- Cənnət ilə cəhənnəm münaqişə etdilər.

Cəhənnəm:

- Məndə zorbalar və təkəbbürlülər var, dedi.

Cənnət:

- Məndə yalnız zəiflər və yoxsullar var, dedi.

Uca Allah onların çəkişməsini belə həll etdi:

- Ey cənnət! Sən mənim rəhmətimsən, dilədiyimə səninlə mərhəmət edərəm.

---

[428] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 531.
[429] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 533.
[430] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 535.

Ey cəhənnəm! Sən də mənim əzabımsan. Dilədiyimə səninlə əzab edərəm. Mən hər ikinizi də dolduracağam».[431]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Təkəbbürlənərək paltarını yerdə sürüyən kimsənin sifətinə uca Allah qiyamət günü baxmaz».[432]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Uca Allah qiyamət günündə üç insanla danışmaz. Onları təmizə çıxarmaz. Sifətlərinə belə baxmaz, üstəlik onlar qorxunc bir əzaba düçar olarlar. Bunlar, zina edən qoca, yalan söyləyən hökmdar, təkəbbürlənən kasıbdır».[433]

Əbu Hureyrə (r.a.) rəvayət edir. Rəsulullah (s.a.s.) belə buyurdu: «Vaxtı ilə özünü bəyənmiş bir adam gözəl paltarını geymiş, saçını daramış, naz sataraq yeriyirdi. Uca Allah onu yerin dibinə quyuladı. O şəxs qiyamətədək eşələnərək yerin dibini qazmağa davam edəcəkdir».[434]

Əbu Hureyrə (r.a.) rəvayət edir. Rəsulullah (s.a.s.) belə buyurdu: «Müsəlman müsəlmanın qardaşıdır. Ona xəyanət etməz, yalan söyləməz və yardımı tərk etməz. Hər müsəlmanın başqa müsəlmana namusu, qanı və malı haramdır. (Qəlbinə işarə edərək) Təqva buradadır. Bir kimsəyə şər olaraq müsəlman qardaşını kiçik görməsi yetər».[435]

Cabir ibni Abdullah (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Yaxşı xasiyyətli olanlarınız içinizdə ən çox sevdiyim və qiyamət günü mənə ən yaxın məsafədə olacaq kimsələrdir. «Gözəl söhbət edir», dedirtmək üçün uzun-uzun danışanlar, sözünü bəyəndirmək üçün ovurdunu

---

[431] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 537.
[432] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 538.
[433] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 540.
[434] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 543.
[435] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 197.

şişirdə-şişirdə  danışanlar və bilikli olduğunu göstərmək üçün çətin sözlər seçənlər isə ən sevmədiyim və qiyamət günü mənə ən uzaq məsafədə olacaq kimsələrdir.

Əshabi-kiram:

- Ey Rəsulullah! «Gözəl söhbət edir» dedirtmək üçün uzun-uzadı danışanları, sözünü bəyəndirmək üçün ovurdunu şişirdə-şiqirdə danışanları tanıyırıq (bilirik). Ancaq bilikli görünmək üçün çətin sözlər seçənlər dediyiniz kimlərdir?, - deyə soruşduqlarında:

- Təkəbbürlü kimsələrdir, cavabını verdi».[436]

Uca Allah (c.c.) təkəbbürün bir ruhi, psixoloji xəstəlik olması ilə birgə sosial bəla olduğunu da buyurur. İlahi bəyana görə, təkəbbür insanlar, toplumlar arasındakı əlaqələri pozur, ünsiyyət imkanlarını azaldır, cəmiyyəti parçalayır.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا يَسْخَرْ قَومٌ مِّن قَوْمٍ عَسَى أَن يَكُونُوا خَيْراً مِّنْهُمْ وَلَا نِسَاء مِّن نِّسَاء عَسَى أَن يَكُنَّ خَيْراً مِّنْهُنَّ وَلَا تَلْمِزُوا أَنفُسَكُمْ وَلَا تَنَابَزُوا بِالْأَلْقَابِ بِئْسَ الاِسْمُ الْفُسُوقُ بَعْدَ الْإِيمَانِ وَمَن لَّمْ يَتُبْ فَأُوْلَئِكَ هُمُ الظَّالِمُونَ

(Hucurat, 49/11)

«Ey möminlər! Bir topluluq başqa bir topluluğa lağ etməsin (ələ salmasın). Bəlkə də ələ saldıqları onlardan daha yaxşıdır. Qadınlar da qadınları ələ salmasınlar. Bəlkə də ələ saldıqları onlardan daha yaxşıdır. Özünüz özünüzə eyib tutmayın. Bir-birinizi pis ləqəblərlə çağırmayın. İman etdikdən sonra doğru olandan ayrılıb günaha girmək çox pis addır. Tövbə etməyənlər zalımların elə özləridir».

Bu ayələrdə təkəbbür və onun əlamətləri verilmişdir. Təkəbbürlü insan başqasına lağ edir, onu ələ salır, başqalarını adam yerinə qoymur. Uca Allah (c.c.) ayədə qadınları ayrıca xəbərdar edir. Onları bir-birini bəyənməzlikdən çəkindirir.

[436] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 565.

Uca Allahın (c.c.) ölçülərinə görə, təkəbbürlü adamlar başqalarında eyib, qüsur axtarır, başqalarını pis ləqəblərlə çağırır. Təkəbbür elə bir xəstəlikdir ki, o, iman etmiş insanı belə günaha bulaşdıra bilər. Uca Allah (c.c.) təkəbbür xəstəliyinin çox qorxulu olduğunu anlatmaq üçün ayənin sonunda tövbəni xatırladır. Tövbə insanın yanlış yoldan əl çəkəcəyinə söz verməsi və bir daha bu yanlış yola doğru bir addım belə atmayacağı demək olduğundan insanın özünü günahlardan təmizləmə və qoruma metodudur. Deməli, təkəbbür də insanı tövbəni zəruri edəcək yanlış yola yönəldə bilər.

Uca Allah (c.c.) başqa bir ayədə təkəbbürlü insanın bir əlamətini çox açıq biçimdə təqdim edir:

وَيْلٌ لِّكُلِّ هُمَزَةٍ لُّمَزَةٍ

(Huməzə, 104/1)

«İnsanların arxasından qaş-göz işarəsiylə onlarla əylənməyi adət halına gətirənlərin vay halına!»

Bu ayə bizi bir də təkəbbürlü insanları tanımağa yönəldir. Onlar insanların arxasınca danışırlar, qaş-göz işarəsi ilə başqalarını ələ salırlar.

Uca Allah (c.c.) bu surədə təkəbbürlü insanın başqa əlamətlərini də sadalayır: onlar çoxlu mal toplayırlar, gecə-gündüz onu sayırlar, bu sərvətin onları əbədi edəcəyini düşünürlər. Uca Allah (c.c.) bu təkəbbürlü insanları acı, atəşli, qorxunc bir aqibətlə xəbərdar edir:

كَلَّا لَيُنبَذَنَّ فِي الْحُطَمَةِ . وَمَا أَدْرَاكَ مَا الْحُطَمَةُ . نَارُ اللَّهِ الْمُوقَدَةُ الَّتِي تَطَّلِعُ عَلَى الْأَفْئِدَةِ . إِنَّهَا عَلَيْهِم مُّؤْصَدَةٌ . فِي عَمَدٍ مُّمَدَّدَةٍ

(Huməzə, 104/4-9)

«Xeyr, and olsun ki, o Hutaməyə atılacaqdır. Bildinmi o Hutamə nədir? O, Allahın qalanmış bir atəşidir ki, qəlblərin içinə işləyəcəkdir. O atəş tikilmiş sütunlara bağlı olaraq onları bürüyəcəkdir».

Buradan aydın olur ki, təkəbbür insanı qeybətə, dedi-qoduya yönəldir. Təkəbbürlü insan qəlbindəki böyüklük ehtirasını başqalarını kiçiltmək, ələ salmaq hesabına söndürməyə çalışır. Əslində, təkəbbürlü insan əbədi bir sıxıntı içindədir.

Bu ilahi buyruqlara uyğun olaraq hz.Məhəmməd (s.a.s.) təkəbbürü haram elan edir:

«Qəlbində zərrə qədər təkəbbür olan cənnətə girə bilməz».[437]

«Müsəlman qardaşını aşağı görməsi insana pislik olaraq yetər».[438]

Hz. Məhəmmədin (s.a.s.) ölçülərinə görə, təkəbbürlü insan doğrunu qəbul etməz, xalqa qarşı yönələr, onun qəlbində başqalarına sevgi yoxdur, o, ruhi xəstədir, o, hamıdan böyük olmaq azarına tutulub, təkəbbür onun qəlbində mərhəməti öldürüb, onun viran qalmış qəlbində ilanlar oynaşır, o, hər zaman yalan danışır.

---

[437] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 579.
[438] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 579.

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ TƏKƏBBÜRÜ YARADAN SƏBƏBLƏR

Hz. Nizaminin beytinin dəyər yükünə görə, dünya təkəbbürü hz.Məhəmmədin (s.a.s.) başına dolmadı. Buradakı «dünya təkəbbürü» anlayışının bir anlamı da dünya malı ilə bağlıdır. Ayələrin və hədislərin tanıtdığı kimi, təkəbbürlü insan sərvət düşgünü olur, o, halal, haram demədən mal-dövlət toplayır, təkəbbür duyğusu onu qamçılayır, o, bu dünyada baş olmaq ehtirası ilə alışıb yanır.

Onun düşüncəsinə görə, bu dünyada hamıdan böyük olmağın yolu çoxlu sərvətdən keçir. Onun təkəbbür duyğusunun ehtiyaclarını təmin etmək üçün pul, mal-dövlət ən etibarlı vasitədir. Deməli, hz.Nizaminin də düşüncəsinə görə, insanda təkəbbürü yaradan qaynaqlardan biri mal-dövlətdir.

Hz.Nizami Peyğəmbərin (s.a.s.) ucalığının səbəbləri sırasında onun dünyaya, dünya malına dəyər verməməsini önə çəkir. Şair bəyan edir ki, hz.Məhəmməd (s.a.s.) bu dünyada başını «cahan qabağında əymədi». Əslində, bu sadəcə bir öygü, nəsihət deyil. Bu ilahi ölçülərə uyğun bir dəyərdir. Fitrətinə uyğun insan olmaq, dəyərli, uca Allahın (c.c.) razı qalacağı varlığa çevrilməyin düsturudur. Ucalmaq istəyirsənsə, bu dünyanın ehtiyacından artıq malına göz dikməməlisən. İndi gəlin görək, uca Allah (c.c.), onun elçisi bu dünyaya münasibətdə hansı ölçüləri müəyyənləşdirib.

Uca Quran buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ مَا لَكُمْ إِذَا قِيلَ لَكُمُ انفِرُواْ فِي سَبِيلِ اللّهِ اثَّاقَلْتُمْ إِلَى الأَرْضِ أَرَضِيتُم بِالْحَيَاةِ الدُّنْيَا مِنَ الآخِرَةِ فَمَا مَتَاعُ الْحَيَاةِ الدُّنْيَا فِي الآخِرَةِ إِلاَّ قَلِيلٌ إِلاَّ تَنفِرُواْ يُعَذِّبْكُمْ عَذَاباً أَلِيماً وَيَسْتَبْدِلْ قَوْماً غَيْرَكُمْ وَلاَ تَضُرُّوهُ شَيْئاً وَاللّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ إِلاَّ تَنصُرُوهُ فَقَدْ نَصَرَهُ اللّهُ إِذْ أَخْرَجَهُ الَّذِينَ كَفَرُواْ ثَانِيَ اثْنَيْنِ إِذْ هُمَا فِي الْغَارِ إِذْ يَقُولُ

لِصَاحِبِهِ لاَ تَحْزَنْ إِنَّ اللّهَ مَعَنَا فَأَنزَلَ اللّهُ سَكِينَتَهُ عَلَيْهِ وَأَيَّدَهُ بِجُنُودٍ لَّمْ تَرَوْهَا وَجَعَلَ كَلِمَةَ الَّذِينَ كَفَرُواْ السُّفْلَى وَكَلِمَةُ اللّهِ هِيَ الْعُلْيَا وَاللّهُ عَزِيزٌ حَكِيمٌ انْفِرُواْ خِفَافاً وَثِقَالاً وَجَاهِدُواْ بِأَمْوَالِكُمْ وَأَنفُسِكُمْ فِي سَبِيلِ اللّهِ ذَلِكُمْ خَيْرٌ لَّكُمْ إِن كُنتُمْ تَعْلَمُونَ

(Tövbə, 9/38-41)

«Ey iman gətirənlər! Sizə nə oldu: «Allah yolunda döyüşə çıxın!»,-deyiləndə yerə yapışıb qaldınız. Yoxsa axirətdən vaz keçib dünya həyatına razı oldunuz? Halbuki, dünya malı axirət yanında yalnız cüzi bir şeydir! Əgər çıxmasanız, Allah sizə şiddətli bir əzab verər və sizi başqa bir tayfa ilə əvəz edər. Siz isə Ona heç bir zərər verə bilməzsiniz. Allah hər şeyə qadirdir. Əgər siz Ona kömək etməsəniz, Allah Ona kömək göstərmiş olar. Necə ki, kafirlər Onu iki nəfərdən biri olaraq çıxartdıqları, hər ikisi mağarada olduğu və öz dostuna: «Qəm yemə, Allah bizimlədir!»,-dediyi zaman o vaxt Allah ona bir arxayınlıq nazil etmiş, onu sizin görmədiyiniz əsgərlərlə müdafiə etmiş, kafirlərin sözünü alçaltmışdı. Yalnız Allahın sözü ucadır. Allah yenilməz qüvvə sahibi, hikmət sahibidir. Ağırlı-yüngüllü hamınız cihada çıxıb malınız və canınızla Allah yolunda vuruşun! Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!».

زُيِّنَ لِلنَّاسِ حُبُّ الشَّهَوَاتِ مِنَ النِّسَاء وَالْبَنِينَ وَالْقَنَاطِيرِ الْمُقَنطَرَةِ مِنَ الذَّهَبِ وَالْفِضَّةِ وَالْخَيْلِ الْمُسَوَّمَةِ وَالأَنْعَامِ وَالْحَرْثِ ذَلِكَ مَتَاعُ الْحَيَاةِ الدُّنْيَا وَاللّهُ عِندَهُ حُسْنُ الْمَآبِ

(Ali-İmran, 3/14)

«İnsanlara qadınlar, oğullar, yüklərlə altun və gümüş yığınları, gözəl atlar, davarlar, əkinləri kimi şeylərin sevgisi gözəl göstərildi, bəzəndi. Ancaq bunlar dünya həyatının keçici mənfəətidir. Gözəl nəticə Allahın yanındadır».

أَلَمْ تَرَ إِلَى الَّذِينَ قِيلَ لَهُمْ كُفُّواْ أَيْدِيَكُمْ وَأَقِيمُواْ الصَّلاَةَ وَآتُواْ الزَّكَاةَ فَلَمَّا كُتِبَ عَلَيْهِمُ الْقِتَالُ إِذَا فَرِيقٌ مِّنْهُمْ يَخْشَوْنَ النَّاسَ كَخَشْيَةِ اللّهِ أَوْ أَشَدَّ خَشْيَةً وَقَالُواْ رَبَّنَا لِمَ كَتَبْتَ عَلَيْنَا الْقِتَالَ لَوْلا أَخَّرْتَنَا إِلَى أَجَلٍ قَرِيبٍ قُلْ مَتَاعُ الدَّنْيَا قَلِيلٌ وَالآخِرَةُ خَيْرٌ لِّمَنِ اتَّقَى وَلاَ تُظْلَمُونَ فَتِيلاً
(Nisa, 4/77)

«O şəxsləri görmürsənmi ki, onlara: «(Müharibədən) əl çəkin, namaz qılın, zəkat verin!»,-deyilmişdi. Onlara cihad etmək vacib olduqda isə, içərilərindən bir qismi Allahdan qorxan kimi, ya da daha artıq bir qorxu ilə insanlardan qorxuya düşərək: «Ey Rəbbimiz! Cihad etməyi nə üçün bizə vacib etdin? Nə olardı ki, bizi yaxın zamana qədər yubandıraydın!»,-dedilər. Onlara söylə: «Dünyanın ləzzəti və faydası azdır, ancaq inananlar üçün axirət daha xeyirlidir. Sizə xurma çəyirdəyində olan nazik tel qədər belə zülm olunmayacaq».

وَذَرِ الَّذِينَ اتَّخَذُواْ دِينَهُمْ لَعِباً وَلَهْواً وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا وَذَكِّرْ بِهِ أَن تُبْسَلَ نَفْسٌ بِمَا كَسَبَتْ لَيْسَ لَهَا مِن دُونِ اللّهِ وَلِيٌّ وَلاَ شَفِيعٌ وَإِن تَعْدِلْ كُلَّ عَدْلٍ لاَّ يُؤْخَذْ مِنْهَا أُوْلَـئِكَ الَّذِينَ أُبْسِلُواْ بِمَا كَسَبُواْ لَهُمْ شَرَابٌ مِّنْ حَمِيمٍ وَعَذَابٌ أَلِيمٌ بِمَا كَانُواْ يَكْفُرُونَ
(Ənam, 6/70)

«Dinlərini bir oyun və əyləncə sayan və özlərini dünya həyatının aldatdığı kimsələri burax! Və heç bir kimsənin qazandığı şey üzündən özünü həlaka atmaması üçün ona Allahdan başaq heç bir dost və şəfaətçinin olmadığını Quran ilə xatırlat. O, əzabdan qurtulmaq üçün hər cür fidyəni tarazlaşdırırsa belə, qəbul edilməz. Onlar qazandıqları günahlar üzündən həlaka uğradılmış kimsələrdir. Onlar üçün inkar etdiklərinə görə qaynar bir içəcək və canyandırıcı bir əzab vardır».

إِنَّ الَّذِينَ لاَ يَرْجُونَ لِقَاءنَا وَرَضُواْ بِالْحَياةِ الدُّنْيَا وَاطْمَأَنُّواْ بِهَا وَالَّذِينَ هُمْ عَنْ آيَاتِنَا غَافِلُونَ

(Yunus, 10/7)

«Onlar ki, bizə qovuşmağı ümid etməzlər və dünya həyatına razı olub onunla kifayətlənərlər. Onlar bizim ayələrimizdən qafildirlər».

الَّذِينَ يَسْتَحِبُّونَ الْحَيَاةَ الدُّنْيَا عَلَى الآخِرَةِ وَيَصُدُّونَ عَن سَبِيلِ اللّهِ وَيَبْغُونَهَا عِوَجاً أُوْلَـئِكَ فِي ضَلاَلٍ بَعِيدٍ

(İbrahim, 14/3)

«Onlar ki, dünya həyatını sevər, onu axirətdən üstün tutarlar, insanları Allah yolundan döndərərlər və onu (Allahın yolunu) əyri və dolambaclı göstərməyə çalışarlar. Onlar çox dərin, haqdan uzaq bir sapıqlıq içindədirlər».

وَاصْبِرْ نَفْسَكَ مَعَ الَّذِينَ يَدْعُونَ رَبَّهُم بِالْغَدَاةِ وَالْعَشِيِّ يُرِيدُونَ وَجْهَهُ وَلَا تَعْدُ عَيْنَاكَ عَنْهُمْ تُرِيدُ زِينَةَ الْحَيَاةِ الدُّنْيَا وَلَا تُطِعْ مَنْ أَغْفَلْنَا قَلْبَهُ عَن ذِكْرِنَا وَاتَّبَعَ هَوَاهُ وَكَانَ أَمْرُهُ فُرُطاً

(Kəhf, 18/28)

«Sabah axşam Rəbblərinin rizasını diləyərək dua edənlərlə bərabər səbr et. Sən dünya həyatının bəzəyini (süsünü) istəyərək onlardan gözlərini ayırma. Qəlbini zikrimizdən qafil saxladığımız, keyfinin arzusuna uyan və işi-gücü həddi aşmaq olan kimsəyə itaət etmə».

الْمَالُ وَالْبَنُونَ زِينَةُ الْحَيَاةِ الدُّنْيَا وَالْبَاقِيَاتُ الصَّالِحَاتُ خَيْرٌ عِندَ رَبِّكَ ثَوَاباً وَخَيْرٌ أَمَلاً

(Kəhf, 18/46)

«Mal və oğullar dünya həyatının zinətidir. Əbədi qalacaq saleh əməllər isə Rəbbinin yanında savabca da xeyirlidir, ümidcə də xeyirlidir».

وَمَا هَذِهِ الْحَيَاةُ الدُّنْيَا إِلَّا لَهْوٌ وَلَعِبٌ وَإِنَّ الدَّارَ الْآخِرَةَ لَهِيَ الْحَيَوَانُ لَوْ كَانُوا يَعْلَمُونَ

(Ənkəbud, 29/64)

«Bu dünya həyatı bir əyləncə və oyundan ibarətdir. Gerçəkdən son yurd (axirət) – xalis həyat odur. Kaş biləydilər».

اعْلَمُوا أَنَّمَا الْحَيَاةُ الدُّنْيَا لَعِبٌ وَلَهْوٌ وَزِينَةٌ وَتَفَاخُرٌ بَيْنَكُمْ وَتَكَاثُرٌ فِي الْأَمْوَالِ وَالْأَوْلَادِ كَمَثَلِ غَيْثٍ أَعْجَبَ الْكُفَّارَ نَبَاتُهُ ثُمَّ يَهِيجُ فَتَرَاهُ مُصْفَرّاً ثُمَّ يَكُونُ حُطَاماً وَفِي الْآخِرَةِ عَذَابٌ شَدِيدٌ وَمَغْفِرَةٌ مِّنَ اللَّهِ وَرِضْوَانٌ وَمَا الْحَيَاةُ الدُّنْيَا إِلَّا مَتَاعُ الْغُرُورِ

(Hədid, 57/20)

«Bilin ki, dünya həyatı bir oyun, bir əyləncə, bir süs və aranızda bir öyünmə, mal və övladda bir çoxluq yarışından ibarətdir. Bu bir yağmura bənzər ki, bitirdiyi ot əkinçilərin xoşuna gələr, sonra quruyar. Bir də görürsən ki, sapsarı olmuş, sonra çör-çöp olmuşdur. Axirətdə isə ya şiddətli bir əzab, ya da Allahdan bir bağışlama, riza vardır. Dünya həyatı aldadıcı bir faydalanmadan başqa bir şey deyildir».

إِنَّمَا أَمْوَالُكُمْ وَأَوْلَادُكُمْ فِتْنَةٌ وَاللَّهُ عِندَهُ أَجْرٌ عَظِيمٌ

(Təqabun, 64/15)

«Hər halda mallarınız və övladlarınız bir fitnədir (imtahandır). Allah isə, bütün mükafat onun yanındadır».

Bu ayələrdə uca Allah (c.c.) bu dünya ilə axirəti birgə dəyərləndirib. Təbii ki, islam kasıb həyatı təbliğ etmir, bu dünya nemətlərini də inkar etmir. Bu ilahi iradəyə də uyğun deyil. Qadir Allah (c.c.) bu dünya nemətlərini insan üçün yaradıb, insan da ondan ehtiyacına uyğun istifadə etməlidir. Bunsuz həyat olmaz. Ancaq insan Allahın qoyduğu ölçülərə uyğun yaşamaq istəyirsə, nemətə münasibətdə bir sıra şərtlərə əməl etməlidir. Bu şərtlər insanı təkəbbürdən

qoruyur, dünya nemətlərini axirəti qazanmaq üçün vasitəyə çevirir.

Bunun üçün insan hər şeydən öncə nemətin sahibinin Allah olduğuna inanmalıdır. Bu inam insanda şükür duyğusu yaradır, onu israfdan qoruyur, onu bu nemətləri təyinatı üzrə xərcləməyə yönəldir.

## MÜLKÜN SAHİBİ ALLAHDIR

İnsan qazandıqlarının Allahın (c.c.) istəyi ilə ona verildiyinə inanmalıdır. O, düşünməlidir ki, ona verilmiş dünya neməti onun üçün bir sınaqdır.

İnsan hansı halda qazancından rahatlıqla zəkat, sədəqə verə bilər? Məktəb, məscid tikdirər, yol çəkdirər, darda olanlara yardım edər? Allahın (c.c.) verdiyi neməti göstərilən məqsədlərə xərcləmək ancaq axirət inancı ilə mümkündür. Axirətə inanan insan onu qazanmağa çalışır, bütün vaxtını, düşüncəsini, sərvətini, bir sözlə varlığını bu yolda sərf edir. İnsan axirət inancı olmadan da, məsələn, yol çəkdirə bilər. Ancaq belə insanın məqsədi bu dünya çıxarı (faydası) ilə bağlıdır.

Daha sonra təkəbbürdən qorunmağın yolu qazancın halal olmasıdır, bu qazancın başqasının haqqını yemədən qazanılmasıdır. İnsan təkəbbürdən qorunmaq istəyirsə, o, hər gün gördüyü, eşitdiyi adi, sadə bir gerçəkliyə inanmalıdır ki, bu dünya fanidir. Onun axirətə əməlindən başqa aparacaq bir şeyi yoxdur. Sərvətə, şöhrətə münasibətdə bu anlayış yoxdursa, o, insanı mütləq təkəbbürə yönəldəcək. Təkəbbür isə insanla Allah (c.c.) arasındakı ən qatı, ən qaranlıq pərdələrdən biri olduğundan uca Allah (c.c.) bu xisləti şiddətlə tənqid edir.

Yuxarıdakı ayələrdə də gördük ki, uca Allah (c.c.) dünya sevgisindən, təkəbbürdən danışdığı ayələrdə tez-tez

cəhənnəmi, əzabı, atəşi xatırladır. Bu da birbaşa təkəbbürün çox təhlükəli ruhi xəstəlik olması ilə bağlıdır.

Hz.Nizamiyə görə, hz.Məhəmmədin (s.a.v) bu dünya sərvəti qarşısında baş əyməməsi onun böyüklüyünün, Allaha (c.c.) sonsuz sevgisinin nəticəsidir. Doğrudan da insan yalnız çox sevdiyi yolunda hər şeyini fəda edə bilər.

Hz.Məhəmmədin (s.a.s.) dünyaya doğru münasibətinin səbəbi onun dünyanı doğru tanıması ilə bağlıdır. O, dünyanın yaradıcısını tanıyır, dünyanın yaradılma qayəsini bilir, insanın yaradılış missiyasını doğru dəyərləndirir, nəticədə, insanla Allah (c.c.), insanla dünya arasındakı münasibət ölçülərini dəqiq müəyyən edir.

Hz.Nizaminin bu beytdə insanlara göstərmək istədiyi hədəflərdən biri də dünyanı hz.Məhəmmədin (s.a.s.) ölçüləri ilə onlara tanıtmaqdır. Çünki dünya nemətinin afətindən qorunmağın yolunu bu dünyanı doğru tanımaqla tapmaq olar.

Gəlin, hz. Məhəmmədin (s.a.s.) bu dünyaya münasibətinin ölçülərinə baxaq.

Amr ibni Avf əl-Ensarı rəvayət edir. «Rəsulullah belə buyurdu: «Sevinin və sizi sevindirəcək şeylərə ümid edin. Allaha and içirəm ki, sizlər üçün kasıblıqdan qorxmuram. Ancaq mən sizdən öncəkilərin önünə sərildiyi kimi dünyanın sizin önünüzə sərilməsindən, onların dünya üçün yarışdıqları kimi sizin də yarışa girmənizdən, dünyanın onları həlak etdiyi kimi sizi də həlak etməsindən qorxuram».[439]

Bu hədisdəki ölçülərə görə, insan halal yaşamalıdır, dünya malı insanları təkəbbürə, təkəbbür də həlaka yönəldir. Zənginlik onun verildiyi insan üçün bir sınaqdır və böyük məsuliyyəti var.

[439] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 181-182.

Əbu Səid əl-Hudri (r.a.) belə rəvayət edir. «Rəsulullah (s.a.s.) minbərdə oturmuş, biz də onun ətrafında oturmuşduq. Rəsulullah (s.a.s.) belə buyurdu: «Məndən sonra siz dünya nemətlərinin və zinətlərinin gözəl görünməsindən və könlünüzü ona vermənizdən qorxuram».[440]

Bu hədisə görə dünya malına həddən çox bağlanmaq insana Allahı (c.c.) unutdura bilər. Təkəbbürün qaynağı dünya malına yanlış münasibətdir.

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Dünya dadlıdır, mənzərəsi xoşdur. Şübhəsiz ki, Allah dünyanın idarəsini sizə verəcək və necə davranacağınıza, nə kimi işlər edəcəyinizə baxacaq. O halda çəkinin və qadınlardan qorunun».[441]

Bu hədisə görə, dünya nemətlərindən biri hakimiyyət, yəni şöhrətdir. İnsan bu nemətdən doğru yararlanmasa, hakimiyyət də təkəbbürə yol açacaq. İnsanı dünyaya bağlayan nemətlərdən biri də qadındır. İdarə olunmayan şəhvət, qadına yanlış münasibət də insanı azdırır. Qadına doğru münasibət yalnız qarşılıqlı sevgi, hörmət, bağışlama əsasında qurulmuş ailə çərçivəsində ola bilər. Ailə qurmaq Allah (c.c.) buyruğudur və onun məqsədi insanların xoşbəxtliyi, nəslin davam etdirilməsidir. Qadınla başqa məqsəd və müstəvidə qurulan əlaqələr təkəbbürdən qaynaqlanır və sonu fəlakətdir.

Başqa bir hədisində hz. Məhəmməd (s.a.s.) dünya sevgisindən qurtulmağın yolunu göstərir. Enes (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Allahım! Gerçək həyat sadəcə axirət həyatıdır».[442]

Bu hədisə görə hər şey ziddi ilə sağalar. Dünyanın ziddi axirətdir. İnsan axirətə inansa, ona ürəkdən bağlansa, bu

---

[440] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 184.
[441] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 185.
[442] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 187.

dünyadakı addımlarını axirət qazancı hədəfinə uyğunlaşdırar və dünya sevgisindən qopar. İnsan qəlbində dünya sevgisi yoxdursa, təkəbbür də yoxdur.

Enes (r.a.) rəvayət edir. Rəsulullah (s.a.s.) belə buyurdu: «Ölən bir adamı arxasından üç şey təqib edir. Ailəsi, malı və gördüyü işlər. Bunlardan ikisi geri dönər, biri isə onunla birlikdə qalır. Ailəsi və malı geri dönər. Gördüyü işlər özü ilə birlikdə qalar».[443]

Ailə və mal insanı xoşbəxtliyə də yönəldə bilər, bədbəxtliyə də. Ailə və mal təkəbbür qaynağına çevrilirsə, o insanı azdırır. İnsanın bu dünya nemətlərinə axirət qazancı ölçüləri ilə baxıb yaşaması isə onu xilas edər.

Cabir (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) bir gün bazara getdi. Ətrafında səhabə də vardı. Rəsulullah kiçik qulaqlı bir oğlaq ölüsünü gördü. Onun qulağından tutaraq:

- Hansınız bunu bir dirhəmə satın almaq istər?, - buyurdu.

Əshab:

- Daha az pul ilə də olsa, almarıq. O, nəyə yarayar ki!, - dedilər.

Sonra Rəsuli-Əkrəm:

- Sizə havayı verilsə, istəyərsinizmi?, - deyə soruşdu. Onlar:

- Allaha and içərik ki, o diri belə olsa, qulaqsız olduğu üçün qüsurludur. Ölüsünü nə edək?, - deyə cavab verdilər.

Rəsulullah:

- Allaha and içirəm ki, Allaha görə dünya önünüzdəki bu ölü oğlaqdan daha dəyərsizdir, buyurdu».[444]

---

443 Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 188.
444 Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 194.

Hz.Məhəmmədin (s.a.s.) dünyaya başqa bir baxış ölçüsü belədir. İbni Ömər (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) mənim iki çiynimi tutdu və: «Dünyada sanki bir qərib, ya da bir yolçu kimi ol!».[445]

Bu hədislərdə hz.Məhəmməd (s.a.s.) dünya malının insanda təkəbbür yaradacağına işarə etmiş, hesabını axirətə görə tutmağın təkəbbürdən qurtuluşun tək yolu olduğunu buyurmuşdur.

Aişə (r.a.) belə buyurur: «Rəsulullah (s.a.s.) vəfat etmişdi. O sırada mənim evimin taxçasında bir parça arpadan başqa bir canlının yeyəcəyi heç bir şey yox idi. Mən ondan uzun müddət yedim. Sonra ölçdüm, tükənmişdi».[446]

Amr ibni Haris (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) vəfat edəndə geridə mindiyi ağ qatırı, silahı, yolçular üçün vəqf etdiyi ərazidən başqa nə qızıl, nə kölə, nə cariyə, nə də başqa bir şey saxlamışdır».[447]

Kab ibni İyaz (r.a.) Rəsulullahın (s.a.s.) belə buyurduğunu rəvayət edir: «Şübhəsiz, hər ümmətin bir fitnəsi vardır. Ümmətimin fitnəsi (imtahan vasitəsi) isə maldır».[448]

Əbu Amr Osman ibni Affan (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Adəm oğlunun bunlardan başqa bir haqqı yoxdur. Oturacağı ev, bədənini örtəcək paltar, yeyiləcək çörək ilə su qoyulacaq qab».[449]

Abdullah ibni Məsud (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) bir həsir üzərində yatmışdı. Yuxudan oyandıqdan sonra həsirin bədəninin yan tərəfində iz qoyduğunu gördük. Biz:

- Ey Rəsulullah! Sizin üçün bir döşək gətirək, dedik.

---

[445] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 207.
[446] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 213.
[447] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 215.
[448] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 224.
[449] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 226.

Rəsuli-Əkrəm:

- Mənim dünya ilə bağlılığım nə qədərdir ki? Mən bu dünyada bir ağacın altında kölgələnən, sonra da oradan qalxıb gedən minikli bir yolçu kimiyəm, buyurdu».[450]

Hz.Nizami islam peyğəmbərinin özünü bu dünyanın fitnəsindən qorumaq üçün təkəbbürdən uzaq durduğunu ifadə edir. Hz.Nizamiyə görə bu dünya sevgisindən qurtulmağın yollarından biri daim Allahı (c.c.) xatırlamaq, onun nemətlərinə şükr etmək, orta ölçüdə yaşamaq, axirəti bu dünyadan üstün tutmaqdır.

Uca Allah (c.c.) və onun sevimli elçisi təkəbbürdən, dünya sevgisindən azad olmağın başqa bir yolunu da göstərib. Bu yol da ölümü tez-tez xatırlamaq, onu dərindən düşünməkdir. Ölümü düşünmək insanı qorxudan azad edir. Belə ki, insanın qəlbində, düşüncəsində yaranan qorxu hissi, həsəd, paxıllıq duyğusu dünya malına görədir. Ölüm isə dünyanın ziddidir. Ölümü düşünmək insanın qəlbindəki dünya sevgisini öldürür. İslam peyğəmbərinin qəbir ziyarətinə icazə verməsinin səbəbi də budur. Qəbirstanlıq ölümü xatırladır, insanda Allahdan (c.c.) başqa hər şeyin fani olduğu duyğusunu yaradır.

Təsəvvüf təliminə görə, ölümü düşünmək, heçliyini anlamaq bir ibadətdir. Deməli, yaradılışı, bu dünyanı doğru anlamağın yolu ölümü, axirəti tanımaqla mümkündür. Ölümü düşünmək mədəniyyətinə, iradə və cəsarətinə yiyələnmək hər bir möminin Allah qarşısındakı borcudur.

Uca kitabımız Qurani-Kərim tez-tez ölümü xatırladır:

كُلُّ نَفْسٍ ذَآئِقَةُ الْمَوْتِ وَإِنَّمَا تُوَفَّوْنَ أُجُورَكُمْ يَوْمَ الْقِيَامَةِ فَمَن زُحْزِحَ عَنِ النَّارِ وَأُدْخِلَ الْجَنَّةَ فَقَدْ فَازَ وَما الْحَيَاةُ الدُّنْيَا إِلاَّ مَتَاعُ الْغُرُورِ

---

[450] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 235.

(Ali-İmran, 3/185)

«Hər can ölümü dadacaqdır. Qiyamət günü mükafatlarınız büsbütün veriləcəkdir. Kim cəhənnəmdən uzaqlaşdırılıb cənnətə göndərilirsə, o, gerçəkdən qurtulmuşdur. Bu dünya həyatı aldadıcı bir mətahdır».

Uca Allah (c.c.) ayədə ölümün mütləq olduğunu buyurur. Ondan qaçmağın mümkünsüzlüyünü bildirir. Ardınca qiyaməti, cənnət və cəhənnəmi xatırladır. Sonra da bu dünya həyatının fani olduğunu bəyan edir. Ayədəki ilahi düzüm – ölüm, cənnət, cəhənnəm – bir yandan həyat haqqında tam, başdan sonadək bir təsəvvür yaradır, başqa yöndən isə bu xatırlamalar insan qəlbində onun yüksəlişinə mane olan duyğuları öldürmək məqsədi güdür.

إِنَّ اللَّهَ عِندَهُ عِلْمُ السَّاعَةِ وَيُنَزِّلُ الْغَيْثَ وَيَعْلَمُ مَا فِي الْأَرْحَامِ وَمَا تَدْرِي نَفْسٌ مَّاذَا تَكْسِبُ غَداً وَمَا تَدْرِي نَفْسٌ بِأَيِّ أَرْضٍ تَمُوتُ إِنَّ اللَّهَ عَلِيمٌ خَبِيرٌ

(Loğman, 31/34)

«Həqiqətən, o saatı ancaq Allah bilir. Yağışı göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə kəsb edəcəyini, heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz, biləndir, xəbərdardır».

وَلَوْ يُؤَاخِذُ اللّهُ النَّاسَ بِظُلْمِهِم مَّا تَرَكَ عَلَيْهَا مِن دَآبَّةٍ وَلَكِن يُؤَخِّرُهُمْ إلَى أَجَلٍ مُّسَمًّى فَإِذَا جَاء أَجَلُهُمْ لاَ يَسْتَأْخِرُونَ سَاعَةً وَلاَ يَسْتَقْدِمُونَ

(Nəhl, 16/61)

«Əgər Allah insanları zülmləri üzündən cəzalandırsaydı, yer üzündə heç bir canlını sağ buraxmazdı. Ancaq onlara müəyyən müddət möhlət verər. Əcəlləri gəlib çatdıqda isə bir saat belə nə geri qalar, nə də irəli keçə bilərlər».

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تُلْهِكُمْ أَمْوَالُكُمْ وَلَا أَوْلَادُكُمْ عَن ذِكْرِ اللَّهِ وَمَن يَفْعَلْ ذَلِكَ فَأُوْلَئِكَ هُمُ الْخَاسِرُونَ . وَأَنفِقُوا مِن مَّا رَزَقْنَاكُم مِّن قَبْلِ أَن يَأْتِيَ أَحَدَكُمُ الْمَوْتُ فَيَقُولَ رَبِّ لَوْلَا أَخَّرْتَنِي إِلَى أَجَلٍ قَرِيبٍ فَأَصَّدَّقَ وَأَكُن مِّنَ الصَّالِحِينَ . وَلَن يُؤَخِّرَ اللَّهُ نَفْساً إِذَا جَاء أَجَلُهَا وَاللَّهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ

(Münafiqun, 63/9-11)

«Ey iman edənlər! Mallarınız və uşaqlarınız sizi Allahı anmaqdan uzaqlaşdırmasın. Kim bunu edərsə, onlar ziyana uğrayanlardır. Hər hansı birinizə ölüm gələndə: Rəbbim nə olar, ölümümü bir az gecikdirsən, sədəqə verib yaxşılıq edənlərdən olaram demədən öncə sizə verdiyimiz ruzidən xərcləyin. Allah əcəli gələn kimsəni saxlamaz. Allah bütün etdiklərimizdən xəbərdardır».

Hz.Nizami beytdə hz. Məhəmməd (s.a.s.) «cahanda başını cahan qabağında əymədi», deyir. Bunun səbəbi olaraq da Peyğəmbərin təkəbbürü rədd etməsini, təvazökar olmasını göstərir. Hz.Nizamiyə görə, təvazökarlıq təkkəbürün ziddidir, təvazökarlıq təkəbbür xəstəliyini sağaldan dərmandır. İlk baxışda təkəbbürlü adam başını əyməyən, kimsənin qarşısında əyilməyən adam görüntüsü yaradır. Ancaq təkəbbür dünya malına təslim olmaqdır, o kölələrin xislətidir. Təvazökarlıq isə haqqa boyun əyməkdir, Allahı qəbul etməkdir.

Təvazökarlıqla bağlı təsəvvüf böyüklərinin dediklərinə baxaq: Fudayl buyurur: «Təvazökarlıq Haqqa itaət etmək, ona boyun əymək, kim söyləyirsə söyləsin, haqqı qəbul etməkdir».[451]

---

[451] Kuşeyri risalesi (hazırlayan, Süleyman Uludağ), İstanbul, 1991, s. 286.

Cüneyd Bağdadi buyurur: «Təvazö şəfqət qanadlarını (ana quşun üzərinə gərdiyi kimi) xalq üzərinə gərmək və onlara qarşı yumşaq davranmaqdır».[452]

Yəhya b. Muaz buyurur: «Kimdə olursa olsun, təvazökarlıq gözəldir, ancaq zənginlərdə təvazökarlıq çox daha gözəldir. Kimdə olursa olsun, təkəbbür çirkindir, ancaq kasıblarda təkəbbür çox daha çirkindir».[453]

Abdullah Razi buyurur: «Təvazökarlıq xidmətdə fərq qoymamaqdır».

Biz bu verilən bilgilər işığında hz.Nizaminin:

***Cahan təkəbbürü onun başına dolmadı,***
***Ancaq o, cahanda başını cahan qabağında əymədi.***

beytinin anlamını ortaya çıxarmış oluruq. Şairin bu beytdə insan kimi yaşamaq üçün verdiyi ölçü budur: **dünya neməti insana sınaq üçün verilib, insan hər zaman nemətə şükr etməlidir, nemətin sahibinin Allah (c.c.) olduğunu bilməlidir, Allaha qul olan, yalnız Allaha (c.c.) ibadət edən kimsə başqa bir kimsənin qarşısında baş əyməz, insanı Allahın (c.c.) yolundan çıxaran ən pis xislətlərdən biri təkəbbürdür, təkəbbür xəstəliyi ancaq təvazökarlıqla sağala bilər. Təkəbbür insanı azdırdığı kimi, insanlar-arası münasibətləri də pozur, fərdi və ictimai inkişafın qarşısını alır.**

---

[452] Kuşeyri risalesi (hazırlayan, Süleyman Uludağ), İstanbul, 1991, s. 286.
[453] Kuşeyri risalesi (hazırlayan, Süleyman Uludağ), İstanbul, 1991, s. 287.

## ON BEŞİNCİ BEYTİN ŞƏRHİ: İSMƏTLİLƏR (MƏSUMLAR) ONUN HƏRƏMİNDƏ PƏRDƏ DALINDA QALIRLAR

Hz. Nizami nətin on beşinci beytində hz. Məhəmmədlə (s.a.s.) bağlı ismət anlayışını önə çəkib:

عصمتيان در حرمش پرد گی
عصمت از اويافته پرورد گی

***İsmətlilər (məsumlar) onun hərəmində***
***pərdə dalında qalırlar,***
***İsməti (o,) tərbiyələndirmişdir.***[454]
***(İsmət ondan yüksəliş tapmışdır)***

## İSMƏT ANLAYIŞI

Hz. Nizami bu beytin ideyasını «ismət» anlayışı üzərində qurmuşdur. Beytdə «ismət» sözü bir neçə anlamda işlədilmişdir. Biz «ismət» qavramının dini, hüquqi, elm, əxlaqi yönlərini açmağa çalışaq.

Öncə onu deməliyik ki, «ismət» anlayışı din elmində peyğəmbərlərin günahdan qorunmuş olduğunu ifadə edir. Bu sözün leksik, lüğəvi anlamı «mane olmaq», «mümkün zərərləri önləyib bir şeyi qorumaq»dır. «İsmət» sözü yuxarıdakı mənaları ifadə edən «asm» kökündəndir. Alimlər «ismət»in «qorumaq» mənasına üstünlük verərək çeşidli şərhlər vermişlər. «Raqib el-İsfahani peyğamberlerin ismetini Allahın temiz bir yaratılışa sahib kılması, bedeni üstünlük vermesi, zafer ve kararlılık lütf etməsi, iç huzuru yaratması ve hayra muaffak kılması suretiyle kendilerini koruması şeklinde tarif etmişdir».[455]

---

[454] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.
[455] İslam Ansiklopedisi, c. XXVII, s. 134.

İbn Manzur isə «ismət» anlayışını Allahın (c.c.) qulunu cəzalandıracağı pis şeylərdən qoruması, ona əngəl olması kimi şərh etmişdir.[456]

Kəlam elmində «İsmət» Allahın (c.c.) peyğəmbərləri günah işləməkdən qoruması kimi dəyərləndirilmişdir. Kəlam elminə görə, peyğəmbərlər bu ilahi missiya ilə yükləndikdən sonra ilahi qorunma altına alınmışlar. Onların toplumdakı siyasi, dini, əxlaqi liderlikləri də bu qorunma ilə mümkün olmuşdur. Onlar insan olduqları üçün tam xətasız olmaları mümkün deyil. Səhv etməmək ancaq Allaha (c.c.) aiddir. Ancaq peyğəmbərlər zəruri anlarda xəbərdarlıq edilərək səhvlərdən qorunurlar, olan səhvləri düzəldirlər.

Qurani-Kərimdə bir sıra peyğəmbərlər ayrı-ayrı hərəkətlərinə görə xəbərdar edilir. Uca Allah (c.c.) hz.Adəmi (s.a.s.) öncədən xəbərdar edir:

وَقُلْنَا يَا آدَمُ اسْكُنْ أَنتَ وَزَوْجُكَ الْجَنَّةَ وَكُلاَ مِنْهَا رَغَداً حَيْثُ شِئْتُمَا وَلاَ تَقْرَبَا هَـذِهِ الشَّجَرَةَ فَتَكُونَا مِنَ الْظَّالِمِينَ فَأَزَلَّهُمَا الشَّيْطَانُ عَنْهَا فَأَخْرَجَهُمَا مِمَّا كَانَا فِيهِ وَقُلْنَا اهْبِطُواْ بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ وَلَكُمْ فِي الأَرْضِ مُسْتَقَرٌّ وَمَتَاعٌ إِلَى حِينٍ فَتَلَقَّى آدَمُ مِن رَّبِّهِ كَلِمَاتٍ فَتَابَ عَلَيْهِ إِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ

(Bəqərə, 2/35-37)

«Dedik ki: «Ey Adəm sən və arvadın cənnətdə oturun, ikiniz də ondan dilədiyiniz yerdə bol-bol yeyin, ancaq bu ağaca yaxınlaşmayın, yoxsa həddi aşan zalimlərdən olarsınız. Bunun üzərinə şeytan onları çaşdırdı. İkisini də içində olduqları cənnətdən çıxartdı. Biz də «bəziniz bəzinizə düşmən olaraq enin, sizin üçün orada bəlli bir zamana qədər bir qalma yeri və bir nəsib vardır», dedik. Adəm Rəbbindən

---

[456] İslam Ansiklopedisi, c. XXVII, s. 134.

bir sıra bilgilər aldı, o an Ona yalvardı. O da tövbəni qəbul edib, ona yenə baxdı. Şübhəsiz ki, O, tövbəni çox qəbul edən, çox bağışlayandır».

Nuh (s.a.s.) peyğəmbər ona itaətdən imtina edən oğlunun bağışlanması üçün dua edəndə uca Allah (s.a.s.) onu xəbərdar edir:

وَنَادَى نُوحٌ رَّبَّهُ فَقَالَ رَبِّ إِنَّ ابُنِي مِنْ أَهْلِي وَإِنَّ وَعْدَكَ الْحَقُّ وَأَنتَ أَحْكَمُ الْحَاكِمِينَ قَالَ يَا نُوحُ إِنَّهُ لَيْسَ مِنْ أَهْلِكَ إِنَّهُ عَمَلٌ غَيْرُ صَالِحٍ فَلاَ تَسْأَلْنِ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ إِنِّي أَعِظُكَ أَن تَكُونَ مِنَ الْجَاهِلِينَ

(Hud, 11/45-46)

«Nuh, Rəbbinə nida edib dedi ki: «Ey Rəbbim, oğlum mənim əhlimdəndir, sənin vədin də, əlbəttə, haqdır və sən hakimlər hakimisən. Allah: «Ey Nuh, o sənin əhlindən deyildir. O, saleh olmayan bir iş görmüşdür. Haqqında bilgin olmayan bir şeyi məndən istəmə. Mən səni cahillərdən olmaqdan çəkindirirəm», buyurdu».

Uca Allah (c.c.) başqa bir ayədə hz. Yusifi (s.a.s.) qoruduğunu buyurur:

وَرَاوَدَتْهُ الَّتِي هُوَ فِي بَيْتِهَا عَن نَّفْسِهِ وَغَلَّقَتِ الأَبْوَابَ وَقَالَتْ هَيْتَ لَكَ قَالَ مَعَاذَ اللّهِ إِنَّهُ رَبِّي أَحْسَنَ مَثْوَايَ إِنَّهُ لاَ يُفْلِحُ الظَّالِمُونَ .وَلَقَدْ هَمَّتْ بِهِ وَهَمَّ بِهَا لَوْلا أَن رَّأَى بُرْهَانَ رَبِّهِ كَذَلِكَ لِنَصْرِفَ عَنْهُ السُّوءَ وَالْفَحْشَاء إِنَّهُ مِنْ عِبَادِنَا الْمُخْلَصِينَ

(Yusif, 12/23-24)

«Evində olduğu xanım onun nəfsindən kam almaq istədi və qapılarını kilidlədi: «Bax, səninəm», dedi. Yusif : «Allaha sığınıram! Şübhəsiz ki, o, (ərin) mənim əfəndim, mənə çox gözəl baxdı. Doğrusu, zalımlar heç qurtulmazlar», dedi. Xanım ciddi olaraq ona olan niyyətini pozmuşdu. Əgər Rəbbinin dəlilini görməsəydi, Yusif də ona aldanıb getmişdi. Ondan fuhuş və fənalığı uzaq tutaq deyə belə olmuşdu. Çünki o, bizim ixlasa məzhər edilmiş xoş qullarımızdandır».

Ya da hz. Musa (s.a.s.) ilə bağlı uyğun ayəni oxuyaq:

وَدَخَلَ الْمَدِينَةَ عَلَى حِينِ غَفْلَةٍ مِّنْ أَهْلِهَا فَوَجَدَ فِيهَا رَجُلَيْنِ يَقْتَتِلَانِ هَذَا مِن شِيعَتِهِ وَهَذَا مِنْ عَدُوِّهِ فَاسْتَغَاثَهُ الَّذِي مِن شِيعَتِهِ عَلَى الَّذِي مِنْ عَدُوِّهِ فَوَكَزَهُ مُوسَى فَقَضَى عَلَيْهِ قَالَ هَذَا مِنْ عَمَلِ الشَّيْطَانِ إِنَّهُ عَدُوٌّ مُّضِلٌّ مُّبِينٌ

(Qəsəs, 28/15)

«Musa xalqının xəbəri olmadığı bir vaxtda şəhərə girdi. Orada biri öz tərəfindən, başqası düşmən tərəfindən olan iki adamı döyüşərkən gördü. Öz tərəfindəki düşmənə qarşı ondan yardım dilədi. Musa da o birisinə bir yumruq endirdi, onun işini bitirdi. «Bu şeytan işidir. O, doğrudan çaşdırıcı, acıq bir düşməndir», dedi».

Qurani-Kərimdə uca Allah (c.c.) hz.Məhəmmədi (s.a.s.) də xəbərdar etmişdir. Peyğəmbər (s.a.s.) Bədir savaşından sonra əshabla məsləhətləşərək əsirlərdən fidyə almağa qərar vermişdi. Bu qərardan sonra uca Allah (c.c.) bu qərarın yanlış olduğunu buyurdu:

مَا كَانَ لِنَبِيٍّ أَن يَكُونَ لَهُ أَسْرَى حَتَّى يُثْخِنَ فِي الأَرْضِ تُرِيدُونَ عَرَضَ الدُّنْيَا وَاللّهُ يُرِيدُ الآخِرَةَ وَاللّهُ عَزِيزٌ حَكِيمٌ . لَّوْلاَ كِتَابٌ مِّنَ اللّهِ سَبَقَ لَمَسَّكُمْ فِيمَا أَخَذْتُمْ عَذَابٌ عَظِيمٌ

(Ənfal, 8/67-68)

«Heç bir peyğəmbərin yer üzündə qəti zəfər əldə etmədikcə əsirləri olması uyğun deyildir. Siz dünya malını istəyirsiniz, ancaq Allah axirəti qazanmağınızı istəyir. Allah əzizdir, hakimdir. Əgər Allahdan bir yazı keçmiş olmasaydı, aldığınız fidyədən ötrü sizə mütləq böyük bir əzab toxunardı».

Başqa bir ayədə də hz. Məhəmməd (s.a.s.) kafirlərin böyüklərini islama dəvət edərkən yanına gələn kor İbn Ümmü Məktum ilə az maraqlandığına görə uca Allah (c.c.) ona irad tutmuşdur:

عَبَسَ وَتَوَلَّى . أَن جَاءهُ الْأَعْمَى . وَمَا يُدْرِيكَ لَعَلَّهُ يَزَّكَّى . أَوْ يَذَّكَّرُ فَتَنفَعَهُ الذِّكْرَى . أَمَّا مَنِ اسْتَغْنَى . فَأَنتَ لَهُ تَصَدَّى . وَمَا عَلَيْكَ أَلَّا يَزَّكَّى . وَأَمَّا مَن جَاءكَ يَسْعَى . وَهُوَ يَخْشَى . فَأَنتَ عَنْهُ تَلَهَّى

(Əbəsə, 80/1-10)

«O, üzünü turşutdu və döndü. Çünki ona kor gəldi. Nə bilirsən o bəlkə təmizlənəcək?! Və ya öyüd veriləcək, o öyüd də ona fayda verəcək! Ancaq özünü hər şeyə yetərli görənə gəlincə sən bütün münasibəti ona göstərdin. Ancaq onun arınmaqdan geri qalmasının məsuliyyətini daşıyan sən deyilsən. Ancaq sənə böyük istəklə gələni və Allah qorxusu ilə yaxınlaşanı sən görməzliyə vurdun».

Hz.Məhəmməd (s.a.s.) Təbuk səfərinə çıxarkən üzr istəyən münafiqlərə icazə verəndə, bir sıra mövzularda başqalarından təsirlənmək ehtimalı olanda da uca Allah (c.c.) onu xəbərdar etmişdir:

لَقَد تَّابَ الله عَلَى النَّبِيِّ وَالْمُهَاجِرِينَ وَالأَنصَارِ الَّذِينَ اتَّبَعُوهُ فِي سَاعَةِ الْعُسْرَةِ مِن بَعْدِ مَا كَادَ يَزِيغُ قُلُوبُ فَرِيقٍ مِّنْهُمْ ثُمَّ تَابَ عَلَيْهِمْ إِنَّهُ بِهِمْ رَؤُوفٌ رَّحِيمٌ

(Tövbə, 9/117)

«And olsun ki, Allah yenə peyğəmbəri və çətinlik zamanında ona tabe olan mühacirlərlə ənsarı, içlərindən bir qisminin qəlbləri az qala çaşacaq kimi olmuşkən tövbəyə layiq etdi və sonra da onların tövbələrini qəbul buyurdu. Çünki, O, onlara qarşı çox şəfqətli, çox bağışlayıcıdır».

وَإِن كَادُواْ لَيَفْتِنُونَكَ عَنِ الَّذِي أَوْحَيْنَا إِلَيْكَ لِتفْتَرِيَ عَلَيْنَا غَيْرَهُ وَإِذاً لاَّتَّخَذُوكَ خَلِيلاً .وَلَوْلاَ أَن ثَبَّتْنَاكَ لَقَدْ كِدتَّ تَرْكَنُ إِلَيْهِمْ شَيْئاً قَلِيلاً .إِذاً لَّأَذَقْنَاكَ ضِعْفَ الْحَيَاةِ وَضِعْفَ الْمَمَاتِ ثُمَّ لاَ تَجِدُ لَكَ عَلَيْنَا نَصِيراً

(İsra, 17/73-75)

«O (yolunu çaşmış) kimsələr, bizim adımıza vəhy etdiyimizdən başqa bir şey ortaya atasan deyə səni çaşdıraraq vəhy etdiyimiz (gerçəklərdən) uzaqlaşdırmağa çalışmaqdadırlar. Belə ki bunu bacara bilsə idilər, səni özlərinə dost edərdilər. Əgər sənin imanını gücləndirməmiş olsa idik, bəlkə də onlara bir az da olsa meyl göstərəcək idin. O zaman sənə həyatda da, ölümdən sonra da qat-qat (əzab) daddırardıq və Bizə qarşı sənə yardım edəcək kimsəni də tapa bilməzdin!»

## PEYĞƏMBƏRLƏR GÜNAH EDƏ BİLƏRMİ?

Kəlamçılara görə, peyğəmbərlik dönəmində peyğəmbərlər heç bir günah etməmişlər. Onların etdiyi kiçik xətalar ilahi uyarı nəticəsində düzəldilmişdir. İslam alimləri bu kiçik səhvləri «zəllə» adlandırmışlar. «Teorik olarak günahdan korunmaları gerektigi gibi, praktikdə də bunun gerçekleştigi peyğamberlerin hayat hekayelerinin incelenmesiyle anlaşılır. İsmet sıfatı sadece peyğamberlere aittir. Onların dışında hiç bir insan bu sıfata sahip deyildir».[457]

Peyğəmbərlərin qorunma altında olmalarının başlıca səbəbi odur ki, Allaha (c.c.) qarşı olanların əlinə bəhanələr verilməsin, ilahi xəbərləri təbliğ edən elçilərin doğruluğuna şübhə yaranmasın. Hz.Məhəmməd (s.a.s.) özü də bu məsələlərə açıqlıq gətirmişdir. O buyurur: «Hər insan yanılır, yanılanların ən yaxşısı xətasından dönəndir».[458]

«İçinizdən biri müsəlman qardaşını mütləq öymək istəyirsə, qəti danışmayıb, belə desin: filankəsin belə

---
[457] İslamda inanc esasları, göstərilən qaynaq, s. 186.
[458] İslamda inanc esasları, göstərilən qaynaq, s. 186.

olduğunu düşünürəm, ancaq Allaha qarşı kimsəni təmizə çıxara bilmərəm».[459]

Yəni, bəşəri sifəti olan insan yanıla bilər. Ancaq ilahi qorunma altında olan peyğəmbərlər istisnadır.

Günahdan qorunmuş olmaq məsumluq deməkdir. Uca Allah (c.c.) peyğəmbərləri nəzarət altında saxladığını buyurur:

أَنِ اقْذِفِيهِ فِي التَّابُوتِ فَاقْذِفِيهِ فِي الْيَمِّ فَلْيُلْقِهِ الْيَمُّ بِالسَّاحِلِ يَأْخُذْهُ عَدُوٌّ لِّي وَعَدُوٌّ لَّهُ وَأَلْقَيْتُ عَلَيْكَ مَحَبَّةً مِّنِّي وَلِتُصْنَعَ عَلَى عَيْنِي

(Taha, 20/39)

«Onu (Musanı) tabut içinə qoy və dənizə at. Dəniz də onu sahilə atsın. Onu həm mənə düşmən, həm də ona düşmən biri alsın. Üzərinə məndən bir sevgi qoydum ki, mənim nəzarətim altında yetişdirilsin».

وَجَعَلْنَاهُمْ أَئِمَّةً يَهْدُونَ بِأَمْرِنَا وَأَوْحَيْنَا إِلَيْهِمْ فِعْلَ الْخَيْرَاتِ وَإِقَامَ الصَّلَاةِ وَإِيتَاء الزَّكَاةِ وَكَانُوا لَنَا عَابِدِينَ

(Ənbiya, 21/73)

«Hamısını əmrimizlə doğru yolu göstərəcək öndərlər etdik. Onlara xeyirli işlər görməyi, namaz qılmağı, zəkat verməyi vəhy etdik. Onlar bizə qulluq edən kimsələrdir».

**Əhli-sünnət kəlamçıları peyğəmbərlərin ismət sifəti ilə bağlı görüşlərini belə sıralayıblar:**

- Dini hökmlərin təbliği və ümmətin irşadı ilə bağlı məsələlərdə peyğəmbərlərin yalançılıqdan qorunmuş olmalarında görüş birliyi var;

- Peyğəmbərlərin həm vəhydən öncə, həm də vəhydən sonra küfr və şirk günahından məsum olduqları ilə bağlı görüş birliyi var;

[459] İslamda inanc esasları, göstərilən qaynaq, s. 105-106.

- Peyğəmbərlər vəhydən sonra qəsdən böyük günah işləməkdən qorunmuşlar. Peyğəmbərlikdən öncə qəsdən böyük günah işləmələri mümkündür;

- Peyğəmbərlərin həm vəhydən öncə, həm də vəhydən sonra səhvən və xəta ilə böyük günah işləmələri mümkündür. Bu onların ismət sifətinə zərər vurmaz;

- Nəbilərin bütün ömür boyunca həm qəsdən, həm də səhvən kiçik günahlar etmələri mümkündür.

Peyğəmbərlərin ilahi xəbərləri təbliğ edərkən yalan söyləmələrinin mümkünsüzlüyü Quran ayəsi ilə təsbit olunmuşdur:

وَلَوْ تَقَوَّلَ عَلَيْنَا بَعْضَ الْأَقَاوِيلِ . لَأَخَذْنَا مِنْهُ بِالْيَمِينِ . ثُمَّ لَقَطَعْنَا مِنْهُ الْوَتِينَ .فَمَا مِنكُم مِّنْ أَحَدٍ عَنْهُ حَاجِزِينَ

(Haqqa, 69/44-47)

«İndi o, (ona bunu əmanət etdiyimiz insan) öz sözlərindən bir qismini bizə istinad etməyə çalışsa idi, onu sağ əlindən yaxalayardıq və şah damarını kəsərdik. Heç biriniz onu qoruya bilməzdi».

İslam alimlərinin çoxuna görə, peyğəmbərlər ciddi olmayan günahları unudaraq, ya da yanılaraq edə bilərlər. Ancaq onlar bu günahlarda israr etməz, Allahın (c.c.) xəbərdarlığı ilə bundan əl çəkərlər.

İslam məzhəbləri və onlara bağlı alimlər arasında peyğəmbərlərin ismət sifəti ilə bağlı fərqli görüşləri də var. Mötəzilə alimlərinə görə, peyğəmbərlər nübüvvətdən öncə və sonra qəsdən, ya da səhvən böyük günah etməkdən qorunmuşlar. Onlar unudaraq, ya da yanılaraq kiçik günahlar edə bilərlər.

Şiə məzhəbinə görə, peyğəmbərlərlə birgə hz.Fatimə (r.a.) ilə imamlar da doğumlarından başlayaraq küfrdən, şirk-

dən, yalan söyləməkdən, böyük kiçik hər cür günahdan, eləcə də yanılma və unutmaqdan məsumdurlar. «Şiələr doğruluqları möcüzələrlə təyid edilən peyğəmbərin yalan söyləməsinin, ya da günah etməsinin onların etibarını zədələyəcəyini, təbliğ etdiklərinin qəbuluna problem yaradacağını, bununla da Allahın peyğəmbər göndərməsindəki hikməti ortadan qaldıracağını bildirmişlər. Onlara görə, peyğəmbərlərin məsum olmasına bağlı dəlillər imamların məsumiyyəti üçün də dəlildir».[460]

Təsəvvüf düşüncəsinə görə, peyğəmbərlər günah etməkdən qorunmuşlar.

Ortodoks yəhudiliyə görə heç kimsə günah etməkdən qurtula bilməz. Ancaq kim səmimi  tövbə edərsə, Tanrı onun bütün günahlarını əfv edər.

Xristian inancına görə, hz.Adəmin (s.a.s.) etdiyi günah nəsildən-nəslə keçmiş, hz.İsa (s.a.s.) çarmıxa çəkilməklə bunu ortadan qaldırmışdır. Ancaq hər doğulan uşaq xaç suyuna salınmadıqca günahkardır.

Qurani-Kərimdə «ismət» anlayışına on üç ayədə işarə edilmişdir. Bu ayələrdə «ismət» anlayışı «qorumaq», «qurtarmaq», «Allaha sarılmaq», «namuslu olmaq» mənalarında işlənmişdir. Bu ayələrdə peyğəmbərlərin ismətinə toxunulmamışdır. Quranın bir sıra ayələri peyğəmbərlərin başqaları kimi bəşər olduqlarını vurğulayır, onların başqalarına təbliğ etdikləri məsələlərlə bağlı özlərinin də məsuliyyət daşıdıqlarını buyurur:

وَمَا مَنَعَ النَّاسَ أَن يُؤْمِنُواْ إِذْ جَاءهُمُ الْهُدَى إِلاَّ أَن قَالُواْ أَبَعَثَ اللّهُ بَشَراً رَّسُولاً .قُل لَّوْ كَانَ فِي الأَرْضِ مَلآئِكَةٌ يَمْشُونَ مُطْمَئِنِّينَ لَنَزَّلْنَا عَلَيْهِم مِّنَ السَّمَاءِ مَلَكاً رَّسُولاً

---

[460] İslam Ansiklopedisi, göstərilən qaynaq, s. 136.

(İsra, 17/94-95)

«Onlara doğru yolu göstərən hidayətçi gələndə insanların iman etmələrinə ancaq belə demələri mane oldu: «Allah bir insanımı peyğəmbər olaraq göndərdi?». Onlara söylə: «Əgər yer üzündə yurd tutub dolaşan mələklər olsa idi, əlbəttə, onlara göydən mələk bir peyğəmbər göndərərdik».

وَمَا أَرْسَلْنَا قَبْلَكَ إِلاَّ رِجَالاً نُّوحِي إِلَيْهِمْ فَاسْأَلُواْ أَهْلَ الذِّكْرِ إِن كُنتُمْ لاَ تَعْلَمُونَ . وَمَا جَعَلْنَاهُمْ جَسَداً لَّا يَأْكُلُونَ الطَّعَامَ وَمَا كَانُوا خَالِدِينَ

(Ənbiya, 21/7-8)

«Səndən öncə də başqa deyil, ancaq onlara vəhy etdiyimiz bir qism peyğəmbərlər göndərdik. Bilmirsinizsə, elm əhli olanlardan soruşun. Biz onları yemək yeməyən bir cansız cəsəd etmədik. Onlar ölümsüz də deyillər».

فَلَنَسْأَلَنَّ الَّذِينَ أُرْسِلَ إِلَيْهِمْ وَلَنَسْأَلَنَّ الْمُرْسَلِينَ  فَلَنَقُصَّنَّ عَلَيْهِم بِعِلْمٍ وَمَا كُنَّا غَآئِبِينَ

(Əraf, 7/6-7)

«Sonra, əlbəttə, peyğəmbər göndərilən ümmətlərdən soruşacağıq. Onlara olanları tam bir elm ilə mütləq anladacağıq. Biz onlardan uzaq deyilik».

Alimlər peyğəmbərlərin qorunmuş olduğuna dəlil olaraq başqa ayələri  də göstərirlər. Onlara görə, «ismət» qavramı bu ayələrdə ayrı-ayrı yönləri ilə özünü göstərir. Bu ayələrdən bir neçəsinə baxaq:

وَإِذَا تُتْلَى عَلَيْهِمْ آيَاتُنَا بَيِّنَاتٍ قَالَ الَّذِينَ لاَ يَرْجُونَ لِقَاءنَا ائْتِ بِقُرْآنٍ غَيْرِ هَـذَا أَوْ بَدِّلْهُ قُلْ مَا يَكُونُ لِي أَنْ أُبَدِّلَهُ مِن تِلْقَاء نَفْسِي إِنْ أَتَّبِعُ إِلاَّ مَا يُوحَى إِلَيَّ إِنِّي أَخَافُ إِنْ عَصَيْتُ رَبِّي عَذَابَ يَوْمٍ عَظِيمٍ

(Yunus, 10/15)

«Belə ikən ayələrimiz açıq bir dəlil olaraq onlara oxunduğu zaman bizə qovuşmağı ummayanlar: «Bunlardan

başqa bir Quran gətir, ya da bunu dəyişdir», dedilər. De ki: «Onu özümdən dəyişdirmək mənim üçün olacaq şey deyildir. Mən ancaq mənə vəhy olunana tabe oluram. Rəbbimə üsyan etsəm, şübhəsiz, böyük bir günün əzabından qorxaram».

وَلَوْلاَ أَن ثَبَّتْنَاكَ لَقَدْ كِدتَّ تَرْكَنُ إِلَيْهِمْ شَيْئاً قَلِيلاً

(İsra, 17/74)

«Əgər biz sənə səbat verməmiş olsa idik, sən onlara mütləq bir az meyl edəcək idin».

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَطِيعُواْ اللّهَ وَرَسُولَهُ وَلاَ تَوَلَّوْا عَنْهُ وَأَنتُمْ تَسْمَعُونَ

(Ənfal, 8/20)

«Ey iman edənlər! Allaha və Rəsuluna itaət edin. Eşitdiyiniz halda ondan üz çevirməyin».

وَأَطِيعُواْ اللّهَ وَرَسُولَهُ وَلاَ تَنَازَعُواْ فَتَفْشَلُواْ وَتَذْهَبَ رِيحُكُمْ
وَاصْبِرُواْ إِنَّ اللّهَ مَعَ الصَّابِرِينَ

(Ənfal, 8/46)

«Allaha və Rəsuluna itaət edin. Bir-birinizlə çəkişməyin, sonra içinizə qorxu düşər və gücünüz əldən gedər. Bir də səbrli olun. Çünki Allah səbr edənlərlə bərabərdir».

إِنَّ اللَّهَ وَمَلَائِكَتَهُ يُصَلُّونَ عَلَى النَّبِيِّ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا صَلُّوا عَلَيْهِ
وَسَلِّمُوا تَسْلِيماً .إِنَّ الَّذِينَ يُؤْذُونَ اللَّهَ وَرَسُولَهُ لَعَنَهُمُ اللَّهُ فِي الدُّنْيَا
وَالْآخِرَةِ وَأَعَدَّ لَهُمْ عَذَاباً مُّهِيناً

(Əhzab, 33/56-57)

«Şübhəsiz ki, Allah və mələkləri peyğəmbərə səlat edərlər. Ey iman edənlər, siz də Ona təslimiyyətlə səlat və salam deyin. Çünki Allah və Rəsuluna əziyyət edənlərə Allah həm dünyada, həm axirətdə lənət etmişdir. Onlara aşağılayıcı bir əzab hazırlamışdır».

وَاذْكُرْ عِبَادَنَا إبْرَاهِيمَ وَإِسْحَاقَ وَيَعْقُوبَ أُوْلِي الْأَيْدِي وَالْأَبْصَارِ. إِنَّا أَخْلَصْنَاهُم بِخَالِصَةٍ ذِكْرَى الدَّارِ. وَإِنَّهُمْ عِندَنَا لَمِنَ الْمُصْطَفَيْنَ لَأَخْيَارِ
(Sad, 38/45-47)

«Qullarımız İbrahimi, İshaqı, Yaqubu da an. Onlar əl və göz (güc və görüş) sahibləri idilər. Çünki biz onları təmiz bir xislət, xalis yurd (axirət) düşüncəsiylə xalis qullarımızdan etdik. Onlar, şübhəsiz, yanımızda seçilmiş ən xeyirli kimsələrdəndir».

Bu ayələr Peyğəmbərin dini məsələlərdə ona qarşı olanların tələblərini rədd etməsi; Allaha (c.c.) və elçisinə itaətin əmr edilməsi, onlara əziyyət edənlərin bu dünya və axirətdə lənətlənməsi, peyğəmbərlərin xeyirli kimsələr olduğuna hökm edilməsi onların ismətli, qorunmuş olmalarının dəlilləri kimi şərh edilmişdir.

Bir sıra qaynaqlara görə, Qurani-Kərimdəki «Sad» surəsinin 21-26-cı ayələri də peyğəmbərlərin məsumluğu ilə bağlıdır:

وَهَلْ أَتَاكَ نَبَأُ الْخَصْمِ إِذْ تَسَوَّرُوا الْمِحْرَابَ . إِذْ دَخَلُوا عَلَى دَاوُودَ فَفَزِعَ مِنْهُمْ قَالُوا لَا تَخَفْ خَصْمَانِ بَغَى بَعْضُنَا عَلَى بَعْضٍ فَاحْكُم بَيْنَنَا بِالْحَقِّ وَلَا تُشْطِطْ وَاهْدِنَا إِلَى سَوَاءِ الصِّرَاطِ .إِنَّ هَذَا أَخِي لَهُ تِسْعٌ وَتِسْعُونَ نَعْجَةً وَلِيَ نَعْجَةٌ وَاحِدَةٌ فَقَالَ أَكْفِلْنِيهَا وَعَزَّنِي فِي الْخِطَابِ .قَالَ لَقَدْ ظَلَمَكَ بِسُؤَالِ نَعْجَتِكَ إِلَى نِعَاجِهِ وَإِنَّ كَثِيراً مِّنْ الْخُلَطَاء لَيَبْغِي بَعْضُهُمْ عَلَى بَعْضٍ إِلَّا الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَقَلِيلٌ مَّا هُمْ وَظَنَّ دَاوُودُ أَنَّمَا فَتَنَّاهُ فَاسْتَغْفَرَ رَبَّهُ وَخَرَّ رَاكِعاً وَأَنَابَ {س} . فَغَفَرْنَا لَهُ ذَلِكَ وَإِنَّ لَهُ عِندَنَا لَزُلْفَى وَحُسْنَ مَآبٍ يَا دَاوُودُ إِنَّا جَعَلْنَاكَ خَلِيفَةً فِي الْأَرْضِ فَاحْكُم بَيْنَ النَّاسِ بِالْحَقِّ وَلَا تَتَّبِعِ الْهَوَى فَيُضِلَّكَ عَن سَبِيلِ اللَّهِ إِنَّ الَّذِينَ يَضِلُّونَ عَن سَبِيلِ اللَّهِ لَهُمْ عَذَابٌ شَدِيدٌ بِمَا نَسُوا يَوْمَ الْحِسَابِ

(Sad, 38/21-26)

«Dava edənlərin qissəsindən xəbərin oldumu? (Davudun ibadət etdiyi) məbədin divarlarına dırmaşan (iki kişinin qissəsindən). Davud onları yanında görəndə təlaşlanıb qorxdu. Onlar: «Qorxma!», - dedilər. «Biz (sadəcə) iki davaçıyıq. Birimiz o birisinin haqqına təcavüz etdi. İndi aramızda ədalətlə qərar ver, doğrudan ayrılma və (ikimizə) doğruluq yolunu göstər. Bu mənim qardaşımdır. Onun doxsan doqquz qoyunu var. Mənim isə sadəcə bir qoyunum var. Buna baxmayaraq, «onu mənə ver» dedi. O, bu mübahisədə məni zorla dediyini etməyə məcbur etdi. Davud dedi ki: «Bu (adam) sənin qoyununu özününkülərinin arasına qatmağı istəməklə sənə haqsızlıq etmişdir. Yaxınların çoxu bir-birilərinə eyni şeyi edirlər. Allaha inanıb doğru və yararlı işlər görənlərdən başqa. Belələri də nə qədər azdır. Davud (bunları söyləyərkən) Bizim onu sınadığımızı (birdən) anladı. Bunun üzərinə Rəbbindən günahının bağışlamasını istədi, səcdəyə qapandı və tövbə edərək Ona yönəldi. Biz də bu (günahını) bağışladıq. (O biri dünyada onu Bizim yaxınlığımız və mənzillərin ən gözəli gözləməkdədir) (Və belə dedik:) «Ey Davud! Səni (bir peyğəmbər və beləliklə) yer üzündəki xəlifəmiz etdik. Elə isə insanlar arasında ədalətlə hökm et, boş arzu və həvəslərə uyma, sonra onlar səni Allah yolundan azdırar. Allah yolundan azanları isə hesab gününü unutduqlarından ötrü şiddətli bir əzab gözləyir».

Məhəmməd Əsədə görə, bu ayələr peyğəmbərlərin günah edib-etməməsi ilə bağlıdır. İnsan təbiətində olan zəifliklər onlarda da varmı? Onların «günahdan arı» («məsum») olmaları öncədən, ilkdəndirmi? Alimə görə, bu ayələr bir sıra səhabələrin və sonrakı dönəmdə bir sıra

ilahiyyatçıların irəli sürdüyü peyğəmbərlərin xarakter və təbiətlərinə görə günah işləməyəcəkləri görüşünü şübhə altına alır. Ona görə bu ayələr «Peyğəmbərlərin təmizliyinin, bunun səbəbi olan məsumiyyətlərinin iç mübarizəsi və sınaqların bir nəticəsi olduğunu göstərməkdədir. Beləliklə, bu məsumiyyət (ismət) doğuluşdan əldə edilmiş (bəxş edilmiş) bir nemətdən çox, mənəvi, əxlaqi bir qazancı təmsil edir».[461]

Peyğəmbərlərin ismət sifətinin dəlillərindən biri də onların qövmlərinə müraciət edərkən inanılan insanlar olduqlarını söyləmələridir.

Əhli-sünnət və Mötəzilə alimlərinə görə, ismət sadəcə peyğəmbərlərə aid bir sifətdir. Şiələr isə imamların da məsum olduğuna inanırlar.

İsmət-məsumiyyət qavramının anlamı, dövrü ilə də bağlı fərqli görüşlər var. Maturidilərə görə, ismət peyğəmbərin iradəsini heçə saymadan onu pis işlərdən çəkindirən, xeyirli işlərə yönəldən bir sifətdir. Alimlərin çoxu bu görüşü paylaşır. Ancaq Əşari kəlamçıları peyğəmbərləri mələk biçimində təqdim edərək onları pisliklərə yönəlməkdən qoruyan bir özəlliyin olduğunu söyləmişlər.[462]

Bir sıra alimlər məsumiyyətin peyğəmbərlik vaxtından, başqaları isə həddi-buluğa çatdığı dövrdən, Şiələr isə peyğəmbərlərlə birlikdə imamların da doğumlarından başlayaraq məsum olduqlarını bildirirlər.[463]

Qurani-Kərimdə peyğəmbərlərin nübüvvətdən öncə qorunmuş olduqlarını açıq bəyan edən bir ayə yoxdur. Ancaq Quranda peyğəmbərlərin nübüvvətdən öncəki halları ilə bağlı işarələr var. Bu ayələrdən peyğəmbərlərin nübüvvətdən öncə

---

[461] Muhammed Esed, göstərilən qaynaq, s. 927.
[462] İslam Ansiklopedisi, göstərilən qaynaq, s. 135.
[463] İslam Ansiklopedisi, göstərilən qaynaq, s. 135.

də inanılan insanlar olduğu görünür. Bu ayələrdən ikisini oxuyaq:

قَالُواْ يَا صَالِحُ قَدْ كُنتَ فِينَا مَرْجُوّاً قَبْلَ هَـذَا أَتَنْهَانَا أَن نَّعْبُدَ مَا يَعْبُدُ آبَاؤُنَا وَإِنَّنَا لَفِي شَكٍّ مِّمَّا تَدْعُونَا إِلَيْهِ مُرِيبٍ

(Hud, 11/62)

«Ey Saleh! - deyə qarşılıq verdilər. Sən bundan öncə aramızda böyük ümidlər bəslənən biriydin. İndi bizi atalarımızın qulluq edərək gəldiyi şeylərə qulluq etməkdən çəkindirəcəksənmi? Doğrusu, bu ki, bizi çağırdığın (dava) haqqında son dərəcə ciddi bir şübhə və qayğı içindəyik».

قُل لَّوْ شَاء اللّهُ مَا تَلَوْتُهُ عَلَيْكُمْ وَلاَ أَدْرَاكُم بِهِ فَقَدْ لَبِثْتُ فِيكُمْ عُمُراً مِّن قَبْلِهِ أَفَلاَ تَعْقِلُونَ

(Yunus, 10/16)

«De ki: Allah diləsəydi, mən onu sizə oxumazdım. O da onu heç bir yolla sizə bildirməzdi. Bilirsiniz ki, mən sizin içinizdə bundan öncə bir ömür boyu olmuşdum. Ağlınızı işlətməyəcəksinizmi?».

İslam alimlərinə görə, peyğəmbərlər nübüvvətdən öncə və sonra küfr və şirkdən qorunmuşlar. Bu bütün alimlərin ortaq düşüncəsidir. Qurani-Kərim də bu məsələni açıq bir biçimdə bəyan etmişdir. Qurana görə, peyğəmbərlərin üzərində həssaslıqla durduqları ən önəmli məsələ Allaha (c.c.) şərik qoşmamaqdır:

يَا أَيُّهَا النَّاسُ اعْبُدُواْ رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ وَالَّذِينَ مِن قَبْلِكُمْ لَعَلَّكُمْ تَتَّقُونَ

(Bəqərə, 2/21)

«Ey insanlar! Sizi və sizdən öncəkiləri yaradan Rəbbinizə qulluq və ibadət edin ki, Allahın əzabından qorunan müttəqilərdən olasınız».

وَاعْبُدُواْ اللّهَ وَلاَ تُشْرِكُواْ بِهِ شَيْئاً وَبِالْوَالِدَيْنِ إِحْسَاناً وَبِذِي الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِينِ وَالْجَارِ ذِي الْقُرْبَى وَالْجَارِ الْجُنُبِ وَالصَّاحِبِ بِالجَنبِ وَابْنِ السَّبِيلِ وَمَا مَلَكَتْ أَيْمَانُكُمْ إِنَّ اللّهَ لاَ يُحِبُّ مَن كَانَ مُخْتَالاً فَخُوراً

(Nisa, 4/36)

«Həm Allaha ibadət edin, Ona heç bir şeyi şərik qoşmayın. Sonra ataya, anaya, qohumlarınıza, günahsızlara, yoxsullara, yaxın qonşuya, uzaq qonşuya, dosta, yolda qalana, əllərinizin altındakı kimsələrə yaxşılıq, ehsan edin. Allah təkəbbürlü, öyünən olanların heç birini sevməz».

وَمَا أَرْسَلْنَا مِن قَبْلِكَ مِن رَّسُولٍ إِلَّا نُوحِي إِلَيْهِ أَنَّهُ لَا إِلَهَ إِلَّا أَنَا فَاعْبُدُونِ

(Ənbiya, 21/25)

«Səndən öncə heç bir peyğəmbər göndərmədik ki, ona belə vəhy etmiş olmayaq. Gerçək budur ki, məndən başqa ilah yoxdur, ona görə ancaq mənə ibadət edin».

وَلَقَدْ أُوحِيَ إِلَيْكَ وَإِلَى الَّذِينَ مِنْ قَبْلِكَ لَئِنْ أَشْرَكْتَ لَيَحْبَطَنَّ عَمَلُكَ وَلَتَكُونَنَّ مِنَ الْخَاسِرِينَ

(Zumər, 39/65)

«And olsun ki, sənə və səndən öncəkilərə belə vəhy olundu: «And içirəm ki, Allaha ortaq qoşsan, bütün əməyin boşuna gedər və mütləq özünə zülm edənlərdən olarsan!».

Hz.Məhəmmədlə (s.a.s.) bağlı yazılmış kitablarda (siyər) onun nübüvvətdən öncəki həyatı təsvir edilmişdir. Onun ailəsi başqa məkkəlilər kimi bütpərəst olsa da, hz.Məhəmməd (s.a.s.) heç zaman bütlərə sitayiş etmədi, bütlərə and içmədi, bütlərlə bağlı keçirilən törənlərdə iştirakçı olmadı. Onun babası Əbdül Mütəllib Ramazan ayında Hira mağarasına çəkilirdi. Hz.Məhəmməd (s.a.s.) də

sonralar bu mağaraya çəkilməyi, orada qalmağı adətə çevirdi. Bir sıra hallarda xanımı hz.Xədicə (r.a.) ona yemək aparırdı. O, ilk vəhyi də bu Nur dağındakı Hira mağarasında aldı.[464]

Burada bir məsələyə də toxunmaq istəyirik. Bilindiyi kimi, Şiə məzhəbi peyğəmbərlərə bağlı «ismət» (məsumluq) sifətini imamlara da aid edirlər. Bu anlayış dini məzhəblər arasında mübahisə mövzusudur. Ancaq çoxluğun fikri budur ki, məsumluq ancaq peyğəmbərlərə bağlı bir sifətdir.

**Peyğəmbərlərə bağlı «ismət» anlayışı islam dinində həm də hüquqi bir qavramdır. İslam hüququnda «ismət» termini toxunulmazlıq anlayışını bildirir. Bilindiyi kimi, dinlərin ortaq hədəfi insanın canını, ağlını, malını, şərəfini, ailəsini, dinini qorumaqdır. Bu anlayışlar insan haqq və azadlıqlarını tam əhatə edir. «İsmət» anlayışı da başda can və mal toxunulmazlığı olmaqla insanın təməl haqlarının qorunması anlamındadır.**

İslam dinində peyğəmbərlərin günah etməkdən qorunmuş olduqlarını təsdiq etmək məqsədi ilə yazılmış əsərlərin də özəl adı var. Bu əsərlər «İsmətül-ənbiya» adlanır. Bu ad «ismət» qavramı ilə bir mənadadır. «İslam dininin yayılmasından sonra çeşidli din və mədəniyyətlərə mənsub çevrələrin peyğəmbərlərin günah işləmiş ola biləcəklərini, hətta, nübüvvətdən öncə şirk inancını belə mənimsəyənlərin olduğunu söyləmələri, bundan başqa bir sıra islami məzhəblərin mənsublarının da mövzu ilə bağlı nasları fərqli şəkillərdə şərh etmələri yeni bir əsər növünün yaranmasına zəmin hazırladı».[465]

---

[464] Prof. Dr. Muhammed Hamidullah, İslam peyğamberi, İstanbul, 2003, c. I, s. 72-73.
[465] İslam Ansiklopedisi, göstərilən qaynaq, s. 141.

Bu tipli əsərlərdə peyğəmbərlərin nübüvvətdən öncəki və sonrakı həyatları təsvir edilir, onlara qarşı deyilən fikirlərə yer verilir və bu düşüncələrin doğru olmadığı əsaslandırılır.

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ İSMƏT ANLAYIŞININ DİNİ, BƏDİİ MƏNASI

**«İsmət» anlayışı ilə bağlı bu çoxyönlü açıqlamadan sonra hz.Nizaminin beytinə baxaq. Şair bu beytin birinci misrasında: «İsmətlilər (məsumlar) onun hərəmində pərdə dalında qalırlar», deyir. Bu misrada «ismət» anlayışı ilə birgə «hərəm» sözü də işlənmişdir. Bu söz də «toxunulmaz ev» mənasını ifadə edir. Deməli, birinci misradakı «ismət» anlayışı namus, iffət mənasındadır. Peyğəmbərin namuslu, iffətli ailə üzvləri onun toxunulmaz evində pərdə arxasında qalırlar. Birinci misrada həm namus, iffət anlamında «ismət» sözü var (bilindiyi kimi, namus, iffət də toxunulmazlıq deməkdir), həm toxunulmazlıq anlamında olan «hərəm» sözü var, həm də toxunulmazlığı təmin edən «pərdə» sözü var.**

**Bu «ismət», «hərəm», «pərdə» sözləri birlikdə toxunulmazlıq, müqəddəslik, təmizlik mənasını yaradır. Misradakı «pərdə dalında qalmaq» anlayışının da qaynağı var. Biz buna bir az sonra toxunacağıq. İndi isə «ismət» anlayışının namus, iffət çalarını şərh edək.**

Bilindiyi kimi, Qurani-Kərimdə bir çox ayələrdə «ismət» qavramı namuslu, iffətli olmaq mənasında işlənmişdir, namuslu, iffətli olmaq gözəl əxlaqi dəyər kimi öyülmüşdür:

قُل لِّلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ أَبْصَارِهِمْ وَيَحْفَظُوا فُرُوجَهُمْ
ذَلِكَ أَزْكَى لَهُمْ إِنَّ اللَّهَ خَبِيرٌ بِمَا يَصْنَعُونَ

(Nur, 24/30)

«Mömin kişilərə söylə: Gözlərini haramdan çəksinlər, namuslarını qorusunlar. Bu, onlar üçün daha təmizdir. Allah onların etdiklərindən xəbərdardır».

إِنَّ الَّذِينَ يَرْمُونَ الْمُحْصَنَاتِ الْغَافِلَاتِ الْمُؤْمِنَاتِ لُعِنُوا فِي الدُّنْيَا وَالْآخِرَةِ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ . يَوْمَ تَشْهَدُ عَلَيْهِمْ أَلْسِنَتُهُمْ وَأَيْدِيهِمْ وَأَرْجُلُهُم بِمَا كَانُوا يَعْمَلُونَ يَوْمَئِذٍ يُوَفِّيهِمُ اللَّهُ دِينَهُمُ الْحَقَّ وَيَعْلَمُونَ أَنَّ اللَّهَ هُوَ الْحَقُّ الْمُبِينُ

(Nur, 24/23-25)

«Şübhəsiz, namuslu və bir şeydən xəbərsiz mömin qadınlara (zina iftirası) atanlar dünyada və axirətdə lənətlənmişlər. Onlara böyük bir əzab vardır. O gün etdiklərinin əleyhində dilləri, əlləri və ayaqları şahidlik edəcəkdir. O gün Allah onlara haqq etdikləri cəzalarını tamamən verəcək və Allahın aşikar haqq olduğunu biləcəklər».

قَدْ أَفْلَحَ الْمُؤْمِنُونَ .الَّذِينَ هُمْ فِي صَلَاتِهِمْ خَاشِعُونَ . وَالَّذِينَ هُمْ عَنِ اللَّغْوِ مُعْرِضُونَ .وَالَّذِينَ هُمْ لِلزَّكَاةِ فَاعِلُونَ . وَالَّذِينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَ

(Möminun, 23/1-5)

«Qəti olan budur ki, insanlar qurtulacaqdır. Onlar ki, namazlarında duyarlılıq (huşu) içindədirlər, onlar ki, boş və anlamsız şeylərdən üz çevirirlər, arınmaq üçün zəruri olanı edərlər, onlar ki, iffətlərini qoruyarlar…».

وَمَرْيَمَ ابْنَتَ عِمْرَانَ الَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهِ مِن رُّوحِنَا وَصَدَّقَتْ بِكَلِمَاتِ رَبِّهَا وَكُتُبِهِ وَكَانَتْ مِنَ الْقَانِتِينَ

(Təhrim, 66/12)

«Və İmranın qızı Məryəmin qissəsini Allaha qarşı məsuliyyət düşüncəsi daşıyanların başqa bir örnəyi etdik. O, iffətini qorumuşdu, buna görə Biz onun (rəhmindəkinə)

ruhumuzdan üfürmüşdük və Məryəm Rəbbinin sözlərinin və beləcə vəhy etdiklərinin doğruluğunu qəbul etmiş və səmimiyyətlə bağlananlardan biri olmuşdu».

Hz.Məhəmmədin (s.a.s.) hədislərində də ismətli, namuslu, iffətli olmaq Allahın sevdiyi əxlaqi sifət olaraq öyülmüşdür. İbni Məsud (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə dua edərdi: «Allahım! Səndən hidayət, təqva, iffət və könül zənginliyi istəyirəm».[466]

Hz.Nizaminin bu beytinin birinci misrasında onun iffətli ailə üzvlərindən danışılır. Qurani-Kərimdə hz.Məhəmmədin (s.a.s.) ailəsi ilə bağlı ilahi buyruq var:

يَا نِسَاء النَّبِيِّ لَسْتُنَّ كَأَحَدٍ مِّنَ النِّسَاء إِنِ اتَّقَيْتُنَّ فَلَا تَخْضَعْنَ بِالْقَوْلِ فَيَطْمَعَ الَّذِي فِي قَلْبِهِ مَرَضٌ وَقُلْنَ قَوْلاً مَّعْرُوفاً . وَقَرْنَ فِي بُيُوتِكُنَّ وَلَا تَبَرَّجْنَ تَبَرُّجَ الْجَاهِلِيَّةِ الْأُولَى وَأَقِمْنَ الصَّلَاةَ وَآتِينَ الزَّكَاةَ وَأَطِعْنَ اللَّهَ وَرَسُولَهُ إِنَّمَا يُرِيدُ اللَّهُ لِيُذْهِبَ عَنكُمُ الرِّجْسَ أَهْلَ الْبَيْتِ وَيُطَهِّرَكُمْ تَطْهِيراً

(Əhzab, 33/32-33)

«Ey peyğəmbər qadınları! Siz qadınlardan hər hansı biri kimi deyilsiniz. Əgər (Allahdan) qorxursunuzsa, kişilərlə danışanda yumşaq davranmayın ki, qəlbində xəstəlik olan kimsə tamah etməsin, gözəl, şübhədən uzaq bir biçimdə söz söyləyin. Evlərinizdə oturun, ilk cahiliyyə çağı qadınlarının açılıb saçılması kimi açılıb- saçılaraq, qırıla-tökülə yeriməyin. Namaz qılın, zəkatı verin, Allaha və Rəsuluna itaət edin. Ey Əhli-Beyt! Allah sizdən hər cür kiri yumaq, sizi tərtəmiz etmək istər».

## PEYĞƏMBƏRİN (s.a.s.) ƏHLİ-BEYTİ

466 Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 327.

Ayrı-ayrı qruplar, alimlər arasında Əhli-Beytə kimlərin daxil olması ilə bağlı fərqli fikirlər var. Şiə alimləri Əhli-Beytə peyğəmbərin xanımlarını daxil etmirlər. Onlar Əhli-Beyt və məsumlar deyəndə hz. Məhəmmədi (s.a.s.), hz.Əlini (r.a.), hz.Fatiməni (r.a.) və hz.Həsənlə (r.a.), hz.Hüseyni (r.a.) və onların soyundan gələn imamları nəzərdə tuturlar. Şiə alimləri «ismət» sifətini onlara aid edirlər. Ancaq bu anlayış alimlərin çoxu tərəfindən qəbul olunmur. Əhli-sünnət alimləri «ismət» sifətinin ancaq peyğəmbərlərə aid olduğunu bildirir, Əhli-Beytə hz. Məhəmmədin (s.a.s.) xanımlarının da daxil olduğunu qəbul edirlər.

Hz.Nizaminin şərh olunan beytinin birinci misrasında olan «ismətlilər onun hərəmində pərdə arxasında qalırlar» fikrindən aydın olur ki, şair hz.Məhəmmədin (s.a.s.) xanımlarını da Əhli-Beyt sayır. Elə buna görə də, hz.Nizami onları cəm olaraq «ismətlilər» adlandırır və onları hz.Məhəmmədin (s.a.s.) «toxunulmaz evində, pərdə arxasında» təsvir edir.

Hz.Məhəmmədin (s.a.s.) Əhli-Beytinin kimlərdən ibarət olması ilə bağlı hədisləri oxuyaq.

Yezid ibni Hayyan belə dedi: «Bir gün Husayn ibni Səbrə və Amr ibni Müslim ilə birgə Zeyd ibni Erkamın evinə getdik. Yanında oturanda Husayn ibni Səbrə dedi:

- Zeyd! Sən çox lütfə nail olmuş bir kimsəsən. Rəsulullahı (s.a.s.) gördün, sözünü dinlədin, onunla birlikdə savaşlarda iştirak etdin və arxasında namaz qıldın. Doğrusu, böyük səadətə çatdın, Zeyd! Rəsulullahdan (s.a.s.) duyduqlarını bizə də anlat!

Zeyd bunları söylədi:

- Bacıoğlu! Vallahi çox yaşlandım. Aradan çox zaman keçdi. Rəsulullahdan (s.a.s.) duyub öyrəndiklərimin bir

qismini unutdum. Bu səbəblə sizə anlatdıqlarımı öyrənin. Anlatmadıqlarım xüsusunda da məni çətinliyə salmayın.

Zeyd sözlərinə davam etdi:

- Bir gün Rəsulullah (s.a.s.) Məkkə ilə Mədinə arasındakı Xum suyu başında ayağa qalxaraq bizə bir nitq söylədi. Allaha həmd və sənadan sonra bizə öyüd verdi. Sonra da belə buyurdu:

- Ey insanlar! Mən də bir insanam. Yaxında Rəbbimin elçisi mənə də gələcək və mən onun dəvətinə uyub gedəcəyəm. Sizə iki önəmli şey qoyub gedirəm. Biri insanı doğru olana aparan bir rəhbər və nur olan Allahın kitabı Qurandır. Ondan yapışın və sıx sarılın!

Peyğəmbər (s.a.s.) Qurana sarılmaq və ona bağlanmaq məsələsində tövsiyələr verdi. Sonra sözünə belə davam etdi:

- Sizə bir də Əhli-Beytimi qoyub gedirəm. Allahdan qorxun və Əhli-Beytimlə sayğılı davranın! Allahdan qorxun və Əhli-Beytimlə sayğılı davranın!

Husayn ibni Səbrə:

- Zeyd! Peyğəmbərin Əhli-Beyti kimdir? Xanımları da Əhli-Beytindən deyilmi?, deyə soruşdu.

Zeyd:

- Xanımları da Əhli-Beytindəndir. Ancaq onun əsl Əhli-Beyti özündən sonra da sədəqə almaları haram olanlardır.

Husayn:

- Sədəqə almaları haram olanlar kimlərdir?, - deyə soruşdu.

Zeyd:

- Əlinin ailəsi, Aqilin ailəsi, Cəfərin ailəsi və Abbasın ailəsidir.

Husayn:

- Bunların hamısına sədəqə almaq haramdırmı?, - deyə soruşdu.

Zeyd:

- Bəli cavabını verdi».[467]

Hz.Məhəmmədin (s.a.s.) xanımlarının Əhli-Beytdən olduğunu təsdiq edən bir başqa hədisdə deyilir: «Hz. Məhəmməd (s.a.s.) Zeynəb Binti Cahşla evləndiyi gün hz. Aişədən (r.a.) başlamaqla xanımlarının evlərini bir-bir dolaşdı və:

- Allahın salamı və rəhməti üzərinizə olsun, Əhli-Beyt!, - deyə salam verib vəziyyətlərini soruşdu.

Hər bir xanımı:

- Allahın salamı və rəhməti sənin də üzərinə olsun. Xanımın necədir? Allah mübarək etsin, deyə onu təbrik etdilər».[468]

Deyildiyi kimi, Şiə alimləri hz.Məhəmmədin (s.a.s.) xanımlarını onun Əhli-Beytindən saymırlar. Onların görüşünə görə, Əhli-Beyt hz.Əli (r.a.), hz.Fatimə (r.a.), hz.Həsən (r.a.), hz.Hüseyn (r.a.) və onların nəsillərindən olanlardır. Şiə alimləri mövqeylərini əsaslandırmaq üçün bu hədisi dəlil olaraq göstərirlər:

«Bir sabah Peyğəmbər (s.a.s.) qara yundan hazırlanmış naxışlı bir əbaya bürünüb evdən çıxdı. Yanına sırası ilə hz.Həsən, hz.Hüseyn, hz.Fatimə ilə hz.Əli gəldilər. O, hamısını əba ilə örtdükdən sonra «Əzhab» surəsinin 33-cü ayəsini oxudu:

«Ey Əhli-Beyt! Uca Allah sizdən günahı yumaq və sizi tərtəmiz etmək istəyir».[469]

---

[467] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 512.
[468] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 516.
[469] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 516.

**Alimlərin düşüncəsinə görə, bu sağlam bir hədisdir. Ancaq təkcə bu hədisə əsaslanaraq Əhli-Beytin (Əhli-Əbanın) ancaq hz.Məhəmməd (s.a.s.) ilə adı çəkilənlərdən ibarət olduğunu irəli sürmək doğru deyil. Ümumi qənaətə görə, hz.Məhəmmədin (s.a.s.) bütün xanımları, qızı hz.Fatimə (r.a.), nəvələri hz.Həsən (r.a.) ilə hz.Hüseyn (r.a.), əmisi hz.Abbas (r.a.), əmioğulları hz.Əli (r.a.), Aqil və Cəfərin ailələri onun Əhli-Beytidir. Əhli-Beyti sevmək, onlara sayğı göstərmək hər bir müsəlmanın borcudur.**

Hz.Nizami şərh olunan beytin birinci misrasında «İsmətlilər onun (hz.Məhəmmədin (s.a.s.) toxunulmaz evində pərdə arxasında qalırlar», deyir. Bu, əslində, müsəlmanların Peyğəmbərin (s.a.s.) xanımlarına, bir-birilərinin xanımına münasibətlərinin ölçüsüdür. Bu ölçünün də ilahi qaynağı var, bu ölçünün də uca Allah (c.c.) müəyyən edib:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَدْخُلُوا بُيُوتَ النَّبِيِّ إِلَّا أَن يُؤْذَنَ لَكُمْ إِلَى طَعَامٍ غَيْرَ نَاظِرِينَ إِنَاهُ وَلَكِنْ إِذَا دُعِيتُمْ فَادْخُلُوا فَإِذَا طَعِمْتُمْ فَانتَشِرُوا وَلَا مُسْتَأْنِسِينَ لِحَدِيثٍ إِنَّ ذَلِكُمْ كَانَ يُؤْذِي النَّبِيَّ فَيَسْتَحْيِي مِنكُمْ وَاللَّهُ لَا يَسْتَحْيِي مِنَ الْحَقِّ وَإِذَا سَأَلْتُمُوهُنَّ مَتَاعاً فَاسْأَلُوهُنَّ مِن وَرَاء حِجَابٍ ذَلِكُمْ أَطْهَرُ لِقُلُوبِكُمْ وَقُلُوبِهِنَّ وَمَا كَانَ لَكُمْ أَن تُؤْذُوا رَسُولَ اللَّهِ وَلَا أَن تَنكِحُوا أَزْوَاجَهُ مِن بَعْدِهِ أَبَداً إِنَّ ذَلِكُمْ كَانَ عِندَ اللَّهِ عَظِيماً يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَدْخُلُوا بُيُوتَ النَّبِيِّ إِلَّا أَن يُؤْذَنَ لَكُمْ إِلَى طَعَامٍ غَيْرَ نَاظِرِينَ إِنَاهُ وَلَكِنْ إِذَا دُعِيتُمْ فَادْخُلُوا فَإِذَا طَعِمْتُمْ فَانتَشِرُوا وَلَا مُسْتَأْنِسِينَ لِحَدِيثٍ إِنَّ ذَلِكُمْ كَانَ يُؤْذِي النَّبِيَّ فَيَسْتَحْيِي مِنكُمْ وَاللَّهُ لَا يَسْتَحْيِي مِنَ الْحَقِّ وَإِذَا سَأَلْتُمُوهُنَّ مَتَاعاً فَاسْأَلُوهُنَّ مِن وَرَاء حِجَابٍ ذَلِكُمْ أَطْهَرُ لِقُلُوبِكُمْ وَقُلُوبِهِنَّ وَمَا كَانَ لَكُمْ أَن تُؤْذُوا رَسُولَ اللَّهِ وَلَا أَن تَنكِحُوا أَزْوَاجَهُ مِن بَعْدِهِ أَبَداً إِنَّ ذَلِكُمْ كَانَ عِندَ اللَّهِ عَظِيماً

(Əhzab, 33/53)

**«Ey iman edənlər! İcazə verilmədikcə peyğəmbərin evlərinə girməyin. Yemək üçün (dəvət edildiyiniz zaman erkəndən) gedib hazırlanmasını gözləməyin. Çağrıldığınızda (ən uyğun zamanda) girin. Yeməyi yeyən kimi ayrılın. Söz, söhbət üçün də icazəsiz girməyin. Çünki bu, peyğəmbərə əziyyət verir, ancaq o, sizdən utanır. Ancaq Allah haqqı söyləməkdən sıxılmaz. Peyğəmbərin xanımlarından bir şey istədiyiniz zaman pərdə arxasından istəyin. Belə etməyiniz həm sizin qəlbləriniz, həm də onların qəlbləri üçün daha təmizdir. Sizin Rəsulullaha əziyyət etməyə haqqınız yoxdur. Ondan sonra xanımlarını da nigahlamağa haqqınız yoxdur. Belə etməyiniz Allah yanında çox böyük bir günahdır».**

**Bu ayədə («Peyğəmbər xanımlarından bir şey istədiyiniz zaman pərdə arxasından istəyin») uca Allah (c.c.) hz.Məhəmmədin (s.a.s.) xanımlarını «hərəm» (toxunulmaz) elan edir. Bu yolla da kişi-qadın münasibətlərinin ölçüsünü cızır. Burada «Pərdə arxasından istəmək (soruşmaq)» ölçüsü insanların, toplumun əxlaqi təmizliyini təmin edən bir ölçü kimi önə çıxır.**

Əski müsəlman evlərində «toxunulmaz yer», ancaq ailə məhrəmləri üçün olan otaq olurdu. Başqa bir kimsənin ora girmək haqqı yox idi.

Hz. Nizami də hz. Məhəmmədin (s.a.s.) evinin toxunulmaz olduğunu bildirir və onun evində ismətlilər pərdə arxasında qalırlar. Bu, əslində, bir əxlaq ölçüsüdür. Bununla bağlı hədisləri oxuyaq.

Uqbə ibni Əmir (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Yanında məhrəm olmayan qadınların yanına girməkdən çəkinin!»

Bunun üzərinə birisi:

- Ey Allahın Rəsulu! Ərin kişi qohumu haqqında nə deyirsiniz?, - dedi.

- Onlarla xəlvət, ölüm deməkdir, buyurdu».[470]

Büreydə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Cihada çıxan kişilərin geridə qoyduqları xanımları, cihada çıxmayan kişilərə öz anaları kimi haramdır. Bunlardan bir kişi mücahidlərin birinin ailəsinə baxmağı üzərinə alıb, sonra xəyanət edərsə, qiyamət günü bu adam saxlanılar, o mücahid onun əməlindən dilədiyini alar».

Büreydə deyir ki, sonra Rəsulullah (s.a.s.) bizə döndü və «Nə zənn edirdiniz?», buyurdu».[471]

Biz şərh olunan beytin birinci misrasında olan «ismətlilər» qavramının namuslular, iffətlilər mənasında işləndiyini bildirdik. Hz.Nizami bir yandan hz.Məhəmmədin (s.a.s.) Əhli-Beytinin çərçivəsini müəyyən edir, Peyğəmbərin (s.a.s.) xanımlarının namuslu, iffətli, pak olduqlarını göstərir, başqa yöndən isə toplumun mənəvi sağlamlığına ciddi təsir göstərən qadın-kişi münasibətlərinin ən önəmli ölçülərindən biri olan «xəlvət», «pərdə» prinsipinə işarə edir. Bu «xəlvət» ölçüsünə görə, yanında məhrəmi olmayan (qadınla evlənməsi haram olan) bir qadının yanına girmək, onunla tənha baş-başa qalmaq haramdır, qardaş, onun uşaqları, əmi, əmi uşaqları qardaşın xanımı ilə təkbətək qala bilməz.

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ «PƏRDƏ» AİLƏNİ QORUYAN ÖLÇÜDÜR

Bu anlayış islamın hədəfinə uyğundur. Belə ki, islamın hədəflərindən biri ailəni qorumaqdır. **Deməli, hz.Nizamiyə**

[470] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 92.
[471] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 93.

**görə, namuslu, iffətli olmaq ailənin əsasıdır. İffəti, namusu qorumağın yollarından biri də örtünmədir, hz. Nizaminin dediyi kimi «pərdə»dir. Hz.Nizaminin beytində «ismət», «hərəm», «pərdə» fərdi, ailəni, toplumu qoruyan dəyər, ölçü kimi çıxış edir. Toplumun əsası ailədir, ailənin əsası sevgi, iffət və namusdur, ailəni dağıdan zinadır, zinaya yol açan ölçüsüzlükdür (ölçüsüz geyinmə, ölçüsüz münasibət), pərdəsizlikdir. Deməli, pərdə, örtünmə iffəti, namusu, bu yolla da ailəni qoruyan ölçülərdən biridir.**

Baxın, uca Allah (c.c.) harama baxmağı necə qadağan edir:

قُل لِّلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ أَبْصَارِهِمْ وَيَحْفَظُوا فُرُوجَهُمْ ذَلِكَ أَزْكَى لَهُمْ إِنَّ اللَّهَ خَبِيرٌ بِمَا يَصْنَعُونَ

(Nur, 24/30)

«Mömin kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər, ayıb yerlərini qorusunlar. Bu onlar üçün daha yaxşıdır. Şübhəsiz, Allah onların nə etdiklərindən xəbərdardır!».

وَلاَ تَقْفُ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ إِنَّ السَّمْعَ وَالْبَصَرَ وَالْفُؤَادَ كُلُّ أُولـئِكَ كَانَ عَنْهُ مَسْؤُولاً

(İsra, 17/36)

«(Ey insan!) Bilmədiyin bir şeyin ardınca getmə. Çünki qulaq, göz və ürək-bunların hamısı sorğu-sual olunacaqdır».

يَعْلَمُ خَائِنَةَ الْأَعْيُنِ وَمَا تُخْفِي الصُّدُورُ

(Mömin, 40/19)

«Allah gözlərin xain baxışını və qəlblərin gizlədiyini bilir».

إِنَّ رَبَّكَ لَبِالْمِرْصَادِ

(Fəcr, 89/14)

«Rəbbin hər an gözləməkdədir».

İslam Peyğəmbəri (s.a.s.) halal, haram məsələlərinin üzərində israrla durur:

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə buyurdu: «Adəm oğluna zinadan nəsibi təqdir olunmuşdur. O, buna mütləq çatacaq. Gözlərin zinası baxmaq, qulaqların zinası dinləmək, dilin zinası danışmaq, əlin zinası tutmaq, ayaqların zinası yeriməkdir. Qəlbə gəlincə o, arzu edər, istər. Cinsi orqan isə bunu ya gerçəkləşdirər, ya da boşa çıxarar».[472]

Əbu Talha Zeyd ibni Səhl (r.a.) belə rəvayət edir: «Biz küçə başında, evlərin önündə oturub danışırdıq. Bir dəfə Rəsulullah gəldi, başımızın üstündə durdu və:

- Sizə nə olub ki, belə küçələrdə oturursunuz? Buralarda oturmaqdan çəkinin!, -buyurdu.

Biz:

- Qorxusuz şeylər üçün otururuq, müzakirələr edir, danışırıq, dedik.

- Əgər küçələrdə oturmaqdan əl çəkə bilmirsinizsə, heç olmasa haqqını verin. Onun haqqı isə gözü haramdan qorumaq, salam vermək və gözəl şeylər söyləməkdir».[473]

İslam anlayışı çərçivəsində ismətin, namusun, iffətin, bu yolla da ailənin qorunmasının yollarından bir nigah, biri də örtünmədir. Qurani-Kərim belə buyurur:

الْيَوْمَ أُحِلَّ لَكُمُ الطَّيِّبَاتُ وَطَعَامُ الَّذِينَ أُوتُواْ الْكِتَابَ حِلٌّ لَّكُمْ وَطَعَامُكُمْ حِلُّ لَّهُمْ وَالْمُحْصَنَاتُ مِنَ الْمُؤْمِنَاتِ وَالْمُحْصَنَاتُ مِنَ الَّذِينَ أُوتُواْ الْكِتَابَ مِن قَبْلِكُمْ إِذَا آتَيْتُمُوهُنَّ أُجُورَهُنَّ مُحْصِنِينَ غَيْرَ مُسَافِحِينَ وَلاَ

---

[472] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 80.
[473] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 83.

مُتَّخِذِي أَخْدَانٍ وَمَن يَكْفُرْ بِالإِيمَانِ فَقَدْ حَبِطَ عَمَلُهُ وَهُوَ فِي الآخِرَةِ مِنَ الْخَاسِرِينَ

(Maidə, 5/5)

«Bu gün həyatın bütün gözəl şeyləri sizə halal edildi. Və daha öncə vəhy verilənlərin yeyəcəkləri sizə halaldır. Sizin yeyəcəkləriniz də onlara halaldır. (Bu ilahi kəlama) inananlar içindəki iffətli qadınlar ilə sizdən öncə özlərinə vəhy verilənlər arasında olan qadınları nigah etməyiniz, onların mehrlərini verməyiniz şərti ilə, onları qeyri-qanuni yolla, ya da gizli dost tutma yolu ilə deyil, halal (qanuni) bir nigahla almağınız şərti ilə sizə halaldır. Allaha inanmağı rədd edənə gəlincə isə onun bütün işləri boşa gedəcək. Belə ki, o, o biri dünyada zərərə düşənlər arasında yer alacaqdır».

Ummi Sələmə (r.a.) rəvayət edir: «Mən Rəsulullahın (s.a.s.) yanında idim. Meymunə də vardı. İbni Ümmi Məktum çıxıb gəldi. Bu hadisə biz örtünməklə əmr olunduqdan sonra idi. Nəbi (s.a.s.) bizə:

- Örtünün!, - buyurdu.

Biz:

- O kor biri deyilmi, ey Allahın Rəsulu? Bizi görməz, bilməz, dedik.

Hz. Peyğəmbər:

- Siz ikinizdə korsunuz, onu görmürsünüz?, - buyurdu».[474]

Biz, hz.Nizaminin şərh olunan beytinin ikinci misrasında «ismət» anlayışının həm namuslu, iffətli, ismətli olmaq kimi gözəl əxlaqın önəmli ölçüləri anlamında, həm də yalnız peyğəmbərlərə bağlı bir sifət kimi dəyərləndirildiyini görürük. Hz.Nizami beytin ikinci misrasında «İsməti o (hz.Məhəmməd (s.a.s.)) tərbiyələndirmişdir», «İsmət ondan yüksəliş tapmışdır»,

---

[474] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 86-87.

deyir. Təbii ki, biz bu ikinci misranın məna çalarlarını da birinci misra ilə birgə şərh etməliyik. Yuxarıda «ismət» anlayışı ilə bağlı verdiyimiz dini, hüquqi, mənəvi yöndə olan bilgilər bu misranı da tam qavramağa yol açır.

## MİSRANIN DİNİ, FƏLSƏFİ, BƏDİİ ŞƏRHİ

**Bizcə, hz.Nizami bu misranı aşağıdakı məna ilə yükləmişdir. İsmət bir əxlaqi dəyərdir, fərdin, toplumun, dünyanın sağlam yaşaması da əxlaqi ölçülər içində yaşamağa bağlıdır. Hz.Nizamiyə görə, «ismət» anlayışının çərçivəsini və onu qorumağın yollarını hz.Məhəmmədin (s.a.s.) gətirdiyi din müəyyən etmişdir. Evlənib ailə qurmaq, nikah, örtünmə, qadın haqqı, uşaq hüququ, zinanın haram elan edilməsi bu ölçülər sırasındadır. İslam ailəni müqəddəs elan etdi, «Qadın Allahın əmanətidir», buyurdu, qadının kişi, kişinin də qadın üzərindəki haqlarını göstərdi. İslam dini ailənin sevgi, qarşılıqlı hörmət, bir-birinin haqqını tanımaq kimi dəyərlər üzərində qurula biləcəyini irəli sürdü. İslam ailəiçi şiddəti, zorakılığı rədd etdi, qadına miras haqqı tanıdı, qadına öz ərini seçmək, boşanmaq hüququ verdi, qadının elm öyrənməsinin önəmini bəyan etdi. Bu gün ailə, qadın, uşaq hüquqları ilə bağlı elə bir bəşəri doğru hökm yoxdur ki, islam dinində olmasın. İslama görə, qadının ən böyük haqqı onun ana olmasıdır. Dövlət, toplum qadının bu ilahi missiyasının gerçəkləşməsi üçün zəruri olan bütün işləri görməlidir.**

Hz.Nizamiyə görə, islamın, bu dinin peyğəmbəri hz. Məhəmmədin (s.a.s.) qadının toxunulmaz olduğunu buyurması ismət, iffət qavramının mənasıdır. Hz.Nizaminin bu beytin məna yükünə yerləşdirdiyi başqa bir anlam da budur ki, peyğəmbərin xanımları onun Əhli-Beytinə daxildir və onlara hörmət etmək hər bir müsəlmanın borcudur.

Şair beytdə hz.Məhəmmədin (s.a.s.) evini bir model kimi təqdim edir. «İsmətli, namuslu, iffətlilər (toxunulmazlar) onun toxunulmaz evində, pərdə arxasında (toxunulmaz məkanda) qalır. Bizcə, bu hər bir müsəlman üçün nümunə olaraq təqdim olunan bir evdir, bir münasibətlər sistemidir. Buradakı ev hər bir müsəlmanın evidir, namusla yaşayan toplumun müqəddəs məkanıdır, daha böyük anlamda sevgi içində yaşayan bir dünyadır. Bu gözəl «ev»də hər şey və hamı toxunulmazdır. İslamın, hz.Məhəmmədin (s.a.s.), onlara arxalanaraq hz.Nizaminin irəli sürdüyü bu toxunulmazlıq anlayışı fərdin, ailənin, toplumun, dünyanın barış içində yaşamasının təməli deyilmi?

İnsanlara dəyər ver, onları sev, heç kimin və heç nəyin haqqına toxunma – bu ilahi ölçülər Allahın (c.c.) rizasını qazanmaq istəyən fərdin, toplumun, dünyanın tək yaşama biçimidir.

Hz.Nizami bu beytdə «ismət» anlayışının başqa ölçüsünü də dəyərləndirmişdir. Şairə görə, «ismət» ancaq peyğəmbərlərə bağlı bir sifətdir. **O, bu anlayış çərçivəsində hz.Məhəmmədə (s.a.s.) ayrıca yer vermişdir. «İsməti o tərbiyələndirmişdir» fikri o deməkdir ki, islam peyğəmbəri peyğəmbərlikdən öncə və sonra heç bir kiçik, böyük günah etməmişdir. O, pak, təmiz, halal, şərəfli, ismətli, fədakar bir peyğəmbər ömrü yaşadı. Uca Allah (c.c.) onu qorudu. O da Allahın əmanətlərinin toxunulmazlığını təmin etdi.**

Bu beytdə olan başqa bir məna da odur ki, onun gətirdiyi Quran toxunulmaz qaldı, bir hərfi belə dəyişilmədi. Hz. Nizaminin «İsməti o tərbiyələndirmişdir», «İsmət ondan yüksəldi» anlayışının bir mənası da odur ki, onun gətirdiyi dəyərlər bəşəridir, bütün insanlığa aiddir. Peyğəmbərlər

içində ən çox qorunmuş olanı da hz.Məhəmməddir (s.a.s.). Bu həm hz.Məhəmmədin (s.a.s.) şəxsiyyəti, həm dini, həm də kitabı ilə bağlıdır.

**Hz.Nizaminin bu beytdən çıxış edərək irəli sürdüyü ideyalardan biri də budur ki, ilahi buyruqlar (əmr və yasaqlar) toxunulmazdır. Bu buyruqlar insanın fitrətinə uyğundur və fərdin, toplumun, kainatdakı varlıqların arasındakı sağlam münasibətləri qorumaq üçündür. Bu ilahi buyruqlara əl vurulanda, onların toxunulmazlığı pozulanda insanın, toplumun, kainatın fitrəti pozulur və əxlaqi, ekoloji çöküş başlayır.**

**Hz.Nizaminin beytindən çıxan nəticənin biri də budur ki, qorumağın yolu toxunulmazlıqdır. Toxunulmazlığın təmini üçün də normalara, buyruqlara, ilahi ölçülərə ehtiyac var. Uca Allah (c.c.) hz.Məhəmmədin (s.a.s.) elçiliyi ilə bu ilahi buyruqlara son şəklini vermişdir** («İsməti o tərbiyələndirmişdir», «İsmət ondan yüksəliş tapmışdır»). Bir anlayışı «tərbiyə etmək» onun gerçək mənasını üzə çıxarmaq, onu terminləşdirmək və onun əsasında yaşamaqdır. Hz.Məhəmmədin (s.a.s.) müəllimliyi ilə biçimlənmiş anlayışları bilmək, ona uyğun yaşamaq isə bir vəzifədir.

Hz.Nizaminin bu beyti yazmaqda məqsədlərindən biri də hz.Məhəmmədin (s.a.s.) elçiliyi ilə biçimlənmiş «ismət» anlayışını şərh etməkdir.

## ON ALTINCI BEYTİN ŞƏRHİ: ONUN QÜRBƏTƏ DÜŞMƏSİ MƏKKƏNİN BAC VERMƏSİNƏ SƏBƏB OLURDU

Şair Nizami nətin on altıncı beytində hz. Məhəmmədlə (s.a.s.) bağlı başqa bir anlayışı önə çəkir:

تربتـش از دیده جنایت ستان
غربتـش از مکه جبایت ستان

***Onun türbəsinə baxanların cinayəti bağışlanırdı,***
***Onun qürbətə düşməsi Məkkənin bac verməsinə səbəb olurdu.***[475]

## «TÜRBƏ» ANLAYIŞI

Hz.Nizaminin bu beyti də başqa beytləri kimi tarixi, dini informasiyalarla zəngindir. Biz beytin informasiya qaynaqlarını bir-bir açıqlamağa çalışacağıq.

Öncə beytin birinci misrasında olan anlayışların məna çərçivəsini müəyyən edək. Bizcə, beytin birinci misrasında olan «türbə» anlayışı bir neçə mənanı özündə birləşdirir. **Təbii ki, şair ilk sırada «türbə» anlayışı ilə hz.Məhəmmədin (s.a.s.) Mədinə şəhərindəki qəbrini nəzərdə tutur. Bu anlayış çərçivəsində biz islamda qəbir ziyarəti ilə bağlı hökmləri göstərməyə çalışacağıq. Daha sonra beytdəki «türbə» sözü məscidlərə, ayrıca olaraq Məscidil – Həram, Məscidil – Nəbi və Məscidil – Əqsaya olan özəl münasibəti ehtiva edir. Bundan başqa hz.Nizami «hz.Məhəmmədin (s.a.s.) türbəsinə baxanların cinayətinin bağışlanması»ndan danışır. Biz bununla bağlı qaynaqları da şərhə daxil edəcəyik.**

[475] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.

## QƏBİR ZİYARƏTİ

Bilindiyi kimi, İslam dini ölümdən ibrət almaq, ölənləri rəhmətlə yad etmək üçün qəbir ziyarətini halal saymışdır. Ancaq İslamın ilk dönəmlərində hz.Məhəmməd (s.a.s.) qəbir ziyarətini yasaq etmişdi. Bunun başlıca səbəbi o dövrdə bir sıra cahiliyyə adətlərinin qalması idi. «Araplar büyük ve kalabalık bir kabile olduklarını bir-birlerine ispat etmek için mezardakı ölülerin sayısı ile övünürlerdi. Ölülerin kahramanlıklarını anarlar, gögüslerini yırtarak ve bağırıp çağırarak onlar için ağlarlardı».[476]

Hz.Məhəmməd (s.a.s.) bu cahiliyyə adətləri aradan götürülənədək qəbir ziyarətini yasaqladı. Qadınlar əski ənənələrin davam etməsinə daha çox maraq göstərdiyindən onların qəbir ziyarəti özəl olaraq qadağan edildi. İslam alimləri qadınların qəbir ziyarəti ilə bağlı fərqli fikirlər irəli sürsələr də, ümumi qənaət budur ki, qadın qaydalarına uymaq, cənazə ilə birlikdə olmamaq şərti ilə qəbir ziyarətinə gedə bilər.

İslam peyğəmbəri qəbir ziyarətinin önəmi, ədəbi ilə bağlı hədislər buyurmuşdur. Büreydə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Qəbirləri ziyarət etmənizi yasaqlamışdım. Ancaq artıq ziyarət edə bilərsiniz».[477]

Başqa bir rəvayətdə isə bu hədis belədir: «Qəbirləri ziyarət etmək istəyən ziyarət etsin. Çünki qəbir ziyarəti bizə axirəti xatırladır».[478]

Bu hədisdən görünür ki, hz.Peyğəmbər (s.a.s.) qəbir ziyarətinin insanlara ölümü, axirəti xatırladaraq, onlara bu dünya nemətlərinə çox bağlanmamağı, dünyanın fani olduğunu təlqin etdiyindən kişi, qadın fərqi qoymadan qəbri

[476] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 453.
[477] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 453.
[478] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 453.

ziyarət etməyi doğru saymışdır. O, hz.Aişənin (r.a.) qəbir ziyarətinə getməsinə də icazə vermişdir.[479]

Hz.Məhəmməd (s.a.s.) bir sıra hədislərində qəbir ziyarətinin ədəbini açıqlamışdır. Hz.Aişə (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) onun yanında qaldığı gecələrin sonuna doğru Baqi məzarlığına gedərək belə dedi: «Salam sizə, ey möminlər diyarı! Başınıza gələcəyi söylənən şeylərlə, nəhayət, qarşılaşdınız. İndilik irəli bir tarixdəsiniz. İnşallah, yaxında biz də aranıza qatılacağıq.

Allahım! Baqiül – Qarkad məzarlığında yatanları bağışla!»[480]

Büreydə (r.a.) belə rəvayət edir: «Hz.Peyğəmbər əshabi-kirama qəbirstanlığa getdikləri zaman belə dua etmələrini öyrədirdi: «Salam sizə, ey bu diyarın mömin və müslim xalqı! İnşallah, yaxında biz də aranıza qatılacağıq. Allahın bizi də, sizi də bağışlamasını istəyirəm».[481]

İbni Abbas (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) Mədinədə bir sıra qəbirləri ziyarət etdi. Üzünü onlara çevirərək belə buyurdu: «Salam sizə, ey bu qəbirlərdə yatanlar! Allah bizi də, sizi də bağışlasın. Siz bizdən öncə getdiniz. Biz ardınızdan gələcəyik».[482]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) qəbirstana gəldi və: «Salam sizə, ey möminlər diyarı! İnşallah, biz də sizə qatılacağıq. Qardaşlarımı görməyimi çox istərdim», dedi.

Əshabi-kiram:

---

[479] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 455.
[480] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 457.
[481] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 458.
[482] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 458.

- Biz sənin qardaşların deyilikmi, ey Rəsulullah?, - dedilər.

Rəsuli-Əkrəm:

- Sizlər mənim əshabımsınız, qardaşlarımız hələ gəlməmiş olanlardır, buyurdu.

Bunun üzərinə əshab:

- Ümmətindən hələ gəlməmiş olanları necə tanıyacaqsan, ey Allahın Rəsulu?, - dedilər.

Peyğəmbər (s.a.s.):

- Nə danışırsınız? Bir adamın alnı ağ və ayaqları səkilli bir atı olsa, yağız və qaraxallı at sürüsü içində öz atını tanımazmı?, - deyə soruşdu.

- Bəli, tanıyar, ey Allahın Rəsulu, dedilər.

Rəsuli-kibriya:

- Elə olanlar da abdəstinə görə üzləri nurlu, əl və ayaqları parlaq olaraq gələcəklər. Mən hovuzun başına onlardan öncə çatacağam».[483]

Bununla birgə hz.Məhəmməd (s.a.s.) müsəlmanların qəbir anlayışı ilə bağlı da bir sıra ölçülər müəyyənləşdirib.

Cabir (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) qəbrin kirəçlənməsini (bəzədilməsini), qəbrin üzərində oturulmasını və qəbir üzərində bina tikilməsini yasaqladı».[484]

İslam peyğəmbəri həm qəbirlərin qorunmasını, tapdaq altında qalmamasını doğru sayıb, həm də qəbirləri bir ev kimi tikib bəzəməyi qadağan edib. Qəbir bir öyünmə, fərqlənmə yerinə çevrilməməlidir.

Hz. Məhəmməd (s.a.s.) qəbirlər üzərində bina, məscid tikilməsini də qadağan edib. O xəstələnəndə xanımları Ümmi Sələmə və Ümmi Həbibə Həbəşistana hicrət edərkən orada

[483] Riyazüs-Salihin, göstərilən qaynaq, c. V, s. 170-172.
[484] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 338.

gördükləri «Mariya» adlı bir kilsənin gözəlliyini və içindəki qiymətli təsvirləri Peyğəmbərimizin (s.a.s.) o biri xanımlarına anladırdılar. Bunu eşidən Rəsulullah (s.a.s.) başını qaldıraraq: «Həbəşlilər elə kimsələrdir ki, onlardan əziz bir kişi öləndə qəbri üzərində bir məscid tikərlər, o kişinin rəsmini də o məscidə qoyarlar. Bunlar Allah yanında xalqın ən şərliləridir».[485]

İslam dininə görə, qəbirlər məscidlərin qiblə yönündə olmamalı, onların üzərində qübbə, türbə tikilməməlidir.

Hz.Məhəmməd (s.a.s.) qəbirlərə doğru namaz qılmağı da yasaqlamışdır. Əbu Mərsəd Kənnaz ibni Husayn (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Qəbirlərə doğru namaz qılmayın və qəbirlər üzərində oturmayın».[486]

Bunun anlamı odur ki, bir qəbri qibləyə çevirmək, o qəbri, ya da o qəbirdə yatanı ibadətə layiq görmək deməkdir, bu isə küfrdür. Qiblə etmək niyyəti olmadan belə, qəbrə doğru namaz qılmaq da doğru deyil.

Əbül – Heyyac Hayyan ibni Husayn belə rəvayət edir: «Əli ibni Əbu Talib (r.a.) mənə: «Sənə, Rəsulullahın (s.a.s.) mənə həvalə etdiyi bir işi tapşırımmı? Harada canlı surəti tapsan, onu tanınmaz hala sal, rastlaşdığın yüksək qəbirləri də yerlə bir et!», - dedi.[487]

Burada yüksək qəbirlərin yerlə bir edilməsi onların yerdən bir qarış hündür edilməsi anlamına gəlir. Dinimiz təmtəraqlı, bahalı qəbirlərin düzəldilməsini də doğru saymamışdır.

Bu qəbir, türbə və onların ziyarəti ilə bağlı verdiyimiz bilgilər hz.Nizaminin beytinin birinci misrasında olan anlayışların doğru başa düşülməsinə yol açır. Belə ki, islam dinində qəbir, türbə və onların ziyarəti ilə bağlı hökmləri,

---

[485] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 339.
[486] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 321.
[487] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 195.

qaydaları bilmədən hz.Nizaminin *«Onun türbəsinə baxanların cinayəti bağışlanırdı»* fikrinin doğru şərhi çətin olardı.

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) QƏBRİNİ ZİYARƏT ETMƏK OLARMI?

**Hz.Nizaminin misrada ifadə etdiyi fikrin qaynaqlarına baxaq. Yəni, hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarət etmək olarmı? Onun qəbrini ziyarət edənin günahının bağışlanması ilə bağlı deyilən söz hansı qaynağa əsaslanır. Hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarətin ədəbi nədir? Biz bu məsələlərlə bağlı olan qaynaqları araşdırdıq. Öncə qaynaqları təqdim edək:**

«Əş-Şifa fi-tarifi-huquqil-Mustafa» adlı əsərdə bu məsələ ilə bağlı bir sıra hədis verilmişdir. Bu kitabda verilən hədislərdən birini Abdullah ibni Ömər (r.a.) rəvayət edib. «Rəsuli-Əkrəm belə buyurdu: «Kim ki, qəbrimi ziyarət edər, onun üçün şəfaətim sabit bir haqq olur».[488]

Enes ibni-Malik (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Kim ki, savab qəsd edərək Mədinədə məni ziyarət edərsə, o mənim mücavirim olur, qiyamət günündə ona şəfaət edərəm».[489]

Abdullah ibni Ömər (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) buyurdu: «Kim ki, vəfatımdan sonra məni ziyarət edərsə, həyatımda məni ziyarət etmiş kimidir».[490]

İbni-Adiyy rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Kim ki, Beyti-Şərifi qəsd və ziyarət edib, məni ziyarət etməzsə, mənə cəfa etmiş olar».[491]

---

[488] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 176.
[489] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 176.
[490] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 176.
[491] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 176.

Alimlər bu sonuncu hədisi zəif, doğru olmayan hədis sayırlar.[492]

Alimlərin ümumi qənaətinə görə, hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarət gözəl bir əməldir (məndubdur). Hənəfi alimləri hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarəti vacibə yaxın olan bir gözəl əməl kimi dəyərləndirmişlər. Kimin maddi və fiziki imkanı varsa, hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarət ona vacibə yaxın bir hökmdür.[493]

Qazı İyaz «Şəfa»sında hz.Məhəmmədin (s.a.s.) ziyarətini ibni-Rahuyənin dili ilə belə anladır: «İslamdan beri Beytullahı ziyaret ve hacc eden her möminin ya hacdan evvel ve ya sonra Medine-i Münevvereye gelerek Mescidi-Saadette namaz kılması ve Ravzai-Mutahhareyi, Minberi-Şerifi, Kabri-Saadeti görüp karirül-ayn olması müslümanlar arasında carı olagelen bir sünnettir. Resuli-Ekremin Mescidi-Saadette oturduğu yeri yanında namaz kıldığı üstüvaneleri, mübarek elinin dokunduğu, Kademi- Saadetinin çiğnediği şerefli mevazii, istinad buyurdukları ve hali-istinadda Hazret-i Cibrilin kendilerine vahiy tebliğ ettiği diregi görmekle teberrük edile gelmiştir. Aleyhis-salatü ves-selamı ziyarete tebaan da sahabeden ve eimme-i Müsliminin bir çoklarının meşahid-i mübarekeleri ziyaret edilmiştir».[494]

Alimlər hz.Məhəmmədin (s.a.s.) qəbrinin həcc ziyarətindən öncə, yoxsa sonra ziyarət edilməsi ilə bağlı da görüşlərini açıqlamışlar. Əbu Hənifəyə görə, əgər həcc fərz olaraq yerinə yetirilirsə, ən gözəl hərəkət öncə həcc etmək, sonra da hz. Məhəmmədin (s.a.s.) qəbrini ziyarət etməkdir.

---

[492] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 176-177.
[493] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 177.
[494] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 177-178.

Ancaq öncə qəbri ziyarət edib, sonra həccə başlamaq da olar.[495]

Alimlərə görə, hz.Məhəmmədin (s.a.s.) qəbrinin ziyarəti üçün edilən niyyət, Məscidi-Nəbəvini ziyarət üçün edilən niyyətdən ayrılmalıdır. Çünki, hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarət edəndə Məscidi-Nəbi də ziyarət edilmiş olur. Bu fikri əsaslandıran alimlər hz.Peyğəmbərin (s.a.s.) bu hədisinə də istinad edirlər. «Kim ki, məni ziyarətdən başqa, könlündə heç bir əməl və arzu hakim olmayaraq ziyarət edərsə, qiyamət günü, əlbəttə, ona şəfaətçi olaram».[496]

Alimlərin şərhinə görə, hz.Məhəmmədin (s.a.s.) qəbrini qadınlar da ziyarət edə bilər. Çünki qəbir ziyarətinə icazə qadınlar və kişilərə eyni zamanda verilmişdir.

Bir sıra alimlər isə hz.Məhəmmədin (s.a.s.) qəbrini niyyət edərək ziyarəti doğru saymırlar.[497]

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) QƏBRİNİ ZİYARƏT ETMƏYİN ƏDƏBLƏRİ

Hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarətin ədəb qaydaları da müəyyənləşdirilmişdir.

Ziyarətə gedən şəxs Mədinə şəhəri görünəndə belə dua edir: «Allahım, bura sənin peyğəmbərinin müqəddəs yeridir, vəhyin endiyi mübarək yerdir. Bu yeri mənim üçün cəhənnəmdən qorunma, əzabdan və hesabdan güvəncə vəsiləsi et».

Mədinəyə gələn şəxs mümkündürsə, qüsl etməli, mümkün deyilsə, dəstəmaz almalı, təmiz paltar geyməli, salatü-salam gətirərək ədəb və təvazökarlıqla Məscidi-Səadətə getməlidir.

---

[495] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 178.
[496] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 178.
[497] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 184.

Məsciddə namaz qıldıqdan sonra ziyarətçi hz. Məhəmmədin (s.a.s.) qəbrinə yaxınlaşır. Üzünü ona çevirərək salam verir və dua oxuyur. Sonra sıra ilə hz.Məhəmmədin (s.a.s.) qəbrinin yanında dəfn olunmuş hz.Əbu Bəkirə (r.a.) və hz. Ömərə (r.a.) salam verir, dua oxuyur. Daha sonra hz. Məhəmmədin (s.a.s.) qəbri başında üzünü qibləyə çevirir, dua oxuyur, Rövzeyi-Mutahharaya gəlir, istədiyi duaları dilə gətirir, hz. Məhəmmədə (s.a.s.) səlat və salam deyir. Mədinədə qaldığı dövrdə namazlarını Məscidi-Səadətdə qılır, Quran oxuyur. Mədinədən ayrılanda da bu Məsciddə namaz qılaraq ayrılır.

Peyğəmbərin (s.a.s.) qəbrinin başına dolanmaq, ona əl sürtmək, onu öpmək, ondan bir şey istəmək, onun qəbrinə doğru namaz qılmaq, ona təzim etmək olmaz.

Hz.Məhəmməd (s.a.s.) sağlığında onun qəbrini tapınaq halına gətirməyi qadağan etmişdir. Əbu Hureyrə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Qəbrimi bayram yeri halına çevirməyin. Mənə salatü salam gətirin. Harada olursunuz olun, salatü salamınız mənə çatar».[498]

Bu məsələ ilə bağlı hz.Məhəmmədin (s.a.s.) başqa hədisləri də var:

«Peyğəmbərlərin məzarlarını məscid edən yəhudilərə Allah lənət etsin!»[499]

«Allahım! Qəbrimi bütxanə halına gətirmə!»[500]

Hz.Məhəmmədin (s.a.s.) qəbirləri məscidə çevirməyə qarşı sərt mövqeyi, insanların qəbir ziyarəti ilə bağlı həddi aşması, onu bütə çevirməsi, bidətlərin, fitnələrin ortaya çıxması təhlükəsi ilə bağlıdır. Bir sıra xalqlar, insanlar bu nöqtədə azmış və küfrə düşmüşdür.

---

[498] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 206-207.
[499] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 538.
[500] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 207.

Hz.Nizaminin şərh olunan beytinin birinci misrasında olan «türbə», «şəfaət» və «bağışlanma» anlayışlarının, ümumiyyətlə, qəbir ziyarəti, ayrıca olaraq isə hz.Məhəmmədin (s.a.s.) qəbrini ziyarətin fəziləti çərçivəsində iki yönünü açıqladıq, qaynaqları göstərdik. Ancaq bu misrada bir üçüncü yön də var. Bu da onunla bağlıdır ki, Mədinə şəhərində hz. Məhəmmədin (s.a.s.) qəbri ilə yanaşı olan Məscidi-Səadət, Məscidi-Nəbi adlanan məscid də mübarək yerdir. Bu mübarək yeri ziyarətin, orada ibadət etməyin çox fəziləti var. Bununla bağlı qaynaqlara baxaq:

## ÜÇ MƏSCİDDƏ NAMAZ QILMAĞIN SAVABI DAHA ÇOXDUR

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Hz.Məhəmməd (s.a.s.) belə buyurdu: «Namaz və ibadət üçün heç bir məscidə səfər edilməsi doğru deyildir. Çox savab umaraq yalnız bu üç məscidə səfər edilir: «Məscidi-Həram, Məscidi-Rəsul və Məscidi-Əqsa».[501]

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Miniklər ancaq üç məscid üçün qoşulur. Biri mənim bu Məscidim, Məscidi-Həram (Kəbə) və Məscidi-Əqsa».[502]

Abdullah b. Zeyd (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «İbrahim peyğəmbər Məkkəni toxunulmaz etdi və bərəkətli olması üçün dua oxudu. Mən də Mədinəni toxunulmaz etdim və İbrahimin dua etdiyi kimi Mədinəyə bərəkət duası oxudum».[503]

Enes (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Mədinə buradan buraya qədər toxunulmazdır. Ağacı

[501] Sahih Buxari, göstərilən qaynaq, c. VI, s. 163.
[502] Sahih Buxari, Sahih Müslüm, göstərilən qaynaq, s. 271.
[503] Sahih Buxari, Sahih Müslüm, göstərilən qaynaq, s. 276.

kəsilməz, içərisində Quran və Sünnətə tərs olan iş görülməz. Kim Quran və Sünnətə zidd iş görərsə, Allahın, mələklərin və bütün insanların lənəti onun üzərinə olsun».[504]

Əbu Səid Hudri (r.a.) rəvayət edir: «Bir dəfə Rəsulullah (s.a.s.) birisi ilə vidalaşdı, sonra da:

- Haraya gedirsən?, - deyə soruşdu.

O da:

- Beyti-Məqdisə (namaz qılmağa) getmək istəyirəm, deyə cavab verdi.

Rəsuli-Əkrəm:

- Mənim bu Məscidimdə qılınan bir namaz, Məscidi-Həram müstəsna olmaq üzrə başqa məscidlərdə qılınan yüz namazdan üstündür, buyurdu».[505]

Cabir (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu:

«Məscidimdə qılınan bir namaz Məscidi-Həram xaric başqa məscidlərdə qılınan min namzdan xeyirlidir. Məscidi-Həramda qılınan bir namaz da başqa məscidlərdə qılınan yüz min namazdan üstündür».[506]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə buyurdu: «Evimlə minbərim arasındakı sahə cənnət bağçalarından bir bağçadır. Minbərim də (mənə bəxş edilən Kövsər) hovuzunun üzərində qurulmuşdur».[507]

Bu hədislərdən görünür ki, Məscidi-Həram, Məscidi Nəbi və Məscidi-Əqsa başqa məscidlərdən üstündür, onları ziyarət üçün səfərə çıxmaq doğrudur, bu üç məsciddən başqa heç bir məscidə ziyarət niyyəti ilə səfər etmək doğru deyil. Bu üç məscid arasında da dərəcə fərqləri var. Sıra ilə öncə

---

[504] Sahih Buxari, Sahih Müslüm, göstərilən qaynaq, s. 276.
[505] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 199.
[506] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 204.
[507] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 213.

Məscidi-Həram, sonra Məscidi Nəbi, daha sonra isə Məscidi-Əqsa gəlir.

Bu üç məscidin başqalarından fərqləndirilməsinin də səbəbləri var. Hər şeydən öncə hər üç məscid peyğəmbərlərin qərarları və iştirakı ilə tikilmişdir. Məscidi-Həram (Kəbə) müsəlmanların qibləsidir. Məscidi-Nəbi Allaha (c.c.) təslimiyyət niyyəti ilə tikilmişdir. Məscidi-Əqsa isə öncəki nəsillərin qibləsidir. «Mescid-i Hərama uzaqlığından dolayı da Mescid-i–Aksa denilmiştir. Bu sebeb de bu mescidlere memur bir takım melekler bulunup bunların buralara gelen müminlerin aralarında dönüp dolaşarak haklarında hayır ve saadet dilemeleridir».[508]

Bu üç məscidin başqalarından üstün olmasının bir səbəbi də onları ziyarət etməyin islam böyüklərini yada salmasıdır.

Bu üç məscidi ziyarət etmək üçün səfərə çıxmağın doğruluğunu aşağıdakı xəbər də təsdiq edir: «Suleyman alehis-selam Beyti-Makdisin binasını bitirdikten sonra Cenabi-Haktan üç dilekte bulunmuştur: 1) Kendisindən sonra kimseye müyesser olmayacak bir mülk ve saltanat. 2) Hükmü ilahiye muvafik bir hükmü kaza kudreti bahş edilmesi. 3) Yalnız namaz kılmak için Mescidi-Aksayı kasd edip gelenlerin mahzar-i gufran olması. Rasuli-Ekrem: «Canabi-Hak Suleymana bunlardan iki evvelkileri vermiştir. Üçüncü niyazının da mahzar-ı kabul olmasını temenni ederim, buyurmuştur».[509]

Alimlərin yekdil rəyinə görə, bu üç məscidə ziyarət üçün səfərə çıxmaq, ibadət-namaz, dua, zikr, Quran oxumaq

---

[508] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 167.
[509] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 167.

niyyəti ilə ola bilər. Başqa məscidlərin bərəkəti bir olduğundan onları ziyarət üçün səfərə çıxmaq doğru deyil.

Bunlarla birgə hz.Məhəmmədin (s.a.s.) Quba məscidinə ayrıca önəm verdiyi də bilinməkdədir. «Quba məscidində bir namaz, ümrəyə getmək kimidir».[510]

«İbni Ömər (r.a.) iki gündən başqa quşluq vaxtında namaz qılmazdı. Biri Məkkəyə gəldiyi gündür. O, quşluq vaxtı Məkkəyə girər, Kəbəni tavaf edib məqami-İbrahimin arxasında iki rükət namaz qılardı. O birisi isə Quba məscidinə gəldiyi gün idi. O, özü hər cümə ertəsi bura gəlirdi. Məscidə girəndə içərisində namaz qılmadan çıxmağı xoş qarşılamazdı. Hz.Peyğəmbərin (s.a.s.) buranı istər miniklə, istərsə də piyada gəlib ziyarət etdiyini söylər və: «Mən dostlarımın etdiyi işləri yerinə yetirərəm. Heç kimi günəşin doğması və batışına uyğun gəlmədikcə (bu zamandan başqa) gecə və gündüz istədiyi saatda namaz qılmaqdan çəkindirə bilmərəm», demişdir».[511]

## BEYTİN İDEYA-BƏDİİ YÜKÜ

**Bu qaynaqlar işığında hz.Nizaminin *«Onun türbəsinə baxanların cinayəti bağışlanırdı»* misrasının bilgi və ideya yükü ortaya çıxmış olur. Hz.Nizaminin bu misranı yazmaq üçün tarixi qaynaqları, hədisləri, bu hədislərlə bağlı ayrı-ayrı şərhləri oxuduğu, təhlil etdiyi göz qabağındadır. Onun bütün beytlərində olduğu kimi bu beytində də ideya tarixi, gerçək bilgilər üzərində qurulmuşdur.**

**Biz bu şərh olunan misradakı «cinayət» sözünü «günah» kimi qavramalıyıq. Misranın hədis qaynağından bu məna doğur. Şair, hz.Məhəmmədin (s.a.s.) türbəsinə-**

---

[510] Sahih Buxari, göstərilən qaynaq, c. IV, s. 184.
[511] Sahih Buxari, göstərilən qaynaq, c. IV,s. 185.

**qəbrinə baxmaqla günahların bağışlanması fikrini bu məkanın fəzilətini anlatmaq üçün, gerçək hədisdən çıxış edərək ifadə etmişdir. Hz.Nizami bu mübarək məkanın bərəkətini misranın ruhuna yerləşdirmişdir. O, bu türbəyə baxarkən düşünülməsi zəruri olan anlayışları bizə xatırlatmışdır. Bu dünya fanidir, əbədi həyat axirətdir, uca Allah (c.c.) bu bəlli vaxtı insana sınaq üçün vermişdir. Hz.Nizaminin anlayışına görə, hz.Məhəm-mədin (s.a.s.) türbəsini ziyarət də ağıllı müsəlman üçün bir fürsətdir, özünü anlamaq, Allahı (c.c.) tanımaq, hz. Məhəmmədə (s.a.s.) bağlanmaq üçün bir imkandır.**

İslam böyükləri məzarları bir ibrət düşüncəsi içində ziyarət etmişlər. **Hz.Əli** (r.a.) qəbirləri ziyarət anında düşüncələrini belə dilə gətirmişdir:

Buraxıb getdiyimiz evləri indi əllər tutdu,
Mallarımız paylaşıldı, bitdi.
Xanımlarınızı başqaları nikah etdi,
Bunlar bizim tərəfdə olub bitənlər.
Ah! Kaş bir də sizin tərəfdə olub bitənləri öyrənə bilsəydik!
Allaha and içirəm ki, onların danışmalarına izn verilsəydi,
«Ən xeyirli azuqə Allah qorxusudur», deyərlərdi.[512]

**Böyük türk ozanı Yunis Əmrə:**
Şunlar ki, çoktur malları,
Gör nice oldu halleri,
Sonuncu bir gömlek giymiş
Onun da yoktur kolları.[513]

---

[512] Üsve-i Hasene, göstərilən qaynaq, s. 471.
[513] Yunus Emre (hazırlayan, Abdülbaki Gölpınarlı), İstanbul, 2005.

**Başqa bir adı bilinməyən şair də belə deyir:**
Vucudum tatlıdır bana, harab olmaq ne müşküldür,
Çürüyüp ayak altında türab olmaq ne müşküldür.
Tutmaz olur semiz eller, kopar nazlı temiz diller,
Mevkiler, mallar, makamlar berbad olmak
ne müşküldür!...[514]

**Hz.Nizaminin də göstərdiyi kimi, hz.Məhəmmədin (s.a.s.) mübarək məzarını ziyarət etməyin böyük dəyəri var. Bu ziyarət bizi düşündürür, ölümü bizə xatırladır, bizi ibrət almağa, dünyanı doğru anlamağa yönəldir, qəlbimizdəki dünya ehtirasını söndürür, bizi halala yönəldir, bizi axirətə hazırlayır, bizi arındırır.**

Hz.Nizaminin bu misrasının şərhini bir ibrətli hekayə ilə bitirirəm. Bir gün Mərvan üzünü Rəsulullahın qəbri-şərifinin daşına qoymuş bir kişi gördü. Onun islam ölçülərinə uyğun olmayan hərəkət etdiyini düşündü. Yaxasından tutaraq:

- Nə etdiyini düşünürsən?, - dedi.

Adam başını çevirəndə onun Əbu Əyyub əl- Ənsari olduğunu gördü. Əbu Əyyub (r.a.) Mərvanın narahatlığını duydu. Ona doğru döndü:

- Bəli, nə etdiyimi bilirəm. Mən Rəsulullaha gəldim, daşa gəlmədim! Peyğəmbərin (s.a.s.) belə dediyini eşitmişdim: Din işlərini əhli olan (onu bilən) kimsələr üzərinə götürəndə narahat olma. Ancaq bu işə əhli olmayanlar qarışmağa başlayanda din üçün nə qədər narahat olsan, ağlasan yeridir»[515]

---

[514] Üsve-i Hasene, göstərilən qaynaq, s. 471.
[515] Üsve-i Hasene, göstərilən qaynaq, s. 472.

**Hz. Nizaminin şərh olunan beytinin ikinci misrası belədir:**

***«Onun qürbətə düşməsi Məkkənin bac verməsinə səbəb olurdu»***

Şairin bu misrası da tarixi bilgilər üzərində qurulmuşdur. Hz.Nizami bu iki misrada hz.Məhəmmədin (s.a.s.) peyğəmbərlik yönü ilə birgə dünyəvi yönünü də şərh etmişdir. Biz bu misranı şərh edərkən «qürbət», «Hz.Məhəmmədin (s.a.s.) Məkkə sevgisi» və «Məkkənin bac verməsi» kimi anlayış və fikirlərə aydınlıq gətirəcəyik.

## «QÜRBƏT» NƏDİR?

Bizcə, misradakı «qürbət» anlayışı hz.Məhəmmədin (s.a.s.) Məkkədən Mədinəyə hicrətini ifadə edir.

Bilindiyi kimi, hicrət etmək çox peyğəmbərin həyatında olmuşdur. Hz.İbrahim (s.a.s.), hz.Lut (s.a.s.), hz.Şuayb (s.a.s.), hz.Musa (s.a.s.) və başqa peyğəmbərlər təzyiqlər nəticəsində yurdlarını tərk etmişlər.

Hz.Məhəmməd (s.a.s.) Məkkədə ilahi mesajı təbliğə başlayanda çeşidli təbəqələr narahat olmağa başladılar. Onlar hz.Məhəmmədi (s.a.s.) özlərinə təhlükə saydılar və onu zərərsizləşdirmək üçün müxtəlif yollar düşündülər. Biz bu din düşmənlərinin hz.Məhəmmədə (s.a.s.) qarşı mübarizə üsullarını bir neçə yerə ayıra bilərik: hz.Məhəmmədi (s.a.s.) öldürmək, onu tutduğu yoldan çəkindirmək, onu həbs etmək, onu mühacirətə məcbur etmək.

Sonda islamın düşmənləri onu mühacirətə məcbur etmək yolunu seçdilər. Onlar hz.Məhəmmədə (s.a.s.) qarşı çirkin təbliğata başladılar. Məsələnin mahiyyətini anlamaq üçün bir faktı qeyd edək. Ona qarşı elə təbliğat aparmışdılar ki, bir yəmənli Məkkəyə gələrkən hz.Məhəmmədin (s.a.s.)

sehrli sözlərinin təsirinə düşməmək üçün qulaqlarına bez tıxamışdı. Yəni onun nəzərində hz.Məhəmməd (s.a.s.) çox təhlükəli bir insan idi. Bu islam düşmənləri onun yollarına tikan tökürdülər, o, namaz qılarkən üzərinə murdar şeylər atırdılar, yoluna, qapısının önünə pisliklər tullayırdılar. Onu ələ salırdılar, ləkələməyə çalışırdılar, iftira atırdılar, mane olurdular, işgəncə verirdilər, qorxudurdular, dediklərini təhrif edirdilər, onun dediklərini gizlədirdilər, ona şair deyirdilər, onu kahin adlandırırdılar, deyirdilər ki, o sehirbazdır, onu təhqir edirdilər, onu boğub öldürmək istəyirdilər. Əbu Cəhl onun başını daşla əzmək istəyirdi, ona pul verərək ələ almaq istəyirdilər, hakimiyyət vəd edirdilər, ən gözəl qadınla evlənmək təklif edirdilər. Ancaq bütün bu cəhdlər bir nəticə vermirdi.

## HƏZRƏT MƏHƏMMƏDƏ (s.a.s.) QARŞI OLANLARIN MÜBARİZƏ METODLARI

Uca Quranda hz.Məhəmmədə (s.a.s.) qarşı olan bu amansız mübarizəni təsvir edən ayələr var. Bu ayələrdə qüdrət sahibi Allahın (c.c.) öz sevimli peyğəmbərini necə qoruduğu, onu necə gücləndirdiyi də aydın görünür:

بَلْ قَالُواْ أَضْغَاثُ أَحْلاَمٍ بَلِ افْتَرَاهُ بَلْ هُوَ شَاعِرٌ فَلْيَأْتِنَا بِآيَةٍ كَمَا أُرْسِلَ الأَوَّلُونَ .مَا آمَنَتْ قَبْلَهُم مِّن قَرْيَةٍ أَهْلَكْنَاهَا أَفَهُمْ يُؤْمِنُونَ .وَمَا أَرْسَلْنَا قَبْلَكَ إِلاَّ رِجَالاً نُّوحِي إِلَيْهِمْ فَاسْأَلُواْ أَهْلَ الذِّكْرِ إِن كُنتُمْ لاَ تَعْلَمُونَ . وَمَا جَعَلْنَاهُمْ جَسَداً لَّا يَأْكُلُونَ الطَّعَامَ وَمَا كَانُوا خَالِدِينَ . ثُمَّ صَدَقْنَاهُمُ الْوَعْدَ فَأَنجَيْنَاهُمْ وَمَن نَّشَاء وَأَهْلَكْنَا الْمُسْرِفِينَ . لَقَدْ أَنزَلْنَا إِلَيْكُمْ كِتَاباً فِيهِ ذِكْرُكُمْ أَفَلَا تَعْقِلُونَ

(Ənbiya, 21/5-10)

«Onlar: «Xeyr, bunlar qarışıq röyalardır; yox, onu özü uydurdu, yox o, bir şairdir. Yoxsa bizə öncəkilərin (möcüzələrlə) göndərildikləri kimi bir ayə (möcüzə) gətirsin», dedilər. Onlardan öncə həlak etdiyimiz heç bir qəsəbə xalqı iman etmədi. İndi bunlarmı iman edəcəklər? Səndən öncə də başqa deyil, ancaq özlərinə vəhy etdiyimiz bir qisim peyğəmbərlər göndərdik. Bilmirsinizsə, elm əhli olanlardan soruşun. Biz onları yemək yeməz bir cansız cəsəd etmədik, həm də ölümsüz də deyillər. Sonra onlara verdiyimiz sözü yerinə yetirdik, onları və dilədiklərimizi qurtardıq, həddi aşanları yox etdik. And olsun, sizə elə bir kitab endirdik ki, bütün şanınız ondadır. Hələ ağıllanmayacaqsınızmı?»

وَيَقُولُونَ أَئِنَّا لَتَارِكُوا آلِهَتِنَا لِشَاعِرٍ مَّجْنُونٍ . بَلْ جَاء بِالْحَقِّ وَصَدَّقَ الْمُرْسَلِينَ . إِنَّكُمْ لَذَائِقُو الْعَذَابِ الْأَلِيمِ

(Saffat, 37/36-38)

«Və biz heç dəli bir şairə görə ilahlarımızdan əl çəkərikmi?», - deyirdilər. Xeyr, O, haqq ilə gəldi və bütün peyğəmbərləri təsdiq etdi. Əlbəttə, siz o ələm verən əzabı dadacaqsınız».

İslam düşmənləri həm bu dini öz əski inanclarına zidd sayırdılar, həm də islamı, hz.Məhəmmədi (s.a.s.) öz şəxsi hakimiyyət və çıxarlarına təhlükə hesab edirdilər. Mənəm-mənəmlik, şöhrət və sərvət ehtirası onları düşmənə çevirirdi. Bu yöndə Əbu Cəhlin iddiaları diqqəti çəkir: «Biz və Əbdi Mənaf oğulları şan və şərəf mövzusunda indiyə qədər yarışdıq və bərabər getdik. Onlar yedirtdilər, biz də yedirtdik, geyindirdilər, biz də geyindirdik… ancaq indi onlar «bizim ona vəhy gələn bir Nəbimiz var» deyirlər, biz buna uyğununu

tapa bilməyəcəyimizə görə ona iman etməyə imkan yoxdur».[516]

Bu islama qarşı olanlar öncə hz.Məhəmmədə (s.a.s.) vəhy olunanı «özü uydurur», dedilər. Sonra onun dedikləri «yuxusunda gördüyü hadisələrdir», dedilər, sonra dedilər ki, onu bir başqası öyrədir, «Rəhman adında biri öyrədir, başqalarından dərs alıb bizə söyləyir», sonra iftiralar yaydılar, yolların üstündə oturaraq, bazarları dolaşaraq, ev-ev hər kəsə anladaraq hz.Məhəmmədin (s.a.s.) yalan söylədiyini bildirdilər. Din düşmənləri onu addım-addım izləyirdilər.

Məkkədə ən gözəl insanlar şairlər, ən gözəl sənət də şairlik olduğundan ona şair dedilər. Ancaq artıq hz.Məhəmmədin (s.a.s.) düşmənlərinin sözü bir-birinə uyğun gəlmirdi. Xalq onların dediyi hansı sözə inanmalıydı? Bunu hiss edən və yalanlarının ortaya çıxdığını görən müşriklər bir gün Mugirə oğlu Vəlidin evində toplaşdılar. Vəlid onlara: «Həcc mövsümü gəlib çatdı. Məkkəyə uzaqdan yaxından ərəblər gələcək və sizdən Məhəmməd haqqında suallar soruşacaqlar. Kiminiz «o bir şairdir» deyəcək, kiminiz «o bir sehrbazdır» deyəcək, kiminiz «dəlidir», kiminiz də «kahindir» deyəcək və xalq da bir adam üçün söylənilən bu qədər şey qarşısında sözlərinizə dəyər verməyəcəkdir. Buna görə də, onunla bağlı nə deyəcəyinizi qərarlaşdıraq. Hər kəs eyni şeyi söyləsin.

- Kahin olduğunu deyərik.

- Biz kahinləri gördük. Onun oxuduğu kahinlərin düzüb qoşduğu şeylərdən deyildir. Kahinlər doğru da söylər, yalan da söylər, ancaq biz Məhəmmədin yalanını görmədik, o bir kahin deyildir.

- Deyərik ki, dəlidir.

[516] Ali Ünal, Mekke, Rasullerin yolu, s. 206.

- Xeyr, dəli də deyildir. Biz dəlilərin necə olduğunu bilirik. Məhəmməddə nə boğulma, nə öz-özünə əsəbiləşmə, nə titrəmə, nə qaş-göz oynatma, nə də anlaşılmaz şeylər danışmaq var.

- Deyərik ki, şairdir.

- Biz şeirin hər çeşidini, rəcəzini, həcəzini bilirik. Onun oxuduqları isə bunların heç birinə bənzəmir.

- Deyərik ki, sehrbazdır.

- Xeyr, sehrbaz da deyildir. Biz sehrbazları və etdikləri şeyləri gördük. Ancaq Məhəmmədin oxuduqları nə sehrbazların oxuyub üflədiklərindəndir, nə də düyünləyib bağladıqlarındandır.

- Onda onu necə adlandıraq?

- Onun oxuduğu sözdən daha üstün söz yoxdur, o bir nurdur. Elə dadlı ki, kökü çox məhsuldar torpaqlarda, bol sulu bağçalarda, ucalan budaqları ətrafa uzanan salxımlı bir xurma ağacı sanki.

Vəlid bir az düşündü. Sonra qərarını açıqladı. Üzünü müşriklərə tutub dedi:

- Nə deyəcəyinizi düşündüm. Qərara gəldim ki, o sehrbazdır. Bəli, o, bir sehrbazdır. Onun etdikləri və söylədikləri ata ilə oğlun, qardaşla qardaşın, arvad ilə ərin, insanla qövmünün arasını açır. O, bir sehrbazdır».[517]

Uca Allah (c.c.) müşriklərin bu hərəkətlərini belə qeydə alır və dəyərləndirir:

ذَرْنِي وَمَنْ خَلَقْتُ وَحِيداً. وَجَعَلْتُ لَهُ مَالاً مَّمْدُوداً. وَبَنِينَ شُهُوداً. وَمَهَّدتُّ لَهُ تَمْهِيداً. ثُمَّ يَطْمَعُ أَنْ أَزِيدَ. كَلَّا إِنَّهُ كَانَ لِآيَاتِنَا عَنِيداً. سَأُرْهِقُهُ صَعُوداً. إِنَّهُ فَكَّرَ وَقَدَّرَ. فَقُتِلَ كَيْفَ قَدَّرَ. ثُمَّ قُتِلَ كَيْفَ قَدَّرَ. ثُمَّ نَظَرَ.ثُمَّ عَبَسَ وَبَسَرَ. ثُمَّ أَدْبَرَ وَاسْتَكْبَرَ. فَقَالَ إِنْ هَذَا إِلَّا سِحْرٌ يُؤْثَرُ.

---

[517]Mekke – Rasullerin yolu, göstərilən qaynaq, s. 207-208.

إِنْ هَذَا إِلَّا قَوْلُ الْبَشَرِ. سَأُصْلِيهِ سَقَرَ. وَمَا أَدْرَاكَ مَا سَقَرُ. لَا تُبْقِي وَلَا تَذَرُ . لَوَّاحَةٌ لِّلْبَشَرِ. عَلَيْهَا تِسْعَةَ عَشَرَ

(Müddəssir, 74/11-30)

«Tək olaraq yaratdığım o hərifi mənim öhdəmə burax. Ona həm çox mal verdim, həm də göz önündə oğullar. Ona həm də nemətlərimi çox verdim. Sonra da nemətlərimi daha da artırmaq istərmi? Xeyr, çünki o, bizim ayələrimizə qarşı qənim kəsildi (inadkar oldu). Mən onu dimdik, sərt yoxuşa dırmaşdıracağam. Çünki o, bir düşündü, ölçdü-biçdi. Qəhr olsun, necə biçdi? Sonra baxdı. Sonra qaşını çatdı və sifətini turşutdu. Sonra arxasına döndü və qürurlandı: «Bu, başqası deyil, qədimdən bəri gələn sehirdir. İnsan sözündən başqa bir şey deyildir!». Onu cəhənnəmə atacağam. Cəhənnəmin nə olduğunu bilirsənmi? O nə yaşadır, nə də öldürür. O, insana susamış bir təşnədir. (İnsana son həqiqəti göstərən, ya da onun dərisini qovurandır). Üzərində on doqquz mələk var».

Müşriklərin hz.Məhəmmədə (s.a.s.) qarşı tətbiq etdiyi bezdirmə, sıxışdırma siyasətinin tərkib hissələrindən biri də onun gətirdiklərini gözdən salmaq idi. Onlar deyirdilər ki, hz.Məhəmmədin (s.a.s.) danışdıqları «köhnə əfsanələrdir». Qurani – Kərim onların bu tutumunu belə qeydə alır və onlara qarşı sərt cavab yönəldir:

وَمِنْهُم مَّن يَسْتَمِعُ إِلَيْكَ وَجَعَلْنَا عَلَى قُلُوبِهِمْ أَكِنَّةً أَن يَفْقَهُوهُ وَفِي آذَانِهِمْ وَقْراً وَإِن يَرَوْاْ كُلَّ آيَةٍ لاَّ يُؤْمِنُواْ بِهَا حَتَّى إِذَا جَآؤُوكَ يُجَادِلُونَكَ يَقُولُ الَّذِينَ كَفَرُواْ إِنْ هَذَا إِلاَّ أَسَاطِيرُ الأَوَّلِينَ .وَهُمْ يَنْهَوْنَ عَنْهُ وَيَنْأَوْنَ عَنْهُ وَإِن يُهْلِكُونَ إِلاَّ أَنفُسَهُمْ وَمَا يَشْعُرُونَ . وَلَوْ تَرَىَ إِذْ وُقِفُواْ عَلَى النَّارِ فَقَالُواْ يَا لَيْتَنَا نُرَدُّ وَلاَ نُكَذِّبَ بِآيَاتِ رَبِّنَا وَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ

(Ənam, 6/25-27)

«İçlərindən bir çoxu da səni Quran oxuyarkən dinləyərlər. Ancaq biz onların qəlblərinə onu zövqlə anlamalarına mane olan örtüklər sərmişik, qulaqlarında da bir ağırlıq var! Hər möcüzəni görsələr də, iman etməzlər. Hətta, sənin yanına gələndə səninlə mübahisəyə girişərək, o haqtanımaz kafirlər: «Bu köhnələrin məsəllərindən başqa bir şey deyildir», deyərlər. O biriləri isə həm ona yaxınlaşmağı qadağan edirlər, həm də özləri ondan uzaqlaşırlar. Beləcə, sadəcə özlərini məhv edirlər, ancaq fərqinə varmazlar. Atəşin yanında duranda isə: «Ah! Nə olardı geri qaytarılsaq və Rəbbimizin ayələrini inkar etməyib möminlərdən olsa idik!», - dediklərini bir görəsən».

Müşriklərin hz.Məhəmmədə (s.a.s.) qarşı seçdikləri mübarizə vasitələrindən biri də Quranın oxunmasına, onun dinlənilməsinə mane olmaq idi. Hz.Məhəmməd (s.a.s.) namaz qılarkən, Quran oxuyarkən bağırıb-çığıraraq onu susdurmağa çalışırdılar. Onlar evinin qarşısında Quran oxuyan Əbu Bəkiri bundan çəkindirməyə çalışdılar. Quran oxuyarkən qulaqlarını tıxadılar, başqalarının dinləməsinə mane olmaq üçün planlar qurdular. Onların bu düşmən davranışlarına da Quran münasibətini açıqladı:

أَلَمْ يَأْتِكُمْ نَبَأُ الَّذِينَ مِن قَبْلِكُمْ قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ وَالَّذِينَ مِن بَعْدِهِمْ لاَ يَعْلَمُهُمْ إِلاَّ اللّهُ جَاءتْهُمْ رُسُلُهُم بِالْبَيِّنَاتِ فَرَدُّواْ أَيْدِيَهُمْ فِي أَفْوَاهِهِمْ وَقَالُواْ إِنَّا كَفَرْنَا بِمَا أُرْسِلْتُم بِهِ وَإِنَّا لَفِي شَكٍّ مِّمَّا تَدْعُونَنَا إِلَيْهِ مُرِيبٍ .قَالَتْ رُسُلُهُمْ أَفِي اللّهِ شَكٌّ فَاطِرِ السَّمَاوَاتِ وَالأَرْضِ يَدْعُوكُمْ لِيَغْفِرَ لَكُم مِّن ذُنُوبِكُمْ وَيُؤَخِّرَكُمْ إِلَى أَجَلٍ مُّسَمًّى قَالُواْ إِنْ أَنتُمْ إِلاَّ بَشَرٌ مِّثْلُنَا تُرِيدُونَ أَن تَصُدُّونَا عَمَّا كَانَ يَعْبُدُ آبَآؤُنَا فَأْتُونَا بِسُلْطَانٍ مُّبِينٍ

(İbrahim, 14/9-10)

«Sizdən öncəkilərin-Nuh, Ad, Səmud qövmlərinin və onlardan sonra gələnlərin xəbərləri sizə çatmadımı? Onları

Allahdan başqası bilməz. Peyğəmbərləri onlara möcüzələrlə gəldilər. Onlar isə əllərini rəsulların ağzına tutdular və: «Biz, sizin göndərildiyiniz şeyi tanımırıq və bizi çağırdığınız şeydən də əndişə və şübhə içindəyik», dedilər. Peyğəmbərləri dedi ki: «Heç göyləri və yeri yaradan Allah haqqında şübhə etmək olarmı? O, sizi günahlarınızı bağışlamaq üçün çağırır və bəlli bir zamana qədər sizə icazə verir». Onlar: «Siz, bizim kimi bir insansınız, bizi atalarımızın tapındıqlarından ayırmaq istəyirsiniz. O halda bizə açıq bir dəlil gətirin», dedilər».

Onlar hz.Peyğəmbər (s.a.s.) Quran oxuyanda səs salır, əl çalır, qışqırır, danışır, başqa məzmunlu hekayələr söyləyir, Quranla bağlı insanların düşüncəsinə şübhə toxumu səpirdilər. Onların bu çılğınlıqlarını Quran belə dəyərləndirir:

وَقَالُوا لَوْلَا نُزِّلَ هَذَا الْقُرْآنُ عَلَى رَجُلٍ مِّنَ الْقَرْيَتَيْنِ عَظِيمٍ .أَهُمْ يَقْسِمُونَ رَحْمَةَ رَبِّكَ نَحْنُ قَسَمْنَا بَيْنَهُم مَّعِيشَتَهُمْ فِي الْحَيَاةِ الدُّنْيَا وَرَفَعْنَا بَعْضَهُمْ فَوْقَ بَعْضٍ دَرَجَاتٍ لِيَتَّخِذَ بَعْضُهُم بَعْضاً سُخْرِيّاً وَرَحْمَتُ رَبِّكَ خَيْرٌ مِّمَّا يَجْمَعُونَ

(Zuhruf, 43/31-32)

«Nə olardı, bu Quran iki məmləkətdən (Məkkə ilə Taif) bir böyük adama endirilsəydi», dedilər. Rəbbinin rəhmətini onlarmı paylaşdırır? Onların bu dünya həyatında yaşayışlarını Biz təmin etdik və bir qismini başqasından üstün dərəcələrə çıxardıq ki, biri o birisini idarə etsin. Rəbbinin rəhməti isə onların topladıqlarından (mallarından) daha xeyirlidir».

Din düşmənləri hz.Məhəmmədə (s.a.s.) qarşı mübarizədə yalan, iftira, təhrif, boş danışıqlardan da istifadə edirdilər. Onu dolaşdırmaq üçün müxtəlif suallar hazırlayırdılar. Bir dəfə Abdullah bin Zibara müşriklərə belə məsləhət verdi: «Siz Məhəmməddən soruşun, Allahdan başqa özünə ibadət edilən

hər məbud cəhənnəmlikdirmi? Elə isə biz mələklərə ibadət edirik, yəhudilər Üzeyrə, xristianlar isə İsaya ibadət edərlər. Onda mələklər, Üzeyr, İsa da cəhənnəmlikdirmi?».

Onlar hz.Məhəmmədi (s.a.s.) çaşdıracaqlarını ümid edərək bu sualları ona yönəltdilər. Ancaq aldıqları cavab onları pərişan etdi:

- Allahdan başqa kim özünə ibadət edilməsini istəyərsə, ibadət edənlərlə birlikdə cəhənnəmlikdir».[518]

Hz.Məhəmmədi (s.a.s.) təcrid etmək, onu və tərəfdarlarını hicrətə məcbur etmək məqsədilə müşriklər ideoloji mübarizə ilə birgə siyasi, iqtisadi, sosial yönlü qərarlar da qəbul etdilər. Bu bir embarqo siyasəti idi. Onların qadağan siyasətinin istiqamətləri bunlar idi:

- Haşim və Mütəllib oğullarından qız almayacaqlar, onlara qız verməyəcəklər.

- Onlara mal satılmayacaq, onlardan mal alınmayacaq.

Buradan aydın görünür ki, müşriklər hz.Məhəmmədi (s.a.s.) ona bağlı qəbilələrlə belə hiyləgər, birbaşa insanların mənafelərinə, qüruruna toxunan tədbirlərlə üz-üzə qoymaq istəyirdilər, yaxın adamlarını ona qarşı çevirməyə çalışırdılar.

İslamın Məkkə dövründə hz.Məhəmməd (s.a.s.) inanılmaz çətinliklərlə üz-üzə qaldı, ilk müsəlman olan hz. Xədicəni (r.a.), onu daim qoruyan əmisi Əbu Talibi itirdi. Artıq Məkkədə qalmaq, tövhid inancını yaymaq mümkünsüz bir işə çevrilmişdi.

## «MÜHACİR» ANLAYIŞI

**Biz hz.Nizaminin «qürbət» deyə bədii bir biçimdə ifadə etdiyi «hicrət» anlayışının dini, sosial, siyasi yükünü də şərh edək.**

---

518 Mekke – Rasullerin yolu, göstərilən qaynaq, s. 212.

**Hz.Peyğəmbərin (s.a.s.) anlayışına görə, «Mühacir günahdan, üsyandan, pisliklərdən qaçandır».**[519]

İslam tarixində mühacirət iki şeyə görə baş verir: Allahın (c.c.) birliyi inancını tamamlamaq üçün, təbliği tamamlamaq imkanı olmadıqda imanı itirməmək üçün. Məkkədə yaşamaq, can və mal təhlükəsizliyi olmayanda müsəlmanlar hz.Məhəmmədin (s.a.s.) təlimatı ilə bu şəhəri tərk etdi. «Hicret, Hirada gelen ilk vahiyle başlayan Mekke devrini Sevrdeki tarihi yolçulukla sona erdiren bir olaydır. Mekke devrinin son imtihanı, ilk müslüman neslinin nefislerini arındırmadakı son sahfadır. Hicretle birlikte, Miladi 622-deki Sevr yolçuluğu ile başlayıb 632 yılında hz.Muhammedin (s.a.s.) vefatıyla sona eren Medine Devrine girilmektedir. Hicret, ferdi plandakı Mekke devri müslümanlığının Medine devrinde toplumsallaşmasını ve devlet olmasını sağlayan bir hadisedir. Hicretle birlikte yeni bir güce kavuşan İslam kısa zamanda Medine ve çevresinde yayılıp genişledi».[520]

Hz.Aişe (r.a.) rəvayət edir: «Hz.Məhəmməd (s.a.s.) belə buyurdu: «Məkkə fəthindən sonra artıq hicrət yoxdur. Ancaq cihad və niyyət vardır. Allah yolunda savaşa çağrıldığınız zaman o an qalxın».[521]

Hz.Məhəmməd (s.a.s.) başqa bir hədisində belə buyurur: «Tövbə etmək zamanı sona çatmadan hicrət zamanı da sona çatmaz. Tövbə isə günəş batdığı yerdən doğuncaya qədər davam edər».[522]

---

[519] Mekke – Rasullerin yolu, göstərilən qaynaq, s.165.
[520] İslam tarihi, göstərilən qaynaq, s. 249.
[521] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 131-132.
[522] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 103.

İslam anlayışına görə, insan yaşadığı yerdən ayrılaraq başqa yerlərə elm öyrənməyə gedərsə, o da hicrət etmiş insan kimi savab qazanar.

Bütün işlərdə olduğu kimi, hicrətdə də önəmli olan niyyətdir. Hz.Ömər ibni Xəttab (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Görülən iş niyyətlərə görə dəyər qazanır. Hər kəs gördüyü işin qarşılığını niyyətinə görə alır. Kimin niyyəti Allaha və Rəsuluna varmaq, onlara hicrət etməksə, əlinə keçəcək savab da Allaha və Rəsuluna hicrət savabıdır. Kim də əldə edəcəyi bir dünyalığa, ya da evlənəcəyi bir qadına qovuşmaq üçün yola çıxmışsa, onun hicrəti də hicrət etdiyi şeyə görə dəyər qazanır».[523]

Hicrətin savabını hz.Məhəmməd (s.a.s.) başqa bir hədisində belə anladır. İbni Şüməsə rəvayət edir. «Amr ibni As ölüm döşəyində ikən yanına getdik. Üzünü divara çevirdi, uzun-uzun ağladı. Bunu görən oğlu:

- Ata! Rəsulullah (s.a.s.) sənə bu müjdəni vermədimi? Rəsulullah (s.a.s.) səni belə müjdələmədimi?, - deməyə başladı.

O zaman Amr ibni As üzünü bizə çevirərək dedi:

- Axirət üçün hazırladığımız ən dəyərli azuqə «La ilahə illallah Məhəmmədən Rəsulullah» sözüdür. Həyatımda üç dövr var. Bir zamanlar Rəsulullaha məndən çox kin bəsləyən yox idi. Bir yolunu tapıb onu öldürmək mənim ən çox arzu etdiyim şeydi. Əgər belə ölsəydim, mütləq cəhənnəmlik olardım. Uca Allah könlümə islam sevgisini qoyunca Peyğəmbərin (s.a.s.) yanına gedərək:

- Əlini uzat, sənə biət edəcəyəm, dedim.

O, əlini uzatdı, mən əlimi geri çəkdim.

Rəsuli-Əkrəm:

---

[523]Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 91.

- Nə oldu, Amr?, - dedi.

- Şərt qoymaq istəyirəm.

- Nəyi şərt qoyacaqsan?

- Bağışlanmağımı.

- Müsəlman olmağın daha öncəki günahları silib süpürdüyünü, hicrət etməyin daha öncə işlənən günahları yox etdiyini, həccə getməyin daha öncə edilən günahları ortadan qaldırdığını bilmirsənmi?»[524]

Hicrət hadisəsi ilə müsəlmanlar islamı qorudular. Hicrətdən on yeddi il sonra bu tarix müsəlman təqviminin başlanğıcı oldu. Hicrətlə Mədinə böyük islam inqilabının mərkəzinə çevrildi.

Biz islam tarixində hicrət hadisəsinin ayrı-ayrı mərhələlərini görürük. İlk olaraq müsəlmanlar Həbəşistana mühacirət edirlər. Bu mühacirət hz.Məhəmmədin (s.a.s.) icazəsi ilə baş verdi. Daha sonra hz.Məhəmmədin (s.a.s.) Taifə hicrəti baş verir. Bundan sonra isə əshabələrin və hz.Məhəmmədin Mədinəyə hicrəti gerçəkləşir. Əslində, hicrət Allahın (c.c.) birliyi inancını yaymaq yolunda əzab və işgəncələrin ən ağırıdır. Gerçəkdən insanın yurdunu, ev-eşiyini, malını tərk edib, tanımadığı, yaşamağa yeri olmadığı başqa bir yerə getməsi ağır işgəncədir. Ona görə də «Hicret hakikatta işkence ve eziyetten dolayı kaçmak deyil, aksine zafer ve kurtuluşa erişinceye kadar çileyi degiştirmektir».[525]

O dönəmdə Məkkə müsəlmanlığın yerləşmədiyi bir şəhər olduğundan oradan müsəlman olmayan bir yerə hicrət etmək doğru bir hərəkətdir. Dini yaymaq, inancını qorumaq üçün hansı yer daha uyğun idisə, ora getmək zəruri idi. «Dari-İslamda hicretin hükmü ise farz, caiz ve haramlık

---

[524] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 164-165.

[525] M. Said Ramazan əl-Buti, Fikhus's-siyre, İstanbul, 2003, s. 141.

arasında deyişiklik arz eder. Bir müslümanın yaşadığı yerde namaz, oruc, ezan, hacc gibi İslamın şiarlarını yerine getirmek imkanı olmadığı zaman oradan hicret etmesi farz olur. Bir müslümanın yaşadığı ülkede kendisini sıkıntıya sokan bir bela başına gelirse, o vakit bir başka İslam ülkesine hicret etmesi caiz olur. Yine bir müslümanın ülkesini terk etmesi İslamı farzlardan birinin ihmalini gerektiriyor ve o farzı yerine getirecek bir başkası da bulunmuyorsa, o zaman hicret haram olur».[526]

Hz.Məhəmmədin (s.a.s.) təlimatına uyğun olaraq müsəlmanlar ilk olaraq Həbəşistana hicrət etdilər. Peyğəmbərin (s.a.s.) möminlərə tövsiyəsi belə oldu: «Əgər istəyirsinizsə, Həbəşistana sığının! Orada ölkəsində kimsəyə zülm etməyən bir hökmdar iş başındadır. Ora bir doğruluq və həqiqət ölkəsidir. Allah işlərdə bir asanlıq yaradana qədər orada oturub qalın».[527]

Həbəşistana gedənlər arasında Osman b. Affan və xanımı Ruqiyyə (hz. Məhəmmədin (s.a.s.) qızı), Əbu Huzeyfə və xanımı, Zübeyr b. Avvam, Musab b. Umeyr və Abdurrahman b. Avf kimi səhabələr var idi. Həbəşistana gedən mühacirlərin sayı 80-dan çox idi.[528]

Hz.Məhəmməd (s.a.s.) Həbəş kralı Nəcaşiyə bir məktub yazaraq müsəlmanları yaxşı qarşılamasını xahiş etdi:

«Rəsulullah Məhəmməddən həbəşlilərin kralı Necaşiyə: Özündən başqa Tanrı olmayan, gerçək hökmdar (Məlik), Müqəddəs (Kuddus), Salam, Qoruyucu, Qurtarıcı olan Allahın öygüsünü sənə çatdırıram. Təsdiq edib şəhadət edirəm ki, Məryəm oğlu İsa Allahın Ruhu və Kəlməsidir. Bu kəlimə, toxunulmamış Məryəmə verilmişdir. Beləliklə, o

[526] M. Said Ramazan əl-Buti, Fikhus's-siyre, göstərilən qaynaq, s. 141. s. 141.
[527] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, c. I, s. 109.
[528] M. Said Ramazan əl-Buti, Fikhus's-siyre, göstərilən qaynaq, s. 141.

İsaya hamilə olmuş və Allah da onu öz ruh və nəfəsindən olmaq üzərə Adəmi əli və nəfəsi ilə necə yaratdı isə onu da eləcə yaratmışdır.

Səni tək olan Allaha çağırıram ki, onun heç bir şəriki yoxdur. Ona itaətlə bağlı qarşılıqlı yardıma çağırıram. Məni təqib et, mənə uy, mənə gələn şeyə iman et! Çünki mən Allahın elçisiyəm. Bu duruma görə səni və ətrafındakı əsgərlərini Qadir və Əzim olan Allaha dəvət edirəm. Nəsihət və sözlərimi qəbul etməyinizi tövsiyyə edirəm.

Əmi tərəfindən yeyənim olan Cəfəri yanında az sayda bir müsəlman kimsəylə birlikdə sənə doğru bu an yola çıxarıram. O sənə çatar-çatmaz daşıdığın qürur və əzəməti bir kənara qoyub onlara müsafirpərəstlik göstər!

Salam gerçək hidayət yolunu təqib edən kimsənin üzərinə olsun!»[529]

## «HİCRƏT» VƏ ONUN NƏTİCƏLƏRİ

Müsəlmanların ilk hicrəti ilə bağlı alimlər bir sıra nəticələr çıxarmışlar. Məsələn, görkəmli islam alimi Səid Ramazan Butiyə görə, din hər cür mal, mülk və hürriyyət haqqını və şərəfini qorumaq üçün bir qaladır. Buna görə islam dəvətçiləri dini qorumaq üçün bütün imkanlarını səfər etməlidir. İnancı qorumaq və qəlblərə yerləşdirmək üçün yeri-yurdu, malı və canı vasitəyə çevirməlidir. İnanc uğrunda bunları fəda etmək zəruri olanda onları fəda etməlidir. Çünki din, iman yox olsa, malın, mülkün, yerin, yurdun bir faydası yoxdur. Ancaq insan, millət dinini, inancını qorusa, itirdiklərini qazanmaq asan olur. **Alim, hz.Məhəmmədin (s.a.s.) təlimatı üzrə gerçəkləşən Həbəşistan hicrətini və bütövlükdə hicrətin anlamını şərh edərək yazır: «Ancaq dinin durumu güclü, dayaqları toplumda dimdik, inanc**

[529] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 297.

**prinsipləri də qəlblərə yaxşıca kök salmış isə, onun yolunda getmiş olan malın, yerin və yurdun hamısı geri dönər. Hətta, bəsirət, şərəf və qüvvət surları bunları qoruduğu üçün əskisindən daha güclü olaraq geri dönər. Tarixin axışına görə, Allahın qanunu dünyada belə cərəyan etmişdir: «Mənəviyyatı güclü olanlar qazanclarını və maddi güclərini daha yaxşı qorumuşlardır. Bir millət əxlaqi baxımdan zəngin, inanc yönündən dürüst, sosial prinsiplər baxımından sağlam isə, o millətin bir-birinə olan bağı daha sağlam, qalıcılığı daha köklü, hər yönü daha güclü olur. Bir millət də əxlaqı baxımdan yoxsul, inanc yönündən zəif, sosial düzən və prinsiplər baxımından əyri və yanlışsa, o millətin maddi səltənəti çöküntüyə, maddi qazancları da zavala doğru gedir».**[530]

Bu anlamda Hicrətin mənası, İslama dəvətin əsası onun uğrunda malı, vətəni, həyatı fəda etməkdir. «Müsəlmanlar ancaq bununla malı, vətəni və həyatı özlərinə təmin (qarantiya) edə bilərlər! İslamdakı hicrət prinsipi bunun üçün halal olmuşdur».[531]

**Müsəlmanların Həbəşistan hicrəti hz.Məhəmmədin (s.a.s.) dini ilə hz.İsanın (s.a.s.) dini arasındakı bağlılığı da açıqca ortaya qoydu. Həbəş kralı müsəlmanları geri istəyən müşriklərə inancına görə yox dedi.**

**Hicrət hadisəsi ilə uca Allah (c.c.) müsəlmanları səbrə, mübarizəyə öyrətdi. Bu yolda hz.Məhəmmədin (s.a.s.) çəkdikləri o zaman və indi müsəlmanlar üçün bir örnəyə çevrildi.**

**Hicrət, «Allah sevdiklərinə çətinlik verir», düşüncəsinin doğruluğunu təsdiq etdi.**

Hicrət hadisəsi uca Allahın (c.c.) öz sevgili elçisini hər an necə qoruduğunun açıq bir dəlilidir:

---

[530] M. Said Ramazan əl-Buti, Fikhus's-siyre, göstərilən qaynaq, s. 140.
[531] M. Said Ramazan əl-Buti, Fikhus's-siyre, göstərilən qaynaq, s. 140.

قَدْ نَعْلَمُ إِنَّهُ لَيَحْزُنُكَ الَّذِي يَقُولُونَ فَإِنَّهُمْ لاَ يُكَذِّبُونَكَ وَلَكِنَّ الظَّالِمِينَ بِآيَاتِ اللّهِ يَجْحَدُونَ .وَلَقَدْ كُذِّبَتْ رُسُلٌ مِّن قَبْلِكَ فَصَبَرُواْ عَلَى مَا كُذِّبُواْ وَأُوذُواْ حَتَّى أَتَاهُمْ نَصْرُنَا وَلاَ مُبَدِّلَ لِكَلِمَاتِ اللّهِ وَلَقدْ جَاءكَ مِن نَّبَإِ الْمُرْسَلِينَ .وَإِن كَانَ كَبُرَ عَلَيْكَ إِعْرَاضُهُمْ فَإِنِ اسْتَطَعْتَ أَن تَبْتَغِيَ نَفَقاً فِي الأَرْضِ أَوْ سُلَّماً فِي السَّمَاء فَتَأْتِيَهُم بِآيَةٍ وَلَوْ شَاء اللّهُ لَجَمَعَهُمْ عَلَى الْهُدَى فَلاَ تَكُونَنَّ مِنَ الْجَاهِلِينَ

(Ənam, 6/33-35)

«Həbibim, bu həqiqəti çox yaxşı bilirik ki, onların söylədikləri səni incidir. Onlar, əslində, səni yalanlamırlar, o zalımlar Allahın ayələrini inkar edirlər. And olsun ki, səndən öncə göndərilən peyğəmbərləri də yalanladılar. Onlara yardımımız gələnə qədər yalanlamaya və əziyyətlərə səbir etdilər. Allahın sözlərini (qanunlarını) dəyişdirəcək heç bir güc yoxdur. Şübhəsiz, sənə peyğəmbərlərin qissələrindən xəbər də gəldi. Onların üz çevirməsi sənə ağır gəlirsə, əgər gücün çatırsa, özünə yerin dibinə enəcək bir baca (tunel), ya da göylərə çıxacaq bir nərdivan arayıb da onlara bambaşqa bir ayə gətirməyə gücün yetdiyi təqdirdə heç durma! Allah istəsəydi, onları doğru yola yönəldərdi. O halda əsla cahillərdən olma».

Hicrət hz.Məhəmmədin (s.a.s.) çətinliklərini, bu çətinliklər qarşısında dözümünü, mətanətli duruşunu anlatmaq baxımından da misilsiz bir örnəkdir. Hz.Məhəmməd (s.a.s.) Taifə hicrət etdi, onları İslama çağırdı, ancaq sərt münasibət gördü, cahillər onu daşa basdı, o, qan içində geri döndü. Ancaq bu vəhşiliyin qarşısında hz.Məhəmməd (s.a.s.) əllərini Allaha açaraq belə dua etdi: «Allahım! Gücsüz və çarəsiz qaldığımı, xalqın gözü önündə təhqir olunduğumu ancaq sənə ərz və şikayət edirəm. Ey mərhəmətlilərin ən mərhəmətlisi! Hər kəsin təhqir edib, belinə mindiyi biçarələrin Rəbbi sənsən. Mənim də Rəbbim

sənsən. Sən məni pis xasiyyətli, həyasız bir düşmən əlinə verməyəcək qədər… mənə mərhəmətlisən.

Allahım! Sənin qəzəbinə tuş gəlməyim. Çəkdiklərim nə olursa olsun, qatlanaram! Ancaq sənin əfv və mərhəmətin mənə bunları göstərməyəcək qədər genişdir. Allahım! Sənin qəzəbinə uğramaqdan, ilahi rizana uzaq qalmaqdan sənə, sənin o qaranlıqları aydınladan, dünya və axirət işlərini yoluna qoyan ilahi nuruna sığınıram. Allahım! Sən razı olun-cayadək əfvini istəyirəm. Allahım! Hər qüvvət və hər qüdrət ancaq səninlə qaimdir».[532]

Hz.Məhəmməd (s.a.s.) onu al qana boyayan müşrikləri də lənətləmir. «Mən Allahın bu müşriklərin nəslindən yalnız Allaha ibadət edən və Ona heç bir şeyi ortaq qoşmayan bir nəsil meydana çıxarmasını təmənni edirəm», deyə Allaha dua edir.

Hz.Məhəmməd (s.a.s.) Taifə hicrətdə müsəlmanlara, ağlı olan hər kəsə bir səbir dərsi verir və bununla da səbrlə bağlı ilahi əmri layiqincə yerinə yetirmiş olur:

«Ey iman edənlər! Səbr edin, düşmənlərinizdən daha səbrli olun, cihada hazır olun…»

**Hicrət dini, imanı insanların qəlbinə yerləşdirdi, islamın yayılmasının yeni bir mərhələsi başlandı. Hicrət islam və insanlıq tarixinə böyük bir təcrübə verdi. Hz.Məhəmmədin (s.a.s.) səhabələri ciddi bir imtahandan keçdilər.**

**Göründüyü kimi, hicrət İslam tarixində siyasi, ideoloji, mənəvi, əxlaqi, psixoloji, sosial yönü olan bir hadisədir. Elə bu dərinliyinə görə də ciddi bir qavrama, anlayışa çevrilmişdir. Hz.Nizami də «hicrət» qavramını**

---

[532] M. Said Ramazan əl-Buti, Fikhus's-siyre, göstərilən qaynaq, s. 152.

**bədii biçimdə «qürbət» adlandıraraq bir «sirri» kodlaşdırmışdır. Şair beytində bu «hicrət» qavramına aydınlıq gətirən başqa bir deyim də işlətmişdir:**

***Onun qürbətə düşməsi Məkkənin bac verməsinə səbəb olurdu.***

## KİMLƏR HƏZRƏT MƏHƏMMƏDƏ (s.a.s.) BAC VERDİ?

Misrada deyilən «bac vermək» anlayışının qaynağı varmı? Hz.Nizami bununla nəyi nəzərdə tutmuşdur?

Burada hz.Nizami hicrətin daha çox siyasi yönünü önə çəkmişdir. Hicrət elə bir hadisəyə çevrildi ki, hz.Məhəmmədi (s.a.s.) və onun səhabələrini hicrətə məcbur edənlərin də həyatını dəyişdirdi.

**Hz.Nizaminin işarə etdiyi məsələ hz.Məhəmmədin (s.a.s.) Mədinəyə hicrət etdikdən sonra qureyşlilərlə olan münasibətləri çərçivəsində anlaşıla bilər.** Hz.Məhəmməd (s.a.s.) Mədinəyə hicrət etdikdən sonra Məkkənin iki başçısı – Əbu Sufyan və Ubey ibn Xələf mədinəli müsəlmanlara bir məktub yazdılar:

«… Əsl məsələyə gəlincə ərəb qəbilələri arasında çıxa biləcək heç bir hərb bizimlə sizin aranızda ortaya çıxacaq bir hərbdən daha iztirabverici ola bilməz. Gerçəkdə, siz bizim aramızdan çıxan çox əsil və eyni zamanda çox ulu bir kimsəyə yardım etməyə təşəbbüs etmiş olursunuz. Ona təhlükəsizlik haqqı tanıdınız və onu himayəniz altına aldınız. Bu, gerçəkdən sizin üçün utanılacaq bir şey və bir ləkədir. Bizimlə onun arasına girməyin. Əgər o doğru yoldadırsa, doğru davranırsa, bundan çıxarılacaq səadət payı bizə aiddir.

Yox, əgər pisdirsə, onu ələ keçirməkdə biz hər kəsdən daha çox haqq sahibiyik».[533]

Ancaq Məkkə müşrikləri Mədinədən rədd cavabı aldılar. Bununla belə onlar hz. Məhəmmədi (s.a.s.) tələb etməkdə davam etdilər. Mədinəli Abdullah ibn Ubeyy və onun bütpərəst dostlarına bir ultimatum göndərdilər:

«Qaçmış olan adamımıza bir aman və sığınma haqqı tanımışsınız. Allaha and içirik ki, əgər ona qarşı bir mübarizəyə başlamasanız, ya da onu ölkənizdən çıxarıb atmasanız, döyüşçülərinizi öldürmək və qadınlarınızı da almaqla hamımız qalxıb üzərinizə yürüş edəcəyik».[534]

Daha sonra məkkəli müşriklər mədinəli yəhudilərlə iş birliyi qurdular. Məkkəlilərlə mədinəlilər arasında gedən mübarizənin araşdırılması onu göstərir ki, məkkəli müşriklər Mədinəyə qarşı iqtisadi qadağalar da tətbiq etmişlər. Məsələn, Əbu Nailə adlı bir şəxs Mədinədəki müsəlmanların durumunu belə anladır:

«Bu adamın (Məhəmməd (s.a.s.) bizim aramıza gəlməsi bizim üçün böyük bir fəlakət oldu. Bütün Ərəbistan düşmənimiz oldu, hər kəs bizə qarşı çıxmağa başladı, yollarımız kəsildi, ailələrimiz aclıqdan ölür, yeyəcək bir şeyimiz qalmadı və özümüzü bəsləmək üçün böyük çətinliklər çəkdik».[535]

O dönəmdə məkkəlilər millətlərarası ticarətə nəzarət edirdilər. Bu təzyiqlərin sonunda hz.Məhəmməd (s.a.s.) bir sıra qərarlar qəbul etdi:

---

[533] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 217.
[534] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 218.
[535] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 218.

«Bundan sonra Qureyşə aid ticarət karvanlarının islami nüfuz bölgəsindən artıq keçməmələrini bildirmək məqsədilə ilk müsəlman əsgəri birliyini məkkəlilərə göndərdi».[536]

**Bizcə, hz.Nizaminin «Məkkənin bac verməsi» fikrinin qaynaqlarından biri hz.Məhəmmədin (s.a.s.) bu addımıdır.**

Hz.Məhəmmədin (s.a.s.) əmisi hz. Həmzənin (r.a.) başçılığı ilə otuzadək əsgər «Mədinənin qərbində Qızıl Dəniz sahillərinə yaxın bir yerə qədər getdilər. Burada Cuheynə qəbiləsinin bölgəsinə daxil olan bir yerdə düşərgə qurmuş Əbu Cəhlin komandalığı altında üç yüz dəvədən ibarət olan bir karvanla qarşılaşdılar».[537]

Ancaq aralarında bir döyüş olmadı. «Bu və bundan sonra gələn bütün əsgəri səfərlərdə müsəlmanlar sadəcə və sadəcə məkkəlilərə aid karvanlara hücum etdilər».[538]

Başqa heç bir qəbilənin karvanı mədinəlilərin hücumuna məruz qalmadı. Bu isə onu göstərir ki, mədinəlilər özlərini qorumaq, məkkəliləri iddialarından əl çəkməyə məcbur etmək məqsədi ilə bu addımları atmışlar. Yəni bu iki toplum arasında karvanı soymaq hadisəsi deyil, hərbi qarşıdurma var idi.

Bu arada hz.Məhəmməd (s.a.s.) məkkəlilərin karvan yollarının üstündə yerləşən qəbilələrlə anlaşmağı qərara aldı. Çünki, onlar karvan yollarının üstündə yerləşmələrindən yararlanaraq yaşayışlarını təmin edirdilər. Peyğəmbər (s.a.s.) öncə onlarla anlaşma imzaladı. Bu anlaşmalardan birinin mətni belədir: «Rəsulullah Məhəmmədin Bəni Damra ilə (bağladığı) yazı budur: Onlar canları və malları baxımından təhlükəsizlik içində olacaqlar. Onlara bir hücum şəklində

[536] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 219.
[537] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 219.
[538] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 219.

yönələcək bir təcavüzə qarşı yardım ediləcək. Onlar da buna qarşılıq Rəsulullaha (s.a.s.) yardım əlini uzadacaqlarını vəd edirlər. Bu sözləşmə dənizin bir tükü əridib yox edəcəyi zamana qədər qüvvədə qalacaqdır. Müsəlmanların Allahın dini üçün çıxacaqları savaş durumu bundan müstəsnadır. Ayrıca, Rəsulullah onları yardıma çağırır- çağırmaz onlar buna müsbət bir cavab verməyə məcburdular. Bu anlaşma üçün onlar Allahın və Rəsulunun təminatına sahibdirlər…».[539]

Bu görülən tədbirlər nəticəsində məkkəlilərin karvan yollarından öncəki kimi rahat istifadə etmələri çətinləşdi. İqtisadi mənafeylərinin təhlükə altında olduğunu görən məkkəlilər savaşa qərar verdilər.

**Hz. Nizaminin misrasında yer tutan «Məkkənin bac verməsi» anlayışının ikinci qaynağı da onların karvan yollarından istifadəsinin məhdudlaşdırılmasıdır.**

Sonrakı mərhələlərdə Məkkə ilə Mədinə arasında Bədr savaşı oldu. Qurani-Kərim bu savaşda uca Allahın (c.c.) müsəlmanları necə müdafiə etdiyi açıqca bəyan edilir:

إِذْ تَقُولُ لِلْمُؤْمِنِينَ أَلَن يَكْفِيكُمْ أَن يُمِدَّكُمْ رَبُّكُم بِثَلاَثَةِ آلاَفٍ مِّنَ الْمَلآئِكَةِ مُنزَلِينَ . بَلَى إِن تَصْبِرُواْ وَتَتَّقُواْ وَيَأْتُوكُم مِّن فَوْرِهِمْ هَـذَا يُمْدِدْكُمْ رَبُّكُم بِخَمْسَةِ آلاَفٍ مِّنَ الْمَلآئِكَةِ مُسَوِّمِينَ .وَمَا جَعَلَهُ اللّهُ إِلاَّ بُشْرَى لَكُمْ وَلِتَطْمَئِنَّ قُلُوبُكُم بِهِ وَمَا النَّصْرُ إِلاَّ مِنْ عِندِ اللّهِ الْعَزِيزِ الْحَكِيمِ

(Ali-İmran, 3/124-126)

«Sən o sırada möminlərə belə deyirdin: Yardım olmaqla Rəbbimiz üç min mələk endirsə, yetməzmi? Əlbəttə, siz səbir edər və Allaha qarşı müttəqi davranarsınız və onlar da sizə ani bir hücumla təcavüz edərlərsə, Rəbbiniz sizi

[539] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 222.

dəstəkləmək üçün özəl işarətlər daşıyan beş min mələk göndərəcəkdir. Allah bunu sizə sadəcə sevimli, bu müjdəli xəbəri vermək üçün, qəlbləriniz bununla sakitlik tapsın deyə etdi. Zəfər əziz, hakim olan Allahdandır».

Daha sonra Məkkə ilə Mədinə arasında Uhud savaşı, Xəndək savaşı oldu. Sonda əvvəllər mədinəliləri tanımayan, onlara ultimatum göndərən Məkkə müşrikləri onlarla müqavilə imzalamağa məcbur oldu. Müqavilənin mətni belədir:

1. Müsəlmanlar Məkkəyə ziyarətə getmədən dərhal Mədinəyə geri dönəcəklər, ancaq onlara ertəsi il üçün üç günlük bir Həcc ziyarəti vəd ediləcəkdir.
2. Məkkəyə getmiş heç bir mədinəli müsəlman geri qaytarılmayacaq, ancaq Məhəmməd bundan belə ona sığınan bütün məkkəliləri, bu kimsə Məkkədəki yetkilərin (kölə isə ağası, deyilsə ailə rəisi) istəyi üzərinə geri qaytarmaq məcburiyyətində olacaqdır.
3. Bu sülh anlaşmasına daxil olan müttəfiqləri də daxil, hər iki ölkə arasında bu sülh anlaşması on il müddətlə qüvvədə qalacaqdır. **Bu sülh anlaşması hər iki tərəfin hökmü altındakı bölgələrin, başqa tərəfdən gələcək (karvanlara) tam bir keçid təhlükəsizliyi içində açıq tutulmasını təmin edəcəkdir. Eyni sülh anlaşması ilə üçüncü şəxslərlə olacaq savaşlarda hər iki tərəf də bitərəf qalacaqdır».[540]**

   **Bu anlaşmanın mətni hz. Nizaminin misrasında yer tutan «Məkkənin bac verməsi» fikrinin üçüncü qaynağıdır.**

Bu mübarizə sonda Mədinə ilə Məkkənin birləşməsi, Məkkənin fəth olunması ilə nəticələndi. Kəbə bütlərdən

[540] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 255-256.

təmizləndi, Məkkə bir müsəlman şəhəri oldu. İslam dini yeni bir güc qaynağı əldə etdi.

Hz. Nizaminin «Məkkənin bac verməsi» fikrinin bütün siyasi, iqtisadi, dini, mənəvi-əxlaqi, psixoloji çalarlarını anlamaq üçün Məkkə ilə Mədinə, küfrlə iman arasında gedən mübarizənin sonunu göstərən bu ibrətamiz səhnəni təqdim edirik. Hz.Məhəmməd (s.a.s.) Məkkəni fəth etdi. O, bir sıra islam düşmənlərini bağışladı. Onların sırasında qatı islam düşməni Safvan ibn Umeyyə da var idi. O, bir gün hz.Məhəmmədin (s.a.s.) hüzuruna gəldi.

- Öyrəndiyimə görə sən mənim üçün bir əfv fərmanı çıxarmısan.

- Bəli.

- Ancaq mən islama girmək istəmirəm. İki ay düşünməyimə icazə ver.

- Sənə dörd ay icazə verirəm.

Hz.Məhəmməd (s.a.s.) Kəbədəki dini bəxşişlər xəzinəsində 70. 000 qızıl pul olduğunu təsbit etdi, ancaq bu pula toxunmadı. Bir necə gün sonra başladılan Xuneyn səfərində istifadə etmək üçün Safvan ibn Umeyyə hz.Məhəmmədə (s.a.s.) başqa ləvazimatı ilə birgə yüz zirehli köynək borc verdi. İslam hədəflərinə uyğun istifadə məqsədilə Rəsulullah (s.a.s.) Safvandan 50. 000 dirhəm, Abdullah ibn Əbi Rəbiədən 40. 000 və Huveytib ibn Əbdül Uzzadan 40. 000 dirhəm borc aldı. Bunları Huneyn savaşından sonra dərhal geri qaytardı. Huneyn savaşından sonra Rəsulullah tərəfindən qənimət olaraq ələ keçirilən çox sayda qoyun sürülərini özünə hədiyyə olaraq verildiyini görən Safvan çox təsirləndi və eyni gün islamı qəbul etdi».[541]

[541] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, s. 270.

Bu göstərilən də hz.Nizaminin misrasında olan «Məkkə bac verdi» fikrinin başqa bir qaynağı kimi göstərilə bilər.

Biz ifadə etdik ki, hz.Nizami misrada «hicrət» anlayışını «qürbət» biçimində təqdim edib. Bu həm poetik örtük kimi dəyərləndirilə bilər, həm də «hicrət»in bədii ədəbiyyatda kodlaşmış şəkli kimi. Məsələn, təsəvvüfdə «hicrət»in ayrı bir məna yükü var. «Hicrət» təsəvvüfdə bir qavramdır və insanın onun kamilləşməsinə mane olan pis xislətlərdən arınaraq, uzaqlaşaraq, «hicrət edərək», könlünə ancaq Allah (c.c.) sevgisini yerləşdirməsidir.

Hz.Nizaminin şərhində hicrət anlayışını hz. Məhəmmədin (s.a.s.) məkkəlilərin yolunu kəsib onlardan bac alması, məkkəlilərin təzminat ödəməyə məcbur edilməsi kimi dəyərləndirmək olmaz. Çünki, hz.Məhəmməd (s.a.s.) heç bir işi öz şəxsi çıxarlarını təmin etmək məqsədi ilə görməmişdir.

## HƏZRƏT NİZAMİNİN HİCRƏT ANLAYIŞINA VERDİYİ MƏNA

Hz.Nizaminin düşüncəsində «hicrət» siyasi, sosial, dini, mənəvi-əxlaqi, psixoloji yönləri olan çoxyönlü bir qavramdır. **Şairin təqdimatında «hicrət» küfrün imana məğlub olmasının yolunu, mərhələsini, metodunu anladır. Hz.Nizaminin təqdimatında hicrət bir fədakarlıq hadisəsidir. Allahın birliyinə iman etmiş möminlər malından, yurdundan, ailəsindən hicrət etdi. Dini, imanı qorumaq uğrunda savaş sonda itirilən hər şeyin geri qaytarılması ilə başa çatdı. Deməli, hicrət insanlar üçün doğru yaşamaq düsturu, ölçüsü müəyyən etmişdir. Bir insan dini, imanı ilə sərvəti arasında seçim etmək qarşısında qalsa, önündə böyük bir hicrət təcrübəsi var.**

Hicrət hz.Məhəmmədin (s.a.s.) fədakarlığının, sevgisinin, dözümünün, inamının, ağlının, uzaqgörənliyinin simvoludur. Bizcə, hz.Nizaminin hz.Məhəmmədi (s.a.s.) anladarkən «hicrət» hadisəsinə ayrıca yer verməsinin səbəbi də yuxarıda deyilənlərdir. Hz.Nizami «hicrət»i bir Allah (c.c.) yolunda fədakarlıq, sevgi qavramına, mənəvi-əxlaqi dəyər ölçüsünə çevirib. Hz.Nizaminin təqdimatında hicrət Allahı (c.c.), onun sevimli peyğəmbərini anlatmaq vasitəsidir. İslam tarixində imanla küfr arasındakı mübarizəni anladan ən tutarlı faktlardan biri hicrətdir. Biz hicrəti bir hekayə, bir nağıl, bir şeir, bir tarix kimi övladlarımıza da danışa bilərik. «Hicrət»in verdiyi ölçülər imanlı bir nəsil yetişdirmək üçün gözəl bir örnəkdir, tükənməz bir fədakarlıq qaynağıdır.

Görün, uca Allah Qurani-Kərimdə hicrət edənlər, onlara qucaq açanları necə öyür. Quranın təqdimatında onlar Allah yolunda cihad etmiş mühacirlərdir. Bu dəyərləndirməyə görə hicrət bir cihaddır. Gəlin, Quranı dinləyək:

وَالَّذِينَ آمَنُواْ وَهَاجَرُواْ وَجَاهَدُواْ فِي سَبِيلِ اللّهِ وَالَّذِينَ آوَواْ وَّنَصَرُواْ
أُولَـئِكَ هُمُ الْمُؤْمِنُونَ حَقًّا لَّهُم مَّغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ . وَالَّذِينَ آمَنُواْ مِن بَعْدُ

وَهَاجَرُواْ وَجَاهَدُواْ مَعَكُمْ فَأُوْلَـئِكَ مِنكُمْ وَأُوْلُواْ الأَرْحَامِ بَعْضُهُمْ أَوْلَى بِبَعْضٍ فِي كِتَابِ اللّهِ إِنَّ اللّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ

(Ənfal, 8/74-75)

«İman edib hicrət edən və Allah yolunda cihada qatılanlarla onları barındırıb yer, yurd sahibi edənlər və yardıma tələsənlər, məhz bunlar haqqı ilə mömin olanlardır. Bunlara bir bağışlanma və dəyərli bir ruzi vardır. Sonradan iman edib hicrət edən və sizinlə birlikdə cihad edənlər də sizdəndir. Əqrəbalar isə Allahın kitabına görə bir-birilərinə daha yaxındırlar. Şübhə yox ki, Allah hər şeyi bilir».

وَالسَّابِقُونَ الأَوَّلُونَ مِنَ الْمُهَاجِرِينَ وَالأَنصَارِ وَالَّذِينَ اتَّبَعُوهُم بِإِحْسَانٍ رَّضِيَ اللّهُ عَنْهُمْ وَرَضُواْ عَنْهُ وَأَعَدَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي تَحْتَهَا الأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَداً ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ

(Tövbə, 9/100)

«Yaxşılıq yarışında öncəliyi qazanan Mühacirlər və Ənsar ilə onlara gözəlcə uyanlardan Allah razı olmuşdur, onlar da Allahdan razı oldular. Allah onlara içində yerləşib əbədi qalacaqları, içlərindən irmaqlar axan cənnətlər hazırlamışdır. Məhz böyük qurtuluş budur».

وَالَّذِينَ هَاجَرُواْ فِي اللّهِ مِن بَعْدِ مَا ظُلِمُواْ لَنُبَوِّئَنَّهُمْ فِي الدُّنْيَا حَسَنَةً وَلَأَجْرُ الآخِرَةِ أَكْبَرُ لَوْ كَانُواْ يَعْلَمُونَ . الَّذِينَ صَبَرُواْ وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ

(Nəhl, 16/41-42)

«Onlara zülm etdikdən sonra Allah yolunda hicrət edənləri biz dünyada gözəl bir şəkildə yerləşdirdik. Halbuki, bilsələr axirətin mükafatı, əlbəttə, daha böyükdür. Onlar kı, səbir etmişlər və hər zaman Rəbblərinə təvəkkül edərlər».

ثُمَّ إِنَّ رَبَّكَ لِلَّذِينَ هَاجَرُواْ مِن بَعْدِ مَا فُتِنُواْ ثُمَّ جَاهَدُواْ

وَصَبَرُواْ إِنَّ رَبَّكَ مِن بَعْدِهَا لَغَفُورٌ رَّحِيمٌ
(Nəhl, 16/110)

«Sonra şübhəsiz ki, Rəbbim əziyyət edildikdən sonra hicrət edən, sonra cihad edən və səbir edən kimsələrin yardımçısıdır. Bundan sonra Rəbbim, əlbəttə, çox bağışlayıcı, çox mərhəmətlidir».

Bu ayədə uca Allah «hicrət», «cihad», «səbir» anlayışlarını yanaşı işlətmişdir. Bu anlayışların mahiyyətindəki çətinlik, dözüm, Allah (c.c.) sevgisi onları birləşdirmişdir. Daha sonra da uca Allah (c.c.) onun yolunda «hicrət», «cihad», «səbr» edənləri bağışlayacağını vəd edir:

وَالَّذِينَ هَاجَرُوا فِي سَبِيلِ اللَّهِ ثُمَّ قُتِلُوا أَوْ مَاتُوا لَيَرْزُقَنَّهُمُ اللَّهُ رِزْقاً حَسَناً وَإِنَّ اللَّهَ لَهُوَ خَيْرُ الرَّازِقِينَ . لَيُدْخِلَنَّهُم مُّدْخَلاً يَرْضَوْنَهُ وَإِنَّ اللَّهَ لَعَلِيمٌ حَلِيمٌ
(Həcc, 22/58-59)

«Allah yolunda hicrət edib sonra öldürülmüş, ya da ölmüş olanlar isə, əlbəttə, Allah onları gözəl bir ruzi ilə təmin edəcəkdir. Çünki Allah ruzi verənlərin ən xeyirlisidir. Allah onları razı olacaqları cənnətə, əlbəttə, yerləşdirəcəkdir. Şübhəsiz, Allah hər şeyi bilir, qullarına yumşaq davranır».

Bu ayələrdə Allah (c.c.) yolunda hicrət edənlərin axirətdəki mükafatları daha açıq bir biçimdə sadalanmışdır. Burada «ruzi» bağışlanmaq, Allahın (c.c.) qulundan razı olması anlamlarında işlədilmişdir.

وَلَا يَأْتَلِ أُوْلُوا الْفَضْلِ مِنكُمْ وَالسَّعَةِ أَن يُؤْتُوا أُوْلِي الْقُرْبَى وَالْمَسَاكِينَ وَالْمُهَاجِرِينَ فِي سَبِيلِ اللَّهِ وَلْيَعْفُوا وَلْيَصْفَحُوا أَلَا تُحِبُّونَ أَن يَغْفِرَ اللَّهُ لَكُمْ وَاللَّهُ غَفُورٌ رَّحِيمٌ
(Nur, 24/22)

«İçinizdən fəzilət və sərvət sahibi olanlar qohuma, yoxsullara, Allah yolunda hicrət edənlərə verməkdə (bağışlamaqda) qüsur etməsin və əfv etsin. Allahın sizi bağışlamasını istəməzsinizmi? (O halda siz əfv edin) Allah çox bağışlayandır, çox mərhəmətlidir».

لِلْفُقَرَاء الْمُهَاجِرِينَ الَّذِينَ أُخْرِجُوا مِن دِيارِهِمْ وَأَمْوَالِهِمْ يَبْتَغُونَ فَضْلاً مِّنَ اللَّهِ وَرِضْوَاناً وَيَنصُرُونَ اللَّهَ وَرَسُولَهُ أُوْلَئِكَ هُمُ الصَّادِقُونَ . وَالَّذِينَ تَبَوَّؤُوا الدَّارَ وَالْإِيمَانَ مِن قَبْلِهِمْ يُحِبُّونَ مَنْ هَاجَرَ إِلَيْهِمْ وَلَا يَجِدُونَ فِي صُدُورِهِمْ حَاجَةً مِّمَّا أُوتُوا وَيُؤْثِرُونَ عَلَى أَنفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ وَمَن يُوقَ شُحَّ نَفْسِهِ فَأُوْلَئِكَ هُمُ الْمُفْلِحُونَ

(Həşr, 59/8-9)

«(Bu qənimət malları) bir də o yoxsul mühacirlər üçün ki, yurdlarından və mallarından uzaqlaşdırıldılar, Allahın lütf və rizasını arayarlar. Allahın dininə və Rəsuluna yardım edərlər, sadiqlər məhz onlardır. Onlardan öncə (Mədinəni) yurd etmiş və iman sahibi olanlar (Ənsar), onlara hicrət edib gələnləri (mühacirləri) sevərlər. Onlara verilən qənimətdən ötrü nəfslərində bir qısqanclıq duymazlar. Özlərinin ehtiyacı belə olsa, onlar özlərindən üstün tutarlar. Kim nəfsinin mala olan tamahından qorunarsa, məhz onlar qurtulanlardır».

Bu ayələrdə isə hicrət edənlər «Allahın lütf və rizasını arayanlar», «Allahın dininə və Rəsuluna yardım edənlər», «Sadiqlər» kimi təqdim edilmişdir. Uca Allah (c.c.) hicrət edənlərə olan sevgisini bu gözəl, ümid dolu sözlərlə ifadə etmişdir.

Hz.Nizaminin beytində «hicrət», «qürbət» anlayışının yer tutmasının bir səbəbi də bu qavramın müsəlmanların qardaşlığı ideyasını ifadə etməsidir. Belə ki, hz.Məhəmməd (s.a.s.) Mədinəyə hicrət edən kimi bir sıra addımlar atdı. O, yeni dövlətin əsaslarını yaratdı, məscid tikdi, qonşu qəbilələrlə əlaqələr qurdu, dini təbliğ etdi, ordu qurdu.

Bunlarla birgə hz.Məhəmmədin (s.a.s.) gördüyü işlərin sırasında hicrət edənlərlə (mühacirlərlə) mədinəliləri (Ənsarı) qardaş elan etməsi ayrıca yer tutur. Hicrət qardaşlığı yaratdı, müsəlmanlar bir-birinə əl tutdular, onlarda birlik düşüncəsi oyandı, yardımlaşma, paylaşma islamın insanlığa verdiyi bir dəyər olaraq təsbit olundu. Hz.Məhəmmədin (s.a.s.) bu addımı islamın ruhuna uyğun və Allahın (c.c.) buyurduğu, bizdən tələb etdiyi bir əməldir. İslam bir qardaşlıq dinidir.

وَاعْتَصِمُواْ بِحَبْلِ اللّهِ جَمِيعاً وَلاَ تَفَرَّقُواْ وَاذْكُرُواْ نِعْمَتَ اللّهِ عَلَيْكُمْ إِذْ كُنتُمْ أَعْدَاء فَأَلَّفَ بَيْنَ قُلُوبِكُمْ فَأَصْبَحْتُم بِنِعْمَتِهِ إِخْوَاناً وَكُنتُمْ عَلَىَ شَفَا حُفْرَةٍ مِّنَ النَّارِ فَأَنقَذَكُم مِّنْهَا كَذَلِكَ يُبَيِّنُ اللّهُ لَكُمْ آيَاتِهِ لَعَلَّكُمْ تَهْتَدُونَ

(Ali-İmran, 3/103)

«Hamınız bir olaraq Allahın ipindən sıx tutun, bir-birinizdən ayrılmayın və Allahın üzərinizdəki nemətini düşünün. Sizlər bir-birinizə düşmənlər ikən O, sizin qəlblərinizin arasında yaxınlaşma meydana gətirib yaxınlaşdırdı və Allahın neməti sayəsində oyanıb qardaş oldunuz. Sizlər atəşdən bir çuxurun lap kənarında dururdunuz. O tutdu, sizi oradan qurtardı. İndi sizə ayələrini belə açıqlayır ki, Allaha doğru gedə biləsiniz».

**Hz.Nizaminin misrasına yerləşdirdiyi «hicrət» anlayışı bir sıra nəticələri də ortaya qoyur. Allaha (c.c.) inanan, Allahın (c.c.) onu nə üçün yaratdığını anlayan insan bilməlidir ki, heç bir böyük, ciddi iş çətinliksiz, qurbansız gerçəkləşmir. Ancaq insan bu çətinliklərdən qorxmamalıdır, çətinliyi Allahın rizasını qazanmaq üçün bir fürsət kimi dəyərləndirməlidir.**

**Hicrət gerçəkliyi, təcrübəsi anladır ki, insan ideallarını sevəndə onun yolunda fədakarlıqlara, qurbanlara hazır olur, çətinliklər asanlaşır. İnsan**

**çətinlikləri həll etdikcə güclənir, özünə inamı artır, ruhən təmizlənir.**

Hicrət Allahın (c.c.) sevdiyi insanlara çətinliklər verməsinin anlamını da ortaya çıxarır. Uca Allah (c.c.) bir insana çətinlik verirsə, bu ona əziyyət vermək üçün deyil. Allahın (c.c.) hədəfi özünü insanlara tanıtmaqdır. Xoşbəxtlik də ancaq Allahı (c.c.) tanımaqla ola bilər. Allahı (c.c.) tanımağın yolu isə çətinliklərdir. Qızıl odda yanmasa, dəyəri ortaya çıxmaz. Uca Allah (c.c.) sevdiyi insanları bu çətinliklər odunda əridir, insan onun Allahı (c.c.) tanımasına mane olan xislətlərdən çətinliklər yolu ilə arınaraq süzülür və onun gerçək mahiyyəti üzə çıxır.

**Hicrət Allah (c.c.) sevgisini – imanı əməli olaraq göstərmək, sübut etmək üçün bir fürsətdir. Hicrət, əslində, bir aşiqlikdir, Allah (c.c.) yolunda var-yoxdan imtina hadisəsidir. Hicrət Allaha (c.c.) itaətin ölçüsüdür.**

Biz, hz.Nizaminin «hicrət», «qürbət» adı, şifrəsi ilə beytinə yerləşdirdiyi «sirri» belə anlayırıq.

# ON YEDDİNCİ BEYTİN ŞƏRHİ: ONUN DOSTLUĞU EYİBLƏRİ YANDIRAN BİR HÜNƏR İDİ

Hz.Nizaminin on yeddinci beyti islam Peyğəmbərinin iki önəmli əxlaqi fəzilətinin açıqlanması üzərində qurulub:

خامشی اوسخن دلفروز

دوستی او هنر عیب سوز

***Onun dinməzliyi könül oxşayan danışıq idi,***
***Onun dostluğu eyibləri yandıran bir hünər idi.***[542]

Biz birinci misradakı «onun dinməzliyi» («onun susması») deyiminin dəyərləndirməsini Allahın (c.c.) sözü, Peyğəmbərin (s.a.s.) sözü, söz, dil, sükut, nitq mədəniyyəti anlayışları çərçivəsində şərh edə bilərik. Bununla birgə hz.Məhəmmədin (s.a.s.) sözü, davranışı və bir hadisəni görüb susması da hədis sayılır.

Uca Allah Qurani-Kərimdə az danışmağı, faydalı söz söyləməyi, sözün gözəlini deməyi, sözün məsuliyyət olduğunu buyurur:

وَقُل لِّعِبَادِي يَقُولُواْ الَّتِي هِيَ أَحْسَنُ إِنَّ الشَّيْطَانَ يَنزَغُ بَيْنَهُمْ إِنَّ الشَّيْطَانَ كَانَ لِلإِنْسَانِ عَدُوّاً مُّبِيناً

(İsra, 17/53)

«Qullarıma söylə ki: Ən gözəl olan sözü söyləsinlər. Çünki şeytan aralarını pozar. Çünki şeytan insana açıq bir düşməndir».

Bu ayədə «ən gözəl söz» doğru olan sözdür. İnsanlararası münasibətlərin qurulmasında, toplumun təməlinin sağlam olmasında, inam, etibar mühitinin yaradılmasında ən gözəl vasitə doğru danışmaqdır. Yalanın sonu isə

[542] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.

düşmənçilikdir. Ona görə də, uca Allah (c.c.) yalanın şeytanın silahı olduğunu bildirir:

وَلَقَدْ خَلَقْنَا الْإِنسَانَ وَنَعْلَمُ مَا تُوَسْوِسُ بِهِ نَفْسُهُ وَنَحْنُ أَقْرَبُ إِلَيْهِ مِنْ حَبْلِ الْوَرِيدِ . إِذْ يَتَلَقَّى الْمُتَلَقِّيَانِ عَنِ الْيَمِينِ وَعَنِ الشِّمَالِ قَعِيدٌ .مَا يَلْفِظُ مِن قَوْلٍ إِلَّا لَدَيْهِ رَقِيبٌ عَتِيدٌ

(Qaf, 50/16-18)

«Həm şanıma and içirəm ki, insanı Biz yaratdıq və nəfsinin ona nə ilə vəsvəsə verdiyini bilirik. Biz ona şah damarından daha yaxınıq. İki hazır mələk, biri sağda, o biri solda oturmuşdur. Hər nə söz söylərsə, mütləq yanında hazır bir gözləyən vardır».

Bu insanın düşüncəsinə, davranışına, sözünə, gizlədiyinə və açıq dediyinə ilahi bir nəzarətin olduğuna açıq dəlildir. Bu sözün məsuliyyətini anlamağın ölçüsüdür.

Uca Allahın (c.c.) başqa bir xəbərdarlığı:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَقُولُوا قَوْلاً سَدِيداً. يُصْلِحْ لَكُمْ أَعْمَالَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَمَن يُطِعْ اللَّهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوْزاً عَظِيماً .إِنَّا عَرَضْنَا الْأَمَانَةَ عَلَى السَّمَاوَاتِ وَالْأَرْضِ وَالْجِبَالِ فَأَبَيْنَ أَن يَحْمِلْنَهَا وَأَشْفَقْنَ مِنْهَا وَحَمَلَهَا الْإِنسَانُ إِنَّهُ كَانَ ظَلُوماً جَهُولاً

(Əhzab, 33/70-72)

«Ey iman edənlər! Allahdan qorxun və sağlam (doğru) söz söyləyin ki, işinizi yoluna qoysun və günahlarınızı bağışlasın. Hər Kim Allaha və Rəsuluna itaət edərsə, o, gerçəkdən ən böyük arzusuna çatmışdır. Biz o əmanəti göylərə və dağlara ərz etdik. Onlar onu yüklənməyə yanaşmadılar. Ondan qorxdular. Ona insan yükləndi. O, doğrudan çox zalım və çox cahildir».

Burada uca Allah (c.c.) doğru sözü, sağlam sözü işlərin yoluna qoyulmasının, bağışlanmanın səbəbi kimi dəyərləndirir, sözün Allahın (c.c.) əmanəti olduğunu buyurur.

Quran bəyan edir ki, Allahın (c.c.) sözü tükənməz.

قُل لَّوْ كَانَ الْبَحْرُ مِدَاداً لِّكَلِمَاتِ رَبِّي لَنَفِدَ الْبَحْرُ قَبْلَ أَن تَنفَدَ كَلِمَاتُ رَبِّي وَلَوْ جِئْنَا بِمِثْلِهِ مَدَداً

(Kəhf, 18/109)

«De ki: Rəbbimin sözlərini yazmaq üçün dənizlər mürəkkəb olsaydı, bir o qədərini daha əlavə etsəydik, Rəbbimin sözləri tükənmədən dənizlər tükənərdi».

Allahın (c.c.) elçisi hz.Məhəmməd (s.a.s.) doğru sözü gözəl əxlaqın ayrılmaz bir parçası saymışdır. Əbu-Dərda (r.a.) rəvayət edir: «Peyğəmbər (s.a.s.) belə buyurdu: «Qiyamət günündə mömin qulun tərəzisində gözəl əxlaqdan daha ağır bir şey olmaz. Uca Allah çirkin hərəkətlər edən, çirkin sözlər söyləyən kimsəyə nifrət edir».[543]

Hz.Məhəmməd (s.a.s.) hədislərində «söz və davranışlarında həddi aşanların həlak olacağı»[544], qeybətin haram olduğu[545], insanın bilmədiyi şeyi danışmasının doğru olmadığı[546] açıqca bəyan edilmişdir.

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Allaha və axirət gününə inanan ya xeyir söyləsin, ya da sussun».[547]

Əbu Musa (r.a.) belə rəvayət edir:

- Ey Allahın Rəsulu, hansı müsəlman ən üstündür?, - deyə soruşdum.

---

[543] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III s. 556.
[544] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 502.
[545] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 432.
[546] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 434.
[547] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 434.

- Dilindən və əlindən müsəlmanların əmniyyətdə olduğu kimsə, cavabını verdi».[548]

Hz.Məhəmməd (s.a.s.) bir başqa hədisində «dilin qoruyan qurtuldu» buyurmuşdur.[549]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Qul yaxşıca düşünüb daşınmadan bir söz söylərsə, buna görə cəhənnəmin qərb ilə şərq arasından daha uzaq bir yerinə düşər ».[550]

Əbu Abdurrahman Bilal ibnil-Haris əl-Müzeyni (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə buyurdu: «Qul Allahın xoşnud olduğu bir sözü söylər, ancaq onunla Allahın rizasını qazanacağı heç ağlına gəlməz. Halbuki, Allah o sözə görə ona qovuşduğu qiyamət gününə qədər o kimsədən xoşnud olur.

Yenə bir qul da Allahın qəzəbinə səbəb olan bir söz söylər, ancaq o sözün onu Allahın qəzəbinə gətirəcəyini düşünməz. Ancaq Allah o kimsəyə o pis söz səbəbi ilə ona qovuşacağı qiyamət gününə qədər qəzəb edər».[551]

İslam Peyğəmbəri (s.a.s.) bir sıra hədislərində çox danışmağı qadağan edir. İbn Ömər (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Allahı anmadan çox danışmayın. Allahın zikrindən başqa çox söz söyləmək qəlbi qatılaşdırır. Qatı qəlbli olanların isə Allahdan ən uzaq kimsələr olduğu qətidir».[552]

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «İnsan səhər oyanarkən bütün orqanları dilə baş çəkir. Və (elə bil ki) ona belə deyərlər. Bizim haqlarımızı

---

[548] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 436.
[549] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 437.
[550] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 439.
[551] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 445.
[552] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 449.

qorumaqda Allahdan qorx. Biz ancaq sənin söyləyəcəklərinlə cəza görürük. Biz sənə bağlıyıq. Əgər sən doğru olsan, biz də doğru olarıq. Əgər sən əyilər, yoldan çıxarsan, biz də sənə uyar, sənin kimi olarıq».[553]

Hz.Məhəmməd (s.a.s.) hədislərində mömin olmağın ölçülərini müəyyənləşdirərkən onların sözə münasibətini də önə çəkib.

İbn Məsud (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Mömin, insanları pisləyən, lənətləyən, pis söz və çirkin davranışı olan kimsə deyildir».[554]

Hz.Məhəmmədin (s.a.s.) ölçülərinə görə gözəl söz cəhənnəmdən qorunma vasitəsidir. «Yarım xurma verməklə də olsa, cəhənnəmdən qorunun. Bunu da tapa bilməyənlər (heç olmazsa) gözəl bir sözlə cəhənnəmdən qorunsun».[555]

Hz.Məhəmməd (s.a.s.) çox danışmağı doğru saymır, çox sözün insanın qəlbini qatılaşdıracağını buyurur:

«Allaha və axirət gününə inanan ya xeyir söyləsin, ya da sussun».[556]

«Üzr istəmək məcburiyyətində qalacağın bir söz söyləmə».[557]

Bu deyilənləri ümumiləşdirsək, hz. Nizaminin şərh olunan beytinin birinci misrasındakı «Onun (hz. Məhəmməd (s.a.s.) susması» ifadəsinin ehtiva etdiyi mənaları üzə çıxara bilərik. Hz. Nizami hər şeydən öncə «onun susması» anlayışı ilə bütövlükdə peyğəmbərlik institutunun, peyğəmbərlərin, ayrıca olaraq da hz.Məhəmmədin (s.a.s.) başlıca

---

553 Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 449.
554 Riyazüs-Salihin, göstərilən qaynaq, c. VII, s. 276.
555 Üsve-i Hasene, göstərilən qaynaq, 413.
556 Üsve-i Hasene, göstərilən qaynaq, 415.
557 Üsve-i Hasene, göstərilən qaynaq, 415.

vəzifələrindən biri olan dəvət, təbliğat metoduna işarə etmişdir.

Hz.Məhəmmədin (s.a.s.) hər bir addımının hikməti var. Onun sözü, susması, geyimi, davranışı, baxışı, savaşı uca Allahı (c.c.) anlatmaq, Allahın (c.c.) varlığı və birliyi inancını insanların könlünə yerləşdirmək hədəfinə uyğundur. Hz.Məhəmməd (s.a.s.) Allahın (c.c.) seçdiyi, tələblərinə uyğun özəlliklər verdiyi kamil bir dəvətçidir. Təbii ki, dəvətçinin ən önəmli silahı da sözdür. Hz.Məhəmməd (s.a.s.) dəvətində danışdığı insanın səviyyəsini nəzərə alıb, onun anlayacağı sözü söyləyib. «Hər kəsə dərəcəsinə görə davranın» təlimatını verib. Hz.Məhəmməd (s.a.s.) dəvətində hər zaman asanlaşdırma yolunu tutub. Onun bu metodu ilahi buyruğa uyğundur:

شَهْرُ رَمَضَانَ الَّذِيَ أُنزِلَ فِيهِ الْقُرْآنُ هُدًى لِّلنَّاسِ وَبَيِّنَاتٍ مِّنَ الْهُدَى وَالْفُرْقَانِ فَمَن شَهِدَ مِنكُمُ الشَّهْرَ فَلْيَصُمْهُ وَمَن كَانَ مَرِيضاً أَوْ عَلَى سَفَرٍ فَعِدَّةٌ مِّنْ أَيَّامٍ أُخَرَ يُرِيدُ اللّهُ بِكُمُ الْيُسْرَ وَلاَ يُرِيدُ بِكُمُ الْعُسْرَ وَلِتُكْمِلُواْ الْعِدَّةَ وَلِتُكَبِّرُواْ اللّهَ عَلَى مَا هَدَاكُمْ وَلَعَلَّكُمْ تَشْكُرُونَ

(Bəqərə, 2/185)

«Ramazan ayı insanlara doğru yol göstərən, doğru yolu və haqqı batildən ayırmağı açıq-aşkar dəlillərlə bəyan edən Quranın nazil olduğu aydır. Sizdən hər kim o aya yetişsə, oruc tutsun. Xəstələnənlər, ya da səfərdə olanlar isə başqa günlərdə tutsunlar».

Hz.Məhəmməd (s.a.s.) də bu ilahi buyruğa uyğun olaraq dəvət metodu seçir, bu yöndə təlimat verir: «Asanlaşdırın, çətinləşdirməyin, müjdələyin, nifrət etdirməyin».[558]

---

[558] Prof. Dr. Ahmet Önkal, Rasulullahın islama davet metodu, İstanbul, 2000, s. 234.

Hz.Məhəmməd (s.a.s.) hz.Muazı (r.a.) Yəmənə göndərərkən öncə Yəmən xalqını şəhadətə, bunu qəbul edərlərsə, beş vaxt namaza, bunu da qəbul edərlərsə, zəkat verməyə dəvəti əmr etmişdi.[559]

Hz.Məhəmməd (s.a.s.) dəvətdə, təbliğatda insanlarla mülayim davranmağı, insanlara layiq olduqları gözəl sözlər söyləməyi əsas ölçülərdən biri sayırdı. Onun bu metodu da ilahi təlimata uyğundur:

فَبِمَا رَحْمَةٍ مِّنَ اللّهِ لِنتَ لَهُمْ وَلَوْ كُنتَ فَظّاً غَلِيظَ الْقَلْبِ لاَنفَضُّواْ مِنْ حَوْلِكَ فَاعْفُ عَنْهُمْ وَاسْتَغْفِرْ لَهُمْ وَشَاوِرْهُمْ فِي الأَمْرِ فَإِذَا عَزَمْتَ فَتَوَكَّلْ عَلَى اللّهِ إِنَّ اللّهَ يُحِبُّ الْمُتَوَكِّلِينَ

(Ali-İmran, 3/159)

«(Ey Rəsulum!) Allahın mərhəməti səbəbinə sən onlarla yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onların sənin ətrafından dağılb gedərdilər. Artıq sən onları əfv et. Onlar üçün bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən, Allah təvəkkül edənləri sevər!».

لاَّ يُحِبُّ اللّهُ الْجَهْرَ بِالسُّوَءِ مِنَ الْقَوْلِ إِلاَّ مَن ظُلِمَ وَكَانَ اللّهُ سَمِيعاً عَلِيماً

(Nisa, 4/148)

«Allah pis sözün açıq deyilməsini sevməz. Yalnız zülm olunmuş şəxslər müstəsnadır. Allah eşidəndir, biləndir!».

إِنَّ إِبْرَاهِيمَ لَحَلِيمٌ أَوَّاهٌ مُّنِيبٌ

(Hud, 11/75)

«İbrahim doğrudan yumşaqxasiyyətli, ürəyiyanıq, özünü tamamilə Allaha vermiş bir şəxs idi».

Bu ilahi təlimata uyğun olaraq demək olar ki, bütün divan şairləri sözlə bağlı şeir yazmışlar. Bunlardan

---

[559] Prof. Dr. Ahmet Önkal, Rasulullahın islama davet metodu, İstanbul, 2000, s. 285.

birinə baxaq. **Türk ozanı Yunis Əmrə:**

Söz vardır kesdürür başı,
Söz vardır keser savaşı,
Söz vardır ağulu aşı
Bal ilən yağ edər bir söz.[560]

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) DƏVƏT METODU

Bizim burada hz.Məhəmmədin (s.a.s.) bütün dəvət metodlarını şərh etmək imkanımız yoxdur. Ancaq hz. Məhəmmədin (s.a.s.) dəvət metodlarından biri də hz.Nizaminin «Onun susması» ifadəsi ilə önə çıxardığı susmaqdır. **Hz. Nizami niyə hz.Məhəmmədin (s.a.s.) dəvət metodunun bu yönünü önə çəkib?** Biz bu sualın cavabını öncəki beytlərdə şərh olunan məsələlərlə birgə verə bilərik.

Hz.Nizami bu beytlərdə Peyğəmbərin (s.a.s.) özəlliklərini anladır, onun gücünü, dəyərini göstərir, onun «vəfalı», «ismətli» olduğunu, «onun türbəsinə baxanların cinayətlərinin bağışlandığını», «onun qürbətə düşməsinin məkkəlilərin bac verməsinə səbəb olduğunu» bildirir. Şair hz. Məhəmmədin (s.a.s.) təkcə danışmağının deyil, susmasının da insanlara güclü təsir etdiyini anlatmaq istəyir, «onun susması könül oxşayan danışıq idi», deyir.

Şair təzaddan yararlanaraq («susmaq», «danışmaq») hz. Məhəmmədin (s.a.s.) susmasının da bir fəzilət olduğunu ifadə edir. Ancaq bu, təkcə şair fantaziyasından, onun peyğəmbərə sevgisindən irəli gələn bir dəyərləndirmə də deyil. **Belə ki qaynaqlar hz.Məhəmmədin (s.a.s.) yaraşıqlı bir insan olduğunu, onun baxışının, duruşunun, yerişinin insanlara**

---

[560] Prof. Dr. Ahmet Önkal, Rasulullahın islama davet metodu, İstanbul, 2000, s. 301.

**təsir etdiyini, üzünün işıq içində olduğunu yazırlar. O, hər yönü ilə insanlar üçün bir örnək idi. O, könül, sevgi, hal insanı idi, bir çox gerçəklikləri sözü ilə deyil, halı ilə anladırdı. Üzünün nurundan insanların könlünə sevgi, şəfqət, mərhəmət, gözəllik axırdı. İnsanlar onun tərini, saçının tükünü, paltarını, əşyalarını belə bərəkət olaraq götürürdülər. Hz. Məhəmməd (s.a.s.) nur insanı, sevgi insanı olduğundan sükutu ilə də insanlarla danışırdı. O, susması ilə də bir sıra gerçəklikləri anladırdı.**

Hz.Nizami «onun susması» anlayışı ilə hz. Məhəmmədin (s.a.s.) bir sevgi, bir könül insanı olduğunu ifadə edib. Sonsuz göylər, əngin dənizlər, axan çaylar, uca dağlar, ətirli güllər susması ilə Allahı (c.c.) anlatdığı kimi, hz.Məhəmməd (s.a.s.) də sükutla o uca varlığı anladıb.

**Hz.Nizami «onun susması» dəyərləndirməsi ilə təbliğ metodunun başqa bir prinsipinə də işarə edib. Təbliğdə ən önəmli məsələlərdən biri inandırmaqdır, inandırıcı olmaqdır. İnsanlar təbliğatçının sözündən çox, onun hərəkətlərinə, əməlinə inanırlar. Bu baxımdan hz.Nizami «onun susması» deyərkən hz.Məhəmmədin (s.a.s.) örnək şəxsiyyət olduğunu da ifadə edib.**

Şair şərh olunan misrada «onun susması»nın «könüllər oxşayan danışıq» olduğunu deyir. Hz.Nizami burada «könülləri oxşayan danışıq» ifadəsi ilə inandırıcı sözü, inandırıcı davranışı nəzərdə tutub. **Örnək olmaq adamların sənə inanması deməkdir. O söz «könülləri oxşayır» ki, insanlar onun və onu deyənin doğruluğuna inanırlar. Hz.Məhəmməd (s.a.s.) bir sevgi peyğəmbəri olduğundan insanlara könlündə yer verdi, onları düşündü, onları cəhalətin caynağından qurtarmaq üçün fədakarlıq etdi, savaşdı, nəticədə, insanlar könlünü ona, onun sözünə**

**açdı, onu özünə örnək seçdi, onun ardınca getdi. Düşmən əlində, ağır işgəncələr altında, ölüm təhlükəsi ilə üz-üzə qalan səhabə «…Nəinki onun mənim yerimdə olmasını, onun ayağına bir tikanın batıb onu rahatsız etməsini belə istəmərəm», dedi.**

Hz.Məhəmməd (s.a.s.) bu yönü ilə də bizə bir ölçü verdi: Sən könlünü insanlara açmasan, onlara könlündə yer verməsən, onlar da sənə könlündə yer verməz. Könlünə girmədiyin insanı da inandıra, öyrədə bilməzsən. **Yalnız insanların könlünə, duyğu, düşüncə və davranışlarına yerləşmiş insanın «susması» da «könül oxşayan danışıq» ola bilər.**

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) DOSTLUQ ANLAYIŞI VƏ ONUN ÖLÇÜLƏRİ

Hz.Nizami şərh olunan beytin ikinci misrasında ideyanı iki anlayış üzərində qurmuşdur. Bu anlayışlardan biri dostluq, o birisi eyibləri örtməkdir:

*«Onun dostluğu eybləri yandıran bir hünər idi»*

Öncə Qurani-Kərimdə «dost», «dostluq» anlayışlarının məzmununa baxaq. Daha sonra dost kimlərin arasından seçilməlidir? Möminlər kimlərlə dostluq etməlidir? Peyğəmbərin dostluğunun özəllikləri hansılardır? kimi suallara cavab axtaraq.

Qurani-Kərimdə «dost» sözü çox işlənən sözlərdən biridir və bu söz müxtəlif mənaları ifadə edir. Uca Allah kitabında buyurur ki, ən gözəl dost Allahdır:

وَاللّهُ أعْلَمُ بِأَعْدَائِكُمْ وَكَفَى بِاللّهِ وَلِيّاً وَكَفَى بِاللّهِ نَصِيراً

(Nisa, 4/45)

«Ancaq Allah düşmənlərinizin kimlər olduğunu çox yaxşı bilir. Heç kimsə Allah kimi dost ola bilməz. Heç kimsə Allahın yardım etdiyi kimi yardım edə bilməz».

إِنَّ اللَّهَ لَعَنَ الْكَافِرِينَ وَأَعَدَّ لَهُمْ سَعِيراً

(Əhzab, 33/64)

«Gerçək budur ki, Allah həqiqəti inkar edənləri rəhmətindən qovmuş və onlar üçün yandırıcı bir atəş hazırlamışdır. Onlar orada sonsuza qədər qalacaqlar, nə bir dost, nə də bir yardımçı tapa bilməyəcəklər».

أَلَا لِلَّهِ الدِّينُ الْخَالِصُ وَالَّذِينَ اتَّخَذُوا مِن دُونِهِ أَوْلِيَاء مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَى إِنَّ اللَّهَ يَحْكُمُ بَيْنَهُمْ فِي مَا هُمْ فِيهِ يَخْتَلِفُونَ إِنَّ اللَّهَ لَا يَهْدِي مَنْ هُوَ كَاذِبٌ كَفَّارٌ

(Zumər, 39/3)

«Bil ki, xalis din ancaq Allaha məxsusdur. Allahı qoyub (bütləri) özlərinə dost tutanlar: «Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!»,-deyirlər. Şübhəsiz, Allah ixtilafda olduqları məsələlər barəsində onların arasında hökm edəcək. Allah yalançı, nankor olan kimsəni doğru yola yönəltməz!».

لاَّ يَتَّخِذِ الْمُؤْمِنُونَ الْكَافِرِينَ أَوْلِيَاء مِن دُوْنِ الْمُؤْمِنِينَ وَمَن يَفْعَلْ ذَلِكَ فَلَيْسَ مِنَ اللّهِ فِي شَيْءٍ إِلاَّ أَن تَتَّقُواْ مِنْهُمْ تُقَاةً وَيُحَذِّرُكُمُ اللّهُ نَفْسَهُ وَإِلَى اللّهِ الْمَصِيرُ

(Ali-İmran, 3/28)

«Möminlər möminləri qoyub həqiqəti inkara şərtlənmiş olanları dost seçməsinlər. Çünki bunu edən Allah ilə bütün bağını qoparmış olur…»

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ لاَ تَتَّخِذُواْ الْيَهُودَ وَالنَّصَارَى أَوْلِيَاء بَعْضُهُمْ أَوْلِيَاء بَعْضٍ وَمَن يَتَوَلَّهُم مِّنكُمْ فَإِنَّهُ مِنْهُمْ إِنَّ اللّهَ لاَ يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ

(Maidə, 5/51)

«Siz ey iman etmiş olanlar! Yəhudiləri və xristianları dost seçməyin. Onlar yalnızca bir-birilərinin dostlarıdır. Hansınız onları dost edərsə, mütləq onlardan olur. Bilin ki, Allah belə zalımlara doğru yolu göstərməz!»

إِنَّ الَّذِينَ قَالُوا رَبُّنَا اللَّهُ ثُمَّ اسْتَقَامُوا تَتَنَزَّلُ عَلَيْهِمُ الْمَلَائِكَةُ أَلَّا تَخَافُوا وَلَا تَحْزَنُوا وَأَبْشِرُوا بِالْجَنَّةِ الَّتِي كُنتُمْ تُوعَدُونَ . نَحْنُ أَوْلِيَاؤُكُمْ فِي الْحَيَاةِ الدُّنْيَا وَفِي الْآخِرَةِ وَلَكُمْ فِيهَا مَا تَشْتَهِي أَنفُسُكُمْ وَلَكُمْ فِيهَا مَا تَدَّعُونَ

(Fussilət, 41/30-31)

«Ancaq «Rəbbim Allahdır!», - deyən və səbatla doğru yolu izləyənlərə gəlincə onların üzərinə sıx-sıx mələklər enər (və belə deyərlər): «Qorxmayın və üzülməyin, buyurun, alın sizə vəd edilmiş olan cənnət müjdəsini! Biz bu dünya həyatında sizin dostunuzuq və o biri dünyada (da dostunuz olacağıq) orada canınızın istədiyi hər şeyə sahib olacaq və istədiyiniz hər şeyə qovuşacaqsınız».

قَدْ يَئِسُوا مِنَ الْآخِرَةِ كَمَا يَئِسَ الْكُفَّارُ مِنْ أَصْحَابِ الْقُبُورِ

(Mümtəninə, 60/13)

«Ey iman gətirənlər! Allahın qəzəbinə düçar olmuş bir qövmlə dostluq etməyin. Kafirlər qəbirstan əhlindən ümidlərini üzdükləri kimi, onlar da axirətdən ümidlərini üzmüşlər!».

وَلَا يَحُضُّ عَلَى طَعَامِ الْمِسْكِينِ . فَلَيْسَ لَهُ الْيَوْمَ هَاهُنَا حَمِيمٌ .وَلَا طَعَامٌ إِلَّا مِنْ غِسْلِينٍ .لَا يَأْكُلُهُ إِلَّا الْخَاطِؤُونَ

(Haqqa, 69/34-37)

«Çünki o, uca Allaha inanmadı, ehtiyac içində olanları yedirdib içirtmək üçün heç bir istək və qərarlılıq duymadı.

Buna görə bu gün nə bir dostu var, nə də pislikdən başqa bir yeyəcəyi. Günahkarlardan başqasının yemədiyi bir yeyəcək!»

إِنَّمَا يَنْهَاكُمُ اللَّهُ عَنِ الَّذِينَ قَاتَلُوكُمْ فِي الدِّينِ وَأَخْرَجُوكُم مِّن دِيَارِكُمْ وَظَاهَرُوا عَلَى إِخْرَاجِكُمْ أَن تَوَلَّوْهُمْ وَمَن يَتَوَلَّهُمْ فَأُوْلَئِكَ هُمُ الظَّالِمُونَ

(Mümtəninə, 60/9)

«Allah ancaq inancınıza görə sizə qarşı savaşan və sizi ana yurdunuzdan qovan, ya da başqasının sizi qovmasına yardım edənlərə dostluqla yaxınlaşmanızı yasaqlar. İçinizdən onlarla dostluq edənlərə gəlincə, gerçək zalımlar məhz onlardır!»

Bu ayələrdə «dost» anlayışı «yaxınlıq», «münasibət», «fədakarlıq», «sədaqət» kimi mənalarda işlənmişdir.

Uca Allah (c.c.) bir sıra ayələrdə möminlərin kiminlə dostluq qurmalarının ölçü və sərhədlərini də müəyyən edib:

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ لاَ تَتَّخِذُواْ آبَاءكُمْ وَإِخْوَانَكُمْ أَوْلِيَاء إَنِ اسْتَحَبُّواْ الْكُفْرَ عَلَى الإِيمَانِ وَمَن يَتَوَلَّهُم مِّنكُمْ فَأُوْلَـئِكَ هُمُ الظَّالِمُونَ

(Tövbə, 9/23)

«Siz ey iman edənlər! Əgər könüllərində haqqın inkarı imandan daha çox yer tutursa, atalarınızı və qardaşlarınızı (belə) dost və yaxın bilməyin. İçinizdən kimlər onlarla dostluq qurarsa, (bilin ki) məhz onlardır pisliyi seçən və edən kimsələr!»

أَلَمْ تَرَ إِلَى الَّذِينَ تَوَلَّوْا قَوْماً غَضِبَ اللَّهُ عَلَيْهِم مَّا هُم مِّنكُمْ وَلَا مِنْهُمْ وَيَحْلِفُونَ عَلَى الْكَذِبِ وَهُمْ يَعْلَمُونَ

(Mücadələ, 58/14)

«Məgər onların Allahın qəzəbləndiyi bir tayfanı özlərinə dost tutduqlarını görmədinmi? Onlar nə sizdəndirlər, nə də onlardan. Onlar billə-bilə yalandan and içirlər».

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَتَّخِذُوا عَدُوِّي وَعَدُوَّكُمْ أَوْلِيَاء تُلْقُونَ إِلَيْهِم بِالْمَوَدَّةِ وَقَدْ كَفَرُوا بِمَا جَاءكُم مِّنَ الْحَقِّ يُخْرِجُونَ الرَّسُولَ وَإِيَّاكُمْ أَن تُؤْمِنُوا

بِاللَّهِ رَبِّكُمْ إِن كُنتُمْ خَرَجْتُمْ جِهَاداً فِي سَبِيلِي وَابْتِغَاء مَرْضَاتِي تُسِرُّونَ إِلَيْهِم بِالْمَوَدَّةِ وَأَنَا أَعْلَمُ بِمَا أَخْفَيْتُمْ وَمَا أَعْلَنتُمْ وَمَن يَفْعَلْهُ مِنكُمْ فَقَدْ ضَلَّ سَوَاء السَّبِيلِ

(Mümtəninə, 60/1)

«Siz ey iman etmiş olanlar! Sizə gəlmiş olan bütün həqiqətləri inkar edən və (yalnız) Rəbbiniz Allaha inandığınız üçün elçini və sizi (yurdlarınızdan) qovan düşmənlərimi (onlar eyni zamanda sizin də düşmənlərinizdir) şəfqət göstərərək dost etməyin! Əgər mənim yolumda cəhd göstərmək üçün və mənim rizamı qazanmaq arzusuyla (evlərinizdən) çıxıb getdiyiniz doğru isə, onlara gizli bir şəfqətlə yaxınlaşaraq dostluq qurmayın. Çünki həm açıq etdiyiniz, həm də gizləmiş olduğunuz hər şeydən tamamilə xəbərdaram və içinizdən bunu hər kim edərsə, doğru yoldan azmış olur».

Bu ayələrdə uca Allah (c.c.) onu inkar edənlərlə dostluğu yasaqlayır, möminlərə kimlərlə və hansı yollarla dostluq qurmağın yollarını göstərir. Allahın ölçülərinə görə, dostluq sevgi, fədakarlıq deməkdir və dostun dosta təsiri çox güclüdür. Ona görə də, mömin dostunu diqqətlə seçməlidir.

İslam peyğəmbərinin dostluq anlayışı bu ilahi təməllər üzərində qurulmuşdur. **Hz. Məhəmmədə (s.a.s.) görə, dostluğun birinci təməli sevgidir.**

Əbu Musa əl-Əşari (r.a.) rəvayət edir. «Peyğəmbər (s.a.s.) belə buyurdu: «İnsan sevdiyi ilə bərabərdir».[561]

Enes (r.a.) belə rəvayət edir: «Bir bədəvi Rəsulullahdan (s.a.s.):

- Qiyamət nə zaman qopacaq?, - deyə soruşdu.

Peyğəmbər:

---

[561] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 561.

- Qiyamət üçün nə hazırladın?, - deyə, buyurdu.

- Allah və Rəsulunun sevgisini.

- O halda sən sevdiyin ilə bərabərsən»[562]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «İnsanlar qızıl və gümüş mədənləri kimidir. İslam öncəsi dönəmdə xeyirli olanlar islam dönəmində də islamı qavramaq baxımından xeyirlidirlər. Ruhlar əsgəri birliklər kimidir. Bir-birlərini tanıyan ruhlar bir-birləri ilə qaynaşırlar, tanımayanlar da ayrılığa düşərlər».[563]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «İnsan dostunun yaşayışından təsirlənir. O halda hər biriniz dost edəcəyi insana diqqət etsin».[564]

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Mömindən başqasını dost tutma, yeməyini inananlardan başqasına daddırma».[565]

Əbu Musa əl-Əşari (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Yaxşı və pis dostun halı gözəl ətir satanla körük çəkənin halına bənzər: Ətir satan ya sənə ətrindən bir az pulsuz verər, ya sən satın alarsan, ya da onunla birgə olduğun vaxt gözəl ətir qoxulamış olarsan. Körük çəkən kimsə isə ya paltarını yandırar, ya da ən azından körüyün pis qoxusundan rahatsız olarsan».[566]

**Hz.Məhəmmədə (s.a.s.) görə dostluğun ölçülərindən biri onu ziyarət etmək, xəstə olanda, ehtiyac duyanda onunla birgə olmaqdır.**

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Bir insan bir xəstənin xətrini soruşmağa

---

[562] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 561-562.
[563] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 565.
[564] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 559.
[565] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 557.
[566] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 551.

gedər, ya da Allah üçün sevdiyi bir insanı ziyarət edərsə, ona bir mələk belə səslənər: sən nə xoşbəxtsən! Gözəl bir səfər etdin. Özünə cənnət üçün azuqə hazırladın».[567]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Hz.Peyğəmbər (s.a.s.) belə buyurdu: «Bir adam bir başqa kənddəki din qardaşını ziyarət etmək üçün yola çıxdı. Uca Allah o adama nəzarət etmək üçün onun yolu üzərində durmağı bir mələyə əmr etdi. Adam mələyin yanına gələndə mələk:

- Hara gedirsən?, - dedi.

Adam:

- Bu irəlidəki kənddə bir din qardaşım var, onu ziyarətə gedirəm.

Mələk:

- O adamdan əldə etmək istədiyin bir mənfəətin varmı?

- Xeyr, mən onu ancaq Allah rizası üçün sevirəm, onun üçün ziyarətinə gedirəm.

- Sən onu necə sevirsən, Allah da səni eləcə sevir. Mən bu müjdəni vermək üçün uca Allahın sənə göndərdiyi elçisiyəm».[568]

Hz.Məhəmməd (s.a.s.) yalnız möminləri özünə dost saymışdır. Əbu Abdullah Amr ibni As (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «(Qohumum olan) filan oğulları ailəsi mənim dostlarım deyildir. Mənim dostlarım uca Allah ilə yaxşı möminlərdir. Ancaq o biriləri ilə aramızda qohumluq bağı olduğundan onlarla əlaqəmi kəsməyəcəyəm».[569]

Hz.Məhəmməd (s.a.s.) «Allahın dostları» anlayışını və uca Allahın (c.c.) öz dostlarına sadiq olduğunu da şərh etmişdir.

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) «Allah belə buyurmuşdur» dedi: «Hər kim (ixlas ilə mənə

---

567 Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 550.
568 Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 548.
569 Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 462.

qulluq edən) bir dostuma düşmənçilik edərsə, mən də ona qarşı hərb elan edərəm. Qulum mənə ona fərz etdiyim şeylərdən daha sevimli hər hansı bir şeylə yaxınlıq qazana bilməz. Qulum mənə nafilə ibadətlərlə durmadan yaxınlaşar, nəhayət, mən onu sevərəm. Qulumu sevincə də mən onun eşidən qulağı, görən gözü, tutan əli, yeriyən ayağı olaram. Məndən nə istərsə, onu mütləq verərəm. Mənə sığınarsa, onu qoruyaram».[570]

Bu hədislərdə hz. Məhəmmədin (s.a.s.) dostluq anlayışının əsaslarının fədakarlıq, sevgi, düşüncə və əxlaqda birlik olduğu ortaya qoyulmuşdur. Hz.Peyğəmbərə (s.a.s.) görə, dostluq çox qiymətli bir nemətdir. Burada önəmli məsələlərdən biri də odur ki, uca Allah (c.c.) Qurani-Kərimdə hz. Məhəmmədə (s.a.s.) «dostum» deyir. Allah (c.c.) ən gözəl, ən sadiq dost olduğundan hər zaman sevimli elçisini qorudu, ona öz ilahi vəzifəsini yerinə yetirməyə şərait yaratdı. Uca Allah (c.c.) ona münasibətdə zəruri olan fədakarlığı etdi, hz.Məhəmmədi (s.a.s.) heç vaxt darda qoymadı. Hz.Məhəmməd (s.a.s.) də uca Allah (c.c.) qarşısında öz dostluq vəzifəsini sonadək yerinə yetirdi. Uca Allahla (c.c.) onun elçisi arasındakı dostluğun ölçüləri Qurani-Kərimdə gözəl bir biçimdə yer tutmuşdur:

إِن تَتُوبَا إِلَى اللَّهِ فَقَدْ صَغَتْ قُلُوبُكُمَا وَإِن تَظَاهَرَا عَلَيْهِ فَإِنَّ اللَّهَ هُوَ
مَوْلَاهُ وَجِبْرِيلُ وَصَالِحُ الْمُؤْمِنِينَ وَالْمَلَائِكَةُ بَعْدَ ذَلِكَ ظَهِيرٌ

(Təhrim, 66/4)

«Əgər (ikiniz) Allaha tövbə edərsəniz çox yaxşı. Çünki ikinizin də qəlbi (haqdan) əyildi. Yox, əgər ona (peyğəmbərə) qarşı bir-birinizə yardım etməyə başlasanız,

[570] Riyazüs-Salihin, göstərilən qaynaq, c.I, s. 398.

xəbəriniz olsun ki, Onun dostu Allahdır, Cəbraildir və saleh möminlərdir. Onun arxasından da mələklər onu qoruyur».

أَلا إِنَّ أَوْلِيَاء اللّهِ لاَ خَوْفٌ عَلَيْهِمْ وَلاَ هُمْ يَحْزَنُونَ .الَّذِينَ آمَنُواْ وَكَانُواْ يَتَّقُونَ . لَهُمُ الْبُشْرَى فِي الْحَياةِ الدُّنْيَا وَفِي الآخِرَةِ لاَ تَبْدِيلَ لِكَلِمَاتِ اللّهِ ذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ

(Yunus, 10/62-64)

«Oyan! Allahın dostlarına nə qorxu vardır, nə də onlar hüznlü olarlar! Onlar ki, Allaha inanmışlar və təqva ilə qorunurlar. Onlara dünya həyatında da, axirət həyatında da müjdələr vardır. Allahın sözlərində dəyişiklik yoxdur. Məhz bu, ən böyük qurtuluşdur».

## HƏZRƏT NİZAMİYƏ GÖRƏ EYİB AXTARMAQ İNSANI VƏ CƏMİYYƏTİ ÇÜRÜDÜR

**Hz.Nizami İslam peyğəmbərinin dostluğunun bir özəlliyini də göstərir. Şair deyir ki, onun dostluğu eyibləri yandıran bir hünər idi. Bununla da hz.Nizami Peyğəmbərin (s.a.s.) dostluq ölçülərindən birinə də işarə edir. Dost dostunun eyiblərini örtməlidir və eyibləri örtmək bir hünərdir.**

Öncə onu deyək ki, «eyibləri örtmək» islam əxlaqının ən önəmli ölçülərindən biridir. Peyğəmbər dostluğunun təməlləri sevgi, fədakarlıq, bərabərlik, dəyər vermək, paylaşmaq, bir-birinin haqq və hüquqlarını qorumaq olduğundan dostlar bir-birində eyib axtarmaz, dostlar eyibləri örtər. Çünki eyib axtarmaq dostluğu pozar.

Dostluq təkcə fərdi deyil, həm də ictimai münasibətləri tənzimləyən bir dəyər olduğundan bu ölçü (eyib axtarmamaq) pozulanda cəmiyyətdəki səmimilik mühiti pozulur, fərdi və milli inkişafın önü kəsilir, insanlar arasında inamsızlıq

toxumu səpilir və Allahın (c.c.) ölçülərinə uyğun yaşamaq mümkün olmur. Bununla birgə, eyib axtarmaq qeybətə, dedi-qoduya, yalana, böhtana yol açır. **Nəticədə, xəstə bir toplum yaranır. Bu «eyib axtaranlar» mühitində hamı bir-birindən qorxur, heç kim heç kimi sevmir, hamı qeybətlə məşğul olur, kimsə kimsəyə inanmır, paxıllıq insanları didib parçalayır, bir-birini bəyənməmək, lovğalıq, təkəbbür, tərifə meyl, bu dünya malı uğrunda amansız didişmə əsas ölçülərə çevrilir. Bu yolla da toplum bir cəhənnəmə çevrilir, düşmənçilik insanları, toplumu sıradan çıxarır.**

«Eyib axtarmaq» elə qorxulu bir xəstəlikdir ki, hz.Nizami bu xəstəlikdən onu yandırmaqla qurtarmağın mümkünlüyünə inanır. O, misrada hz.Məhəmmədin (s.a.s.) dostluğunu eyibləri yandıran («hönəre-eyibsüz») bir dostluq adlandırır. «Eyib örtmək» anlayışını «eyib yandırmaq» anlayışı ilə əvəz edir.

Hz.Mövlana da insanları «eyibləri örtməkdə gecə kimi olmağa» çağırır.

Bizcə, hz.Nizami istər eyib axtarmağın mahiyyətini anlatmaq, istərsə də bu düşüncəni bədii biçimdə təqdim etmək baxımından «eyib yandıran» kimi çox uğurlu bir ifadə seçib.

İndi bu məsələ ilə bağlı Qurani-Kərimi dinləyək:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اجْتَنِبُوا كَثِيراً مِّنَ الظَّنِّ إِنَّ بَعْضَ الظَّنِّ إِثْمٌ
وَلَا تَجَسَّسُوا وَلَا يَغْتَب بَّعْضُكُم بَعْضاً أَيُحِبُّ أَحَدُكُمْ أَن يَأْكُلَ لَحْمَ أَخِيهِ
مَيْتاً فَكَرِهْتُمُوهُ وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ تَوَّابٌ رَّحِيمٌ

(Hucurat, 49/12)

«Ey iman gətirənlər! Çox zənnə-gümana qapılmaqdan çəkinin. Şübhəsiz, zənnin bəzisi günahdır. Bir-birinizin eybini, sirrini arayıb axtarmayın, bir-birinizin qeybətini qırmayın! Sizdən biriniz ölmüş qardaşının ətini yeməyə razı

olarmı?! Bu sizdə ikrah hissi oyadar. Allahdan qorxun. Həqiqətən, Allah tövbələri qəbul edəndir, rəhmlidir!».

Hz.Məhəmməd (s.a.s.) hədislərində eyibləri örtməyi bir əxlaqi ölçü olaraq irəli sürür.

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Bir qul bu dünyada başqa bir qulun eybini örtərsə, qiyamət günündə Allah da onun eybini örtər».[571]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Etdiyi günahları danışanlardan başqa, ümmətimin hamısı əfv edilmişdir. Biz adamın gecə pis bir iş edib, Allah onu örtdüyü halda sabah qalxıb: Ey filan! Mən gecə belə-belə etdim, deməsi açıq günahlardandır. Ancaq o insan Rəbbi onun pisliyini örtdüyü halda gecəni keçirtmişdi. Ancaq o, Allahın örtdüyünü açaraq səhərə başlayır».[572]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Bir cariyə zina edər və zina etdiyi də qəti bilinərsə, sahibi ona hədd cəzası (qamçı vurmaq) tətbiq etsin. Ancaq günahını başına qaxmasın. Sonra ikinci dəfə zina edərsə, eyni şəkildə hədd tətbiq etsin, ancaq yenə də günahını üzünə vurub pis sözlərlə qınamasın. Sonra bu cariyə üçüncü dəfə zina edərsə, artıq əfəndisi onu qıldan bir ip əvəzinə belə olsa, satsın».[573]

Abdullah ibni Ömər (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Müsəlman müsəlmanın qardaşıdır. Ona zülm etməz, onu düşmənə təslim etməz. Din qardaşının ehtiyacını ödəyənlərin, Allah da ehtiyacını ödəyər. Müsəlmanın bir sıxıntısını həll edənin Allah da qiyamət günündəki sıxıntılarından birini həll edər. Bir müsəlmanın

[571] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 218.
[572] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 219.
[573] Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 221.

eyibini örtənin, Allah da qiyamət günündə eyiblərini örtər».[574]

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) belə buyurdu: «Bir kimsə bir mömini dünya sıxıntılarının birindən qurtararsa, Allah da qiyamət günündə o mömini sıxıntılarının birindən qurtarar. Bir kimsə darda qalanın işini asanlaşdırarsa, Allah da onun dünya və axirətdə işini asanlaşdırar. Bir kimsə bir müsəlmanın eyibini örtərsə, Allah da onun dünya və axirətdəki eyiblərini örtər. Mömin qul din qardaşının yardımında olduğu müddətdə Allah da o qulun yardımındadır. Bir kimsə elm əldə etmək üçün bir yola girərsə, Allah da ona cənnətin yolunu asanlaşdırar. Bir camaat uca Allahın evlərindən bir evdə toplanıb Allahın kitabını oxuyar və onu aralarında müzakirə edər, anlayıb qavramağa çalışarsa, üzərilərinə sükunət enər və onları rəhmət bürüyər. Mələklər onları əhatə edərlər. Uca Allah da onları öz yanında olanların arasında anar…»[575]

Bu hədislərdə Peyğəmbər (s.a.s.) Allahın (c.c.) sevdiyi, buyurduğu gözəl əməllər sırasında «eyibləri örtməyi»də sadalamışdır, bu əməlin axirətdəki savabını müjdələmişdir. Təbiidir ki, «eyibləri örtmək» əməlinin Quran oxumaq əməli ilə bir sırada yer tutması da təsadüfi deyil.

İslam Peyğəmbəri (s.a.s.) eyibləri araşdırmağı insanın və toplumun əxlaqını pozan bir çirkin hərəkət kimi dəyərləndirmişdir. Bununla birgə o, eyib axtaran insanların əlamətlərini də göstərmişdir. **Bu ölçüyə görə, eyib axtaranlar insanlara şübhə ilə yanaşırlar, onlar özlərindən razı olurlar, heç kimin onlardan üstün olmasını istəmirlər, bir kimsənin üstünlüyü onları rahat**

---

574 Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 226.
575 Riyazüs-Salihin, göstərilən qaynaq, c.II, s. 228.

**buraxmır. Bu tipli adamlar böhtana, iftiraya, adamları qaralamağa meyilli olurlar. Onlar bilmədikləri şeyləri danışırlar, qüsurları şişirdirlər, insanların gizli hallarını, onlara aid olmayan danışıqlarını dinləməyə çalışırlar. İslam Peyğəmbərinin (s.a.s.) ölçüsünə görə, qüsur araşdırmaq, eyibləri açmaq günah və haramdır.**

Əbu Hureyrə (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Zənndən çəkinin. Çünki zənn (yersiz ittiham) sözlərin ən yalan olanıdır. Başqalarının danışdıqlarını dinləməyin, eyibləri araşdırmayın, bir-birinizə qarşı öyünüb qürurlanmayın, bir-birinizi qısqanmayın, kin bəsləməyin, üz çevirməyin. Ey Allahın qulları! Allahın sizə əmr etdiyi kimi qardaş olun! Müsəlman müsəlmanın qardaşıdır. Ona haqsızlıq etməz, onu yardımsız qoymaz, kiçik görməz. (Köksünə işarə edərək) Təqva buradadır, təqva buradadır!

İnsana müsəlman qardaşını xor görməsi pislik olaraq yetər. Müsəlmanın hər şeyi, qanı, namusu və malı müsəlmana haramdır. Şübhəsiz ki, Allah sizin bədənlərinizə, görünüşünüzə və mallarınıza deyil, qəlblərinizə qiymət verir».[576]

Bu hədisdən aydın görünür ki, İslam dini qardaşlıq üzərində qurulmuşdur. Zənn, kin, danışıq dinləmək, eyibləri araşdırmaq, özündən razılıq, qısqanclıq, haqsızlıq etmək, insanları kiçiltmək islamın qardaşlıq təməlini sarsıdır, insanları bir-birinə düşmənə çevirir.

Hz.Nizami də bu prinsipdən çıxış edərək hz. Məhəmmədin (s.a.s.) dostluğunu «eyibləri araşdırmaq» kimi çirkin, toplumun əxlaqını pozan əmələ qarşı qoyur. Şair «eyibləri örtməyi» hünər, ərdəm sayır. Əslində, şair dostluğu,

---

[576] Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 568.

qardaşlığı eyibləri ifşa etmək kimi ruhi, əxlaqi xəstəliyin dərmanı kimi təqdim edir, «dostluq eyibləri yandırar», deyir.

Hz.Məhəmmədin (s.a.s.) bu məsələ ilə bağlı başqa hədislərini oxuyaq:

Muaviyə (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Müsəlmanların eyiblərinin, gizli hallarının arxasınca düşər, araşdırmağa başlayarsan, onların əxlaqını pozarsan, ya da onları buna məcbur etmiş olarsan».[577]

İbni Məsud (r.a.) rəvayət edir: «Bir gün onun yanına bir adam gətirilərək «bu saqqalından şərab damcılayan filan kişidir», deyildiyi zaman o, bu cavabı verdi: «Bizə eyib və qüsur araşdırmaq qadağan edildi. Özlüyündən bir qüsur ortaya çıxarsa, bir zəruri olan işi görərik».[578]

Bu hədislərdə də «eyib axtarma» xəstəliyinin sosial-əxlaqi nəticələri önə çəkilmişdir. İslam dini sonadək insan uğrunda, onu Allahın (c.c.) varlığına və birliyinə inandırmaq uğrunda mübarizə etməyi tələb edir. İnsanları damğalayıb, hərəsinə bir pis ad qoyaraq dindən uzaqlaşdırmaq, onların eyiblərini araşdıraraq düşmənə çevirmək müsəlman əxlaqına uyğun deyil. İnsanlara inanc verməyin, onları gözəl əxlaqla tərbiyə etməyin yolu da dostluq, qardaşlıq, sevgi və fədakarlıqdır.

## BEYTİN İDEYASI

**Biz bu bilgilər işığında hz.Nizaminin şərh olunan beytini oxuduqda şairin, əslində, dostluğun ölçüsünü təsvir etdiyini görürük. Şair həm dostluğun ölçülərini verir, həm də kimin sənə dost olub-olmadığının əlamətlərini açıqlayır. Bu beytə görə, kimsə sənə dost deyir və eyib axtarırsa, o, sənin dostun deyil. Ona görə,**

---

[577] Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 571.
[578] Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 572.

**dost olmaq çətindir, dostluq sevgi, fədakarlıq istər. Eyni zamanda şairin anlayışına görə, dostluq həm bir hünərdir, həm də eyibləri örtməkdir.**

**İnsan psixologiyası belədir, o eyib axtarmağa meyillidir, başqalarının sirrini bilməyə çalışır. Kim iradəlidirsə və bu işin yanlış olduğunu anlayırsa, bu əməli etmir. Eyibləri örtmək insandan iradə tələb etdiyindən o bir hünərdir. Başqa yöndən təbii ki, eyib axtaranın dostu olmaz.**

Şair bu beytdə də başqa beytlərdə olduğu kimi, hz.Məhəmmədin (s.a.s.) dostluğunu bir örnək olaraq təqdim edir. İnsanları onun kimi olmağa çağırır.

Beytin şərhinin sonunda hz.Nizaminin beytini bir daha oxuyaq:

***Onun susması könülləri oxşayan danışıqdır,***
***Onun dostluğu eyibləri yandıran hünərdir.***

## ON SƏKKİZİNCİ BEYTİN ŞƏRHİ:
## ONUN FİTNƏLƏRİ YATIRMAĞI ÜRƏYƏ YATANDIR

Hz.Nizami nətin on səkkizinci beytində islam Peyğəmbərini (s.a.s.) başqa bir yöndən göstərir.

فـتـنه فرو كشتن ازودلـپذير
فـتـنه شدن نيز برونا گزير

***Onun fitnələri yatırmağı ürəyəyatandır,***
***Odur ki, hamı ona məftundur.***[579]

Göründüyü kimi, hz.Nizami bu beytdə əsas ideyanı «fitnə» sözünün üzərində qurub. Şair beyti-evi bu anlayışın verdiyi siyasi, dini, bədii imkanlara görə tikib. Biz də öncə «fitnə» anlayışının məna çalarını, termin kimi imkanlarını üzə çıxaraq.

## «FİTNƏ» ANLAYIŞI

«Fitnə» sözü lüğətlərdə bir neçə mənada işlədilmişdir. «Fitnə», qızıl, gümüş kimi maddələrin saflığını anlamaq üçün odda əritmək mənasında olan «fətn» (fütün) kökündən yaranmışdır. Qədim dövrlərdə bu söz «dərisini daha asan soya bilmək üçün qurbanı isti qumda basdırmaq», «aldatmaq», «könlünü çəkmək», «pusqu quraraq yol kəsmək» anlamlarında da işlədilmişdir.[580]

Zərgər üçün də bu kökdən gələn «fəttan» sözü işlədilib. Zaman keçdikcə «fitnə» sözü yeni çalarlar da qazanmışdır. Klassik lüğətlərdə «fitnə» sözü bu mənalarda işlədilmişdir: «sınama», «maddi və mənəvi sıxıntı», «üzüntü», «bəla və fəlakətlə imtahan etmək». «İnsanın içine aşk ateşi düşürdüyü ve ya könlünü çelip mantıklı düşünmesini engellediyi için kadına fettan denilmişdir. Aynı kelime kişinin aklını

---

[579] Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.
[580] İslam Ansiklopedisi, «Fitne» maddesi, s. 156.

karıştırıp ahlakını bozan ve cezaya çarptırılmasına sebeb olan şeytan için, ayrıca zarar verme manasından dolayı hırsız için de kullanılmışdır. İnsanların hırsını kamçılayıp günah işlemelerine sebep olan altın ve gümüşe «iki fettan»; insanları zor bir imtihandan geçirecek olan Münker ve Nekire de «kabrın iki fettanı» adı verilmiştir. Fitnenin «inanc uğruna maruz kalınan ağır işkence» anlamında kullanımı da olduqca yayğındır».[581]

«Fitnə» sözü çoxçalarlı olduğundan alimlər bu sözü fərqli mənalarda təfsir etmişlər. «Fitnə» sözü və bu sözün ifadə etdiyi anlayış hər zaman mənfi mənada olmamışdır. İbn Manzur «fitnə» sözünü «insanın üsyankarlığını olduğu kimi, səbir və mətanətini də ortaya çıxarıb fürsət verən imtahan» kimi dəyərləndirmişdir. Alim bu izahdan sonra aşağıdakı açıqlamanı verir: «…Mecdüddin ibnül-Esira fitnenin genellikle «hoşa gitmeyen bir imtihanın sonucu» anlamında kullanıldığını, ancak kelimenin giderek «günah, inkarçılık, savaş, yanğın, zelzele» gibi manalarının yayqınlaştığını belirtir».[582]

Böyük islam alimi Təbəri «fitnə» sözünün əsl mənasının «sınağa çəkmək», «yoxlamaq» olduğunu bildirir. Alimə görə, başqa çalarlar bu mənadan törəmişdir.[583] Allah (c.c.) insanı mal, mülk, övlad, sağlamlıq, xəstəlik, müsibət, şeytan, düşmən, sıxıntı ilə sınağa çəkə bilər. Uca Allah (c.c.) bunun belə olduğunu Qurani-Kərimdə buyurur:

كُلُّ نَفْسٍ ذَائِقَةُ الْمَوْتِ وَنَبْلُوكُم بِالشَّرِّ وَالْخَيْرِ فِتْنَةً وَإِلَيْنَا تُرْجَعُونَ

(Ənbiya, 21/35)

---

[581] İslam Ansiklopedisi, «Fitne» maddesi, s. 156.
[582] İslam Ansiklopedisi, «Fitne» maddesi, s. 156.
[583] İslam Ansiklopedisi, «Fitne» maddesi, s. 156.

«Hər nəfs ölümü dadacaqdır. Sizi bir imtahan olaraq pislik və yaxşılıqla sınayacağıq. Hamınız da sonda bizə qaytarılacaqsınız».

وَمِنَ النَّاسِ مَن يَعْبُدُ اللَّهَ عَلَى حَرْفٍ فَإِنْ أَصَابَهُ خَيْرٌ اطْمَأَنَّ بِهِ وَإِنْ أَصَابَتْهُ فِتْنَةٌ انقَلَبَ عَلَى وَجْهِهِ خَسِرَ الدُّنْيَا وَالْآخِرَةَ ذَلِكَ هُوَ الْخُسْرَانُ الْمُبِينُ

(Həcc, 22/11)

«… Əgər ona bir xeyir toxunarsa, ona qəlbi razı olur, əgər bir şər (fitnə) toxunarsa, üz çevirib geri dönər. Dünyası da axirəti də ziyan olur. Açıq itki (zərər) budur».

Allahın (c.c.) insanları fitnə ilə sınağa çəkməsinin çeşidli səbəbləri ola bilər. Allah (c.c.) qullarının ona olan imanını, səmimiyyətini sınayar, Allah (c.c.) sıxıntılarla özünü çətinlik verdiyi insana tanıda bilər. Qurani-Kərimdə uca Allah verdiyi nemət və sıxıntıları bir imtahan olduğunu açıqca buyurmuşdur:

وَلَا تَمُدَّنَّ عَيْنَيْكَ إِلَى مَا مَتَّعْنَا بِهِ أَزْوَاجاً مِّنْهُمْ زَهْرَةَ الْحَيَاةِ الدُّنيَا لِنَفْتِنَهُمْ فِيهِ وَرِزْقُ رَبِّكَ خَيْرٌ وَأَبْقَى

(Taha, 20/131)

«Biz kafirlərdən bir çoxuna onları sınamaq üçün dünya həyatının zinəti olaraq verdiyimiz və onunla onları faydalandırdığımız şeylərə əsla gözlərini dikmə. Halbuki, Rəbbinin ruzisi daha xeyirli və daha davamlıdır».

وَاعْلَمُواْ أَنَّمَا أَمْوَالُكُمْ وَأَوْلاَدُكُمْ فِتْنَةٌ وَأَنَّ اللّهَ عِندَهُ أَجْرٌ عَظِيمٌ

(Ənfal, 8/28)

«Və yaxşı bilin ki, mallarınız və uşaqlarınız bir imtahandan ibarətdir. Allah yanında isə böyük mükafatlar vardır».

إِنَّمَا أَمْوَالُكُمْ وَأَوْلَادُكُمْ فِتْنَةٌ وَاللَّهُ عِندَهُ أَجْرٌ عَظِيمٌ

(Təqabun, 64/15)

«Hər halda mallarınız və övladlarınız bir fitnədir (imtahandır). Allah isə, böyük mükafat onun yanındadır».

فَإِذَا مَسَّ الْإِنسَانَ ضُرٌّ دَعَانَا ثُمَّ إِذَا خَوَّلْنَاهُ نِعْمَةً مِّنَّا قَالَ إِنَّمَا أُوتِيتُهُ عَلَى عِلْمٍ بَلْ هِيَ فِتْنَةٌ وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ

(Zumər, 39/49)

«Ancaq insana bir sıxıntı toxunanda Bizə yalvarar, sonra ona bizdən bir nemət bəxş etdiyimiz zaman da: «O mənə bildiyim üçün verildi», deyər. Bəlkə bu bir imtahandır, ancaq çoxları bilməzlər».

إِذْ تَمْشِي أُخْتُكَ فَتَقُولُ هَلْ أَدُلُّكُمْ عَلَى مَن يَكْفُلُهُ فَرَجَعْنَاكَ إِلَى أُمِّكَ كَيْ تَقَرَّ عَيْنُهَا وَلَا تَحْزَنَ وَقَتَلْتَ نَفْساً فَنَجَّيْنَاكَ مِنَ الْغَمِّ وَفَتَنَّاكَ فُتُوناً فَلَبِثْتَ سِنِينَ فِي أَهْلِ مَدْيَنَ ثُمَّ جِئْتَ عَلَى قَدَرٍ يَا مُوسَى

(Taha, 20/40)

«O vaxt bacın gedərək «Sizə ona baxacaq bir adam tapımmı?», - deyirdi. Beləliklə, səni təkrar anana verdik ki, gözü aydın olsun, kədərlənməsin. Həm də bir adam öldürdün və səni qəmdən qurtardıq, çeşidli müsibətlərlə səni imtahan etdik. Bu səbəblə illərcə Mədyən xalqı içində qaldın. Sonra da bir qədərə görə bu məqama gəldin, ey Musa».

**Qurana görə, «fitnə» insanların bir-birinə münasibətində də özünü göstərir. İnkarçıların müsəlmanlara verdiyi əziyyətlər, zülm və işgəncələr onlar (inananlar) üçün bir fitnədir. Onlar bu yolla da sınaqdan keçirilirlər:**

وَما أَرْسَلْنَا قَبْلَكَ مِنَ الْمُرْسَلِينَ إِلَّا إِنَّهُمْ لَيَأْكُلُونَ الطَّعَامَ وَيَمْشُونَ فِي الْأَسْوَاقِ وَجَعَلْنَا بَعْضَكُمْ لِبَعْضٍ فِتْنَةً أَتَصْبِرُونَ وَكَانَ رَبُّكَ بَصِيراً

(Furkan, 25/20)

«Biz səndən öncə də peyğəmbərləri başqa cür göndərmədik. Şübhəsiz, onlar həm yemək yeyir, həm bazarlarda gəzirlərdi. Bir də sizin bəzinizi başqasına bir fitnə (imtahan) etmişik ki, görək, səbir edəcəksinizmi? Çünki Rəbbin hər şeyi haqqıyla görməkdədir».

**Qurana görə, insan yanlış düşüncəsi, əxlaq və davranışları ilə özü-özünün fitnəsi ola bilər:**

يُنَادُونَهُمْ أَلَمْ نَكُن مَّعَكُمْ قَالُوا بَلَى وَلَكِنَّكُمْ فَتَنتُمْ أَنفُسَكُمْ وَتَرَبَّصْتُمْ وَارْتَبْتُمْ وَغَرَّتْكُمُ الْأَمَانِيُّ حَتَّى جَاء أَمْرُ اللَّهِ وَغَرَّكُم بِاللَّهِ الْغَرُورُ
(Hədid, 57/14)

«(Münafiqlər) onlara belə bağırırlar: «Bizlər sizinlə bərabər deyildikmi?». (Möminlər də) deyərlər ki: «Bəli, ancaq özünüzə pislik etdiniz (özünüzü fitnəyə saldınız), gözlədiniz, şübhəyə düşdünüz və Allahın əmri gələnədək (ölənədək) o fikirlər sizi aldatdı. O çox aldadan (şeytan) sizi Allaha qarşı yanlışlığa sürüklədi».

**Qurani-Kərimdə şeytanın hiylə və tələsi, şeytanın təlqin etdiyi batil inanclar da «fitnə» sözü ilə ifadə edilmişdir:**

يَا بَنِي آدَمَ لاَ يَفْتِنَنَّكُمُ الشَّيْطَانُ كَمَا أَخْرَجَ أَبَوَيْكُم مِّنَ الْجَنَّةِ يَنزِعُ عَنْهُمَا لِبَاسَهُمَا لِيُرِيَهُمَا سَوْءَاتِهِمَا إِنَّهُ يَرَاكُمْ هُوَ وَقَبِيلُهُ مِنْ حَيْثُ لاَ تَرَوْنَهُمْ إِنَّا جَعَلْنَا الشَّيَاطِينَ أَوْلِيَاء لِلَّذِينَ لاَ يُؤْمِنُونَ
(Əraf, 7/27)

«Ey Adəm oğulları! Şeytan ata-ananızı çirkin yerlərini onlara göstərmək üçün paltarlarını soyunduraraq cənnətdən çıxardığı kimi, sizi də bir fitnəyə (bəlaya) salmasın. Çünki o və qəbiləsi sizin onları görməyəcəyiniz yerdən görürlər. Biz şeytanları imana gəlməyənlərin dostu etdik».

لِيَجْعَلَ مَا يُلْقِي الشَّيْطَانُ فِتْنَةً لِّلَّذِينَ فِي قُلُوبِهِم مَّرَضٌ وَالْقَاسِيَةِ قُلُوبُهُمْ وَإِنَّ الظَّالِمِينَ لَفِي شِقَاقٍ بَعِيدٍ
(Həcc, 22/53)

«Bunun üçün ki, şeytanın qarışdırdığını qəlblərində xəstəlik olanlar və qəlbləri sərt olanlar üçün bir fitnə edəcəkdir. Çünki zalimlər haqqdan uzaq dərin bir ayrılıq içindədirlər».

**Qurani-Kərimdə Fironun öz qövmünə zülm etməsi, düşmənin müsəlmanlara hücum edərək onları öldürməsi, əsir alması «fitnə» qavramı ilə ifadə edilmişdir:**

فَمَا آمَنَ لِمُوسَى إِلاَّ ذُرِّيَّةٌ مِّن قَوْمِهِ عَلَى خَوْفٍ مِّن فِرْعَوْنَ وَمَلَئِهِمْ أَن يَفْتِنَهُمْ وَإِنَّ فِرْعَوْنَ لَعَالٍ فِي الأَرْضِ وَإِنَّهُ لَمِنَ الْمُسْرِفِينَ

(Yunus, 10/83)

«Firon və adamlarından onlara bir bəla (fitnə) gəlməsindən qorxduqları üçün qövmünün içində Musaya, bir qrup gəncdən başqa iman edən olmadı. Çünki Firon yer üzündə böyüklük iddiasında olan və həddi aşan müsriflərdən idi».

وَإِذَا ضَرَبْتُمْ فِي الأَرْضِ فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَن تَقْصُرُواْ مِنَ الصَّلاَةِ إِنْ خِفْتُمْ أَن يَفْتِنَكُمُ الَّذِينَ كَفَرُواْ إِنَّ الْكَافِرِينَ كَانُواْ لَكُمْ عَدُوّاً مُّبِيناً

(Nisa, 4/101)

«Yolçuluq etdiyiniz zaman o küfr edənlərin sizə bir pislik etmələrindən (sizə qarşı fitnə çıxartmalarından) qorxursunuzsa, namazı qısaltmağınızda sizə bir günah olmaz. Şübhəsiz ki, kafirlər sizə açıq bir düşməndirlər».

**Qurani-Kərimdə yəhudilərin hz.Məhəmmədi (s.a.s.) Allahın (c.c.) dinindən uzaqlaşdıraraq özlərinə tabe etmək istəməsi, Quranın çeşidli yorumlara yol açan ayələrinin şəxsi istəklərə uyğun izah edilməsi, bu yolla insanların düşüncəsinin qarışdırılması «fitnə» sözü ilə bildirilmişdir:**

هُوَ الَّذِيَ أَنزَلَ عَلَيْكَ الْكِتَابَ مِنْهُ آيَاتٌ مُّحْكَمَاتٌ هُنَّ أُمُّ الْكِتَابِ وَأُخَرُ مُتَشَابِهَاتٌ فَأَمَّا الَّذِينَ في قُلُوبِهِمْ زَيْغٌ فَيَتَّبِعُونَ مَا تَشَابَهَ مِنْهُ ابْتِغَاء الْفِتْنَةِ وَابْتِغَاء تَأْوِيلِهِ وَمَا يَعْلَمُ تَأْوِيلَهُ إِلاَّ اللّهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ يَقُولُونَ آمَنَّا بِهِ كُلٌّ مِّنْ عِندِ رَبِّنَا وَمَا يَذَّكَّرُ إِلاَّ أُوْلُواْ الألْبَابِ

(Ali-İmran, 3/7)

«Bu müəzzəm kitabı sənə endirən Odur. Onun bir qisim mənaları qətidir və kitabın əsasını (özünü) təşkil edir. Başqa bir qisimlərinin də birdən çox mənası var. Ancaq qəlblərində bir xəstəlik olanlar fitnə çıxarmaq və istəklərincə yorumlamaq üçün sadəcə birdən çox anlamı olanların arxasınca düşürlər. Ancaq onun təfsirini ancaq Allah bilir. Elmdə dərinlik qazananlar da «inandıq, hamısı Rəbbimizdəndir», deyərlər. Bunları özü (varlığı) təmiz olanlardan başqası düşünə bilməz».

**Bir sıra ayələrdə müşriklərin müsəlmanları dinlərindən uzaqlaşdırmaq istəməsi, onların bu yöndəki pozucu əməlləri «fitnə» anlayışı ilə ifadə edilmişdir:**

لَوْ خَرَجُواْ فِيكُم مَّا زَادُوكُمْ إِلاَّ خَبَالاً ولأَوْضَعُواْ خِلاَلَكُمْ يَبْغُونَكُمُ الْفِتْنَةَ وَفِيكُمْ سَمَّاعُونَ لَهُمْ وَاللّهُ عَلِيمٌ بِالظَّالِمِينَ

(Tövbə, 9/47)

«Əgər içinizdə sizinlə bərabər cihada çıxmış olsalar idi, pozğunçuluq etməkdən başqa bir faydaları olmayacaq idi və aranıza fitnə salmaq üçün  çalışacaq idilər. İçinizdə onların sözlərini dinləyənlər də var idi. Allah o zalımları yaxşı tanıyır».

لَقَدِ ابْتَغَوُاْ الْفِتْنَةَ مِن قَبْلُ وَقَلَّبُواْ لَكَ الأُمُورَ حَتَّى جَاء الْحَقُّ وَظَهَرَ أَمْرُ اللّهِ وَهُمْ كَارِهُونَ

(Tövbə, 9/48)

«Doğrusu, bunlar daha öncə də fitnə çıxarmaq istədilər və sənə qarşı çeşidli planlar qurdular. Nəhayət, haqq yerini tapdı. Allahın əmri bunlara baxmayaraq, üzə çıxdı, qələbə çaldı».

وَإِن كَادُواْ لَيَفْتِنُونَكَ عَنِ الَّذِي أَوْحَيْنَا إِلَيْكَ لِتفْتَرِيَ عَلَيْنَا غَيْرَهُ وَإِذاً لاَّتَّخَذُوكَ خَلِيلاً

(İsra, 17/73)

«Az qala səni belə sənə vəhy etdiyimizdən başqasını bizə qarşı iftira edəsən deyə fitnəyə salacaqlar idi və o halda səni dost sayacaqlardı».

**Quranın bir sıra ayələrində «fitnə»nin ciddi bir günah olduğu vurğulanmış, onun təhlükələri göstərilmişdir:**

وَاقْتُلُوهُمْ حَيْثُ ثَقِفْتُمُوهُمْ وَأَخْرِجُوهُم مِّنْ حَيْثُ أَخْرَجُوكُمْ وَالْفِتْنَةُ أَشَدُّ مِنَ الْقَتْلِ وَلاَ تُقَاتِلُوهُمْ عِندَ الْمَسْجِدِ الْحَرَامِ حَتَّى يُقَاتِلُوكُمْ فِيهِ فَإِن قَاتَلُوكُمْ فَاقْتُلُوهُمْ كَذَلِكَ جَزَاء الْكَافِرِينَ

(Bəqərə, 2/191)

«Və onları harada yaxalasanız, öldürün və sizi çıxardıqları yerdən (Məkkədən) onları çıxarın. O fitnə öldürməkdən daha şiddətlidir. Ancaq Məscidi-Həram yanında onlar sizinlə savaşmadıqca siz də onlarla savaşmayın, ancaq sizi öldürməyə başlasalar, onda onları öldürün! Kafirlərin cəzası belədir».

يَسْأَلُونَكَ عَنِ الشَّهْرِ الْحَرَامِ قِتَالٍ فِيهِ قُلْ قِتَالٌ فِيهِ كَبِيرٌ وَصَدٌّ عَن سَبِيلِ اللّهِ وَكُفْرٌ بِهِ وَالْمَسْجِدِ الْحَرَامِ وَإِخْرَاجُ أَهْلِهِ مِنْهُ أَكْبَرُ عِندَ اللّهِ وَالْفِتْنَةُ أَكْبَرُ مِنَ الْقَتْلِ وَلاَ يَزَالُونَ يُقَاتِلُونَكُمْ حَتَّىَ يَرُدُّوكُمْ عَن دِينِكُمْ إِنِ اسْتَطَاعُواْ وَمَن يَرْتَدِدْ مِنكُمْ عَن دِينِهِ فَيَمُتْ وَهُوَ كَافِرٌ فَأُوْلَـئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالآخِرَةِ وَأُوْلَـئِكَ أَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ

(Bəqərə, 2/217)

« (Ey Rəsulum!) Haram olan ayda döyüş haqqında səndən soruşanlara söylə: «O ayda döyüşmək böyük günahdır, ancaq Allah yolunu qapamaq, onu inkar etmək, Məscidül-Hərama girməyə mane olmaq və oradakıları kənara çıxarmaq Allah yanında daha böyük günahdır. (Din naminə) fitnə salmaq isə (həmin ayda) vuruşmaqdan daha betərdir! Onlar əgər bacarsalar, sizi dininizdən döndərənə qədər sizinlə vuruşmaqda davam edəcəklər. Sizdən hər kəs öz dinindən dönüb kafir olaraq ölərsə, belə kimsələrin bütün əməlləri

dünya və axirətdə heçə gedər. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar!».

**Qurani-Kərimdə uca Allah (c.c.) «fitnə»nin çox təhlükəli olduğunu buyuraraq inananları fitnəyə qarşı səfərbərliyə çağırır, fitnəni düşüncə mübarizəsinin, imanla küfr, cəhalətlə elm, işıqla zülmət arasındakı amansız savaşın tərkib hissəsi kimi təqdim edir. Allahın (c.c.) dininə görə, insanları zülmətdə saxlayıb, onları kölə kimi idarə etmək istəyənlərin ən təhlükəli silahlarından biri də fitnədir. Allahı (c.c.) inkar edənlər fitnə yolu ilə insanların düşüncəsini qarışdırır, onları parçalayır, gücdən salır və onların üzərində ağalıq edirlər. Allah (c.c.) bizə ayıq olmağı, fitnənin kökünü kəsincəyədək onunla savaşmağı əmr edir:**

وَقَاتِلُوهُمْ حَتَّى لاَ تَكُونَ فِتْنَةٌ وَيَكُونَ الدِّينُ لِلّهِ فَإِنِ انتَهَواْ فَلاَ عُدْوَانَ إِلاَّ عَلَى الظَّالِمِينَ

(Bəqərə, 2/193)

«Bir fitnə qalmayıb din yalnız Allahın oluncayadək onlarla çarpışın. Əl çəkərlərsə, artıq düşmənçilik ancaq zalımlara qarşıdır».

**Quranda «fitnə» «sınamaq», «imtahan etmək» mənalarında işlədilir:**

«Biz sənin ardından qövmünü fitnəyə saldıq, imtahan etdik…»

**Quranda «fitnə» «şərik qoşmaq», «küfr», «müsəlmanlara qarşı olan təzyiq, zülm» mənalarında da verilir:**

سَتَجِدُونَ آخَرِينَ يُرِيدُونَ أَن يَأْمَنُوكُمْ وَيَأْمَنُواْ قَوْمَهُمْ كُلَّ مَا رُدُّوَاْ إِلَى الْفِتْنِةِ أُرْكِسُواْ فِيِهَا فَإِن لَّمْ يَعْتَزِلُوكُمْ وَيُلْقُواْ إِلَيْكُمُ السَّلَمَ وَيَكُفُّوَاْ أَيْدِيَهُمْ فَخُذُوهُمْ وَاقْتُلُوهُمْ حَيْثُ ثِقِفْتُمُوهُمْ وَأُوْلَـئِكُمْ جَعَلْنَا لَكُمْ عَلَيْهِمْ سُلْطَاناً مُّبِيناً

(Nisa, 4/91)

«Siz elə kəslərə də rast gələcəksiniz ki, onlar həm sizdən, həm də öz camaatından arxayın olmaq istərlər. Bunlar da hər dəfə fitnə-fəsad törətməyə sövq edildikdə başıaşağı ora atılarlar. Əgər onlar sizi tərk edib getməsələr, sizdən əl çəkməsələr, onda onlara harada rast gəlsəniz tutub öldürün. Biz onların əleyhinə çıxmaq üçün sizə açıq fərman verdik».

**Quranda «fitnə»nin «azğınlıq», «azmaq», «yolundan çıxmaq» mənaları var:**

مَا أَنتُمْ عَلَيْهِ بِفَاتِنِينَ

(Saffat, 37/162)

«Allaha qarşı bir kimsəni aldadıb yolundan çıxara bilməzsiniz (bir kimsəni fitnəyə sala bilməzsiniz)».

**Quranda «fitnə» «oda atmaq», «atəşlə əzab çəkmək», «əzab», «işgəncə» mənalarında işlədilir:**

يَوْمَ هُمْ عَلَى النَّارِ يُفْتَنُونَ .ذُوقُوا فِتْنَتَكُمْ هَذَا الَّذِي كُنتُم بِهِ تَسْتَعْجِلُونَ

(Zariyat, 51/13-14)

«Atəş üzərində qıvrınacaqları gün Onlara: «Dadın cəzanızı. Bu, sizin tez istədiyinizdir», deyiləcəkdir».

وَمِنَ النَّاسِ مَن يَقُولُ آمَنَّا بِاللَّهِ فَإِذَا أُوذِيَ فِي اللَّهِ جَعَلَ فِتْنَةَ النَّاسِ كَعَذَابِ اللَّهِ وَلَئِن جَاء نَصْرٌ مِّن رَّبِّكَ لَيَقُولُنَّ إِنَّا كُنَّا مَعَكُمْ أَوَلَيْسَ اللَّهُ بِأَعْلَمَ بِمَا فِي صُدُورِ الْعَالَمِينَ

(Ənkəbut, 29/10)

«İnsanlar içində eləsi də vardır ki, «Allaha iman etdik», deyər, ancaq Allah uğrunda bir əziyyətə düşərsə, insanların işgəncəsini Allahın əzabı kimi qəbul edər. And olsun ki, Rəbbimdən bir yardım gələrsə, «biz sizinlə bərabər idik», deyəcəklərində şübhə yoxdur. Məgər Allah bütün insanların sinələrindəkini ən yaxşı bilən deyildirmi?».

**Quranda «fitnə» «düşmənlərin hücumu», «Allahın insanlara fərqli imkanlar verərək onların imkanlarını üzə çıxarması», «günah», «şeytanın hiyləsi», «batil inanc», «dəlilik», «nifaq» mənalarında da işlədilmişdir:**

بِأَييِّكُمُ الْمَفْتُونُ

(Qələm, 68/6)

«Hansınızda imiş o fitnə və dəlilik».

İslam alimləri fitnə kəlməsini siyasi mənada işlədərək müsəlmanlar arasında baş verən hakimiyyət davalarına işarə etmişlər. İslam alimlərinin çoxu ilk fitnənin hz.Osmanın (r.a.) öldürülməsi ilə başladığını bildirir. Sonrakı dönəmlərdə «fitnə» qavramı məna çalarlarını artıraraq «qarışıqlıq», «qarşıdurma», «hakimiyyətə qarşı müqavimət», «üsyan», «anarxiya» kimi mənalarında da işlədilmişdir.

İslam Peyğəmbərinin (s.a.s.) hədislərində də «fitnə» anlayışına geniş yer verilmiş, bu qavram fərqli mənalarda işlədilmişdir. Hədis kitablarında bu mövzulu hədislər «Fitən» («Qarışıqlıqlar») adı altında verilmişdir.

Biz hz.Nizaminin nətində ayrıca yer verdiyi «fitnə» anlayışını daha dərindən anlamaq məqsədilə bu qavramın hədislərindəki yerini də imkan daxilində şərh edək, uyğun misallar verək.

Hz.Məhəmmədin (s.a.s.) hədislərinə görə, müsəlmanın canına və malına təcavüz etmək, müsəlmanın müsəlmanı qorxutması, müsəlmanın müsəlmana silah yönəltməsi, qılıncın qınından çıxarılmış vəziyyətdə verilməsi, islam toplumundan ayrılmaq bir fitnədir.

İbni Ömər (r.a.) rəvayət edir. «Ömər Şamın bir bölgəsi olan Cabiyədə bizə bir xütbə söyləyərkən belə dedi: «Rəsul-ullahın (s.a.s.) bizə söylədiyi bəzi şeyləri sizə söyləmək üçün aranızdayam. O, bizə belə demişdi: «Sizə əshabım, sonra onların arxasından gələnləri, sonra da onların arxasından

gələnlərin həyatlarını tövsiyə edirəm. Onlardan sonrakı nəsillərdə yalan yayılacaq. O dərəcədə ki, özündən and içməsi istənilmədiyi halda insanlar and içəcəklər, şahidlik istənilmədiyi halda insanlar yalan şahidliyi edəcəklşər. Diqqət edin, bir kişi bir qadınla təkbaşına qalmasın, üçüncüləri şeytandır. İslam camaatından ayrılmayın, ayrılıqdan çəkinin, çünki şeytan camaata qatılmayıb tək qalanlarla bərabərdir. Şeytan camaatdan olan iki kişidən uzaqdır. Kim cənnətin ən gözəl yerlərində köşk sahibi olmaq istəyərsə, İslam camaatından ayrılmasın. Kimi etdiyi yaxşılıq sevindirir və pislik də üzürsə, o kimsə mömindir».[584]

**Bu hədisdə fitnələri tanıdan önəmli ölçülər var. Hədisə görə, yalan fitnədir, yalandan and içmək fitnədir, yalandan şahidlik etmək fitnədir, bir qadınla təkbaşına qalmaq fitnədir, islam toplumundan ayrılmaq fitnədir. Bu göstərilənləri fitnə yaradan səbəblər kimi də dəyərləndirə bilərik. Doğrudan da bir çox fitnələr yuxarıda göstərilən səbəblərlə baş qaldırmışdır.**

Hz.Məhəmməd (s.a.s.) bu ölçüləri şərh edərək «Allahın yardımı camaatla bərabərdir», söyləmişdir.[585]

**Hz.Məhəmmədin (s.a.s.) hədislərinə görə pislikləri ortadan qaldırmamaq, pis niyyət, dilin acı olması, əmanət və etibarın ortadan qalxması bir fitnədir.**

Abdullah b. Amr (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Bütün ərəb aləmini tam əhatə edəcək olan bir fitnə çıxacaqdır. Bu qarışıqlıqda ölənlər cəhənnəmlikdir. Bu qarışıqlıqda dil qılıncdan daha kəskin olacaqdır».[586]

**Hz.Məhəmmədin (s.a.s.) hədislərinə görə, müsəlmanın müsəlmanı öldürməsi, çoxlu qarışıqlıqların**

---

[584] Süneni-Tirmizi, Konya, 2004, c. II, s. 208.
[585] Süneni-Tirmizi, Konya, 2004, c. II, s. 208.
[586] Süneni-Tirmizi, Konya, 2004, c. II, s. 211.

**olması, elmin yox olub, qanlı hadisələrin ortaya çıxması bir fitnədir. Hz.Məhəmməd (s.a.s.) qiyamətin əlamətlərini sayarkən fitnələrin çox olmasını ayrıca vurğulayır:**

Enes b. Malik (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Bunlar qiyamətin əlamətləridir: «Elmin ortadan qalxıb, cahilliyin hər yeri tutması, zinanın yayılması, içkinin çox içilməsi, qadınların sayının artması, kişilərin sayının azalması, hətta əlli qadına bir kişinin düşməsi vəziyyətinin yaranması».[587]

Enes b. Malik (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Qiyamətə yaxın qaranlıq gecənin parçaları kimi qarışıqlıqlar ortaya çıxacaq. O qarışıqlıqlar içində adam mömin olaraq sabahlayıb, kafir olaraq axşamlayacaqdır və bəziləri də axşama mömin olaraq çıxıb, sabaha kafir olacaqdır. Bir sıra adamlar dinlərini dünyalıq qarşılığında satacaqlar».[588]

**Hz.Məhəmmədin (s.a.s.) hədislərinə görə, insanlar arasında inamın azalması, etibarın aradan qalxması bir fitnədir.**

İslam Peyğəmbərinin (s.a.s.) bir sıra hədislərində qiyamətin yaxınlaşdığı zaman çoxsaylı fitnələrin ortaya çıxacağı bildirilir. Hədislərdə göstərilən bu fitnələri aşağıdakı kimi ümumiləşdirə bilərik: günəşin qərbdən doğması, Yəcuc və Məcucun çıxması, yer batması hadisəsi, Quran oxunduğu halda dindən çıxanların olması, böyük qarışıqlıqların ortaya çıxması, qanlı hadisələrin baş verməsi, elmin ortadan qalxması, cahilliyin çoxalması, zinanın yayılması, Hicaz bölgəsindən bir atəşin çıxması, yalançı peyğəmbərlərin

---

[587] Süneni-Tirmizi, Konya, 2004, c. II, s. 219.
[588] Süneni-Tirmizi, Konya, 2004, c. II, s. 217.

yaranması, Dəccalın ortaya çıxması, müsəlman toplumları arasında irqçilik üzündən savaşın olması, can və mala təcavüzün halal sayılması, zalımların idarəçi olması və başqa fitnələr qiyamətin əlamətləri sırasında yer tutur.

**Hz.Məhəmməd (s.a.s.) bir hədisində öz ümmətinin fitnəsinin (sınağının) nə ilə olacağını da göstərmişdir:**

Kab ibni İyaz (r.a.) rəvayət edir: «Rəsulullah belə buyurdu: «Şübhəsiz hər ümmətin bir fitnəsi vardır. Ümmətimin fitnəsi (imtahan vəsiləsi) də maldır».[589]

Hz.Məhəmmədin (s.a.s.) bir sıra hədislərində fitnələrin getdikcə ağırlaşacağı bildirilir.

Abdullah ibni Amr (r.a.) rəvayət edir. «Rəsuli-Əkrəm belə buyurdu: «Məndən öncəki bütün peyğəmbərlərin vəzifəsi ümmətlərini yaxşı olduğunu bildikləri şeyə dəvət etmək, pis olduğunu bildikləri şeydən də çəkindirmək idi. Sizin içində olduğunuz ümmətin huzur və sakitliyi öncə gələnlər zamanında olacaq. Daha sonrakıların başına çeşidli bəlalar və bilmədiyimiz pisliklər gələcəkdir. Elə fitnələr çıxacaq ki, bu fitnələrin bir qismi başqasından daha xəfif olacaqdır. Yenə elə fitnə və qarışıqlıq çıxacaq ki, onu görən mömin «elə məni bu məhv edər», deyəcəkdir. Sonra ortalıq sakitləşəcək, arxasından elə müdhiş bir fitnə çıxacaq ki, mömin «daha bundan qurtuluş yoxdur», deyəcəkdir».[590]

Hz.Məhəmməd (s.a.s.) bir sıra hədislərində fitnə zamanı görüləcək işləri göstərmişdir. Malik ibni Yəsar (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Ortalıq qarışıqlıq içində ikən ibadət etmək, mənə hicrət etmək kimidir».[591]

---

[589] Riyazüs-Salihin, göstərilən qaynaq, c. III, s. 225.
[590] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 55.
[591] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 138.

**Hz.Məhəmməd (s.a.s.) fitnə zamanı ona qoşulmamağı buyurur, tək çıxış yolunun bu olduğunu göstərir.**

Əbu Nəcih İrbaz ibni Sariyə (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) bizə çox təsirli bir öyüd verdi. Bu öyüddən qəlblər titrədi, gözlər yaşardı. Bizlər:

- Ey Allahın Rəsulu! Bu öyüd sanki ayrılmaq üzərə olan birinin öyüdünə bənzəyir. Bizə bir tövsiyə et, dedik.

Rəsulullah (s.a.s.):

- Sizə, Allaha qarşı çox hörmət etməyinizi, idarəçiniz bir həbəşli kölə belə olsa, onu dinləyib itaət etməyinizi tövsiyə edirəm. Məndən sonra sağ qalıb uzun bir həyat sürənlər çox ixtilaflar görəcəklər. O zaman sizin üzərinizə düşən mənim sünnətimə və doğru yolda olan Xülafeyi-Raşidinin sünnətinə sarılmaqdır. Bu sünnətlərə sıx sarılın. Sonralar ortaya çıxarılmış bidətlərdən şiddətlə qaçın. Çünki hər bidət dəlalətdir, sapıqlıqdır».[592]

Biz «fitnə» qavramının lüğəvi, dini, hüquqi, sosial, siyasi çərçivəsini müəyyən etdik. (Onu da deyək ki, «fitnə» qavramının bədii yükü də var. Bədii ədəbiyyatda «fitnə» anlayışından çox istifadə edilmişdir).

## HƏZRƏT NİZAMİNİN «FİTNƏ» ANLAYIŞINA VERDİYİ MƏNA

**İndi hz.Nizaminin beytinə baxaq. Şair beytdə hz.Məhəmmədin (s.a.s.) «fitnələri yatırmağından» danışır. Buradan aydın olan odur ki, hz.Nizami «fitnə» qavramının yuxarıda göstərdiyimiz bütün mənalarını nəzərdə tutmuşdur. Yəni hz.Məhəmməd (s.a.s.) onun üçün nəzərdə tutulmuş fitnələrin (imtahanların,**

[592] Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 553-554.

**sınaqların) hamısından alnı açıq, üzü ağ çıxmışdır. Bura həm ilahi sınaqlar daxildir, həm də ayrı-ayrı insanların, qrupların çeşidli məqsədlərlə ortaya çıxardığı imtahanlar.**

İkincisi, hz.Məhəmmədin (s.a.s.) peyğəmbərliyindən öncə və sonra baş verən bir sıra dini, sosial xarakterli fitnələr var ki, Peyğəmbər (s.a.s.) onları uğurla həll etmişdir. **O, hər çətinliyi bir sınaq, bir fürsət kimi dəyərləndirmiş, ondan çəkinməmiş və bu məsələləri Allahın (c.c.) buyruqlarına uyğun həll etmişdir. Fitnələr zamanı onun ağlı, uzaqgörənliyi, səbri, elmi, etibarı, ədaləti, Allahın (c.c.) dinini yaymaq şansı ortaya çıxmış və o, fitnələri həll etmək yolu ilə də xalqın qəlbinə yerləşmişdir.**

Hz.Nizami onun bu fitnələri həlletmə metod və yolunun gözəlliyini, «ürəyə yatmaq» ifadəsi ilə dilə gətirmişdir. O, fitnələri həll edərkən toplumu birləşdirmək yolunu tutmuşdur, hər kəsin haqqını özünə vermişdir. Hz.Nizami deyir ki, o fitnələri elə həll edirdi ki, «hamı ona məftun idi».

Hz.Nizaminin bu dəyərləndirməsinin çoxsaylı tarixi qaynağı var. Məsələn, peyğəmbərlikdən öncə, hz. Məhəmməd (s.a.s.) 35 yaşında olarkən qureyşlilər sel nəticəsində bəzi yerləri yıxılmış Kəbəni təmir etməyi qərara aldılar. O, daş daşıyaraq bu işdə iştirak etdi. Müqəddəs daş sayılan «Həcərül-Əsvəd»i Kəbədəki yerinə qoymaq vaxtı gələndə qəbilələr arasında qovğa çıxdı. Hər qəbilə bu daşı özü yerinə qoymaq istəyirdi. Qarşıdurma gücləndi və qan tökülmək təhlükəsi yarandı. Bu an onların içindən yaşlı bir insan «… mübahisəyə son qoyaq, bu gün Şeybə qapısından Kəbəyə girən ilk insanın hakimiyyətini qəbul edək, onun verəcəyi qərara əməl edək», dedi. Hamı bu təklifi qəbul etdi. O gün qapıdan ilk daxil olan hz.Məhəmməd (s.a.s.) oldu. Hz. Məhəmməd (s.a.s.) bu fitnəni, ixtilafı belə həll etdi. Yerə bir

parça sərdi, daşı bu parçanın üzərinə qoydurdu. Hər qəbilə təmsilçisini bu üzərinə daş qoyulmuş parçanın bir ucundan tutmağa dəvət etdi. Daşı qoyulacağı yerə gətirdilər. O, öz əli ilə daşı yerinə qoydu.

Bu fitnəni həll etməsi ilə o, Məkkədə barış yaratdı, məkkəlilərin gözündə ucaldı, etibar qazandı, ağıllı, ədalətli olduğunu göstərdi, hz.Nizaminin sözləri ilə «hamı ona məftun oldu».

Təbii ki, insanlar doğru, ədalətli saydıqları şeylərə heyran olurlar. Biz, hz.Nizaminin dəyərləndirməsindən çıxış edərək hz.Məhəmmədin (s.a.s.) fitnələri həll etmə prinsiplərini müəyyən edə bilərik.

İlk olaraq onu deyə bilərik ki, hz.Məhəmmədin (s.a.s.) fitnələri həll etməkdə seçdiyi yol ilahi buyruğa uyğundur:

ادْعُ إِلِى سَبِيلِ رَبِّكَ بِالْحِكْمَةِ وَالْمَوْعِظَةِ الْحَسَنَةِ وَجَادِلْهُم بِالَّتِي هِيَ
أَحْسَنُ إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ بِمَن ضَلَّ عَن سَبِيلِهِ وَهُوَ أَعْلَمُ بِالْمُهْتَدِينَ

(Nəhl, 16/125)

«İnsanları hikmətlə, gözəl öyüd-nəsihətlə Rəbbinin yoluna dəvət et. Onlarla ən gözəl surətdə mücadilə et. Həqiqətən, sənin Rəbbin yolundan azanları bilən, doğru yolda olanları da tanıyandır!».

## HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) FİTNƏLƏRİ HƏLL ETMƏK YOLU

**Hz.Məhəmməd (s.a.s.) bu ilahi buyruğa uyğun olaraq fitnələri aşağıdakı prinsiplərlə həll etmişdir:**

**- hər zaman ilahi buyruğa sadiq qalmaq;**

**- ədalətli olmaq;**

**- tərəflərin imkanlarını nəzərə almaq;**

**- insanlara sevgi ilə yanaşmaq, onların haqqlarına hörmət etmək;**

**- qisas, intiqam, şəxsi mənfəət duyğularından uzaq olmaq;**

**- barışı, sülhü, dinc yolu üstün tutmaq;**

**- bağışlamağı, güzəşt etməyi bacarmaq.**

Hz.Məhəmməd (s.a.s.) bütün fitnələri bu prinsiplərlə həll etdi. Məkkəli müşriklər onun Məkkədə qalmasına imkan verməyəndə onlarla savaşmaq yerinə Mədinəyə hicrəti üstün saydı. O, savaşmaq məcburi hala gəlmədikcə döyüşməmişdir, barış peyğəmbəri olduğunu bildirmişdir.

Hz.Məhəmməd (s.a.s.) Xudeybiyə barış anlaşmasına müşriklərin tələbinə görə «Abdullahın oğlu Məhəmməd» adına imza atması onun hədəfdən yayınmamaqla güzəşt etmək bacarığını göstərir.

**Hz.Məhəmməd (s.a.s.) fitnələrin bir çoxunu söhbət, anlatma, başa salmaq yolu ilə həll etmişdir:**

«Gənc bir adam hz.Peyğəmbərin yanına gələrək «zina etmək» üçün icazə istədi. Orada olan adamlar bu cavana «sus, sus!», «tərbiyəsizlik etmə!», - dedilər. Hz.Peyğəmbər (s.a.s.) isə onu yanına çağırdı.

- Bu arzu etdiyin şeyin anana edilməsini arzu edərsənmi?

Dəliqanlı:

- Xeyr, ey Rəsulullah, vallah istəmərəm. Allah məni sənə qurban etsin…

- İnsanlar da belədir. Anaları ilə zina edilməsini arzu etməzlər. Yaxşı, qızınla zina edilməsini arzu edərsənmi?

- Xeyr, ey Allahın Rəsulu. Allah məni sənə qurban etsin, istəmərəm.

- İnsanlar da belədir. Qızları ilə zina edilməsini arzu etməzlər. Sənin bacın zina edərsə, xoşuna gələrmi?

- Xeyr, vallah istəmərəm. Canım sənə fəda olsun.

- Başqaları da bunu istəməzlər. Sənin xalan zina edərsə, xoşuna gələrmi?

- Xeyr, ey Rəsulullah, vallah istəmərəm. Canım sənə fəda olsun.

-Başqaları da bunu istəməzlər. Sənin bibin zina edərsə, xoşuna gələrmi?

- Xeyr, vallah istəmərəm. Canım sənə fəda olsun.

- Başqaları da bunu istəməzlər.

Hz.Məhəmməd (s.a.s.) əlini gəncin üzərinə qoydu və dedi: «Allahım, bu qulun günahını bağışla, qəlbini pisliklərdən təmizlə və onu zinadan qoru!»[593]

Gənc tövbə edərək hz.Məhəmmədin (s.a.s.) yanından ayrıldı.

Bu hədisdə hz.Məhəmmədin (s.a.s.) fitnəni həll metodu bir insanın tövbəsi ilə nəticələnir, həm bir insan xilas olur, həm də pisliklərin yayılmasının qarşısı alınır.

Hz.Nizami başqa beytlərdə olduğu kimi bu beytdə də önəmli olan bir anlayış seçərək onun verdiyi imkanlarla hz.Məhəmmədi (s.a.s.) anlatmışdır. **«Fitnə» qavramı şairə hz.Məhəmmədin (s.a.s.) fərdi, əxlaqi, dini, sosial, millətlərarası, dinlərarası münasibətlərdə məsələlərə yanaşma üsulunu, metod və prinsiplərini şərh etmək baxımından böyük imkanlar vermişdir. Şair çeşidli fitnələr qarşısında hz.Məhəmmədin (s.a.s.) tutumunu detallara varmadan təsvir etmişdir. Daha doğrusu, onun fitnələri həllinin nəticələrini bədii bir biçimdə təqdim etmişdir. Bunun üçün «ürəyə yatmaq» («delpəzir»), «hamı ona məftundur» («naqozir») kimi sevgi yaradan, insanların ona münasibətini ifadə edən sözlər seçmişdir.**

Əslində, «fitnə» ilə «sevgi» anlayışları leksik antonimlərdir. Şair yuxarıdakı beytlərdə də belə antonimlərin

[593] Dini egitim ve ögretim, s. 212.

(«dinməzlik-danışıq», «dostluq-eyib») yararlanaraq beytin ideya yükünü təqdim etmişdir.

Ancaq fitnələri həll üsulu ilə sevgi qazanmaq, insanları birləşdirmək hz.Məhəmmədin (s.a.s.) bacardığı bir işdir. Biz deyə bilərik ki, «fitnə» elə bir qavramdır ki, ondan baxanda hz. Məhəmməd (s.a.s.) bütün əzəməti ilə görünür. Hz. Nizaminin «fitnə» qavramı ilə «sirrə» çevirdiyi məna da bizim anlayışımızda budur.

## ON DOQQUZUNCU BEYTİN ŞƏRHİ: AĞIRTAXTALI VƏ YÜNGÜLYERİŞLİ QÜTB O İDİ

Hz.Nizami nətin on doqquzuncu beytində hz. Məhəmmədin (s.a.s.) ağsaqqal obrazını yaratmışdır:

بر همه سر خیل وسر خیر بود
قطب گرانسنگ سبک سیر بود

***Bütün qəbilələrin, bütün xeyir işlərin başçısı o idi.***
***Ağırtaxtalı və yüngülyerişli qütb o idi.***[594]

Bu beytdə hz.Məhəmmədi (s.a.s.) tanıdacaq bir neçə anlayış var. O, qəbilələrin başçısıdır, o, ağırtaxtalıdır, o, yüngülyerişlidir, o, qütbdür. Biz bir-bir bu anlayışları şərh etməyə çalışaq.

## HƏZRƏT MƏHƏMMƏD (s.a.s.) UŞAQLARA GÖZƏL AD QOYARDI

Təbiidir ki, hz.Məhəmmədin (s.a.s.) bütün xeyir işlərini saymaqla qurtarmaz. Ümmətin sevgisini yaradan, ona inamını göstərən belə xeyir işlərdən biri hz.Məhəmmədin (s.a.s.) uşaqlara gözəl adlar qoymasıdır. Peyğəmbər (s.a.s.) adın insana ciddi təsirini nəzərə alaraq pis adları dəyişdirir, uşaqlara güc, iman, özünəinam təlqin edəcək adlar qoyurdu. İnsanlar yeni doğulan uşağı onun yanına gətirər, peyğəmbər də uşağın dodağına xurma şirəsi sürtər, ona dua edər və ad qoyardı. Hz.Məhəmməd (s.a.s.) uşaqlara pis dua edilməsini də yasaqlayırdı.

Cabir (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Özünüzə bəd dua etməyin, uşaqlarınıza da bəd dua etməyin. İstəklərin qəbul edildiyi zamana uyğun gələr və Allah bəd duanızı qəbul edər».[595]

---

594 Nizami Gəncəvi, Sirlər xəzinəsi, göstərilən qaynaq, s. 26.
595 Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 387.

Hz.Məhəmməd (s.a.s.) uşaqlara salam verirdi.

Enes (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) mənə: «Övladım! Öz ailənin yanına gedəndə onlara salam ver ki, sənə və ev xalqına bərəkət olsun».[596]

İslam peyğəmbəri uşaqlarla zarafat edir, onları çox sevir, yeri gələndə onlarla məsləhətləşirdi.

Səhb ibni Sad (r.a.) rəvayət edir. «Rəsulullaha (s.a.s.) içiləcək bir şey gətirdilər. O da içdi. Bu vaxt sağ tərəfində bir uşaq, sol tərəfində yaşlılar otururdu. Rəsuli-Əkrəm (s.a.s.) uşağa dönərək:

- Bunu yaşlılara verə bilərsənmi?, - deyə soruşdu.

Uşaq:

- Xeyr, vallahi olmaz, ey Rəsulullah! Səndən qazanacağım xeyri kimsəyə bağışlamaram, dedi.

Rəsulullah (s.a.s.) da qabı uşağa verdi».[597]

**Hz.Məhəmməd (s.a.s.) uşaqlara dua etmək öyrədər, valideynlərə tərbiyə məsələləri ilə bağlı tövsiyələr verər, uşaqlara erkən yaşdan başlayaraq tərbiyə və elm öyrətməyin önəmini anladardı. O, hər zaman insanların arasında idi, onların dərdlərini, sevinclərini paylaşardı, sıxıntıda olan insanlara yardım edər, onlara təsəlli verərdi.**

Rəsulullahın (s.a.s.) azad köləsi, dostu və dostunun oğlu olan Əbu Zeyd ibni Zeyd ibni Harisə (r.a.) belə rəvayət edir: «Qızı (Zeynəb) Nəbiyə (s.a.s.):

Oğlum ölmək üzrədir, xahiş edirəm bizə gəlin, deyə xəbər göndərdi. Peyğəmbər (s.a.s.):

[596] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 438.
[597] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 251.

«Alan da, verən də Allahdır. Onun yanında hər şeyin bəlli bir vaxtı var. Səbir etsin və əcrini Allahdan gözləsin, buyuraraq qızına salam göndərdi.

Qızı Peyğəmbərə (s.a.s.) «Nə olar, mütləq gəlsin», xəbərini göndərdi. Bu dəfə Peyğəmbər (s.a.s.) yanında Sad ibni İbadə, Muaz ibni Cəbəl, Übeyy ibni Kaab, Zeyd ibni Sabit və başqa bəzi səhabələr olduğu halda qalxıb getdi. Uşağı hz.Peyğəmbərə (s.a.s.) verdilər, qucağına aldı. Uşaq çox çətin nəfəs almaqda idi. Rəsulullahın gözlərindən yaşlar axdı. Sad ibni Ubadə:

- Ey Allahın Rəsulu, bu nə haldır?, - dedi.

Nəbi (s.a.s.) də:

- Bu Allahın qullarının qəlbinə qoymuş olduğu mərhəmət duyğusudur».[598]

## HƏZRƏT MƏHƏMMƏD (s.a.s.) YOXSULLARIN PƏNAHI İDİ

**Hz.Məhəmməd (s.a.s.) yoxsullara əl tutur, sədəqə, zəkat verir, küsülüləri barışdırır, qonşu haqqına ayrıca önəm verirdi. O, qonşuların hədiyyələşməsini, qonşuya salam verməyi, qonşu xəstə olanda onu ziyarət etməyi, qonşuya yemək verməyi tövsiyə edirdi.**

Əbu Şüreyh əl-Huza (r.a.) rəvayət edir. Peyğəmbər (s.a.s.) belə buyurdu: «Allaha və axirət gününə iman edən kimsə qonşusuna yaxşılıq etsin. Allaha və axirət gününə iman edən kimsə qonağına yemək versin. Allaha və axirət gününə iman edən kimsə ya faydalı söz söyləsin, ya da sussun».[599]

Hz.Məhəmməd (s.a.s.) hər zaman xəstələri ziyarət edərdi, onlara Allahdan şəfa istəyərdi.

---

598 Riyazüs-Salihin, göstərilən qaynaq, c. I, s. 217.

599 Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 403.

Hz.Aişə (r.a.) rəvayət edir. «Nəbi (s.a.s.) ailə fərdlərindən biri xəstələnəndə sağ əli ilə xəstəni sığallayaraq belə dua edərdi: «Bütün insanların Rəbbi olan Allahım! Bunun iztirabını aradan aparıb şəfa ver. Sənin şəfandan başqa şəfa yoxdur. Buna heç bir xəstəlik izi qoymayacaq şəkildə şəfa ehsan et!»[600]

**Hz.Məhəmməd (s.a.s.) xəstə ziyarətinə ayrıca önəm verirdi.**

İbni Abbas (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Kim hələ əcəli gəlməmiş bir xəstəni ziyarət edər və onun baş ucunda yeddi dəfə «bu ərşin sahibi uca Allahdan səni sağaltmasını istəyirəm», deyə dua edərsə, Allah o xəstəni sağaldar».[601]

**Hz.Məhəmməd (s.a.s.) ölən müsəlmanların dəfnində iştirak edir, onların cənazə namazını qıldırırdı. Onun ölçülərinə görə, cənazəyə dua etmək, onun borclarını ödəmək (dövlətin ödəməsi), cənazə törənində iştirak etmək, onu torpağa gömmək müsəlmanın borcudur.**

Əbu Umarə Bəra ibni Əzib (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) bizə bu yeddi şeyi əmr etdi: «Xəstə ziyarətini, cənazədə iştirak etməyi, asqırana xeyir diləməyi, zəifə yardım etməyi, məzluma yardımçı olmağı, salamı yaymağı və and içənin andının yerinə yetirilməsini təmin etməyi».[602]

Təbiidir ki, uşaqlara münasibət, onların doğru tərbiyəsinin prinsiplərinin müəyyənləşdirilməsi, xalqın arasında olmaq, onların sevinc və kədərini bölüşmək, sədəqə, zəkat vermək, qonşu haqqını qorumaq, xəstə ziyarət etmək, cənazə törənində olmaq, xalqa xeyirdə və çətin günlərdə imamlıq etmək, insanlar üçün fədakarlıq göstərmək, yoxsula,

---

[600] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 508.
[601] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 514.
[602] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 412.

yetimə əl tutmaq, küsülüləri barışdırmaq, qan davasını aradan qaldırmaq, cavanlara ailə qurmağa yardım etmək, qəbilələrin qəbul etdiyi inanılmış bir insan olmaq hz.Məhəmmədin (s.a.s.) peyğəmbərlik və dövlət başçısı kimi vəzifələrinin gerçəkləşməsinə, onun xalqın könlünə yerləşməsinə yol açdı. Onun gördüyü xeyir işlərdən biri də borclu insanlara olan münasibəti ilə bağlıdır. Onun ölçülərinə görə, sıxıntıda olana borc vermək, borcu ödəməyi asanlaşdırmaq, alınan borcu vaxtında qaytarmaq müsəlmanın vəzifəsidir.

Cabir (r.a.) rəvayət edir. «Rəsulullah (s.a.s.) belə buyurdu: «Satışda, alışda və borcunu istəməkdə asanlıq yaradan kimsəyə Allah rəhmət etsin».[603]

Əbu Katadə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Qiyamət gününün sıxıntılarından Allahın onu qurtarmasından xoşlanan kimsə borcunu ödəməyənə möhlət tanısın, ya da ondan bir bölümünü endirsin».[604]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «İnsanlara borc pul verən bir adam var idi. O, xidmətçisinə belə deyərdi:

- Darda qalmış bir yoxsul görəndə onu əfv et. Ümid edirik ki, Allah da bizim günahlarımızı əfv edər.

Nəhayət, o kişi Allaha qovuşdu və Allah onu əfv etdi».[605]

Əbu Məsud əl-Bədri (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Sizdən öncəki ümmətlərdən bir adam hesaba çəkildi. Xeyir adına heç bir şey tapılmadı. Ancaq bu adam insanlarla oturub durardı və zəngin bir adam idi. Xidmətçisinə darda qalan yoxsulların borcunu bağışlamasını

---

[603] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 145.
[604] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 147.
[605] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 149.

əmr edərdi. Əziz və Cəlil olan Allah: «Biz əfv etməyə ondan daha layiqik, onu əfv edin», buyurdu».[606]

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Bir adam darda olan borcluya möhlət verər, ya da borcunun bir qismini, tamamını bağışlarsa, uca Yaradan o insanı Allahın (c.c.) kölgəsindən başqa kölgə olmayan qiyamət günündə ərşinin altında kölgələndirər».[607]

Hz.Məhəmməd (s.a.s.) borclu insanların borcunu ödəməyi öz üzərinə götürmüşdü. Cabir (r.a.) belə rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «… Mən hər möminə onun nəfsindən daha yaxınam, daha üstünəm. Bir adam ölərkən mal qalarsa, o mal öz yaxınlarına aiddir. Ancaq borc, ya da yetimlər qalarsa, o borc mənə aiddir, yetimlərə baxmaq da mənim vəzifəmdir».[608]

Bu dediklərimiz və sadalamadığımız çoxsaylı gözəl, xeyir işlər hz.Məhəmmədin (s.a.s.) liderliyinin örnəkləridir.

## HƏZRƏT NİZAMİNİN BEYTİNDƏ HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) ŞƏMAİLİNİN TƏSVİRİ

**Hz.Nizami bu beytdə hz. Məhəmmədi (s.a.s.) bütün yönləri ilə təqdim edir. Şairə görə, onun hər işi gözəldir. O həm xeyir işlərin, qəbilələrin başçısıdır, ağsaqqalıdır, həm də bədəni, danışığı, hərəkəti, yerişi, baxışı da gözəldir. Onda hər şey bir-birini tamamlayır. Şair bu Peyğəmbər əxlaqı ilə Peyğəmbər əzəməti arasındakı ahəngi vermək üçün «ağırtaxtalı» («gəransəng»), «yüngülyerişli» («tez yeriyən»-«səbok seyr») sözlərini seçir. Bu sözlərdən görünür ki, o, hz.Məhəmmədin (s.a.s.) şəmaili ilə bağlı məsələləri də dəqiq öyrənib.**

---

[606] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 149.
[607] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 150.
[608] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 14.

Şəmail kitablarında hz.Peyğəmbərin (s.a.s.) bədən cizgiləri ilə bağlı bütün məsələlərə yer verilib. Qaynaqlara görə, o yeriyərkən ayağını yerlə sürüməz, addımlarını atarkən yerdən sərt qaldırar, hərəkətdə olarkən sağa-sola sallanmazdı. O, enişli-yoxuşlu bu yerdə yeriyən adamlar kimi belini azca irəli əyirdi. O, dik, köksünü qabardaraq yeriməz, qaçmağa bənzəyən sürətli addımlarla da hərəkət etməzdi. Ancaq Allah (c.c.) ona bir nemət də vermişdi. O, uzun məsafələri qısa zamanda qət edərdi. (hz. Nizami onu «ağırtaxtalı», «yüngülyerişli» adlandırır). Hz.Məhəmmədə (s.a.s.) görə, insanın geyimi ilə yerişi, xarakteri arasında sıx bağlılıq var. O, yanından ox-yay qursanmış bir qadın keçəndə ona: «Özünü kişilərə bənzədən qadına, qadınlara bənzədən kişilərə Allah lənət etmişdir», demişdir.

«Öte yandan Hazreti Peyğamberin yürüyüş-kiyafet ilişkisini bir «karakter ölçüsü» çerçivesinde deyerlendirdiyi görülmektedir. O, bir çox hadisinde elbise eteklerinin yerleri süpürecek şekilde uzatılmamasını ve bunu kibir, qurur ve gösteriş vesilesi yaparak, eteklerin elle yukarı çekilmemesini, aksi davranışta bulunanların ise, kiyamet gününde Allahın yüzlerine bakmıyacağını söylemiştir».[609]

**Hz.Məhəmməd (s.a.s.) bir örnək şəxsiyyət olduğundan o hər davranışı, o sıradan yerişi, geyimi ilə də insanları tərbiyə edirdi. İnsanlar gözəl danışmağı, gözəl geyinməyi, gözəl yeriməyi ondan öyrənirdilər. Hz.Nizami onun bu vəzifəsini, örnək olmaq özəlliyini gözəl biçimli və bu ilahi işin bütün mahiyyətini özündə toplayan, ümmət-peyğəmbər münasibətlərini anladan bir sözlə –«qütb» qavramı ilə ifadə etmişdir. Biz bu anlayışın şərhinə qayıdacağıq.**

[609] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 182.

Hz.Məhəmmədin (s.a.s.) yerişi də ilahi buyruğa uyğundur:

وَلَا تُصَعِّرْ خَدَّكَ لِلنَّاسِ وَلَا تَمْشِ فِي الْأَرْضِ مَرَحاً إِنَّ اللَّهَ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍ . وَاقْصِدْ فِي مَشْيِكَ وَاغْضُضْ مِن صَوْتِكَ إِنَّ أَنكَرَ الْأَصْوَاتِ لَصَوْتُ الْحَمِيرِ

(Loğman, 31/18-19)

«Adamlardan təkəbbürlə üz çevirmə, yer üzündə lovğa-lovğa gəzib dolanma. Həqiqətən, Allah heç bir özündən razını, lovğalanıb fəxr edəni sevməz! Yerişində müvazinət gözlə və səsini qaldırma. Çünki ən çirkin səs uzunqulaq səsidir!».

**Hz.Nizami beytdə Peyğəmbəri (s.a.s.) «ağırtaxtalı, yüngülyerişli» adlandırır. Bəs, hz.Məhəmmədi (s.a.s.) görən mübarək insanlar nə deyir:**

Əbu Hureyrə (r.a.) rəvayət edir: «Mən, Rəsulullahdan (s.a.s.) daha gözəl birini görmədim. Sanki günəş Onun mübarək üzündə dövr edirdi. Peyğəmbərdən (s.a.s.) daha sürətli yeriyən («yüngülyerişli», «tez yeriyən» - «səbok seyr» - Nizami) birisini də görmədim. O, yeriyərkən elə bil ki, yer üzü ayaqları altında çevrilirdi (bükülürdü). Bizlər, arxalarından gedərkən geri qalmamaq üçün çox çalışırdıq. O isə bunu heç vecinə də almazdı».[610]

Hz.Əli (r.a.) buyurur: «Hz.Peyğəmbər yolda yeriyərkən, təkəbbürlü bir əda ilə, sinəsini gərərək (qabardaraq), sağına, soluna sallanaraq deyil, bir yoxuşdan enər kimi yüngülcə, önünə əyilərək yeriyərdi».[611]

Hz.Əlinin (r.a.) nəvələrindən İbrahim b. Məhəmməd rəvayət edir: «Dədəm hz.Əli (r.a.) Peyğəmbəri (s.a.s.)

---

[610] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 183.
[611] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 183.

tanıdarkən belə deyərdi: «Rəsulullah (s.a.s.) yeriyərkən adətən yoxuş aşağı enərcəsinə ayaqlarını sərt qaldırardı».[612]

Hədis kitablarında hz.Məhəmmədin (s.a.s.) vüqarını, əzəmətini, əminlik yaradan görünüşünü anladarkən onun oturuşuna da ayrıca yer verilmişdir. O, dizlərini qucağına alaraq, qolları ilə dizlərini qucaqlamaq şəklində, dizlərini qarnına çəkərək belinə doladığı bir kəmər, ya da qurşaqla onu bağlamaq şəklində, bardaşqurma şəklində, çöməlmə şəklində (yemək yeyərkən), kürəyi üstə uzanıb ayağını ayağının üstünə qoymaq şəklində (dincələrkən), bir şeyin üstündə oturaraq ayaqlarını aşağı sallamaq şəklində və diz çökərək oturmuşdur.

Əbu Davudun qeyd etdiyi rəvayətə görə, «hz. Peyğəmbər (s.a.s.) sabah namazını qıldıqdan sonra günəş tam doğuncaya qədər bardaş quraraq otururdu».[613]

Kaylə binti Məhrəmə (r.a.) rəvayət edir ki, o, Peyğəmbərin (s.a.s.) məsciddə dizlərini qarnına çəkib əlləri ilə bağlayaraq oturduğunu görüb. «Rəsulullahı (s.a.s.) sonsuz bir məhviyyət  və təvazu içərisində oturaraq görəndə heybətindən vücudum titrəməyə başladı».[614]

Abdullah b. Zeyd (r.a.) rəvayət edir: «Rəsulullahı (s.a.s.) məsciddə, kürəyi üstə uzanıb ayağını-ayağının üzərinə qoyduğunu gördüm».[615]

Əbu Səid əl-Hudri (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) məscidi-şərifdə oturduğu vaxt iki əli ilə dizlərini qucaqlayırdı. Allahın salat və salamı Onun üzərinə olsun».[616]

Qaynaqlar hz.Məhəmmədin (s.a.s.) «ağırtaxtalı» bir insan olduğunu qeyd edir, onun bədən quruluşunu bütün cizgiləri ilə anladır. O, uzuna yaxın ortaboylu idi. Bədəninin

---

[612] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 183.
[613] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 186.
[614] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 190.
[615] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 190.
[616] Ali Yardım, Peyğamberimizin şemaili, İstanbul, 1998, s. 190.

rəngi qırmızımtıl, nurani ağ idi, gözləri qara, qaşlarının arası geniş, saqqalı sıx, enlikürək, əlləri, ayaqları qalın, saçları qumral, düz ilə qıvrım arası bir biçimdə idi. Saçları qulağın sırğa yerinədək uzanır, ortadan ayrılırdı. O, saç və saqqalını təmiz, ölçülü saxlayar, darayar, sağlamlıq məqsədi ilə yatanda gözlərinə sürmə çəkər, səhər yuyardı. İki kürək sümüyü arasında peyğəmbərlik möhürü var idi. Yatdığı otaqda misvaq (diş fırçası), abdəst suyu, daraq olardı, təmizliyə çox diqqət yetirərdi. Gözəl ətirdən xoşu gələrdi. Onun bu bədən gözəlliyini **Yunis Əmrə** gözəl ifadə etmişdir:

**«… Gül Məhəmməd təridir.»**

O, yavaş-yavaş danışar, sözlərinin arasını ayırardı. O, kimsəni narahat edəcək bir biçimdə gülməzdi, təbəssüm edərdi. Təbəssüm edəndə dişləri inci dənəsi kimi görünərdi.

Abdullah b. Haris (r.a.) rəvayət edir: «Rəsulullahdan daha çox təbəssüm edən kimsə görmədim».[617]

O, sağ yanı üstə yatardı. Barmağında möhür kimi istifadə etdiyi, üzərində «Məhəmməd Rəsulullah» yazılmış, gümüşdən olan üzüyü var idi. Oturanda sağ, ya da sol tərəfinə yastıq qoyub söykənərdi.

O, diqqəti çəkən rəngləri olan paltar geyinməzdi. Yundan, pambıqdan, keçi qılından hazırlanmış paltarlar geyərdi, paltarları təmiz və səliqəli olardı.

Hz.Məhəmmədin (s.a.s.) «ağırtaxtalı» xarakterinə, onun zahiri görünüşünə ciddiyyət verən çalması, baş sarığı diqqəti çəkir.

Cabir b. Abdullah (r.a.) rəvayət edir: «Hz.Peyğəmbər (s.a.s.) fəth günü başında qara bir sarığı olduğu halda Məkkəyə girdi».[618]

---

[617] Hüseyin Algül, Peyğamberimizin şemaili, ahlak ve adabı, İstanbul, 2002, s. 11.
[618] Ali Yardım, Peyğamberimizin şemaili, s. 174.

Amr b. Hureyrə (r.a.) rəvayət edir: «Mən, Peyğəmbəri (s.a.s.) başında siyah sarıq gördüm».[619]

Abdullah b. Ömər (r.a.) rəvayət edir: «Peyğəmbər (s.a.s.) sarıq sarıdığı zaman sarığın ucunu arxadan kürək sümüklərinin arasına atardı».[620]

İbn Abbas (r.a.) rəvayət edir: «Hz.Peyğəmbər qara sarıqlı olaraq topluluq qarşısında xütbə oxumuşdur».[621]

**Hz.Nizaminin «ağırtaxtalı» deyə portretini cızdığı hz. Məhəmməd (s.a.s.) yaradılışdan, fitrətindən gözəl, mütənasib, ciddi idi.** Ümmü Məbəd onu belə təsvir edir: «Aydın üzlü, gözəl yaradılışlı idi. Kök olmadığı kimi zəif və incə də deyildi. Gözlərinin qarası və ağı bir-birindən tam ayrılmışdı. Saçı ilə kiprik və bığında tüklər canlı idi. Səsi qalın idi. Susduğu zaman vüqarlı, danışdığı zaman da heybətli idi. Uzaqdan baxanda insanların ən gözəli və ən sevimlisi kimi görünürdü, yaxından baxılanda da dadlı və xoş bir görüntüsü var idi. Çox şirin (gözəl) danışırdı. Orta boylu idi. Ona baxan kimsə nə qısa, nə də uzun olduğunu hiss edərdi. Üç kişinin arasında ən gözəl görünəni və nur üzlü olanı idi. Dostları onu ortaya alaraq dinləyirdilər. Buyurduğu zaman da o an buyruğunu yerinə yetirirdilər. Danışığı tox və qərarlı idi».[622]

Osmanlı dönəminin böyük alimi Ahmed Cevdet Paşa (ö, 1313/1895) bütün deyilənləri bir araya gətirərək hz. Məhəmmədin (s.a.s.) yaradılışını bütün detalları ilə təsvir etmişdir: **«Rəsuli-Əkrəm Fəxri-aləm Məhəmmədül-Mustafa (s.a.s.) xilqətcə və əxlaqca növi-bəni adəmin ən üstünü idi. Ənbiyayi-izam Əleyhim-üs-salatü vəs-səlam həzaratın bədəninin hər üzvü gözəl üzlü olub, Allahın**

---

[619] Ali Yardım, Peyğamberimizin şemaili, s. 174.
[620] Ali Yardım, Peyğamberimizin şemaili, s. 174.
[621] Ali Yardım, Peyğamberimizin şemaili, s. 174.
[622] Ali Yardım, Peyğamberimizin şemaili, s. 48.

**sevimlisi, onların ən gözəli idi. Mübarək cismi gözəl, hər əzası mütənasib, bədəni çox gözəl, alnı və köksü, iki çiyninin arası, ovucları geniş, boynu uzun, biçimli, gümüş kimi saf, çiyinləri, bazuları, baldırları iri, qalın, biləkləri uzun, barmaqları uzunca, əlləri və barmaqları qalın idi. Mübarək cildi isə ipəkdən yumşaq idi.**

**Kamali-ölçü üzərə böyük başlı, hilal qaşlı, çəkmə burunlu, az dəyirmi çöhrəli və parlaq üzlü idi. Şişman üzlü və yumru yanaqlı deyildi.**

Kiprikləri uzun, gözləri qara, gözəl, böyük, iki qaşının arası açıq, ancaq qaşları bir-birinə uzaq idi. Çatmaqaşlı deyildi. İki qaşının arasında bir damar var idi ki, qəzəblənəndə qabarıb görünürdü.

**O seçilmiş əzhərüllövn idi, yəni nə kirəc kimi ağ, nə də qara yağız, bəlkə ikisi ortası, gül kimi qırmızıya mail ağ, nurani, parlaq olub, mübarək üzündə nur parlayardı. Gözlərinin ağında da az qırmızılıq var idi. Dişləri inci kimi parlaq, zərif və işıqlı olub, danışarkən ön dişlərindən nur saçılır, gülərkən mübarək ağzı bir lətif şimşək kimi ziyalar saçaraq açılır idi.**

**Saçları nə çox qıvrım, nə də çox düz idi. Saçlarını uzatdığı vaxt qulaqlarının məmələrinə toxunardı. Saqqalı sıx və tam idi. Uzun deyildi və bir tutamdan çoxunu kəsərdi.**

**Aləmi-bəqaya rihlət buyurduqlarında saçı, saqqalı təzəcə ağarmağa başlamış, başında bir az, saqqalında iyirmiyədək ağ tuk var idi.**

**Cismi nazif, qoxusu lətif idi. Ətir vursun, vurmasın bədəni, təri ən gözəl ətirlərdən daha ətirli idi. Bir kimsə onunla söhbət etsə, bütün gün onun ətrini duyardı və mübarək əli ilə bir uşağın başını məsh etsə, o uşaq ətri ilə başqa uşaqlar arasında bilinirdi.**

**Doğulduğu vaxt daha nazif, pak idi, sünnətli, göbəyi kəsik olaraq doğulmuş idi. Duyğusu çox güclü idi. Çox uzaqdan eşidir, kimsənin görə bilməyəcəyi məsafədən görürdü.**

**Hər hərəkəti mötədil idi. Bir yerə gedəndə tələsmədən, sağa, sola meyl etməyib, kamali-vəqar ilə doğru yolu ilə gedər, ancaq sürət və asan yeriyirdi («yüngülyerişli» «səbok seyr» - hz.Nizami ). Belə ki adətən yürüyən kimi görünür, ancaq yanında gedənlər sürətlə yeridikləri halda geri qalırdılar.**

**Əlhasil, ən mükəmməl, müstəsna surətdə yaradılmış bir vücudu-məsud və mübarək idi.**

**Gülərüzlü, şirinsözlü idi. Bir kimsəyə pis söz söyləməz, kimsəyə pis müamilə etməz, kimsənin sözünü kəsməz, mülayim və mütəvazi idi. Qəzəbli, qəliz deyildi, ancaq heybətli, əzəmətli (heybətli, «ağırtaxtalı») idi. Boş söz söyləməzdi, gülüşü də təbəssüm idi. Onu qəflətən görən kimsəni cəlb edirdi, onunla ülfət, söhbət edən kimsə Ona canü könüldən aşiq olurdu, sevgi bəsləyirdi. Fəzilət əhlinə dərəcələrinə görə ehtiram edərdi. Qohumlarına da çox pay verərdi. Ancaq payı özündən üstün (varlı) olanlara təqdim etməzdi.**

Xidmətçilərinin hörmətini saxlayardı. Özü nə yeyər, nə geyərdisə, onlara da onu yedirdər, onu geyindirərdi.

**Əliaçıq və kərəm sahibi, şəfqətli və mərhəmətli, cəsur və həlim idi. Əhdində, vədəsində sabit, sözündə sadiq idi. Xülasə, gözəl əxlaqda və tez qavramada bütün insanlardan üstün, hər cür öygüyə layiq idi.**

**Kitab oxumamış, yazı yazmamış olduğu halda avam və seçilmişlərin zahiri və batini işlərindən xəbərdar olan, gözəl tədbir və idarəçiliyini bir adam düşünsə, o həzrətin hansı mərtəbə ağıl, fəhm, zəkası olduğunu dərhal anlayar.**

**Cəhalət zülməti içində qalmış ərəb qəbilələri arasında böyüyüb, ərəb yarımadası kimi bir yerdə, ortaya çıxıb, ümmi olduğu halda iç və dışı gözlə görünən və görünməyəni elm, maarif nuru ilə işıqlandırdığını bir ağlı başında olan düşünsə, sözsüz, onun peyğəmbərlik davasını qəti olaraq təsdiq edər.**

**Yeməkdə, geyməkdə zəruri miqdar ilə kifayətlənər, artığından (çoxunu) çəkinərdi. Tapdığını yeyər, tapdığını geyər, tam doyunca, qarnı dolunca yeməzdi. Üzərində yatdığı döşək dəridən hazırlanıb, içi xurma lifi ilə dolu idi.**

**Az vaxt içində bunca fütuhata (fəthlərə) nail olsa da, islamın gəlirləri çoxalsa da, dünya malında əsla gözü yox idi. Qənimətdən özünə aid olan malların çoxunu ehtiyacı olanlara sədəqə edib, öz yaşayışı üçün çox az bir şey saxlayardı. Buna görə bir sıra hallarda borc almağa məcbur olurdu.**

**Əhli-Beytinin çox vaxt yedikləri arpa çörəyi, ya da xurma idi. Axirət evinə köçəndə ən sevimli xanımı olan Aişə (r.a.) həzrətlərinin hücrəsində bir az arpadan başqa yeyəcək yox idi. Zirehi də bir yəhudi əlində girov idi. Əyalının yaşayışının təmini üçün otuz sa (ölçü, çəki vahidi, bir sa 1040 dirhəmdir) arpa borc alıb, zirehini girov qoymuşdu».[623]**

## BAŞQA SƏNƏT ƏSƏRLƏRİNDƏ PEYĞƏMBƏRİN BƏDƏN CİZGİLƏRİ

Bilindiyi kimi, sonrakı dönəmlərdə ədəbiyyat, xətt, təzhib ustadları hz.Peyğəmbərin (s.a.s.) yaradılışı (şəmaili) ilə bağlı gözəl əsərlər yaratmışlar. Divan ədəbiyyatında bu mövzuya ayrıca yer verilmişdir. Peyğəmbərin (s.a.s.)

[623] Ali Yardım, Peyğamberimizin şemaili, s. 51-53.

həyatına, mövludnamələr, hilyələr, nətlər, meracnamələr yazılmışdır.

Görkəmli türk ədəbiyyat alimi Nihad Sami Banarlı yazır: «Dini edebiyat, bütün heyecanını, bu sıralarda, türk toplulukları arasında sonsuz bir imanla gelişen dini hayatdan alıyordu. Yeni vatanda, gittikçe güzelleşen bir mimarı ile kurulan ve sayıları süratle çoğalan camiler, mescidler, medreseler, dini hayat kadar, dini edebiyatı da yükselten abidelerdi. Bu asırların türk halkı arasında Allaha ve onun peyğamberine karşı sonsuz bir sevgi, bir iman ve bağlılık yaşıyordu. Anadolu ahalisi, islam uğruna asırlarca ölenlerin cocuklarıydı. Bu uğurda başlanğıctan beri dögüşen, ölen islam ve türk-islam kahramanlarının menkibeleri ise, aynı halk tarafından heyecanla anlatılıp huşu içinde dinlenen hikayelerdi…

İslam büyükleri içinde dünyaya gelişi, peyğamberliyi, miracı, hicreti, kazaları, mucizeleri ve vefatı derin heyecanla takip edilen en böyük sevgili ise hazreti-Muhammeddir»[624]

Bu dönəmdə xəttatların yazdıqları «cib hilyesi», «divar hilyesi» geniş yayıldı. Bunlara «Hilye-i Şərif», «Hilye-i Səadət», «Hilye-i Nəbəvi» deyilirdi. Türk insanı bu hilyələrin olduğu evin bərəkətli olacağına, onu bəlalardan qoruyacağına inanmışdır.

Hz.Məhəmmədi (s.a.s.) gözləri ilə görənlər onu heyranlıqla, bütün incəlikləri ilə təsvir etmişlər. Biz onlardan bir neçəsini bu əsərə daxil etməyi gərəkli saydıq.

Bəra b. Azib (r.a.) rəvayət edir:

«Rəsulullahın (s.a.s.) saçı çox düz və çox qıvrım olmayıb azca dalğalı idi. O, orta boylu, geniş çiyinli idi. Qulaq yumşaqlarına qədər enən uzun, gur saçları var idi. Bir

[624] Nihad Sami Banarlı, Resimli Türk Edebiyyatı Tarihi, c. 1, s. 479.

dəfə onu qırmızı xirqəsi ilə gördüm. Gerçəkdən həyatımda Onun qədər gözəl birisini görmüş deyiləm».[625]

Cabir b. Semürə (r.a.) rəvayət edir:

«Aylı bir gecədə Peyğəmbəri (s.a.s.) qırmızı rəngli paltarı ilə gördüm. Müqayisə üçün bir Ona baxdım, bir də aya. Vallahi məncə o, aydan daha gözəl idi».[626]

Əbu İshaq rəvayət edir:

«Bir adam Bəra b. Azibdən (r.a.) soruşur:

- Peyğəmbərin üzü qılınc kimi parlaq idi?

- Xeyr. Qılınc kimi deyil, ay kimi».[627]

Əbu Hureyrə (r.a.) rəvayət edir:

«Həzrət Peyğəmbər (s.a.s.) gümüşdən yaradılmış kimi işıqlı ağ idi. Saçları da azca dalğalı idi».[628]

Cabir b. Abdullah (r.a.) rəvayət edir:

«Peyğəmbər (s.a.s.) belə buyurmuşdur: «(Merac gecəsi) peyğəmbərlər mənə göstərildi. Onlardan Musa (s.a.s.) çəlimsiz idi. Bir növ Yəmənin Şənuc qəbiləsi kişilərinə bənzəyirdi. (Şənuc Yəmənin tanınan qəbilələrindən biridir. Onlar əsil-nəcabətləri, doğruluqları, bədənlərinin çəlimsizliyi ilə seçilirlər). Məryəm oğlu İsanı (s.a.s.) da gördüm. Gördüklərim içərisində ona ən çox bənzəyən kimsə Urvə b. Məsuddur. (O, hz.Məhəmməd (s.a.s.) Taifdən dönərkən yolda müsəlman olmuşdur. Öz qəbiləsini islama dəvət edərkən oxla öldürülmüşdür). O gecə gördüklərim arasında İbrahim (s.a.s.) də var idi. Tanıdığım kimsələr içərisində ona ən çox bənzəyən, sizlərin dostudur (özünü nəzərdə tutmuşdur). Cəbraili (s.a.s.) də gördüm. Tanıdıqlarım arasında ona ən çox bənzəyən kimsə də, Dihyədir (O,

---

[625] Ali Yardım, Peyğamberimizin şemaili, s. 64.
[626] Ali Yardım, Peyğamberimizin şemaili, s. 67.
[627] Ali Yardım, Peyğamberimizin şemaili, s. 67.
[628] Ali Yardım, Peyğamberimizin şemaili, s. 68.

gözəlliyi və diplomatlılığı ilə tanınıb. Cəbrail (s.a.s.) onun şəklinə bürünərək hz.Məhəmmədə (s.a.s.) görünmüşdür)».[629]

İbn Abbas (r.a.) rəvayət edir:

«Rəsulullahın (s.a.s.) ön dişləri azca seyrək olduğundan danışarkən ön dişləri arasından nur (inci) tökülür kimi görünürdü».[630]

Hz.Nizami deyir ki, hz.Məhəmməd (s.a.s.) «ağırtaxtalı», «yüngülyerişli» idi. Misradakı bu şifrələr hz.Məhəmmədin (s.a.s.) əxlaqı və bədən özəlliklərini bütün cizgiləri ilə ifadə edir. **Şair bu misrada da antonim sözlərlə: «ağırtaxtalı» («gərasəng»), «yüngülyerişli» («səbok seyr») qurduğu təzaddan yararlanaraq tarixi qaynaqlar əsasında hz. Məhəmmədin (s.a.s.) portretini yaratmışdır. Şair, hz. Məhəmmədin (s.a.s.) əxlaqı və bədən quruluşu ilə bağlı dəqiq bildiyi informasiyanı bədii örtüyə bürümüşdür. Biz «ağırtaxtalı» sözünü «ciddi», «sanballı», «ağsaqqal», «həyalı», «təvazökar», «nufuzlu» kimi anlamlarda rahatca oxuya bilərik. Hz.Nizami nət boyu islam peyğəmbərini bütün yönləri ilə tanıtmaq ölçüsünə sadiq qalaraq onun davranışlarına da diqqət yetirir. Şairin məqsədi hz.Məhəmmədi (s.a.s.) tanıtmaq və sevdirməkdir.**

## DİVAN ƏDƏBİYYATINDA HƏZRƏT MƏHƏMMƏDİN (s.a.s.) BƏDƏN CİZGİLƏRİNİN TƏSVİRİ

Deyildiyi kimi, divan ədəbiyyatında hz.Məhəmmədin (s.a.s.) bədən özəllikləri ayrıca yer tutur. Şairlər Peyğəmbərin (s.a.s.) bədən üzvlərini bədii bir dillə təqdim etmişlər.

**İffet Bursevi:**

---

[629] Ali Yardım, Peyğamberimizin şemaili, s. 68.
[630] Ali Yardım, Peyğamberimizin şemaili, s. 69.

… Kıldı envari-cebininden tecelli zati-Hak,
Aleme mirati-vahdetdir cemali-Mustafa.[631]

(Haqqın zatı sənin işıqlı alnından təcəlli etdi. Mustafanın gözəl üzü aləm üçün birlik güzgüsüdür).

**Neccarzadə Rıza:**

Nice benzer kaşın resmi-hilale, ya Resulullah,
Peri-zılli-hüma gelmez misale, ya Resulullah.[632]

(Ey Allahın elçisi, sənin qaşın aya çox bənzəyir. Hüma quşunun qanadı sənin qaşınla müqayisə edilə bilməz).

**Zati:**

Yusufu gerçi görenler ellerini kesdiler,
Gün yüzün gördi senün şakk oldu bedrün ayesi.[633]

(Yusifin üzünü görənlər əllərini kəsdilərsə,
Sənin gün üzünü görən ay parçalandı)

**Füzuli:**

Suya versin bağban gülzarı zəhmət çəkməsin,
Bir gül açılmaz yüzün tək versə bin gülzarə su.[634]

(Bağban suvardığı gülzarı suya versin, onu suvarmaq üçün zəhmət çəkməsin, Bağban min gülzara su versə də, hz.Məhəmmədin (s.a.s.) üzü kimi bir gül açmaz)

**Əhmədi:**

Gönlü anun mahzeni-esrari-Hak,
Ruhi anun mahzari-envari-Hak.[635]

(Onun könlü Haqq sirrlərinin xəzinəsidir,
Onun ruhu Haqq nurunun məzhəridir.)

**Qivami:**

[631] Emine Yeniterzi, Divan şirinde nat, s. 219.
[632] Emine Yeniterzi, Divan şirinde nat, s. 219.
[633] Emine Yeniterzi, Divan şirinde nat, s. 228.
[634] Emine Yeniterzi, Divan şirinde nat, s. 234.
[635] Emine Yeniterzi, Divan şirinde nat, s. 268.

Kible-i iman yüzündür rahmeti-Rahman sözün,
Madin-i ihsan özündür bunda yokdur kal u kıl.[636]

(Üzün iman qibləsidir, üzün Rəhmanın rəhmətidir. Özün (varlığın, canın) ehsan mədənidir, bunda şişirtmə yoxdur)

**Yunis Əmrə:**

Hak anı yaratdı, sevdi, «Habibüm» dedi,
Yir yüzinde cümle çiçek Mustafanun teridür.[637]

(Onu Allah yaratdı, sevdi, «həbibim» dedi,
Yer üzündəki bütün çiçəklər Mustafanın təridir.)

Biz belə misalların sayını istədiyimiz qədər artıra bilərik. Ancaq bu misallar da göstərir ki, orta yüzilliklər divan ədəbiyyatında ayrıca bir «peyğəmbər ədəbiyyatı» var.

---

[636] Emine Yeniterzi, Divan şirinde nat, s. 272.
[637] Emine Yeniterzi, Divan şirinde nat, s. 275.

## HƏZRƏT NİZAMİNİN GÖZÜNDƏ HƏZRƏT MƏHƏMMƏD (s.a.s.)

**Hz.Nizaminin «ağırtaxtalı» qavramı ilə ifadə etdiyi mənalara hz.Məhəmmədin (s.a.s.) həyası və təvazökarlığı da daxildir. Həya və təvazökarlıq hz.Peyğəmbərin (s.a.s.) əxlaq və davranışının ayrılmaz bir parçasıdır.**

**Həya Azərbaycan türkcəsində «utancaqlıq», «ar», «namus», «ədəb» kimi anlamlarda işlədilir. «Həya» «həyat» kökündən törəyərək «dirilik» mənasındadır. Deməli, həya insanı diri saxlayan, onu fitrətinə uyğun çalışmağa yönəldən bir duyğudur. Bu baxımdan həyanın yoxluğu insanın mənəvi ölümü deməkdir. İslam böyükləri insanları həyalı, abırlı, ar-namuslu olmağa çağırmışlar. «Həya imandandır», «ədəb ya hu» deyilmişdir.**

İslam ədəbiyyatında həya belə tərif edilmişdir: «Həya insanın özünü bir şeydən geri çəkməsi, onda eyib tutulması qorxusu ilə o şeyi etməməsidir. Bu duyğunun özünü göstərməsi iki yolla olur. Birincisi, fitri olandır. Allah o duyğunu bütün insanlarda yaratmışdır. İnsanların göstərilməsi eyib olan yerlərini açmaqdan, hər kəsin gözü önündə sevişməkdən həya etmələri buna misaldır. İkincisi də imani həyadır ki, möminin Allah qorxusundan günah etməməsidir».[638]

**Deməli, həya duyğusunun canı Allahdan (c.c.) qorxmaq, quldan utanmaqdır. Birinin itirilməsi günaha, o birisinin itgisi eyibə səbəb olur.**

İslam əxlaqının əsaslarından biri həyadır. Hz. Məhəmməd (s.a.s.) buyurur: «Hər dinin bir əxlaq düzəni (sistemi) var. İslamın əxlaq düzəni də həya üzərində qurulmuşdur».[639]

---

[638] Seyyid Şerif, Tarifat, «Haya» maddesi, s. 38; Kamus, IV, s. 936.
[639] Muvatta, II, s. 905.

**Hz.Nizami «o, ağırtaxtalı idi» deyəndə bu anlayışın içərisinə «həya» qavramını da yerləşdirmişdir. «Ağırtaxtalı olmaq» Allah (c.c.) qorxusu ilə, özünü hər an Allahın (c.c.) önündə hiss etməklə, ilahi nəzarətin altında ilahi buyruqlara uyğun yaşamaqdır. Hz.Məhəmmədin (s.a.s.) ömrü başdan sonadək bir həya örtüyünə bürünmüş, həya rənginə boyanmışdır. Onun səhabələri hz.Məhəmmədin (s.a.s.) həya duyğusunu, bu duyğunun əlamətlərini gözəl bir bənzətmə ilə ifadə etmişlər:**

«Rəsuli-Əkrəm gəlinlik duvağına bürünmüş qızdan daha utancaq idi».[640]

Hz.Məhəmməd (s.a.s.) həya duyğusunun insanı bu dünya və axirətdə qoruyacağını buyurmuşdur:

«Sizə bu üç insanın durumunu xəbər verimmi? Onlardan biri Allaha sığındı, Allah da onu qorudu, başqası insanları narahat etməkdən utandı, Allah da ondan həya etdi. O birisinə gəlincə o, bu məclisdən üz çevirdi, Allah da ondan üz çevirdi».[641]

Hz.Məhəmmədin (s.a.s.) dəyərləndirməsinə görə, «həya ancaq xeyir qazandırır», «həyanın hamısı xeyirdir».[642]

**Hz.Nizaminin «ağırtaxtalı» dəyərləndirməsi bir də hz.Məhəmmədin (s.a.s.) təvazökarlığını ifadə edir. Təvazökarlıq da həya kimi Peyğəmbər (s.a.s.) əxlaqının təməl ölçülərindəndir. Təvazökarlıq bütün işlərin ancaq Allah (c.c.) rizasını qazanmaq məqsədi ilə yerinə yetirilməsidir.**

Hz.Əli (r.a.) oğlu hz.Hüseynə (r.a.) İslam Peyğəmbərini (s.a.s.) belə anladır:

---

640 Ali Yardım, Peyğamberimizin şemaili, 417.
641 Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 300.
642 Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 80.

«O, önəmli bir iş olmadıqca danışmazdı. Çevrəsi ilə ülfət qurar, onları ürküdəcək bir hərəkəti olmazdı. Hər camaatın seçilmişinə ayrı bir münasibət göstərir və onları başçı təyin edirdi. İnsanları gözü kimi qoruyur, heç birindən şirin dil və gülər üzünü əsirgəməzdi, onların üzərində titrəyərdi. Əshabını yoxluqlarında arayıb soruşar, durumlarını nəzarətində saxlayardı. Qarşılaşdığı insanlardan «…nə var, nə yox», deyə baş verənləri soruşardı. Gözəl olan hər şeyi bəyəndiyini ifadə edər, ona dəstək verər, pis olan şeyə də etiraz edər, bu pisliyi aradan qaldıracaq bir davranış göstərərdi. Zati-Risalətin bütün hərəkətləri uyumlu idi, ölçüsüz heç bir davranışı yox idi. Əshabının onlara aid işlərində qəflətə düşmələri, ya da yorğunluq duymaları qorxusu ilə onların yerinə özü hər zaman hazır olardı. O, hər durum qarşısında hazır idi (bütün məsələlərin həllini tapırdı). Onun yanında insanların ən fəzilətlisi başqalarına çox yaxşılıq edənlər idi. Mərtəbəsi ən yüksək olanlar da xalqın sıxıntısına ən çox ortaq olan, onlara yardım əlini uzadan kimsələr idi. Onun durması da, oturması da zikr üzrə idi. Toplantı halında olan bir topluluğa getsə, baş yerə keçməz, məclisin bir yerində oturardı, çevrəsində olanların da belə etməsini istəyərdi.

O, birlikdə oturduğu adamların səviyyəsinə görə hər birinin hal və xatirini soruşaraq onlara sevgi göstərirdi. Çevrəsindəkilərə candan elə münasibət göstərirdi ki, onunla birlikdə oturanların hamısı Rəsulullahın (s.a.s.) yanında ən dəyərli insanın o olduğunu düşünərdi. Bir adam hüzuri-səadətlərində çox otursa, ya da bir ehtiyacını çatdırmaq məqsədi ilə yanına gəlsə, o şəxs özü qalxıb gedənədək səbir edərdi. Ondan bir istəyi olan adamın ya istəyini yerinə yetirərdi, ya da şirin bir dillə vəd edər, ancaq heç zaman boş qaytarmazdı. Onun comərdliyi, şirin dili, gözəl əxlaqı insanlar arasında elə yayılmışdı ki, bir növ xalqın atası olmuşdu (hz.Nizami deyir ki,

«o bütün xeyir işlərin və qəbilələrin başçısı idi»). Onun yanında bütün insanlar heç biri arasında haqq fərqi qoyulmayan, eyni səviyyədə olan övladlar kimi idi. Rəsulullahın (s.a.s.) toplantıları başdan-başa elm, həya, əmanət, səbir kimi əxlaqi dəyərlərin öyrədildiyi bir məclis idi. Onun yanında səslər yüksəldilməz, heç kimsənin məhrəmiyyəti danışılmaz, orada olan xəta və qüsurlar başqa yerdə danışılmazdı. Onun məclisində hər kəs bərabər idi. Onlar bir-birindən ancaq təqva ilə seçilə bilərdilər. Hər kəs təvazökar idi. Orada yaşca böyük olanlara sayğı göstərilir, kiçiklərə də mərhəmət edilirdi. Toplantıda ehtiyacı olanlara öncə şərait yaradılır, qərib olanlara ayrıca münasibət göstərilirdi».[643]

Hz.Məhəmməd (s.a.s.) yeri gələndə paltarlarını yamayar, ayaqqabılarını tikər, qoyunlarını sağardı.

**Hz.Nizami şərh olunan beytində hz.Məhəmmədi (s.a.s.) Peyğəmbər, insan, zahid, ailə başçısı, dövlət rəhbəri, imam, əsgər, sərkərdə, diplomat, bir sözlə onu bütün yönləri ilə tanıdan bir söz, bir qavram işlədib: «O, qütb idi». Qütb hədəfi göstərir, karvanlar ona baxıb yolunu müəyyən edir, insanlar ona baxıb azmaqdan, əndişədən qurtulur. «Hz.Məhəmməd (s.a.s.) bir qütbdür», demək onun bütün yönləri ilə insanlığa örnək olması, düşüncə və davranışlara ölçü gətirməsi deməkdir. Hz.Məhəmməd (s.a.s.) müsəlman kimliyinin dini, əxlaqi, siyasi, iqtisadi ölçülərini müəyyən etdi, vəhydən doğan bir mədəniyyətin əsaslarını yaratdı. Elə mədəniyyət də ölçülər sistemi deməkdir. Bir insan, bir ailə başçısı, bir idarəçi, bir din xadimi, bütövlükdə bir toplum durumunun, davranışının doğruluğunu müəyyən etmək istəyirsə, hz.Məhəmməd (s.a.s.) adlı «qütbə» baxaraq bunu edə bilər.**

---

[643] Ali Yardım, Peyğamberimizin şemaili, s. 413.

**Məsələni bir az da dəqiqləşdirsək, hz.Məhəmmədin (s.a.s.) aldığı vəhy, bu vəhyin üzərində qurulmuş Quran, onun ömrü, ilahi buyruğa söykənən həyat ölçüləri, bütün varlığı insanlıq üçün bir qütbdür.**

Hz.Nizaminin şərh olunan nətinin on doqquzuncu beytini verilmiş qaynaqlar, izahlar işığında bir də oxuyaq:

***Bütün qəbilələrin, bütün xeyir işlərin başçısı o idi,***
***Ağırtaxtalı, yüngülyerişli qütb o idi.***

Hz.Nizami bu beytdə hz.Məhəmmədin (s.a.s.) əxlaqi ölçülərini, varlığını şərh etmiş, sonrakı beytdə isə Onun «qütb» olmasının səbəbini açıqlamışdır.

## İYİRMİNCİ BEYTİN ŞƏRHİ: O, ALLAH ŞAMINI ÖZ YÜRƏYİNDƏ YANDIRMIŞDI

Hz. Nizami nətin iyirminci beytində deyir:

شمع الهی ز دل افروخته
درس ازل تا ابد آموخته

***Allah şamını o, öz ürəyində yandırmışdı,***
***O, əzəl dərsini əbədə qədər oxumuşdu*.**[644]

### «ŞAM» ANLAYIŞI

Biz bu beyti şərh etmək üçün beytin ideya yükünü daşıyan anlayışlara diqqət yetirək. Bu anlayışlardan biri «Allah şamı»dır. **Hz.Məhəmmədin (s.a.s.) ürəyində yandırdığı «Allah şamı» nədir? Bizcə, bu anlayışın başlıca mənası ilahi kitab olan Qurani-Kərimlə bağlıdır.** Uca Allah (c.c.) onu hamıdan çox sevdi, onu Peyğəmbər seçdi və ən dəyərli ilahi əmanəti – Qurani-Kərimi hissə-hissə onun könlünə endirdi. Uca Allah (c.c.) öz kitabını bir nura, sönməyən bir işığa, çırağa bənzətmiş, onu insanlığı cəhalətdən qurtarmaq, insanlığa doğru yolu göstərmək, Allahı (c.c.) insanlara tanıtmaq üçün endirdiyini buyurmuşdur:

ذَلِكَ الْكِتَابُ لاَ رَيْبَ فِيهِ هُدًى لِّلْمُتَّقِينَ

(Bəqərə, 2/2)

«Bu kitab, bunda şübhə yoxdur. Möminlər üçün hidayətdir…»

نَزَّلَ عَلَيْكَ الْكِتَابَ بِالْحَقِّ مُصَدِّقاً لِّمَا بَيْنَ يَدَيْهِ وَأَنزَلَ التَّوْرَاةَ وَالإِنجِيلَ
.مِن قَبْلُ هُدًى لِّلنَّاسِ وَأَنزَلَ الْفُرْقَانَ إِنَّ الَّذِينَ كَفَرُواْ بِآيَاتِ اللّهِ لَهُمْ
عَذَابٌ شَدِيدٌ وَاللّهُ عَزِيزٌ ذُو انتِقَامٍ

(Ali-İmran, 3/3-4)

---

[644] Nizami Gəncəvi, Sirlər xəzinəsi, s. 26.

«O, sənə kitabı ondan öncə endirilənləri təsdiqedici olaraq haqq ilə endirməkdədir. Öncədən insanları hidayət üçün Tövratı və İncili endirmişdi. Bir də ayırd edən Furkanı endirdi…».

وَهَذَا كِتَابٌ أَنزَلْنَاهُ مُبَارَكٌ فَاتَّبِعُوهُ وَاتَّقُواْ لَعَلَّكُمْ تُرْحَمُونَ

(Ənam, 6/155)

«Bu (Quran) da mübarək bir kitabdır. Onu biz endirdik. Ona uyun və qorunun ki, rəhmətimə qovuşasınız».

وَنُنَزِّلُ مِنَ الْقُرْآنِ مَا هُوَ شِفَاء وَرَحْمَةٌ لِّلْمُؤْمِنِينَ وَلاَ يَزِيدُ الظَّالِمِينَ إَلاَّ خَسَاراً

(İsra, 17/82)

«Biz də Qurandan elə ayələr endirdik ki, bunlar möminlər üçün bir şəfa və bir rəhmətdir. Zalımların isə ancaq zərərini artırır».

وَالْكِتَابِ الْمُبِينِ .إِنَّا جَعَلْنَاهُ قُرْآناً عَرَبِيّاً لَّعَلَّكُمْ تَعْقِلُونَ .وَإِنَّهُ فِي أُمِّ الْكِتَابِ لَدَيْنَا لَعَلِيٌّ حَكِيمٌ

(Zuhruf, 43/2-4)

«Bu parlaq kitabın qədrini bilin. Biz Onu ərəbcə olaraq oxunacaq bir Quran etdik ki, düşünəsiniz. Gerçəkdən o, bizim yanımızdakı Ana Kitabda olan uca və hikmətli bir kitabdır».

Bu ayələrdə Quran bir yolgöstərici, bir nur olaraq tərif edilmişdir. Hz.Nizaminin beytində yer tutan «ilahi şam» anlayışı da uca Allahın hz.Məhəmmədə (s.a.s.) verdiyi ən dəyərli nemət olan Qurani-Kərimə işarə edir. Quran bir nur olaraq nazil olundu, yer üzünü, insanlığı cəhalətdən qurtardı.

**Hz.Nizaminin «Allahın şamı» anlayışı ilə işarə etdiyi ikinci məna elmdir. Uca Allahın (c.c.) hz.Məhəmmədə (s.a.s.) verdiyi dəyərli nemətlərdən biri də elmdir. Əslində, hz.Məhəmmədi (s.a.s.) təmsil edən ən gözəl**

**anlayış işıqdır, nurdur.** Uca Allah (c.c.) elmlərin ən mükəmməlini Peyğəmbərə verdi, o bu elmlə yaxşını pisdən ayırdı, insanlığa doğru yol göstərdi. Hz.Məhəmmədin (s.a.s.) ölçülərinə görə, «mələklər elm öyrənəni sevər», «elm öyrənənə baxana Allah (c.c.) ruzi verər», «elm öyrənənə mələklər qanad gərər», «elm öyrənənin ruzisini Allah (c.c.) öz üzərinə götürmüşdür», «elm peyğəmbərlərin mirasıdır», «elm öyrənənin çətinlikləri asanlaşdırılır», «elmi sevən Allahın (c.c.) yolundadır», «elmi sevənə cənnətin yolu asanlaşdırılır», «elm öyrənənə qibtə edilə bilər», «elmi saxlamaq olmaz», «elm təbliğ olunmalıdır», «elmin artırılması üçün dua edilməlidir», «elmin savabı kəsilməz».

Uca Allah (c.c.) elmi nemətlər sırasında yad edir:

فَتَعَالَى اللَّهُ الْمَلِكُ الْحَقُّ وَلَا تَعْجَلْ بِالْقُرْآنِ مِن قَبْلِ أَن يُقْضَى إِلَيْكَ
وَحْيُهُ وَقُل رَّبِّ زِدْنِي عِلْماً

(Taha, 20/114)

«Həqiqi hakim olan Allah ucadır! Həm də sənə tamam-kamal vəhy olunmadan əvvəl Quranı oxumağa tələsmə və: «Ey Rəbbim! Mənim elmimi artır!»,-de».

أَمَّنْ هُوَ قَانِتٌ آنَاء اللَّيْلِ سَاجِداً وَقَائِماً يَحْذَرُ الْآخِرَةَ وَيَرْجُو رَحْمَةَ رَبِّهِ قُلْ
هَلْ يَسْتَوِي الَّذِينَ يَعْلَمُونَ وَالَّذِينَ لَا يَعْلَمُونَ إِنَّمَا يَتَذَكَّرُ أُوْلُوا الْأَلْبَابِ

(Zumər, 39/9)

«Məgər axirətdən qorxan, Rəbbinə ümid bəsləyən, gah səcdəyə qapanıb, gah da ayaqüstə durub gecə saatlarını ibadət içində keçirən (müti bəndə kafirlə birdirmi)?! De: «Heç bilənlərlə bilməyənlər eyni ola bilərmi?! Ancaq ağıl sahibləri ibrət alar!».

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا قِيلَ لَكُمْ تَفَسَّحُوا فِي الْمَجَالِسِ فَافْسَحُوا يَفْسَحِ
اللَّهُ لَكُمْ وَإِذَا قِيلَ انشُزُوا فَانشُزُوا يَرْفَعِ اللَّهُ الَّذِينَ آمَنُوا مِنكُمْ وَالَّذِينَ
أُوتُوا الْعِلْمَ دَرَجَاتٍ وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ

(Mücadələ, 58/11)

«Ey iman gətirənlər! Sizə: «Məclislərdə (mömin qardaşlarınıza) yer verin!»,-deyildiyi zaman (onlara) yer verin ki, Allah da sizə geniş yer versin. Eləcə də sizə: «Qalxın!» deyildikdə qalxın ki, Allah da sizdən və iman gətirənlərin və elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın. Allah etdiyiniz əməldən xəbərdardır!».

وَمِنَ النَّاسِ وَالدَّوَابِّ وَالْأَنْعَامِ مُخْتَلِفٌ أَلْوَانُهُ كَذَلِكَ إِنَّمَا يَخْشَى اللَّهَ مِنْ عِبَادِهِ الْعُلَمَاء إِنَّ اللَّهَ عَزِيزٌ غَفُورٌ

(Fatir, 35/28)

«İnsanların, heyvanların və davarların da bu cür müxtəlif rəngləri var. Allahdan Öz bəndələri içərisində ancaq alimlər qorxar. Həqiqətən, Allah yenilməz qüvvət sahibidir, bağışlayandır!».

Hz.Məhəmməd (s.a.s.) buyurmuşdur ki, Allah onunla «yer üzünə elm və hidayət göndərmişdir».[645]

Hz.Məhəmməd (s.a.s.) «ilahi şam» olan elmi (elmin qaynağı Allah (c.c.) olduğundan, Allah (c.c.) bütün elmləri bildiyindən «şam»ın – elmin sahibi də Allahdır (c.c.) ilahi nemət saymış, elm öyrənəni müjdələmişdir.

Əbüd-Dərda (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Bir kimsə elm əldə etmək arzusu ilə bir yola çıxarsa, Allah o insana cənnətin yolunu asanlaşdırır. Şübhəsiz, mələklər onun etdiyindən xoşnud olduqları üçün elm öyrənmək istəyən adamın üzərinə qanadlarını gərərlər. Göylərdə və yerlərdə olanlar, hətta, suyun içindəki balıqlar belə alim kişiyə Allahdan bağışlama dilərlər. Alimin abidə qarşı üstünlüyü, ayın başqa ulduzlara üstünlüyü kimidir. Şübhəsiz ki, alimlər peyğəmbərlərin varisləridir. Peyğəmbərlər qızıl və gümüş miras qoymazlar. Sadəcə, elm

---

[645] Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 162.

miras qoyarlar. O mirası alan kimsə bol nəsib və qismət almış olur».[646]

**Hz.Nizaminin «Allahın şamı» anlayışı ilə ifadə etdiyi üçüncü məna dindir.** Allah öz dinini hz.Məhəmmədin (s.a.s.) elçiliyi ilə insanlara çatdırdı. Din əmanətini, din nemətini öz elçisinə verdi. Dinin şamı öncə hz.Məhəmmədin (s.a.s.) ürəyində yandı. Allahın (c.c.) dininin hədəfi insanları xoşbəxt etməkdir, onları cəhalətin caynağından qurtarıb, dünya və axirət səadətinə qovuşdurmaqdır.

İslam dini son din olması ilə də bir nemətdir. Allahın (c.c.) bu «din şamı» da öncə hz.Məhəmmədin (s.a.s.) ürəyində yandı.

Uca Allah (c.c.) dini fərqli yönləri ilə təqdim edir. **Allahın (c.c.) elminə görə, dindən imtina insanı cəhənnəm əzabına yönəldir:**

وَذَرِ الَّذِينَ اتَّخَذُواْ دِينَهُمْ لَعِباً وَلَهْواً وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا وَذَكِّرْ بِهِ
أَن تُبْسَلَ نَفْسٌ بِمَا كَسَبَتْ لَيْسَ لَهَا مِن دُونِ اللّهِ وَلِيٌّ وَلاَ شَفِيعٌ وَإِن
تَعْدِلْ كُلَّ عَدْلٍ لاَّ يُؤْخَذْ مِنْهَا أُوْلَـئِكَ الَّذِينَ أُبْسِلُواْ بِمَا كَسَبُواْ لَهُمْ شَرَابٌ
مِّنْ حَمِيمٍ وَعَذَابٌ أَلِيمٌ بِمَا كَانُواْ يَكْفُرُونَ

(Ənam, 6/70)

«Dinlərini oyun və əyləncə sayan, dünya həyatının aldatdığı insanları öz hallarına burax. Onlara Quran ilə öyüd ver ki, heç kimsə öz qazandığı ilə özünü həlaka sürükləməsin! Onun üçün Allahdan başqa nə bir dost, nə də bir şəfaətçi olmaz! Əzabdan qurtulmaq üçün hər cür fidyəni versə də, yenə qəbul edilməz! Onlar öz qazandıqları ilə özlərini həlaka atan kimsələrdir! İnkarda israr etmələri üzündən onlar üçün qaynar sudan bir içəcək və çox acı bir əzab vardır!»

---

[646] Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 177.

**Din öyüd-nəsihətdir:**

أَبَلِّغُكُمْ رِسَالاَتِ رَبِّي وَأَنصَحُ لَكُمْ وَأَعْلَمُ مِنَ اللّهِ مَا لاَ تَعْلَمُونَ

(Əraf, 7/62)

«Mən sizə Rəbbimin əmrlərini təbliğ edir və öyüd nəsihət verirəm. Allahdan (gələn vəhy ilə) sizin bilmədiklərinizi bilirəm!».

أُبَلِّغُكُمْ رِسَالاتِ رَبِّي وَأَنَاْ لَكُمْ نَاصِحٌ أَمِينٌ

(Əraf, 7/68)

«Mən sizə Rəbbimin əmrlərini təbliğ edirəm. Mən sizə doğru məsləhət verənəm».

**İslam peyğəmbərinə görə də din bir nəsihətdir, bir adamın dini sevməsi Allahın (c.c.) onu sevməsi anlamına gəlir.**

Əbu Ruqayyə Təmim ibni Əvs əd-Dari (r.a.) rəvayət edir: «Nəbi (s.a.s.) belə buyurdu: «Din nəsihətdir».

Biz ona:

- Kimin üçün nəsihətdir?, - dedik.

- Allah, Kitabı, Rəsulu möminlərin idarəçiləri və bütün müsəlmanlar üçün nəsihətdir».[647]

Muaviyə (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Allah haqqında xeyir istədiyi adama din məsələsində böyük bir anlayış verir».[648]

## BEYTİN İDEYASI VƏ BƏDİİ YÜKÜ

**Hz.Nizaminin «Allah şamı» ilə ifadə etdiyi mənanın biri də Allahın dinini, elmi insanlara öyrətməkdir. Yəni kim, Allahın (c.c.) dinini öyrənir və öyrədirsə, Allah (c.c.)**

---

[647] Riyazüs-Salihin, göstərilən qaynaq, c. II, s. 53.

[648] Riyazüs-Salihin, göstərilən qaynaq, c.VI, s. 158.

**onun qəlbində bir şam yandırır, o özü bir nura çevrilir, nurdan adam olur.**

Bu beytin bütün mənası öyrənmək və öyrətməklə bağlıdır. Şair bu mənanı ifadə etmək üçün uyğun söz və ifadələr seçir. **Məsələn, «şam» öyrənmək və öyrətməklə bağlıdır. Müəllim insanı şam işığında öyrədir, tələbə şam işığında öyrənir. Elm özü bir işıqdır, o, qaranlığın, cəhalətin qənimidir. «İşıqlı adam», «ziyalı» sözləri də bu mənadadır. Yəni, özü işıqlanan və başqalarını işıqlandıran.**

**«Yandırmaq» sözü də beytin mətnində leksik vahid olaraq öyrənməyi təmsil edir. «Qəlbində şam yandırmaq», yəni cəhalətdən qurtulmaq, elm öyrənmək, Allahı (c.c.) tanımaq deməkdir.**

Şair «İlahi şamı ürəyində yandırdı» deməklə elmin fədakarlıq istədiyinə də işarə etmişdir. Şair bu anlayışla diqqəti hz.Məhəmmədin (s.a.s.) ilahi missiyasına, onun bir nur insan olduğuna yönəltmişdir.

**Beytdə öyrənməklə, öyrətməklə bağlı başqa sözlər də var. İkinci beytdə olan «əzəl dərsi», «öyrənmək» anlayışları da bu mənanı gücləndirir. Deməli, uca Allah (c.c.) hz.Məhəmmədə (s.a.s.) elm verməklə onu başqalarından üstün etmişdir, onun çiyninə ağır bir yük qoymuşdur, ona buyurmuşdur ki, sən öyrədəcəksən, sən insanlığı nura qərq edəcəksən.**

**Deməli, uca Allah (c.c.) hz.Məhəmmədə (s.a.s.) nur olmaq vəzifəsi vermişdir:**

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ وَاللّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ إِنَّ اللّهَ لاَ يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ

( (Maidə, 5/67)

«Ey Rəsulum! Sənə Rəbbindən hər endiriləni təbliğ et! Etməsən, Allahın verdiyi elçilik vəzifəsini yerinə yetirməmiş

olarsan! Allah, səni insanlardan qoruyacaqdır. Şübhə yox ki, Allah kafirlər toplumunu arzularına çatdırmayacaqdır».

**Deməli, Allahın (c.c.) elçisi olmaq, Allahın (c.c.) nurunu, elmini, dinini insanlara daşımaq deməkdir.**

Hz.Nizaminin «Allahın şamı» ifadəsi hz.Məhəmmədin (s.a.s.) ümmiliyi anlayışını da nurlandırır. **Bəlli olur ki, onun şamı, elmi haqdan yanıb, onun elmini Allah (c.c.) verib, onun müəllimə ehtiyacı yoxdur.**

Hz.Nizami «şam», «yandırmaq», «əzəl dərsi», «öyrənmək» sözləri ilə beytin ideyasını və bədii biçimini bir-birinə uyğunlaşdırmışdır. Şairin bu beytlə vermək istədiyi ideyanı daha dərindən qavramaq üçün beytdə olan iki anlayışa da açıqlıq gətirək. Bunlardan biri «əzəl dərsi», o birisi isə «əbədiyyətə qədər öyrənmək»dir.

Biz bu anlayışları nətin və beytin ümumi mənası içində şərh edə bilərik. **Hz.Nizaminin bu və bundan sonrakı beytini biz «nur beytləri» kimi təqdim etsək, doğru olar. Şair bu beytlərin başlıca ideyasını nur simvolları üzərində qurmuşdur. Beytlərin ideyası budur:** Allahın (c.c.) elmi sonsuzdur və uca Allah (c.c.) bu elmdən hz.Məhəmmədə (s.a.s.) verərək onu başqalarından üstün etmişdir. Hz. Məhəmməd (s.a.s.) bir nur peyğəmbəri olaraq göndərilmişdir. Uca Allahın (c.c.) hz.Məhəmmədə (s.a.s.) elm verməsinin səbəbi odur ki, Allah (c.c.) insanlığı cəhalətdən, zülmdən, qaranlıqdan qurtarmaq istəyir. Bu zülmün, cəhalətin düşməni də elmdir. Elmlə, nurla şərəfləndirilmiş hz.Məhəmməd (s.a.s.) uca Allahın ona verdiyi nemətlə öz ilahi vəzifəsini Allahın (c.c.) buyurduğu kimi yerinə yetirmişdir. Uca Allah (c.c.) bu peyğəmbərin bu neməti Allahın (c.c.) himayəsi ilə əldə etdiyini dəfələrlə buyurmuşdur:

أَلَمْ نَشْرَحْ لَكَ صَدْرَكَ .وَوَضَعْنَا عَنكَ وِزْرَكَ . الَّذِي أَنقَضَ ظَهْرَكَ
.وَرَفَعْنَا لَكَ ذِكْرَكَ . فَإِنَّ مَعَ الْعُسْرِ يُسْراً .إِنَّ مَعَ الْعُسْرِ يُسْراً

(İnşirah, 94/1-6)

«Sənin köksünü (qəlbini) açmadıqmı? Sənin yükünü götürmədikmi? Ki, o yük sənin belini bükmüşdü. Sənin şanını (şərəfini) yüksəltmədikmi? Demək, çətinliklə bərabər bir asanlıq da var. Bəli, o çətinliklə bərabər bir asanlıq var…».

Hz.Nizami uca Allahın (c.c.) hz.Məhəmmədə (s.a.s.) elm verdiyini, Peyğəmbərin müəlliminin yalnız Allah (c.c.) olduğunu, onun başqa bir müəllimə ehtiyacı olmadığını «əzəl dərsi» anlayışı ilə vermişdir. Dini anlayışa görə, uca Allah (c.c.) hər şeyi bilir, eşidir və görür, gerçək elmin sahibi ancaq Odur və «əzəl elmi», bütün varlığın yaradılış elmidir, əşyaların, canlı və cansız hər şeyin yaradılış sirrini öyrədən elmdir. Bu «əzəl elmi» ən doğru elmdir, burada yanılma yoxdur, bütün sualların ən doğru cavabı bu elmlə verilə bilər.

## «ƏZƏL DƏRSİ»

Hz.Nizami Allahın (c.c.) hz.Məhəmmədə (s.a.s.) elm verdiyini Allah (c.c.) Peyğəmbər, müəllim tələbə münasibətləri çərçivəsində açıqlayaraq «əzəl dərsi» ifadəsini işlədir. Uca Allah (c.c.) öncə hz.Məhəmmədi (s.a.s.) bu «əzəl dərsi» almaq üçün hazırlayır. Onu bütün yüklərdən süzür.

Bu hazırlığın mərhələlərinə baxaq: Allah onu gözəl yaradır, o qeyri-adi bir uşaqdır, doğuluşu fərqlidir, şərəfli bir peyğəmbər soyundan gəlir, o çox ağıllıdır, bərəkətlidir, uşaq ikən Allahın (c.c.) buyruğu ilə mələklər onun köksünü yarır, onun ilahi, «əzəli elmi» almasına mane olacaq «yükü» ondan götürür, o çətinliklərə alışaraq böyüyür, hamı onu sevir, o peyğəmbərliyədək insanlar

arasında böyük etibar qazanır, o halal qazanır, o, ədalətlidir, o, islamadək heç bir bütə ilah kimi baxmır. O, hər zaman düşünür, Nur dağına gedir, özündə qeyri-adiliklər duyur. İlk vəhydən sonra vəhylərin gəlməsinə üç il ara verilir. Allahın (c.c.) Quranı da ona hissə-hissə endirilir.

Bütövlükdə, hz.Məhəmmədlə (s.a.s.) bağlı bütün məsələlərdə bir hikmət var. **Hz.Nizaminin bu «əzəl dərsi» anlayışını nur fonunda verməsi də bir yandan elmin bir nur olması ilə, başqa yöndən elmlə cəhalət arasında mübarizə ilə, həm də «əzəl dərsinin» hz.Məhəmmədə (s.a.s.) bir nur yolu, nur vasitəsi ilə verilməsi ilə bağlıdır. «Əzəl elmi» bir nur kimi hz.Məhəmmədin (s.a.s.) varlığına, könlünə axır, onu nura boyayır. Bu dərs müəllimlə, qələmlə, kitabla, dəftərlə öyrədilmir. Bu elm bir nur olaraq onun könlünə yerləşir.**

Uca Allah (c.c.) Peyğəmbəri ilə özü arasındakı pərdələri götürərək («onun yükünü alaraq») onunla nur vasitəsi ilə danışır, ona yol göstərir. Nəticədə, nur peyğəmbəri olan hz.Məhəmməd (s.a.s.) insanlığı nura boyayır.

Hz.Nizaminin «Allahın şamı», «ürəyində yandırmaq», «əzəl dərsi», «əbədə qədər», «oxumaq» qavramları bu ilahi elmin mahiyyətini, onun verilmə qayəsini, öyrədilmə metod və yollarını, müəllim (Allah), tələbə (peyğəmbər) münasibətini, elm öyrənməyin davamlılığını necə gözəl anladır! Hz.Nizaminin hz.Məhəmmədin (s.a.s.) elm alma yolunu ifadə etmək üçün seçdiyi «ürəyində yandırmaq» ifadəsi bu elmin qaynağını və alınma şəklini dəqiq ifadə edir. **Beytin bir tərəfində Allaha (c.c.) (müəllimə) bağlı: «Allah şamı», «əzəl dərsi» - anlayışları, o biri tərəfinə isə peyğəmbərə (tələbəyə) aid: «ürəyində yandırmaq», «əbədə qədər oxumaq» - anlayışları yerləşdirilmişdir.**

**Allah (c.c.) ilə onun elçisi arasında nur körpüsü var, Peyğəmbər daimi nurlanma içindədir, o, əbədiyyətədək onun şamını yandıracaq bir sonsuz nur-elm qaynağına qoşulmuşdur. Biz-bütün insanlıq Allahın (c.c.) öz peyğəmbərinin ürəyində yandırdığı bu şamın işığında yaşayırıq.**

كَمَا أَرْسَلْنَا فِيكُمْ رَسُولاً مِّنكُمْ يَتْلُو عَلَيْكُمْ آيَاتِنَا وَيُزَكِّيكُمْ وَيُعَلِّمُكُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَيُعَلِّمُكُم مَّا لَمْ تَكُونُواْ تَعْلَمُونَ .فَاذْكُرُونِي أَذْكُرْكُمْ وَاشْكُرُواْ لِي وَلاَ تَكْفُرُونِ

(Bəqərə, 2/151-152)

«İçinizdə sizdən olan bir peyğəmbər göndərdik. Sizə ayələrimizi oxuyur, sizi təmizləyir, sizə kitab (hikmət) öyrədir. Sizə bilmədiyiniz şeyləri öyrədir. O halda məni anın, Mən də sizi anım. Mənə şükr edin, ancaq nankorluq etməyin».

**Əslində, peyğəmbərlik institutu və peyğəmbərlər həm də insanlığı bu dünyada və axirətdə xoşbəxt edəcək bir elm verilmə hadisəsidir, Allahın (c.c.) varlıqla nur təmasıdır, varlığı işıqlandırma yoludur. Seçilmiş peyğəmbərlər də bu ilahi nurun daşıyıcılarıdır.** Baxın, uca Allah (c.c.) bu böyük mənanı, bu insanlığı qurtuluş hadisəsini necə dəqiq anladır:

الشَّيْطَانُ يَعِدُكُمُ الْفَقْرَ وَيَأْمُرُكُم بِالْفَحْشَاء وَاللّهُ يَعِدُكُم مَّغْفِرَةً مِّنْهُ وَفَضْلاً وَاللّهُ وَاسِعٌ عَلِيمٌ . يُؤتِي الْحِكْمَةَ مَن يَشَاءُ وَمَن يُؤْتَ الْحِكْمَةَ فَقَدْ أُوتِيَ خَيْراً كَثِيراً وَمَا يَذَّكَّرُ إِلاَّ أُوْلُواْ الأَلْبَابِ

(Bəqərə, 2/268-269)

«Şeytan sizi yoxsulluqla qorxudub çirkin-çirkin işlərə təşviq edir. Allah isə lütfündən bir bağışlama və çox fayda vəd buyurur. Allahın qüdrəti geniş, elmi çoxdur. İstədiyinə hikmət verir, hikmət verilənə isə çox xeyir verilmişdir. Bunu ancaq təmiz əxlaqlılar anlayar».

أَمَّنْ هُوَ قَانِتٌ آنَاء اللَّيْلِ سَاجِداً وَقَائِماً يَحْذَرُ الْآخِرَةَ وَيَرْجُو رَحْمَةَ رَبِّهِ قُلْ هَلْ يَسْتَوِي الَّذِينَ يَعْلَمُونَ وَالَّذِينَ لَا يَعْلَمُونَ إِنَّمَا يَتَذَكَّرُ أُوْلُوا الْأَلْبَابِ

(Zumər, 39/9)

«Məgər axirətdən qorxan Rəbbinə ümid bəsləyən, gah səcdəyə qapanıb, gah da ayaqüstə durub gecə saatlarını ibadət içində keçirən (müti bəndə kafirlə birdirmi)?! De: «Heç bilənlərlə bilməyənlər eyni ola bilərmi?! Yalnız ağıl sahibləri ibrət alar!»

Hz.Nizaminin bu məsələnin üzərində ayrıca durmasının səbəbi odur ki, o, insanın bu dünyada və axirətdə qurtulmasının, xoşbəxt olmasının Allahı (c.c.) tanımaqla mümkün olacağına inanır. Allahı (c.c.) tanımağın yolu isə elmdir. Bir insan yolunu aydın görə bilmirsə, pisi yaxşıdan seçməkdə çətinlik çəkirsə, bu onun elminin, nurunun azlığını göstərir. Ancaq uca Allah (c.c.) hz.Məhəmmədin (s.a.s.) ürəyində yandırdığı şamının nuru bütün zülmə, çətinliyə cəhalətin soyuq, sərt küləyinə baxmayaraq, sönmədi, daha gur yandı, insanlara doğru yol göstərdi. Bu əbədiyyətədək yanacaq sönməyən bir nurdur.

## O, SONADƏK OXUDU

Hz.Nizaminin şərh olunan beytində diqqəti çəkən ifadələrdən biri də «əbədədək oxumaq»dır. Şair deyir ki, hz.Məhəmməd (s.a.s.) «əzəl dərsini» - «əbədədək oxudu». Biz «əzəl elminin» Allaha (c.c.) aid olduğunu bildirdik. Uca Allah (c.c.) yalnız ona məxsus olan «əzəl elmi»ni bir elm, bir təlim, bir düşüncə, bir inanc və din olaraq birbaşa özü müəllimlik edərək və bir dərs xarakterində, dərs öyrətmə üsulu ilə öz elçisinə öyrədir. Allahın (c.c.) dərsini əbədədək oxumaq, öyrənmək anlayışına bu yöndən yanaşsaq, bir neçə məna ortaya çıxara bilərik. **İlk anlaşılan odur ki, hz. Məhəmməd (s.a.s.) seçilmiş tələbədir, ona verilən dərs və bu dərsin müəllimi bütün elmləri əhatə edir, bu elmdə**

**yanlış yoxdur. Daha sonra «əbədədək oxumaq» o deməkdir ki, hz.Məhəmməd (s.a.s.) müəlliminə, onun elminə inandı, Allahın (c.c.) dərsini sonadək dinlədi və hər şeyi başa düşdü. Bu elm Allahın (c.c.) varlığı, yaradılış, insanın mahiyyəti, onun qurtuluş yolu ilə bağlı məsələlərə doğru cavablar verdi. «Əbədədək öyrənmək» anlayışından çıxan başqa bir məna odur ki, hz.Məhəmməd (s.a.s.) onun üzərinə qoyulan ilahi vəzifəni sonadək yerinə yetirdi. Anlayışın verdiyi başqa bir məna budur ki, hz.Məhəmmədə (s.a.s.) verilmiş elm bu dünyanı və axirəti əhatə edir. Bu elmin hədəfi Allahın (c.c.) razı olacağı insan yetişdirmək, hər iki dünyada insanın səadətini təmin etməkdir.**

Uca Allahın (c.c.) tələbəsi olan hz.Məhəmməd (s.a.s.) insanlığın müəllimi oldu və Allahın (c.c.) buyurduğu hər şeyi sonadək izah və təbliğ etdi. O, peyğəmbərlik vəzifəsini doğru dəyərləndirdi, bu vəzifə ilə bağlı bütün işləri yerinə yetirdi. Uca Allah (c.c.) hz.Məhəmmədin (s.a.s.) vəzifələrini ona və bizə belə anladır:

إِنَّا أَرْسَلْنَاكَ شَاهِداً وَمُبَشِّراً وَنَذِيراً

(Fəth, 48/8)

«Şübhəsiz, biz səni şahid, müjdələyici və xəbərdaredici olaraq göndərdik».

Hz.Nizami bu beytdə də «ürəyində Allahın (c.c.) şamı yanmış, Allahın (c.c.) dərsini əbədədək oxumuş hz. Məhəmmədi (s.a.s.) insanlığa tanıdır, bizi peyğəmbərə, onun gətirdiklərinə inanmağa çağırır. Hz.Nizami bütün nət boyu olduğu kimi, bu beytdə də gerçək informasiyalarla yüklənmiş «sirlər», qavramlar vasitəsi ilə Allahı (c.c.), onun dinini, sevimli Peyğəmbərini (s.a.s.) tanıtmaq, insanları onlara inandırmaq vəzifəsini yerinə yetirmişdir.

## İYİRMİ BİRİNCİ BEYTİN ŞƏRHİ: GÜNƏŞİN GÖZÜ ONA MÖHTACDIR

Hz.Nizami nətin iyirmi birinci beytini də «nur beytləri» sırasına daxil edir. Şair yazır:

چشمه خورشید که محتاج اوست
نیم هلال از شب معراج اوست

***Ona möhtac olan Günəş çeşməsi,***
***Onun merac gecəsinin ayparasıdır.***[649]

Şair beytin birinci misrasında divan ədəbiyyatında ayrıca yeri olan Günəş obrazından istifadə etmişdir. Biz nətin ilk beytlərini şərh edərkən bildirmişdik ki, şair varlığın yaradılışı ilə hz.Məhəmmədin (s.a.s.) yaradılışını birgə anlatmışdır. Hz.Nizamiyə görə, uca Allahın (c.c.) ilk yaratdığı hz.Məhəmmədin (s.a.s.) ruhudur. Şairə görə, uca Allah (c.c.) bütün başqa varlıqları Onun xatirinə yaratmışdır.

Uca Allahın (c.c.) yaratdıqları içərisində Günəşin də ayrıca yeri var. O, Allahın yaratdığı möhtəşəm bir varlıqdır, həyat qaynağıdır, nurdur. Hz.Nizami bildirir ki, bu yaradılmışların ən nurlusu olan Günəş belə hz.Məhəmmədin (s.a.s.) nuruna möhtacdır, uca Allah (c.c.) Günəşin nurunu ona görə yaradıb. **Günəş olmasa idi, həyat sönərdi, hz.Məhəmməd (s.a.s.) olmasa idi, Günəş də yaradılmazdı. Şair hz.Məhəmmədin (s.a.s.) nuru ilə Günəşin nurunu müqayisə edərək, Günəşin Ona möhtac olduğunu bildirir və ikinci misrada hz.Məhəmmədin (s.a.s.) nurunun üstünlüyünü daha açıq göstərmək üçün bir sıra dini anlayışların verdiyi imkanlardan istifadə edir.**

Bunun üçün şair ilk sırada «merac gecəsi» anlayışını beytin quruluşuna yerləşdirir. Merac gecəsi islam tarixində, hz. Məhəmmədin (s.a.s.) peyğəmbərliyində ən önəmli, həll-

---

[649] Nizami Gəncəvi, Sirlər Xəzinəsi, göstərilən qaynaq, s. 26.

edici zaman dilimlərindən biri olduğu və çox məsələlərə yön verdiyindən beytin söz, məna tərkibinə daxil olaraq, ideyanı müəyyən edir.

**Merac gecəsi islam tarixində, hz.Məhəmmədin (s.a.s.) peyğəmbərliyində nurlanmanın, elm almanın ən son həddidir. Uca Allah (c.c.) bu gecə öz elçisini ən yüksək məqama ucaltdı, ona namaz elmini verdi, müsəlmanları bağışlanma ilə müjdələdi. Bu gecənin nuru, bərəkəti o qədər çoxdur ki, Günəşin işığı onun yanında bir aypara işığı kimi görünür.**

**Şair müqayisə tərəflərini belə seçir: Hz.Məhəmmədin (s.a.s.) nuru, Günəş çeşməsinin nuru, Onun merac gecəsi, aypara. Şairə görə kainatın varlıq səbəbi hz.Məhəmmədin (s.a.s.) nuru olduğundan Günəş də Ona möhtacdır, hz.Məhəmmədin (s.a.s.) merac gecəsinin nuru qarşısında Cünəş bir aypara işığı kimi görünür.**

## İYİRMİ İKİNCİ BEYTİN ŞƏRHİ:
## O, MERAC GECƏSİNİN TAXTINDA OTURMUŞDU

Şair iyirmi ikinci beytdə də ideyanı merac gecəsinin bərəkəti üzərində qurmuşdur:

تخت نشین شب معراج بود
تحت نشان کمر وتاج بود

***O merac gecəsinin təxtində oturmuşdu,***
***Onun təxti kəmər və tacının nişanı idi.***[650]

Öncə onu deyək ki, bu beyt nətin Azərbaycan türkcəsinə çevrilmiş sətri tərcümə mətnində yoxdur.

### «MERAC»IN ANLAMI

Hz.Nizami bu nətdə meraca ayrıca yer vermişdir. Şair meracın islam dini tarixində böyük, önəmli yer tutduğunu əsas götürərək bu möhtəşəm hadisəni hz.Məhəmmədin (s.a.s.) peyğəmbərliyinin ən önəmli mərhələlərindən biri kimi dəyərləndirmişdir. Biz də beytin şərhini vermədən öncə sıra ilə Meracı anladaq.

İsra (gecə yolçuluğu) və Merac uca Allahın (c.c.) Peyğəmbərini Məkkədəki Məscidi-Həramdan, Qüdsdəki Məscidi-Əqsaya aparması, daha sonra isə onu göyün yüksək təbəqələrinə çıxarması, sonra insan,cin, mələk və başqa yaradılmışların bilgilərinin qavraya bilməyəcəkləri bir ucalığa yüksəltməsidir.

Merac hz.Məhəmmədin (s.a.s.) Mədinəyə hicrətindən təxminən bir il öncə baş vermişdir. Allahın (c.c.) elçisi yanında Cəbrail (a.s.) olmaqla gecə Qüdsdəki Süleyman məbədinə aparıldı, orada özündən öncə vəfat etmiş peyğəmbərlərə namaz qıldırdı. Merac gecəsində hz.Məhəmmədə (s.a.s.) bir Burak adlı heyvan gətirildi. Burak

---

[650] Nizami Gəncəvi, Sirlər Xəzinəsi, göstərilən qaynaq, s. 26.

eşşəkdən böyük, qatırdan kiçik, çox sürətlə yeriyən bir heyvandır. Peyğəmbər (s.a.s.) Məscidi-Əqsaya girdi, orada iki rükət namaz qıldı. Cəbrail (a.s.) ona süd dolu və içində şərbət olan kasa gətirdi. Rəsulullah (s.a.s.) süd dolu kasanı içdi. Cəbrail (a.s.) ona: «Fitrəti seçdin», dedi. Sonra hz.Məhəmməd (s.a.s.) göyün qatlarına çıxarıldı. O, Sidrətül-Müntəhaya çatdı. Bundan sonra uca Allah (c.c.) ona vəhylə bir sıra müjdələr verdi. Gündə beş vaxt namaz qılmaq əmr edildi. İslamın beş əsasından biri təsbit olundu.

Səhabələr, sonrakı dönəmdə alimlər Meracla bağlı fərqli fikirlər irəli sürmüşlər. Onların çoxu həm İsra, həm də Meracın fiziki olaraq baş verdiyini irəli sürmüşlər. Yəni, hz.Məhəmməd (s.a.s.) fiziki olaraq, bədənlə gecə Məscidi-Əqsaya getmiş, oradan da fiziki olaraq Meraca yüksəlmişdir. Başqa kiçik bir qrup isə bu hər iki hadisənin ruhi olaraq baş verdiyini irəli sürmüşdür. Hz.Aişə (r.a.), Həsən Bəsri (r.a.) bu ikinci fikri müdafiə etmişlər.[651]

Bu iki görüşün bir-birinə zidd olmadığını irəli sürən İbni Qəyyim yazır: «Allahın Rəsulunun meracını bizə rəvayət edənlər iki qrupa bölünür. Bir qrup meracın ruhi və bədəni olaraq gerçəkləşdiyini irəli sürmüşdür. Başqa qrup isə onun ruhi olaraq gerçəkləşdiyini, bədənin isə heç bir yerə ayrılmadığını bildirmişlər. Ancaq bu ikincilər də meracın röyada olduğunu söyləmək istəməmişlər. Sadəcə, felən gecə yolçuluğuna (isra) çıxan və sonra göyə yüksələnin (merac) hz.Peyğəmbərin (s.a.s.) ruhu olduğunu və beləliklə, ruhun (ancaq) ölümdən sonra şahid olacağı şeyləri gördüyünü nəzərdə tutmuşlar. Hz.Peyğəmbərin o zaman olan halı (ruhun) ölümdən sonrakı halına bənzəyir… Ancaq, Allahın elçisinin İsra (gecə yolçuluğu) zamanı yaşadıqları ruhun

[651] Muhammed Esed, Kuran mesajı, göstərilən qaynaq, s. 1337.

ölümdən sonrakı təcrübələrindən daha uca idi və insanın yuxusunda gördüyü yuxulardan çox üstün idi… Allahın elçisinin göydə qarşılaşdığı peyğəmbərlər isə orada olanların bədənlərindən ayrılaraq ora gələn ruhlar idi. Allahın elçisinin ruhu isə o, həyatda olarkən ora yüksəlmişdi»[652]

İsra (gecə yolçuluğu) və Meracın Qurani-Kərimdəki yerinə baxaq. Qurani-Kərimdə ayrıca «İsra» surəsi var. Uca Allah (c.c.) bu surənin birinci ayəsində buyurur:

سُبْحَانَ الَّذِي أَسْرَى بِعَبْدِهِ لَيْلاً مِّنَ الْمَسْجِدِ الْحَرَامِ إِلَى الْمَسْجِدِ الأَقْصَى الَّذِي بَارَكْنَا حَوْلَهُ لِنُرِيَهُ مِنْ آيَاتِنَا إِنَّهُ هُوَ السَّمِيعُ البَصِيرُ

(İsra, 17/1)

«Ucalığına sınır olmayan O (Allah) ki, qulunu gecə vaxtı ona bir sıra əlamətlərimizi göstərmək üçün (Məkkədəki) Məscidi-Həramdan, çevrəsini mübarək etdiyimiz Məscidi-Əqsaya götürdü. Çünki, gerçəkdən hər şeyi eşidən, hər şeyi görən Odur».

Hz.Məhəmmədin (s.a.s.) bir sıra hədislərində meraca yer verilmişdir:

Enes (r.a.) rəvayət edir: «Məşhur merac hadisəsində Rəsulullah (s.a.s.) belə buyurdu: «Sonra Cəbrail məni ən yaxın səmaya çıxartdı. Qapının açılmasını istədi.

- O, kimdir?
- Mən Cəbrailəm.
- Yanındakı kimdir?
- Məhəmməd.

Sonra məni ikinci qat səmaya çıxartdı. Qapının açılmasını istədi.

- O, kimdir?
- Mən Cəbrailəm.

[652] Muhammed Esed, Kuran mesajı, göstərilən qaynaq, s. 1339.

- Yanındakı kimdir?

- Məhəmməd.

Üçüncü, dördüncü səmalara yüksəldikcə hər birinin qapısında:

- O, kimdir?

- Mən Cəbrailəm, sualı və cavabı verilirdi».[653]

Enes (r.a.) rəvayət edir: «Rəsulullah (s.a.s.) belə buyurdu: «Meraca çıxarıldığımda mən misdən dırnaqlarla üzlərini və kökslərini qaşıyan bir qrupun yanından keçdim.

- Ey Cəbrail! Bunlar kimlərdir?, – deyə, soruşdum.

- Bunlar (qeybət etməklə) insanların ətlərini yeyənlər və onların şərəf və namusları ilə oynayanlardır».[654]

«Yuxarı çıxmaq», «nərdivan» anlamına gələn meracla bağlı ən azı qırx beş səhabə bilgi vermişdir. İmam Buxariyə görə meracın süjet xətti belədir:

«Bir gecə Rəsulullah (s.a.s.) uzanıb yatanda, yuxu ilə oyanıqlıq arasında olanda Cəbrail adlı mələk onun yanına gəlir və Allah elçisinin köksünü yarıb, qəlbini yuyur. Sonra ona çox dəbdəbəli bir minik olan Burakı verir. Onlar Kəbədən birinci səmaya çıxırlar. Qoruyucular qapını açırlar, hz.Məhəmməd (s.a.s.) burada onu qarşılayan Adəmi (s.a.s.) görür. Sonra ikinci səmaya çıxırlar, burada İsa (s.a.s.) ilə Yəhyanı (s.a.s.) görürlər. Üçüncü Səmada Yusifi (s.a.s.), dördüncüdə İdrisi (s.a.s.), beşincidə Harunu (s.a.s.), altıncıda Musanı (s.a.s.) və yeddincidə İbrahimi (s.a.s.) görürlər. İbrahim Peyğəmbər (s.a.s.) kürəyini Beytül-Məmur adlı məscidin divarına söykəyərək durmuşdur. Onlar Sidrə ağacı ilə işarə olunmuş sərhədə çatanda Cəbrail belə deyir: «Əgər mən bu sərhədin o biri tərəfinə keçsəm, Allahın ilahi bir təcəllisi

[653] Riyazüs-Salihin, göstərilən qaynaq, c. IV, s. 463-464.
[654] Riyazüs-Salihin, göstərilən qaynaq, c. VI, s. 460.

ilə yanıb məhv olaram, ancaq sən dəvət olunmusan, irəli get!»

Cəbrail sərhədin o biri tərəfində olan Sidrə ağacından sonra ilahi hüzurun yaxınınadək (Kürsiyə) olan yolu ona təsvir edir. Yolu təqib edən Məhəmməd (s.a.s.) bu arada ilahi qərar və təqdirləri yazan qələmlərin kağıza sürtünmədən yaranan səslərini eşidir. O, buradan başlayaraq Qüdsiyyət məkanına girir. Qurani-Kərimə görə aralarında iki yay, ya da daha az bir məsafə qalmışdır. Hz.Məhəmməd (s.a.s.) «Təhiyyat»dan ibarət olan bu salamı verir:

«Müqəddəs, saf və səmimi olan salamlar Allaha aiddir»

Uca Allah ona belə cavab verir:

«Ey Nəbi! Salam sənə! Allahın rəhməti və ilahi bərəkətləri sənin üzərinə olsun!»

Hz.Məhəmməd (s.a.s.) belə cavab verir:

«Bizlərə və Allahın yaxşı iş, hərəkətləri olan saleh qullarına salam olsun»

Qurani-Kərimdə ifadə edildiyi kimi bundan sonra Allah quluna vəhy etmək istədiyi şeyi vəhy etdi: «On iki əmri» verdi. Eyni şəkildə Musaya (s.a.s.) da on əmr vəhy etmişdi. Hədislərdə verilən bilgiyə görə, Allah qulu Məhəmmədə (s.a.s.) qarşı çox comərd, səxavətli oldu. Ona üç nemət verdi. Allahın birliyinə inanan, hz.Məhəmmədi (s.a.s.) elçi olaraq qəbul edən bütün müsəlmanların, əgər günahları varsa, Cəhənnəm atəşinə atılmaqla bir müddət cəzalandırıldıqdan sonra qurtulacağını müjdələdi. Daha sonra uca Allah səmavi ərşində olan ilahi xəzinələrdən əlimizdə olan Quranın ikinci surəsinin (Bəqərə) ən sonuncu iki ayəsini bu yolçuluğun bir xatirəsi olaraq hz.Məhəmmədə (s.a.s.) verdi. Daha sonra gündəlik beş vaxt namazı müsəlmanlara fərz etdi. …Dönüş yolu üzərində Cəbrail ona cənnəti, orada olan nemətləri, bu nemətə layiq görülmüş insanların hallarını göstərdi. Eyni

şəkildə Cəhənnəm, burada olan dəhşət və işgəncə halları, bu cəzalara layiq görülmüş insanların faciəvi halları göstərildi. Səmalardan endirilən hz. Məhəmmədin (s.a.s.) «imam»lıq etməsi ilə namaz qılacaqlarını gözləyən bütün peyğəmbərlər onu Qüdsdə qarşıladılar. (Artıq onların ilahi vəzifələri sona çatmışdı. Hz.Məhəmmədin (s.a.s.) vəzifəsi isə indi başlayırdı). Camaat namazından sonra Məkkəyə döndülər. Hz. Məhəmməd (s.a.s.) özünü Kəbənin yanında gördü»[655]

Meracla bağlı yuxarıdakı mətndə olan bir sıra anlayışlara Quranda da yer verilmişdir:

وَلَقَدْ رَآهُ نَزْلَةً أُخْرَى .عِندَ سِدْرَةِ الْمُنْتَهَى .عِندَهَا جَنَّةُ الْمَأْوَى . إِذْ يَغْشَى السِّدْرَةَ مَا يَغْشَى . مَا زَاغَ الْبَصَرُ وَمَا طَغَى . لَقَدْ رَأَى مِنْ آيَاتِ رَبِّهِ الْكُبْرَى

(Nəcm, 53/13-18)

«Və onu bir daha gördü. Ən uzaq nöqtədəki Sidrə ağacının yanında. Vəd edilən bağçanın yaxınlığında. Bilinməyən bir parlaqlığın çevrəsini əhatə etdiyi Sidrə ağacının yanında. (Diqqət edin) gözü nə çaşdı, nə də başqa yönə çevrildi. Və o, gerçəkdən də Rəbbinin ən möhtəşəm simvollarından bir qismini gördü».

ثُمَّ دَنَا فَتَدَلَّى . فَكَانَ قَابَ قَوْسَيْنِ أَوْ أَدْنَى

(Nəcm, 53/8-9)

«… Və sonra yaxınlaşaraq yanına gəldi. Aralarında iki yay məsafəsi qalana qədər, hətta, daha da yaxınına».

Meracla bağlı diqqəti çəkən məsələlərdən biri də hz.Məhəmmədin (s.a.s.) Merac gecəsi niyə məhz səkkiz peyğəmbərlə görüşməsidir. Təfsirçilərə görə, bu səkkiz peyğəmbərlə hz.Məhəmmədin (s.a.s.) həyatı arasında oxşarlıqlar var. Suheyli bu oxşarlıqları belə sıralayır:

---

655 Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, c. I, s. 134-139.

- Adəm (s.a.s.) Allahın yanında, onun mütləq himayəsində böyüdü. Şeytan onu buradan uzaqlaşdırdı. Hz. Məhəmməd (s.a.s.) isə Allahın evi (Kəbə) yanında doğuldu, böyüdü, şeytan ruhlu həmşəhərliləri onu hicrətə məcbur etdi;

- Yəhya (s.a.s.) və İsa (s.a.s.) yəhudilərin sərt münasibəti ilə üzləşdi, onları öldürmək istədilər. Hz.Məhəmməd də (s.a.s.) yəhudilərin sui-qəsdinə məruz qaldı;

- Yusifə (s.a.s.) qardaşları zülm etdi. Yusif (s.a.s.) onları əfv etdi. Hz.Məhəmməd də (s.a.s.) Məkkə fəthindən sonra müşrikləri əfv etdi;

- İdris (s.a.s.) peyğəmbər ilk dəfə qələmdən istifadə etmişdir. Hz.Məhəmməd (s.a.s.) də müxtəlif ölkələrin hökmdarlarına məktublar göndərmişdir;

- Harun (s.a.s.) mənsub olduğu xalqın sevgisini qazanmışdır. Sonralar ərəblər də Hz.Məhəmmədi (s.a.s.) sevmişlər;

- Allah Musaya (s.a.s.) bütpərəstlərlə savaşmağı əmr etmişdir. Hz.Məhəmmədə (s.a.s.) də eyni şey əmr edilmişdir;

- İbrahim (s.a.s.) səmada Kəbənin üzərində olan «Beytül-Məmurun» yanında dayanmışdır. O, Kəbəni yenidən təmir etmişdir». [656]

Professor Məhəmməd Həmidullah isə bu məsələyə fərqli yanaşmışdır. Ona görə, bu səkkiz peyğəmbərin hər biri ayrılıqda merac hadisəsini yaşamışdır. Bəs onların meracla şərəflənmələrinin səbəbi nədir? Alim bunu belə izah etmişdir:

- Adəm (s.a.s.) peyğəmbər sədaqət və təslimiyyəti təmsil edir;

- Yəhya (s.a.s.) və İsa (s.a.s.) yumşaqlığı ilə seçilirlər, düşmənləri belə sevməyi öyrədirlər;

---

[656] Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, c. I, s. 137.

- Yusif (s.a.s.) peyğəmbər insanı başdan çıxaran təklifləri rədd edir, namus və həyasını qoruyur;

- İdris (s.a.s.) peyğəmbər yazını icad etməklə elm və mədəniyyətin inkişafına yardım edir;

- Harun (s.a.s.) peyğəmbər insanların ruhi-mənəvi, ibadət həyatına yön verir;

- Musa (s.a.s.) peyğəmbər bütpərəstliyə qarşı mübarizə aparır, Allahın birliyi uğrunda savaşır;

- İbrahim (s.a.s.) peyğəmbər Allahın birliyini hər şeydən üstün tutur, bu yolda oğlunu qurban kəsməyə, oda atılmağa razı olur.

Hz.Məhəmməd (s.a.s.) isə adları çəkilən peyğəmbərlərin ayrılıqda üzərlərinə götürdükləri məsələlərin hamısını cəm olaraq bir yerdə özündə birləşdirmişdir, bu üstün özəllikləri yaşamışdır.[657]

## MERACIN ÜÇ NEMƏTİ

İndi Meracın canı olan üç neməti önə çıxaraq. **Bunlardan biri** gündəlik beş vaxt namazın qılınmasının buyrulmasıdır. Gerçəkdən namaz bir nemətdir, islamın beş təməlindən biridir, hz.Peyğəmbərin (s.a.s.) sözləri ilə desək, namaz dinin dirəyidir, namaz möminin meracıdır, namaz hz. Məhəmmədin (s.a.s.) gözünün nurudur.

**İkinci nemət** hz.Məhəmmədə (s.a.s.) on buyruğun verilməsidir:

- Ancaq Allaha ibadət edin;

- Ana və ataya qarşı yaxşı davranın;

- Qohumlara, yoxsullara, yolda çarəsiz qalanlara haqqını verin;

- İsraf etməyin, xəsis olmayın;

---

657 Muhammed Hamidullah, İslam peyğamberi, göstərilən qaynaq, c. I, s. 137-138.

- Ruzi qorxusu ilə övladlarınızı öldürməyin;
- Zinaya yaxınlaşmayın;
- Haqsız olaraq bir kimsəni öldürməyin;
- Yetimin malına toxunmayın;
- Verdiyiniz söz və vədi yerinə yetirin, ölçüdə, çəkidə düz olun;
- Bilmədiyiniz məsələnin arxasınca düşməyin, qürur və təkəbbürlə yeriməyin.

## HƏZRƏT MUSAYA (s.a.s.) VERİLƏN ON BUYRUQ

İndi də hz. Musaya (s.a.s.) verilən on buyruğa baxaq:
- Allahdan başqa ilahın olmayacaq;
- Özünə büt düzəldib, rəsm çəkməyəcəksən, onlara itaət etməyəcəksən;
- Allahın adını boş yerə çəkməyəcəksən;
- İstirahət günü müəyyən etməyi yadında saxla;
- Atana və anana hörmət et;
- İnsan öldürmə;
- Zina etmə;
- Oğurluq etmə;
- Yalandan şahidlik etmə;
- Qonşunun, yaxınının ev və ocağına əsla göz dikmə. Qonşu və yaxınının arvadına göz dikmə. Onların nə kişi, nə də qadın xidmətçisinə, nə öküzünə, nə eşşəyinə, nə də qonşuna aid hər hansı bir şeyə göz dikmə».[658]

Bu buyruqların hər biri insanlıq üçün bir nemətdir. Bunlar insanın fitrətinə uyğun fəaliyyət göstərməsinin prinsipləridir.

---

[658] Çıxış, 20/3-17; Təsniyə, 5/6-21.

Merac gecəsi hz.Məhəmmədə (s.a.s.) verilən **üçüncü nemət** Qurani-Kərimin Bəqərə surəsinin son iki ayəsində ifadə edilmişdir:

آمَنَ الرَّسُولُ بِمَا أُنزِلَ إِلَيْهِ مِن رَّبِّهِ وَالْمُؤْمِنُونَ كُلٌّ آمَنَ بِاللّهِ وَمَلآئِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِ لاَ نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِّن رُّسُلِهِ وَقَالُواْ سَمِعْنَا وَأَطَعْنَا غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ الْمَصِيرُ .لاَ يُكَلِّفُ اللّهُ نَفْساً إِلاَّ وُسْعَهَا لَهَا مَا كَسَبَتْ وَعَلَيْهَا مَا اكْتَسَبَتْ رَبَّنَا لاَ تُؤَاخِذْنَا إِن نَّسِينَا أَوْ أَخْطَأْنَا رَبَّنَا وَلاَ تَحْمِلْ عَلَيْنَا إِصْراً كَمَا حَمَلْتَهُ عَلَى الَّذِينَ مِن قَبْلِنَا رَبَّنَا وَلاَ تُحَمِّلْنَا مَا لاَ طَاقَةَ لَنَا بِهِ وَاعْفُ عَنَّا وَاغْفِرْ لَنَا وَارْحَمْنَا أَنتَ مَوْلاَنَا فَانصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرِينَ

(Bəqərə, 2/285-286)

«O Rəsul da Rəbbindən ona endirilmə iman etdi, mömin kimsələr də. Bütün bunlar Allaha, mələklərinə, kitablarına, rəsullarına inandılar. Onun elçilərindən heç biri arasında fərq qoymazlar. Eşitdik və itaət etdik. Bizi bağışla, ey Rəbbimiz! Dönüş ancaq sənədir. Allah heç kimsəyə daşıya biləcəyindən daha çoxunu yükləməz. İnsanın etdiyi hər yaxşılıq öz lehinə, hər pislik də öz əleyhinədir. Ey Rəbbimiz! Unudaraq və ya bilmədən xəta etsək, bizi mühakimə etmə! Ey Rəbbimiz! Bizdən öncəkilərə yüklədiyin kimi bizə də ağır yüklər yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan yükləri bizə yükləmə! Günahlarımızı bağışla, bizi bağışla və rəhmətini yağdır üstümüzə! Sən uca Mövlamızsan, həqiqəti inkar edən topluma qarşı bizə yardım et!».

Merac gecəsində verilmiş və bu iki ayədə təsbit olunmuş nemətlərin dəyəri çox böyükdür. Uca Allah (c.c.) bir yandan imanın şərtlərini müəyyən edir, Allahın (c.c.) dininə və peyğəmbərlərinə doğru münasibətin prinsiplərini açıqlayır, dinlərarası əlaqələrin əsaslarını göstərir, insanları bir-birinin haqq, hüquq və inanclarına hörmət etməyə çağırır, başqa yöndən isə insanı ağır bir yükdən xilas edir. Uca Allah

